ISSN 2409-8817

AZƏRBAYCAN RESPUBLİKASI ELM VƏ TƏHSİL NAZİRLİYİ

AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL İNSTİTUTU

# *ELMİ ƏSƏRLƏR*

**cild 89, № 6, 2022**

# *НАУЧНЫЕ ТРУДЫ*

**том 89, № 6, 2022**

# *SCIENTIFIC WORKS*

**volume 89, № 6, 2022**

**"Elmi əsərlər" 1934-cü ildən çıxır**
**İldə 6 nömrə nəşr olunur**

**Redaksiyanın ünvanı**:
Bakı şəhəri, Zərifə Əliyeva küçəsi, 96
Tel: 493-96-21, 493-30-06
E-mail: a.abbasov@arti.edu.az
gulizade.gunel@mail.ru
http://www.arti.edu.az/az/

**Bakı – 2022**

## *BAŞ REDAKTORDAN*
## *ОТ ГЛАВНОГО РЕДАКТОРА*
## *FROM THE EDITOR İN CHIEF*

### İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYATIN BİBLİOQRAFİK TƏSVİRİ

### БИБЛИОГРАФИЧЕСКОЕ ОПИСАНИЕ ИСПОЛЬЗОВАННОЙ ЛИТЕРАТУРЫ

### BİBLİOGRAPHİC DESCRİPTİON OF USED LİTERATURE

Jurnalımızın son səhifələrində azərbaycanca, rusca və ingilis dilində "Məqalələrin yazılışına verilən tələbləri" əks etdirmişik. Bəzi müəlliflər həmin tələbləri ciddi şəkildə nəzərə aldıqları halda digər müəlliflər mövcud qaydaları gözləmədən redaksiyaya məqalə gətirir, yaxud elektron poçtla göndərirlər. Bu isə, o deməkdir ki, təqdim olunan məqalə işlənmək üçün geri qaytarılmalı, yaxud da redaksiya tərəfindən redaktə edilməlidir. Belə məqalələr, adətən zəif olur, özündə elmi ideya əks etdirmir, təsviri xarakter daşıyır, məqalənin sonunda verilən ədəbiyyat siyahısı da necə gəldi formalaşdırılır.

2019-cu ildə Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının yeni Əsasnaməsi təsdiq olunmuş, dissertasiyaların, avtoreferatların, ədəbiyyat siyahısının tərtibinə yeni tələblər verilmişdir. Ölkəmizdə dissertasiyaların əsas nəticələrinin dərc olunması tövsiyə edilən elmi nəşrlərdə öz məqalələrini görmək istəyən alimlər, gənc tədqiqatçılar – doktorantlar və dissertantlar "İstifadə edilmiş ədəbiyyatın biblioqrafik təsviri və nümunələr"i ilə tanış olmalı, həm dissertasiyalarında, həm məqalələrində, həm də konfrans materiallarında mövcud tələbləri nəzərə almalıdırlar.

"İstifadə edilmiş ədəbiyyatın biblioqrafik təsviri və nümunələr"i aşağıdakı bölmələrə ayrılır: nəşrin növü; biblioqrafik təsvirin forması; nümunələr.

Tələblərə diqqət yetirək: **Çoxcildli nəşrlər belə yazılır**:

1. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir: [46 cilddə] / H. Əliyev. – Bakı: Azərnəşr, – c. 45. – 2013. – 384 s.
2. Azərbaycan Milli Ensiklopediyası / Red. hey. sədri İ.H. Əliyev. – Bakı: Azərbaycan Milli Ensiklopediyası Elmi Mərkəzi, – c. 8: Enollar – Fedin. – 2018. – 598 s.

**Müəllifi göstərilməyən nəşrlər**: Azərbaycan bayatıları / tərt. ed. B.Abdulla – Bakı: XXI – Yeni nəşrlər evi, – 2004. – 304 s.

**Müəllifi dörd nəfərədək olan nəşrlər**, o cümlədən ***bir müəllifli nəşrlər***: Əlizadə, Ə.Ə. Qadın psixologiyası: Fəlsəfi-psixoloji esselər / Ə.Ə. Əlizadə. – Bakı: Təhsil, – 2015. – 416 s.

**İki və üç müəllifli nəşrlər**: Abbasov, A.N. Pedaqogika: Müntəxəbat. Dərs vəsaiti. / A.N. Abbasov, R.R. Məmmədzadə, L.A. Məmmədli. – Bakı: Mütərcim, – 2021. – 608 s.

**Müəllifi dörd və daha çox olan nəşrlər**. ***Dörd və beş müəllifli nəşrlər***: Pedaqogika: Ali məktəblər üçün dərs vəsaiti / Y.R. Talıbov, Ə.Ə. Ağayev, A.İ. Eminov [və b.] – Bakı: Adiloğlu, – 2003. – s. 48

**Beşdən çox müəllifli nəşrlər**: Kurikulum bələdçisi: İzahlar və tətbiqlər / Ə.M. Abbasov [və b.] – Bakı: Elm və təhsil, – 2019. – 320 s.

**Jurnal məqalələri**: Məmmədli L.A. Şagirdlərin milli qəhrəmanların nümunəsində tərbiyə olunması // – Bakı: Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, – 2020. № 6, – s. 59-62.

**Müəllifi üçdən çox olan jurnal məqalələri**: Rüstəmov, Q.Ə. Vibrasiyalı kəsmə prosesində müqavimət momenti dəyişməsinin tədqiqi / Q.Ə. Rüstəmov, İ.A. Yolçuyev, Ə.T. Həzərxanov [və b.] // Milli Aviasiya Akademiyasının Elmi Əsərləri, – Bakı: – 2005. №1, – s. 80-86.

**Konfrans materialları**: Аббасов, А.Н. Подготовка подростков и молодежи к семейной жизни // Материалы 66-й Международной научно-практической конференции на тему: «Актуальные вопросы науки», Москва: Спутник: -10 августа 2020, с. 33-37

**Dissertasiyalar**: Əliyeva, L.X. Təhsilin demokratikləşdirilməsi pedaqoji kadrların hazırlanmasının mühüm prinsipi kimi: ali pedaqoji məktəblərin bakalavr pilləsinin materialları əsasında: / pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyası) / – Bakı, 2012. – 147 s.

**Dissertasiyanın avtoreferatı**: Əliyev, R.S. Yeniyetmələrin yenidəntərbiyəsi üzrə işin sistemi: / pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyasının avtoreferatı) / - Bakı, 2003. - 29 s.;

**Elektron resurslar**: Меликов, А. Легенда о любви [Звукозапись] / – Баку, 1994. – CD-ROM. Azərbaycan etnik musiqisi: [Elektron resurs] / tərt. ed. T. Məmmədov və b.; Azərbaycan Respublikası Mədəniyyət və Turizm Nazirliyi. – Bakı, 2006. – DVD+; 13 sm Normativ-hüquqi sənədlər: Azərbaycan Respublikasının Konstitusiyası // 12 noyabr 1995-ci ildə qəbul edilmişdir (24 avqust 2002-ci il tarixdə olan dəyişiklik və əlavələr). – Bakı: Qanun, – 2002, – 48 s.

**Qəzet məqalələri**: Abbasov, A.N. Pedaqoji internatura // Azərbaycan müəllimi. -2020, 22 avqust. – s. 6

**Arxiv materialları**: Xarici İşlər naziri Məhəmməd Həsən Hacınskinin məruzəsi (Gəncə: 15 iyul 1918-ci il) // Azərbaycan Respublikası Dövlət Arxivi, Fond № 1061, siyahı №1, iş № 95, vərəq –1.

Azərbaycan Respublikasının Təhsil İnstitutunun "Elmi əsərlər"inə pedaqogikanın, təhsil, təlim və tərbiyənin, didaktikanın, təhsilin idarə olunmasının müxtəlif məsələləri ilə bağlı məqalə yazan alimlərə, gənc tədqiqatçılara xahişimiz budur ki, istifadə edilmiş ədəbiyyatın siyahısını hazırlayarkən yuxarıda göstərilən qaydalara əməl etsinlər.

*UOT 371*



## PROFESSOR FƏRAHİM SADIQOV – 75

***Akif Nurağa oğlu Abbasov***
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibi*
https://orcid.org/ 0000-0002-9210-714
https://doi.org/10.5281/zenodo.6444842 A

## ÇAĞDAŞ PEDAQOGİKA ELMİNİN VƏ MÜSİQİŞÜNASLIĞIN LƏYAQƏTLİ NÜMAYƏNDƏSİ

***Акиф Нурага оглы Аббасов***
*доктор педагогических наук, профессор, заслуженный учитель*
*ученый секретарь Института Образования Азербайджанской Республики*

## ЗАМЕЧАТЕЛЬНЫЙ ПРЕДСТАВИТЕЛЬ СОВРЕМЕННОЙ ПЕДАГОГИЧЕСКОЙ НАУКИ И МУЗЫКОЛОГИИ

***Akif Nuragha Abbasov***
*doctor of pedagogical sciences, professor, honored teacher*
*scientific secretary at the Institute of Education of the Republic of Azerbaijan*

## A GREAT REPRESENTATIVE OF MODERN PEDAGOGICAL SCIENCE AND MUSICOLOGY

**Xülasə.** Məqalə professor Fərahim Sadıqovun həyat və fəaliyyətinə həsr edilmişdir. Bu il onun 75 illiyi tamam olur. Professorun yaradıcılığı bir neçə istiqamətdə nəzərdən keçirilir. Bir alim, doktorantlara elmi rəhbər kimi, dərslik və tədris proqramları müəllifi kimi onun fəaliyyəti araşdırılır. Əsərlərindən sitatlar verilir, dərsliklərinin, kitablarının adları çəkilir.
***Açar sözlər:*** *Fərahim Sadıqovun yaradıcılığı, etnopedaqogika, musiqi, jurnalist, görkəmli alim*

**Резюме.** Статья посвящена жизни и деятельности профессора Фарахима Садыгова. В этом году ему исполняется 75 лет. Творчество профессора рассматривается в нескольких направлениях. Исследуется его деятельность как ученого, как научного руководителя докторантов, как автора учебников и образовательных программ. Приводятся цитаты из его произведений, упоминаются названия его учебников и книг.

***Ключевые слова:*** *творчество Фарахима Садыгова, этнопедагогика, музыка, журналист, выдающийся ученый.*

**Summary.** He article is devoted to the life and work of Professor Farahim Sadigov. He turns 75 this year. The work of the professor is considered in several directions. His activity as a scientist, as a supervisor of doctoral students, as an author of textbooks and educational programs is being investigated. Quotations from his works are given, the names of his textbooks and books are mentioned.

***Key words:*** *creativity of Farakhim Sadigov, ethnopedagogics, music, journalist, outstanding scientist.*

**Qısa təqdimat**

Bu il çağdaş pedaqogika elminin sayılıb-seçilən, dərin hörmət və nüfuz sahibi, çox önəmli natiqlik qabiliyyətinə malik olan pedaqogika elmləri doktoru, professor Fərahim Balakişi oğlu Sadıqov 75-ci baharını başa vurur.

Pedaqoji ictimaiyyət Fərahim müəllimi çox yaxşı tanıyır. Bir xeyirxah, gözəl xasiyyətli insan kimi, bacarıqlı alim-pedaqoq kimi, yaxşı musiqişünas, yazıçı və dramaturq, ensiklopedik bilikli müəllim, Vətənini və xalqını dünyalar qədər sevən şəxs və nəhayət, respublikamızda təhsil qurucusu kimi.

**Uşaqlıq və ilk gənclik illəri**

Dostumuz əslən Masallı rayonundandır. El ağsaqqalı Balakişi kişinin, Əfruz xanımın Abutalıbdan sonrakı övladıdır. Bədii ədəbiyyatın, hikmətli sözün, məntiqli deyilişin vurğunu olan Fərahim 1965-ci ildə Masallı şəhər Nəriman Nərimanov adına 2 nömrəli orta məktəbi başa vurandan sonra sənədlərini Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (*hazırda ADPU*) filologiya fakültəsinə verib və bu institutdakı təhsilini 1969-cu ildə bitirib doğma Masallıya qayıdıb. Əvvəlcə rayonun Sərçuvar kənd, sonradan şəhər 4 nömrəli məktəbində sevib-sevdiyi müəllimlik peşəsi ilə məşğul olub.

İndiki kimi yadındadır. Şagirdlər onun nitqinə heyran idilər. Ədəbiyyat dərsinin olacağı günü səbirsizliklə gözləyirdilər. Fərahim müəllim onları xalqımızın yüz illər ərzində sevə-sevə yaratdığı şifahi xalq yaradıcılığı nümunələri ilə tanış edir, məktəblilər də dastanlarımızın, nağıllarımızın, əsatir və rəvayətlərimizin qəhrəmanları ilə çiyin-çiyinə addımlayaraq xəyalən şər qüvvələrə qarşı vuruşur, xeyirxah işlər görür, kasıba əl tuturdular. Fərahim müəllim elə şirin, elə aydın və mənimsənilməsi güccətan qaydada söhbətini, nitqini qurur, nümunələr gətirirdi ki, anlaşılmayan, qaranlıq qalan bir məsələ qalmırdı. Dərsdən dərsə Nizami, Füzuli, Nəsimi, Xətai, Vaqif, Sabir, Mirzə Cəlil, Nəriman Nərimanov, Cəfər Cabbarlı, Mikayıl Müşfiq, Səməd Vurğun, Bəxtiyar Vahabzadə, Mirzə İbrahimov, Süleyman Rəhimov, Rəsul Rza və başqalarının həyat və yaradıcılığı, ədəbiyyatımızın inkişafında onları rolu şagirdlərə tam aydın olurdu.

Fərahim müəllim tez bir zamanda nəzəri və metodik hazırlığa malik usta müəllim kimi həm Masallıda, həm də respublikada tanındı. Qərara alındı ki, o, bir məktəb çərçivəsində qapanıb qala bilməz. Öz zəngin iş təcrübəsini yaymalı, o biri müəllimlərə də öyrətməlidir. Odur ki, onu rayon Maarif (təhsil) Şöbəsinə metodist vəzifəsinə gətirdilər.

Düzgün qərar idi. Bu qərardan tez bir zamanda rayonun digər məktəbləri, ədəbiyyat müəllimləri də faydalandılar.

**Elmin yolları, çətin və əzablıdır**

Bu barədə Fərahim müəllim eşitmişdi. Lakin elm işlə məşğul olmaq onun böyük arzusuna və zəruri tələbatına çevrildi. Bu elə ülvi arzu idi ki, bəlkə də “Elm Çində də olsa, onun dalınca gedəsi” (Məhəmməd peyğəmbər) idi. Allah üzünə baxdı. Çox da uzağa getmədi. 1975-ci il idi. Bakıya yola düşdü. Azərbaycan Elmi-Tədqiqat Pedaqogika İnstitutunda (hazırda Azərbaycan Respublikasının Təhsil İnstitutu) yeni yaradılmış Tərbiyənin ümumi problemləri şöbəsini formalaşdırmaq üçün müsabiqə elan olunmuşdu. Fərahim müəllim müsabiqədə iştirak etmək üçün sənədlərini təqdim etdi və müsabiqədən keçdi.

O zamanlar mən də Sabirabad rayonunun Şıxsalahlı və Qaragüney kənd məktəblərində ingilis dili müəllimi işləyirdim və elmi işlə məşğul olmaq böyük arzum idi. Mən də sənədlərimi

həmin şöbəyə təqdim etmişdim. İşə götürüldüm. Bizim tanışlığımız belə başlandı. Kiçik elmi işçi vəzifəsini tuturduq. Hazırda hər ikimiz elmlər doktoru, professoruq.

**Elmin enişli, yoxuşlu yollarında qazanılan uğurlar**

Fərahim müəllim hələ Masallıda orta məktəbdə oxuduğu illərdə eyni zamanda musiqi məktəbində də təhsil alırdı. Musiqi qabiliyyəti böyük idi, bir çox musiqi alətlərində, xüsusən də qarmonda çox yaxşı ifa etməyi öyrənmişdi. Bu sahədə özündən böyük qardaşı Abutalıbın rolu böyük idi. Abutalıb respublikada mahir qarmonçu, qarmon ustası kimi məşhur idi.

Musiqiyə bağlılıq Fərahim müəllimin elmi tədqiqatlarının seçiminə də öz təsirini göstərirdi. Onun tədqiqatları estetik tərbiyə, şagirdlərsə bədii-estetik qabiliyyətlərin inkişaf etdirilməsi və s. problemlərə həsr olunurdu. Hətta qarmonçalmanın və nağaraçalmanın əsaslarına dair kitabları da çap olunmuşdu.

Dissertasiya mövzusu götürdü. Tədqiqatlarının səmərəliliyinə nail olmaq üçün Moskvada V.İ. Lenin adına Dövlət Kitabxanasında, M.F. Axundov adına Azərbaycan Dövlət Kitabxanasında araşdırdığı problem üzrə ədəbiyyatı, dissertasiyaları diqqətlə öyrəndi. Hansı məsələlərin tədqiq olunduğunu, hansıların araşdırmalara ehtiyac duyulduğunu bildi. Boşluqları doldurmaq üçün elmi-nəzəri və praktik dəyərə malik bir dissertasiya meydana gətirdi. Elmi işinin təcrübi məsələlərini təkmilləşdirmək, pedaqoji kollektivlərə metodik kömək göstərmək üçün respublikamızın məktəblərini birər-birər gəzdi, iş təcrübəsini – müsbət və çatışmayan cəhətləri öyrəndi.

1984-cü ildə Gürcüstan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunda "Məktəb bədii özfəaliyyət dərnəklərinin təşkili formaları" mövzusunda namizədlik, 1992-ci ildə isə, "Uşaqların bədii yaradıcılıq qabiliyyətlərinin formalaşdırılması işinin elmi-pedaqoji əsasları" mövzusunda doktorluq dissertasiyaları müdafiə etdi. Elmlər doktoru elmi dərəcəsinə və bir müddət sonra professor elmi adına layiq görüldü.

Professor F.B. Sadıqov eyni zamanda Beynəlxalq Türk Akademiyasının həqiqi üzvüdür.

**"Təhsil xəzinədir, əmək onun açarı"**

Fərahim müəllim çox yaxşı bilirdi ki, "*Təhsil xəzinədir, əmək onun açarı*" (S.Ə. Şirvani). Bu həqiqətin işığında böyük əmək, zəhmət hesabına özəl ali məktəb açdı. XX əsrin sonlarında – 90-cı illərində SSRİ dağılandan sonra ölkəmizdə bazar iqtisadiyyatının tələblərinə əsasən, özəl, qeyri-hökumət təşkilatları və müəssisələrinin yaradılmasına və inkişaf etdirilməsinə icazə verildi. Fərahim müəllim özəl ali təhsil müəssisəsinə "Naxçıvan Universiteti" adını verdi, özü də təsisçi və rektor kimi müxtəlif peşələr, ixtisaslar üzrə kadr hazırlığını həyata keçirməyə başladı. Bu universitetdə ibtidai sinif müəllimliyi, məktəbəqədər müəssisələr üçün tərbiyəçi, hüquqşünas, iqtisadçı və b. sahələr üzrə hazırlanmış mütəxəssislər hazırda respublikamızın müxtəlif bölgələrində uğurla fəaliyyət göstərirlər.

Professor Fərahim Sadıqov "Naxçıvan Universiteti"nə 1992-2001-ci illərdə rəhbərlik etdi. Bu qeyri-hökumət təşkilatı – universitet bağlandı. Fərahim müəllim daha sonra (2002-2007-ci illərdə) özəl Azərbaycan Universitetinin prorektoru və rektoru oldu.

İllər ötüb keçdi. Təhsil sistemində, idarəetmə məsələlərində yeniliklər oldu. Fərahim müəllim 2005-ci ildən Bakı Elm və Təhsil Mərkəzinin prezidenti seçildi. İndi həm də Bakı Biznes Universitetinin professorudur. Pedaqogika elminin və təhsilimizin inkişaf etdirilməsi yolunda sidq ürəklə çalışır.

**Musiqi dünyamızda yeri, rolu olan professor**

Dedik ki, Fərahim müəllim musiqinin də vurğunudur. Nəinki muğamlarımızı, xalq mahnılarını və təsnifləri, bəstəkar mahnılarını, aşıq musiqisini sevir, onlara valehdir. Həm də musiqi dünyamızda özünün də yeri və rolu vardır. Piano, tar, nağara, qarmonla sirdaş olub. Fəqət mehrini daha çox qarmona salıb. Azərbaycan Dövlət Pedaqoji İnstitutda təhsil alarkən bədii özfəaliyyət ansamblına rəhbərlik edib. Eyni zamanda ətrafa qarmonundan yayılan xoş, ürəkoxşayan musiqi, oyun havaları eşidilib, rəqslər könülləri oxşayıb.

Rəhbərlik etdiyi ansambl yalnız ölkəmizdə deyil, onun hüdudlarından kənarda da məşhurlaşıb. O, 1980-ci ildə Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunda çalışmaqla yanaşı Bakıdakı 8 nömrəli musiqi təmayüllü internat məktəbinin (hazırda Azərbaycan Milli Konservatoriyası nəzdində Musiqi gimnaziyası) Xalq çalğı alətləri şöbəsinin müdiri vəzifəsində işləyib.

Fərahim müəllim özü bir çox rəqslərin yaradıcısı, müəllifidr. Onlardan "İstəkanın sarısı", "Yara qurban olum", "Lirik rəqs", "Məzəli rəqs", "Masallı", "Təbrizi", "Miyanə", "Tello", "Rahimi" və s. nümunə gətirə bilərik.

Professorun ifasında dörd musiqi nömrəsi respublika radiosunun qızıl fondunda saxlanmaqdadır.

İndi də arada dostlar bir yerə yığışanda Fərahim müəllim xahişimizi nəzərə alaraq qarmonu sinəsinə çıxır, onu dilləndirir. Özü də necə! Yalnız "Afərin!" deyirsən, heyran qalırsan.

**Televiziyada aparıcılıq missiyası**

Təhsilimizin, musiqimizin, muğamlarımızın bu və ya digər problemlərinə aid radio və televiziyada Fərahim müəllimin çoxsaylı çıxışları olmuşdur. Fəqət onun aparıcılıq fəaliyyəti daha yaddaqalan və önəmlidir.

Professorun aparıcısı olduğu veriliş "Örnək" idi. Burada "Muğam dəstgahları və onların tərbiyəvi əhəmiyyətləri" adlı silsiləli verilişləri diqqətə çatdırılırdı.

**Dərslikləri, monoqrafiyaları, kitabları və məqalələri**

Professor Fərahim Sadıqov 100-dən çox monoqrafiya, dərslik və kitabın, tədris proqramının, 500-dən çox elmi məqalənin müəllifidir. Dərslik və dərs vəsaitlərinə "Pedaqogika", "Korreksiya pedaqogikası", "Müqayisəli pedaqogika", "Ali məktəb pedaqogikası", "Ümumi pedaqogika" , "Ana dili" (III sinif), "Oxu" (zəif eşidən uşaqlar üçün, III sinif, prof. A.N. Abbasovla), "Pedaqogika tarixi" (prof. Ə.Ş. Həşimovla), "Qarmon ifaçılığında muğam", "Tərbiyəşünaslıq" (O. Həsənli ilə), "Azərbaycan dili və nitq mədəniyyəti" və s. aid etmək mümkündür.

O, "Uşaqların bədii yaradıcılıq qabiliyyətlərinin formalaşdırılması işinin elmi-pedaqoji əsasları", "Azərbaycan muğamları şagirdlərin vətənpərvərlik tərbiyəsi məktəbidir" (Q. Abdulla və Q. Məmmədova ilə) və s. bu kimi monoqrafiya və kitablar yazmışdır.

**Jurnalistlik fəaliyyəti.**

Fərahim müəllim müəllimlik fəaliyyətinə başladığı ilk illərdən (*bəlkə də bu illərdən daha tez*) Masallıda çıxan "Çağırış" qəzetində, bir çox respublika qəzet ("Azərbaycan müəllimi", "Azərbaycan gəncləri", "Təhsil problemləri" və s.) və jurnallarında ("Azərbaycan məktəbi", "Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri və s.) təhsilimizin, təlim və tərbiyə prosesinin, o cümlədən estetik tərbiyə, bədii yaradıcılıq qabiliyyətlərinin formalaşdırılması və s. bu kimi problemlərə dair çoxlu məqalələr çap etdirmişdir.

Bundan başqa, bir müddət əvvəl "Milli pedaqogika" jurnalının baş redaktoru olmuş, hazırda isə, "Pedaqogika" jurnalının baş redaktorudur. Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyası bu jurnalı da dissertasiyalarının nəticələrinin çap etdirilməsi ilə bağlı nəzərdə tutulan jurnallar siyahısına daxil etmişdir.

"Pedaqogika" jurnalında əsasən pedaqogika, psixologiya, fənlərin tədrisi metodikası, filologiya üzrə məqalələr işıq üzü görür. Jurnalın ildə 4 nömrəsi çıxır.

**Bədii yaradıcılığı**

Fərahim müəllim eyni zamanda, qeyd etdiyimiz kimi, müxtəlif məzmunlu ssenariləri, pyesləri və başqa bədii yaradıcılıq nümunələrini işləyib hazırlamış və nəşrinə nail olmuşdur. "Masallı folkloru"nu, bir sıra hekayələri və 5 dram əsərini qeyd edə bilərik.

**Doktorant və dissertantlara elmi rəhbərlik sahəsində uğurları**

Fərahim müəllimin elmi rəhbərliyi ilə 30 nəfər elmlər doktoru və fəlsəfə doktoru yetişmişdir. Yetirmələrindən mərhum Oruc Qafar oğlu Həsənli pedaqogika elmləri doktoru, professor, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, Naxçıvan Ali Məclisinin üzvü və Naxçıvan Müəllimlər İnstitutunun rektoru idi.

50-yə yaxın iddiaçının dissertasiyasının müdafiəsi zamanı professor F.B. Sadıqov rəsmi opponent kimi çıxış etmiş, onların yetişməsinə öz töhfəsini vermişdir.

Prof. F.B. Sadıqov eyni zamanda müxtəlif illərdə pedaqoji elmlər üzrə Azərbaycan Respublikasının Təhsil İnstitutunda, Naxçıvan Dövlət Universitetində və Azərbaycan Dövlət Pedaqoji Universitetdə fəaliyyət göstərən dissertasiya şuralarında üzv olmuş, gənc tədqiqatçılara dəstək durmuşdur.

Bundan başqa, bir müddət Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasında ekspert şurasının üzvi kimi fəaliyyət göstərmişdir.

**Əsərlərindən parçalar**

* Azərbaycanda pedaqoji fikrin görkəmli nümayəndələri çoxdur. Onları bir ordu şəklində

təsəvvür etsək, onda ən azı Məhəmməd peyğəmbərdən ulu Nizamiyədək, Nizami Gəncəvidən də hazırda fəaliyyət göstərən tanınmış pedaqoji elmlər doktorlarına qədər yüzlərlə şəxsiyyətin adını çəkmək və xidmətlərini qeyd etmək lazım gələr.

∗ Deviant davranış – sosial neqativ davranış olduğu üçün onun qarşısının alınması (profilaktikası) ilə, deviantlıq problemlərinin aradan qaldırılması ilə pedaqogikanın bir sahəsi olan preverentiv pedaqogika da məşğulolur. Preverentiv pedaqogika – (latınca *praeventus* – "*qarşısını alan", "qabaqcadan qoruyan*") – insanın yayınan (*deviant və delinkvent*) davranışının formalaşması səbəblərini və onun qarşısının alınması, aradan qaldırılması və düzəldilməsi pedaqogikasıdır. Ona görə də "Korreksion pedaqogika"nın bir bölməsini həm də *"Preverentiv pedaqogika" h*esab edirlər.

∗ Qüsurlu uşaqların reabilitasiyasını onların gələcək uğurlarının yaranmasına səbəb olmaq kimi başa düşmək lazımdır. Tam reabilitasiya keçmiş belə uşaqlar yeniyetməlik dövrlərindəki ciddi məşqlər hesabına onlarda idmana sonsuz məhəbbət yaranır. Bu gün dünyanın inkişaf etmiş ölkələrində belə uşaqlar idman bölmələrində böyük nailiyyətlər qazanırlar. Onlar ölkə, Avropa, dünya və olimpiya çempionları kimi idman tarixinin qızıl səhifələrini yazırlar. Əlillərin futbol, voleybol, sərbəst güləş, Yunan-Roma güləşi, sambo, dzyudo yarışları onlara dünya şöhrəti qazandırır. Tiflopedaqogikanın canlı əfsanəsi İlham Zəkiyevin ölkə, Avropa, dünya və olimpiya çempionu kimi qazandığı titulları buna parlaq misaldır.

∗ Azərbaycanda vüsət alan elmi pedaqogikanın didaktika (təlim və təhsil nəzəriyyəsi), tərbiyə nəzəriyyəsi, məktəbşünaslıq, ali məktəbdə pedaqoji prosesə xidmət kimi bölmələri bir sıra səriştəli tədqiqatçı pedaqoqlar (Fərahim Sadıqov, Akif Abbasov, Əmrulla Paşayev, Fərrux Rüstəmov, Ağahüseyn Həsənov, Rəfiqə Mustafayeva, Nübar Muxtarova, Sürəyya Əliyeva, Sərdar Quliyev, Hikmət Əlizadə, Fikrət Seyidov, Balaş Abbaszadə, Vidadi Xəlilov, Oqtay Rəcəbov, Mircəfər Həsənov və b.) tərəfindən təkmilləşdirilir.

∗ Azərbaycanda yaranan milli pedaqogika öz milli və ümumbəşəri dəyərlərə əsaslanan məzmunu və strukturu ilə diqqəti cəlb edir. Milli pedaqogikadakı pedaqoji elm və pedaqoji proses, pedaqoji elmin kateqoriyaları, ziddiyyətləri, qanunauyğunluqları və digər struktur bölmələri milli və bəşəri ideyaları özündə əks etdirmək baxımından diqqəti cəlb edir.

∗ Son ədəbiyyatlarda pedaqoji elmin başlıca kateqoriyalarından biri olan təhsilin bilik, bacarıq, vərdişlər sistemini əhatə etməsi, müvafiq tədris müəssisələrində müəyyən müddətdə həyata keçirilməsi, təlimlə üzvü surətdə əlaqədə olması, tərbiyə və inkişaf imkanlarını özündə ehtiva etməsi öz əksini tapır.

**Təltifləri**

Təhsil və elm sahəsində səmərəli fəaliyyəti nəticəsində Fərahim müəllim "Akademik Yusif Məmmədəliyev mükafatı" laureatı və "Qabaqcıl maarif xadimi" adına layiq görülmüş, "Musiqi mükafatı" almışdır.

O, 1996-ci ildən Amerika Birləşmiş Ştatların Knoksvel ştatının fəxri vətəndaşı; 2001-ci ildə Beynəlxalq Lütfi-Zadə Asossasiyasının Elmi Şurasına üzv seçilmişdir.

**Sədaqətli dost, yaxşı yoldaş**

Fərahim müəllimin tədqiqatlarının bir istiqaməti də etnopedaqogikadır. Xalq yaradıcılıq nümunələrini təhsilin, tərbiyənin və inkişafın mühüm vasitələri kimi nəzərdən keçirir. Ona görə də Fərahim müəllim nə zamandır birisi ilə dostluq, yoldaşlıq edəndə atalarımızın sözlərini, məsəllərini qulaqlarında sırğa edir: "Dost qazan, düşməni nənəm də doğar", "Dost dost ilə tən gərək, Tən olmasa gen gərək", "Dost min isə azdır, düşmən bir isə çoxdur" və s.

Odur ki, o, dostluqda son dərəcə etibarlıdır, dosta, yoldaşa böyük dəyər verir. Nəinki dostları, habelə ehtiyacı olanlar onun üstünə gələndə, qapısını döyəndə onları naümid geri qaytarmayıb. Həmişə dostlara, yoldaşlara dayaq durub. Bu gözəl insanla dostluq edənlər özlərini xoşbəxt, bəxtiyar hesab edirlər.

Fərahim müəllim muğamlarımızın mahir bilicisidir. Muğamların hər birinin incəliklərinə bələddir. Onun "Azərbaycan muğamları" monoqrafiyası nəşr olunub. Hazırda həmin monoqrafiyadan incəsənət təmayüllü universitet və kolleclərdə, orta ixtisas məktəblərində dərslik kimi istifadə olunur.

Fərahim müəllim respublika televiziyasında muğamlarla bağlı bir neçə verilişi aparıb, yaxud verilişə cəlb olunub. Mən onların bir neçə-

sinə baxmış və heyran qalmışam. Bir verilişdə muğam ustaları, məşhur tarzən də vardı. Fərahim müəllim muğamların yaranması və inkişafı tarixindən, təşəkkül tapıb formalaşması məsələlərindən, muğamların hissi-emosional, psixoloji təsir xüsusiyyətlərindən elə ustalıqla, elə aydın, məntiqli, elə şirin danışırdı ki, həmin muğam ustaları da mat-məəttəl qalmışdılar. Hətta Fərahim müəllimə suallar verir, nəyi isə öyrənmək istəyirdilər. Onda mən özümdən asılı olmayaraq ucadan səsləndim: “Halal olsun sənə, əziz dost”

Professor öz əsərlərində muğamların şagird şəxsiyyətinin, mənəvi zənginliyinin formalaşmasında, əxlaqının saflaşdırılmasında, ünsiyyət mədəniyyətinin təşəkkülündə böyük rol oynadığını diqqət mərkəzinə gətirməklə bu məsələyə gfikir verilməsini məqsədəuyğun sayır.

**“Oğul arxadırsa, qız yaraşıqdır”**

Fərahim müəllim gözəl ailə başçısıdır. 3 övlad atasıdır. Oğlu Rahim – iqtisad üzrə fəlsəfə doktoru, Təranə – biologiya üzrə fəlsəfə doktorudur. Rasim zabitdir.

Həyat yoldaşı Suriyə xanım Fərahim müəllimin qrup yoldaşıdır, dostu, dayağıdır. Bir yerdə Pedaqoji Universitetdə filologiya fakültəsində təhsil almış, ailə qurmuşlar. Fərahim müəllimlə Suriyə xanımın kamil tərbiyəsi sahəsində gözəl, cəmiyyətimizə layiq, vətənsevər övladlar yetişmişdir. Təbii ki, bu nümunəvi bir ailənin göstəricisidir. İndi Fərahim müəllimin neçə-neçə nəvəsi, hətta nəticəsi var. Burada deyirlər ki, tez evlənənlə, yuxudan tez duran uduzmaq.

Gözəl dostumuz, pedaqogika elmi sahəsində öz sözünü demiş, pedaqoji ictimaiyyətin hörmətini və nüfuzunu qazanmış pedaqogika elmləri doktoru, professor Fərahim Balakişi oğlu Sadıqov 75 yaşına çatdı. Əslində ona bu yaşı heç vermək olur. Fərahim müəllim həyatsevər, çevik, gümrah, zarafatcıl, söhbətçil, mütaliəni sevən, xoş auralı, şən, nikbin və xoşbəxt bir insandır. Necə deyərlər, min oğula dəyər! Bu bizi sevindirir! Həmişə onu belə əhval-ruhiyyədə, sağam və nikbin görmək arzusu ilə ondan ayrılaraq deyirik: Əziz professor, təki bəzi insanlar da səndən ibrət götürə, xeyirxahlığı özlərinə borc bilələr, tolerant olalar! Şəxsiyyətlərarası münasibətləri uğurlu qurmağı bacaralar!

**75 YAŞIN MÜBARƏK!!!**

**Problemin aktuallığı**. Professor Fərahim Sadıqovun 75 illiyi tamam olur.

**Problemin yeniliyi.** Professor Fərahim Sadıqovun 75 illiyi diqqətə çatdırılır.

**Problemin praktik əhəmiyyəti.** Məqalə doktorantlar və gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. https://www.au.edu.az/az/news/ferahim-muellimi-dogum-gunu-munasibeti-ile-tebrik-edirik

**E-mail:** prof.akif@mail.ru

**Rəyçilər:** *ped.elm.dok. prof.* **H.H. Əhmədov,**
*ped.elm.dok., prof.* **İ.H. Cəbrayılov**
**Redaksiyaya daxil olub:** 31.11.2022.

*UOT 371*



***Akif Nurağa oğlu Abbasov***
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibi*
https://orcid.org/ 0000-0002-9210-714
https://doi.org/10.5281/zenodo.6444842 A

## PROFESSOR VİDADİ XƏLİLOV DÜNYASI

***Акиф Нурага оглы Аббасов***
*доктор педагогических наук, профессор, заслуженный учитель,*
*ученый секретарь Института Образования Азербайджанской Республики*

## МИР ПРОФЕССОРА ВИДАДИ ХАЛИЛОВА

***Akif Nuragha Abbasov***
*doctor of pedagogical sciences, professor, honored teacher*
*scientific secretary at the Institute of Education of the Republic of Azerbaijan*

## PROFESSOR VIDADY KHALILOV'S WORLD

**Xülasə.** Məqalə professor Vidadi Xəlilovun həyat və fəaliyyətinə həsr edilmişdir. Bu il onun 80 illiyi tamam olur. Professorun yaradıcılığı bir neçə istiqamətdə nəzərdən keçirilir. Bir alim, doktorantlara elmi rəhbər kimi, dərslik və tədris proqramları müəllifi kimi onun fəaliyyəti araşdırılır. Əsərlərindən sitatlar verilir, dərsliklərinin, kitablarının adları çəkilir.
***Açar sözlər**: Vidadi Xəlilov yaradıcılığı, estetik tərbiyə, pedaqoji texnologiyalar, estetik tərbiyə probleminin tədqiqatçısı, görkəmli alim*

**Резюме.** Статья посвящена жизни и деятельности профессора Видади Халилова. В этом году ему исполняется 80 лет. Творчество профессора рассматривается в нескольких направлениях. Исследуется его деятельность как ученого, как научного руководителя докторантов, как автора учебников и образовательных программ. Приводятся цитаты из его произведений, упоминаются названия его учебников и книг.
***Ключевые слова:** творчество Видади Халилова, эстетическое воспитание, педагогические технологии, исследователь проблемы эстетического воспитания, выдающийся ученый*

**Summary.** The article is devoted to the life and work of Professor Vidadi Khalilov. This year he turns 80 years old. The work of the professor is considered in several directions. His activity as a scientist, as a supervisor of doctoral students, as an author of textbooks and educational programs is being investigated. Quotations from his works are given, the names of his textbooks and books are mentioned.

***Key words:*** *Vidadi Khalilov' creativity, aesthetic upbringing, pedagogical technologies, researcher of the problem of aesthetic upbringing, outstanding scientist*

**Ön söz əvəzi**

Kiçik yaşlarında bir də görürsən ki, uşaqdan soruşurlar:

– Atanı, ananı nə qədər istəyirsən?

O da qollarını yanlara geniş açaraq, sevinclə:

– Bax, bu boyda!!! – deyir.

Valideyn də öz növbəsində:

– Mən də səni dünyalar qədər istəyirəm!

Hərənin öz dünyası var. Kimisinin kiçik, kimisinin böyük, kimisinin daha böyük. Bu mənada Vidadi Xəlilov dünyası da önəmlidir, geniş idi, geniş olaraq qalır. Fəqət arzuları bu gen dünyaya sığmayıb. Uğur qazanmaq, mənalı yaşamaq, yazıb-yaratmaq üçün. Xeyirxahlıq göstərmək, kömək, yardım əlini uzatmaq üçün.

Bu yolda gecəsini gündüzünə qatıb, yuxusuz gecələr, narahat gündüzlər keçirib. Rahatlığını itirsə də, əziyyət çəksə də xoş məramlı əməllərindən qalmayıb, uğurları da bol olub. Bu onu yaşadıb, qanadlandırıb, sevindirib, fərəhləndirib. Günləri, həftələri, ayları, illəri, on illəri yola salıb gəlib çatıb səksən yaşına!

**İllərə nə var ki, illər tələsmir**

Vidadi Xəlilov 1942-ci il dekabrın 25-də Cəbrayıl rayonunun Çərəkən kəndində anadan olub. Uşaqlıqda, orta məktəb və tələbəlik illərində adama elə gəlir ki, günlər keçmək bilmir. Müəyyən vaxt ötdükdən, yaşa dolduqdan sonra isə görürsən ki, illər sanki tələsir, vaxt çatdıra bilmirsən, bu günün işini sabaha qoyursan. Atalar isə deyib: "Bu günün işini sabaha qoyma!" Necə qoymayasan? Çatdırmaq olmur axı.

Başqa uşaqlar kimi, Vidadi də balaca olanda məktəbə getməyə tələsirdi. Bəziləri tələssə də, məktəbə getdikdən bir müddət sonra həvəsləri sönür. Bunun müxtəlif səbəbləri var. Vidadi isə həvəslə, dərin maraqla ümumi təhsilinə davam edir, amma bu qənaətdə idi ki, yenə tələsir. 1959-cu ildə orta təhsili başa vurub ali məktəbə getmək üçün tələsirdi.

Nəhayət, ibtidai təhsilin pedaqogikası və metodikası ixtisası üzrə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna qəbul olundu. Yaxşı müəllim olmaq üçün cani-dildən çalışır, mühazirə və seminar məşğələlərinə hazırlaşır, imtahanlardan yaxşı və əla qiymətlər almağa səy göstərirdi. Yenə tələsirdi. İllər isə tələsmək bilmirdi. Bu dəfə müəllim olmaq, əlinə jurnal alıb sinif otağına girmək üçün tələsirdi. Səbri çatmadı. Ali təhsil ala-ala Bakı şəhərinin 7 və 132 nömrəli məktəblərində bədii rəhbər və musiqi müəllimi vəzifəsində işləməyə başladı (1963).

1964-cü il. Vidadi ali təhsilini də başa vurmuşdu. Müəllimlik peşəsi, ixtisası ilə yanaşı onda elmi işə maraq oyanmışdı. Arzularının qanadında o zamankı Azərbaycan Dövlət Elmi-Tədqiqat Pedaqogika İnstitutuna (hazırda Azərbaycan Respublikasının Təhsil İnstitutu) gəldi, sənədlərini aspiranturaya (hazırda doktorantura) verdi və aspirantların cərgəsinə qoşuldu. 1971-ci ildə aspirantura təhsilini uğurla tamamladı. Artıq dissertasiyasını yazıb tamamlamışdı.

Mən 1975-ci ildə müsabiqə yolu ilə bu institutda Tərbiyənin ümumi problemləri şöbəsində kiçik elmi işçi kimi fəaliyyətə başlayanda Vidadi Xəlilovla tanış oldum. O, artıq dissertasiya müdafiə edib, pedaqoji elmlər namizədi elmi dərəcəsi almışdı.

**Xoş simalı insan**

Bəzi adamların sifətindən zəhrimar yağır. Vidadi müəllimi həmişə şən, xoş simalı, nikbin ovqatlı, gülərüzlü, səmimi... görmüşəm. Öz sözü, öz fikri olan insan və alim idi, indi də belədir. Auditoriyada, televiziyada çıxış edəndə də, insanlarla qarşılıqlı münasibətlərdə də sifətində xoş təbəssüm olur. Bu, onu insanlara sevdirir, onunla səmimi, açıq söhbət etməyə ruhlandırır. Vidadi müəllim xeyirxah adamdır, insanlara yaxşılıq etməkdən, onlara kömək əlini uzatmaqdan hədsiz zövq alır. Ali təhsil müəssisələrində dərs dediyi tələblərlə, elmi rəhbəri olduğu doktorant və dissertantlara münasibətdə səmimidir, onlara hörmət və nəzakətlə yanaşır, nüfuzlarını gözləyir, qayğıları ilə maraqlanır. Şəxsiyyətlərarası münasibətlərdə, həmkarları ilə ünsiyyətdə tolerant olmağa çalışır. İntolerantlığı xoşlamır.

Vidadi müəllimin tədqiqatları əsasən ümumtəhsil məktəbi şagirdlərinin estetik tərbiyəsi problemləri ilə bağlıdır. Onun doktorant və dissertantlarının əksəriyyəti də böyüməkdə olan nəslin estetik tərbiyəsi məsələləri üzrə tədqiqatlar aparmışlar. Bir estetik kimi Vidadi müəllim oturuşuna-duruşuna, geyiminə xüsusi diqqət yetirir. Geyim estetikasının tələblərinə ciddi əməl edir, bir çoxları da ondan nümunə götürür.

**Elm yollarında inamlı addımlar**

Vidadi Xəlilovun namizədlik dissertasiyası "İbtidai siniflərdə Azərbaycan xalq yaradıcılıq nümunələrinin öyrədilməsi estetik tərbiyə vasitəsi kimi" mövzusunda idi. 1975-ci ildə professor Bayram Hüseynlinin elmi rəhbərliyi ilə müdafiə etmişdi. Məktəbəqədər və ibtidai təhsil şöbəsində elmi işçi, aparıcı elmi işçi vəzifələrində işlədi. Estetik tərbiyə şöbəsinin, sonralar isə, əvvəlcə İbtidai təhsil şöbəsinin, bir müddət keçmiş Məktəbəqədər və ibtidai təhsil şöbənin müdiri oldu. Hazırda o, institutun böyük elmi məsləhətçisidir.

Professor 23 il Estetik tərbiyə şöbəsinə rəhbərlik etmişdir. Fəaliyyəti dövründə müdiri olduğu şöbə keçmiş SSRİ Pedaqoji Elmlər Akademiyası və onun sahə institutları, həmçinin Ukrayna, Belarusiya, Latviya, Özbəkistan, Türkmənistan, Qırğızıstan, Gürcüstan, Moldova və digər respublikaların Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutları ilə əlaqələr qurdu. Bunlar şöbənin səmərəli fəaliyyətinə müstəsna dərəcədə böyük təsir göstərmişdi.

V.C. Xəlilov doktorluq dissertasiyasını 1994-cü ildə müdafiə etdi. Dissertasiya "Azərbaycan ümumtəhsil məktəblərində estetik tərbiyənin nəzəriyyəsi və təcrübəsi" adlanırdı. Xüsusən həmin zamanlarda (təxminən 30 il əvvəl) dissertasiyanın mövzusu son dərəcə aktual, işlənmə səviyyəsi yüksək idi.

Dissertasiyada estetik tərbiyənin sosial funksiyasının artması və müasir ümumtəhsil məktəblərində nəzərə alınması məsələləri; Azərbaycan mütəfəkkirlərinin estetik sərvətlər, estetik mədəniyyət haqqında fikirləri şagirdlərin estetik tərbiyəsinin vasitəsi kimi; estetik tərbiyənin mahiyyəti, vəzifələri prinsipləri, vasitə və yolları; təlim prosesində, sinifdənxaric məktəbdənkənar tədbirlərdə şagirdlərin estetik tərbiyəsinin formaları, yolları, estetik tərbiyənin səmərəliliyini artıran başlıca tələblər; mühit, şərait və geyim mədəniyyəti vasitəsilə şagirdlərin estetik zövqünün formalaşdırılması imkanları və yolları və s. bu kimi məsələlər diqqət mərkəzinə gətirilirdi.

Dissertasiyanın müdafiəsi müvəffəqiyyətlə keçdi, tanınmış sahə mütəxəssisi tərəfindən yüksək qiymətləndirildi və tezliklə təsdiq olundu. Bir müddət sonra, 1997-ci ildə səmərəli elmi fəaliyyəti nəzərə alınaraq ona professor elmi adı da verildi.

Vidadi Xəlilov, eyni zamanda, Rusiya Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvüdür.

**Elmi rəhbərlik**

Professor Vidadi Xəlilov elmi kadrların hazırlanmasında mühüm rol oynamışdır və oynamaqdadır. Onun elmi rəhbərliyi ilə 16 nəfər elmlər namizədi (fəlsəfə doktoru) yetişmişdir. Eyni zamanda, fəlsəfə doktoru və elmlər doktoru dissertasiyalarının müdafiəsi ilə bağlı 25 nəfər iddiaçıya rəsmi opponentlik etmişdir.

Yetirmələrindən Əməkdar incəsənət xadimi, professor Nazim Kazımov hazırda Azərbaycan Milli Konservatoriyasının nəzdindəki Bakı Musiqi Kollecinin direktorudur. Səmərəli fəaliyyəti, diqqəti çəkən uğurları ilə tanınır.

**Monoqrafiya, dərslik, kitab, məqalə və tədris proqramları müəllifi**

Vidadi Xəlilov bir sıra monoqrafiyalar qələmə almışdır. Həmin monoqrafiyalar, kitablar, elmi məqalələri professorun "Nərgiz" nəşriyyatında nəşr olunmuş 10 cildlik "Seçilmiş əsərləri"ndə özünə yer almışdır. Onlardan **"**Ümumtəhsil məktəblərində estetik tərbiyənin inkişaf yolları", "Muğamların tədrisinə dair metodik tövsiyələr", "Ustanın pedaqoji mədəniyyəti, "Müəllimin estetik mədəniyyətinin yüksəldilməsi istiqamətləri", "Tələbələrin fəallıq mədəniyyəti", "Məktəbli mədəniyyəti", "Televizor və uşaqlar", "Məktəblinin etik-estetik aləmi" və s. nümunə göstərmək mümkündür.

Professor V.C. Xəlilov pedaqogikanın müxtəlif məsələlərinə, estetikaya, estetik tərbiyə və təsviri incəsənət məsələlərinə həsr olunmuş 50-yə yaxın monoqrafiya, dərslik, kitab və tədris proqramlarının, 200-dən artıq elmi məqalənin müəllifidir. Məqalələri məktəblilərin estetik mədəniyyətinin inkişafı, musiqi təhsilinin, musiqi ifaçılığının və musiqi mədəniyyətinin inkişafı, ifaçılıq mədəniyyəti, ədəbiyyat və təsviri incəsənət vasitəsi ilə estetik tərbiyə imkanları və s. bu kimi məsələlərə həsr edilmişdir.

Vidadi müəllim uzun illər V-VI siniflər üçün "Musiqi", II-IV siniflər üçün "Təsviri incəsənət" dərsliklərinin müəllifi, həmmüəllifi olmuşdur. O, eyni zamanda, İlyas Əfəndiyev adına Elitar gimnaziya üçün "Estetika", "Etika və etiket" tədris proqramlarının müəllifidir.

Ümumpedaqoji problemlərə aid bir sıra məqalələri vardır. "Dərs müəllimin şah əsəridir", "Əxlaq tərbiyəsinin problemləri", "Televizor və uşaqlar", "İstedadlı şagirdlərlə işin sistemi", "Ziyalılıq mənbəyi – mütaliə, – əgər o da yoxdursa", "Mənəviyyat olmasa, mədəniyyət də olmaz", "Uşaq evdə tək qalanda", "Elm-təhsil məbədinin şərəfli yolu" və s. məqalələrini qeyd etmək yerinə düşər.

Professor Vidadi Xəlilovun tədqiqatları sırasında pedaqoji texnologiyalar problemi özünə məxsus yer tutur.

**Görkəmli alimlərin və bəstəkarların həyatına və fəaliyyətinə aid monoqrafiyalar**

Professor V.C. Xəlilovun yaradıcılığının bir istiqaməti də elm və incəsənət xadimlərinə həsr etdiyi monoqrafiyalardan ibarətdir. Həmin monoqrafiyalar bunlardır: "Akademik Mehdi Mehdizadə", "Bəstəkar Süleyman Ələsgərov", "Bəstəkar Qənbər Hüseynli (B. Hüseynli ilə), "Bəstəkar Oqtay Zülfüqarov", "Sadiqlik nümunəsi" (professor Nazim Kazımov haqqında), "Şirin səsin sədası" (əməkdar artist Təhmiraz Şirinov haqqında), "Ustad məhəbbəti, ustad sənəti" ( xalq artisti Səkinə İsmayılova haqqında), "Dolanaram başına"nın heyrət aləmi" (musiqi xadimi Qulu Əsgərov haqqında).

Vidadi Xəlilov tərəfindən qələmə alınmış və ekran həyatı yaşamış bəzi sənədli filmlərin ssenariləri Azərbaycan Televiziyasının qızıl fondunda saxlanır. Həmin filmlər bunlardır: "Əsrə bərabər ömür" (akademik Mehdi Mehdizadə həsr edilmişdir), "Bəstəkar Süleyman Ələsgərov (Ə. Kamaloğlunun həmmüəllifliyi ilə).

**Bayramlara və tarixi günlərə həsr olunan ədəbi-bədii kompozisiyaların ssenariləri**

Professorun yaradıcılıq istiqamətləri çoxcəhətlidir. Bayramlara və tarixi günlərə aid ədəbi-bədii kompozisiyaların ssenarilərini hazırlamaqdan xoşlanar, vaxtilə çalışdığı ali təhsil müəssisəsində (Bakı Qızlar Universitetində) bədii rəhbər kimi onları canlandırardı. Həmin ssenarilərlə tanış olaq: "Elimizə bahar gəlir, Novruz gəlir, yaz gəlir", "Həyata anadır, dünyaya bəzək", Ömrü bahar müəllimim", "Müstəqilliyimiz əbədidir", "Oxu, tar", "Xocalı harayı, Xocalı fəryadı" və s.

**Elm-sənət adamlarının, gənc şairlərin yaradıcılığına həsr olunan ədəbi-bədii kompozisiyalar**

Professor bu seriyadan da bir sıra ədəbi-bədii kompozisiyalar hazırlamışdır. "Akademik Teymur Bünyadovun "Əsrlərdən gələn səslər" əsəri əsasında hazırlanan "Əsrlərdən gələn səslər əsrlərə səda verər", "Anarın sənət dünyası" və s.

**Mənəvi-estetik tərbiyə problemlərinə aid kitablara yazdığı rəylər**

Vidadi müəllim mühüm əhəmiyyət kəsb edən bir sıra monoqrafiyaya, kitab və kitabçaya, metodik vəsaitə və tədris proqramına rəy vermişdir. Yaradıcılığının bir istiqaməti də budur. "Bu səpgidə "Nağıllar yalan olmur, "Əkil-bəkilin nağıllı dünyası", "Ramil dastanı", "Professor Zahid Qaralovun "Tərbiyə" trilogiyası milli tərbiyə sisteminin formalaşmasında mənbədir", "Anam birdir, Vətən tək...", "Başı çalmalı dağlar" və s. resenziyalarını nümunə gətirmək mümkündür.

**Təltifləri**

Professorun səmərəli fəaliyyəti dövlət, respublika Təhsil və Elm Nazirliyi və institut tərəfindən yüksək qiymətləndirilmişdir. O, III dərəcəli Əmək ordeninə, nazirliyin Qabaqcıl maarif xadimi döş nişanına, Fəxri Fərmanlarına layiq görülmüşdür. Respublikanın Əməkdar müəllimi fəxri adını şərəflə daşıyır. SSRİ maarif əlaçısı, akademik Mehdi Mehdizadə mükafatı laureatı, respublika Lenin Komsomolu Mükafatı laureatıdır.

**Əsərlərindən seçmələr**

∗ Prosesin texnologiyasının şərti təsviri texnoloji sxem adlanır. Texnoloji sxemdə prosesin ayrı-ayrı elementləri ayırd edilir, onların arasındakı məntiqi əlaqə işarə olunur. Texnoloji xəritə də tərtib olunur: sxemdən fərqli olaraq xəritədə proses əməliyyatları mərhələlər üzrə ardıcıllığı ilə çox vaxt qrafik formada təsvir olunur və bu zaman zəruri vasitələrdən necə istifadə olunacağı göstərilir... Bütün bunlar "pedaqoji texnologiya" anlayışını mahiyyət dolğunluğu ilə mənimsəmək baxımından mühüm əhəmiyyətə malikdir.

∗ Müəllimlər çalışmalıdır ki, musiqi məşğələlərində uşaq heç bir səs gərginliyi hiss etmədən, qışqırmadan oxumağı bacarsın. Mahnı oxuma zamanı uşağa musiqi cümləsini, habelə ayrı-ayrı bəndlərin sonunadək nəfəsdən qənaətlə istifadə etmək bacarığı da aşılanmalıdır.

∗ Şagirdlərin milli və bəşəri dəyərlər əsasında tərbiyə olunmasında, tariximizin, mədəniyyətimizin, adət-ənənələrimizin daha ətraflı öyrənilməsində, onların maraq və meyllərinin uyğun qabiliyyətlərinin inkişaf etdirilməsində sinifdənxaric işlərin rolu, təsir imkanları çox böyükdür.

**Ailənin fəxri**

Vidadi müəllim həyat yoldaşı Əminə xanımla dörd gözəl övlad böyüdüb. Üçü qız, biri oğlan. Qızı Gülnarə Xəlilova hamısından zirək çıxıb. Sənətşünaslıq üzrə fəlsəfə doktorudur. Respublikamızda və bəzi xarici ölkələrdə onu yaxşı tanıyırlar. O, Gülnarə Xəlilova Moda Evinin və respublika Milli Geyim Mərkəzinin rəhbəri kimi milli geyim ənənələrinin əsas mahiyyətini, dəyərli cəhətlərini sənətsevərlərə çatdırır.

**Son söz əvəzinə**

Pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim Vidadi Cəmil oğlu Xəlilovun bu il dekabrın 25-də anadan olmasının 80 illiyi tamam olur. Lakin o özü buna heç də sevinmir. Qüssəlidir. Həmişə gülümsər olan sifətinin rəngi heç açılmaq bilmir. Bu, səbəbsiz deyildir. 80 illiyinə hazırlaşırdı. Lakin necə deyiblər: "Sən saydığını say, gör fələk nə sayır".

Bu il amansız əcəl oğlu Vüqarı onun, ailəsinin, əzizlərinin əlindən vaxtsız aldı. Vidadi necə sevinsin 80 yaşına?

Ataların belə məsəli də var: "Xeyirlə şər bağrıbadaşdır". Həm də dost dosta arxa gərək, dəstək gərək! Razılığını aldım ki, onun haqqında bir məqalə yazım və ürək sözlərimi, olanları-keçənləri qələmə aldım.

Əziz dostumuzun, pedaqogika elmləri doktoru, professor, respublikanın Əməkdar müəllimi, akademik Mehdi Mehdizadə mükafatı laureatı Vidadi Cəmil oğlu Xəlilovun 80 yaşı mübarək olsun!!!

**Problemin aktuallığı.** Professor Vidadi Xəlilovun 80 illiyi tamam olur.

**Problemin yeniliyi.** Professor Vidadi Xəlilovun 80 illiyi diqqətə çatdırılır.

**Problemin praktik əhəmiyyəti.** Məqalə doktorantlar və gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. Xəlilov, V.C. Seçilmiş əsərləri. 10 cilddə / V.C. Xəlilov. – Bakı: Nərgiz, – 2013.
2. Akademik Vidadi Xəlilov (həyat və yaradıcılığı). – Bakı: Nərgiz, – 2012.

**E-mail**: prof.akif@mail.ru

**Rəyçilər**: *ped.elm.dok., prof.* **İ.H. Cəbrayılov,**
*ped.elm.dok. prof.* **H.H. Əhmədov**
**Redaksiyaya daxil olub**: 31.10.2022.

# *İRƏVAN MÜƏLLİMLƏR SEMİNARİYASI – 140*
# *ИРЕВАНСКАЯ УЧИТЕЛЬСКАЯ СЕМИНАРИЯ – 140*
# *IRAVAN TEACHERS' SEMINARY – 140*

*UOT 37.0*

**Günay Eldar qızı Hüseynzadə**
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*Təhsilin nəzəriyyəsi və tarixi şöbəsinin elmi işçisi*
https://orcid.org/0000-0002-5972-2572

## İRƏVAN MÜƏLLİMLƏR SEMİNARİYASININ MƏZUNLARI

**Гюнай Эльдар гызы Гусейнзаде**
*научный сотрудник отдела теории и истории образования,*
*Института Образования Азербайджанской Республики*

## ВЫПУСКНИКИ ИРЕВАНСКОЙ УЧИТЕЛЬСКОЙ СЕМИНАРИИ

**Gunay Eldar Huseynzade**
*scientific worker of the department of Theory and history of education at the*
*Institute of Education of the Republic of Azerbaijan*

## GRADUATES OF IREVAN TEACHERS' SEMİNARY

**Xülasə.** Qeyd etmək lazımdır ki, ölkəmizdə təhsilin inkişafında İrəvan maarifçiliyinin, ədəbi mühitinin mühüm və böyük rolu olmuşdur. Məqalədə Azərbaycanın ilk pedaqoji təhsillərini İrəvan Müəllimlər Seminariyasında almış məktəb, ədəbiyyat, mədəniyyət və incəsənət sahəsində fəaliyyət göstərən bir çox nümayəndələri haqqında məlumatlar yer almışdır. İrəvan Müəllimlər Seminariyasının məzunlarının azərbaycanlıların yaşadığı bölgələrdə, xüsusən kəndlərdə ibtidai məktəblərin yaradılmasında, xalq arasında elm və maarifin yayılması, savadsızlığın aradan qaldırılması sahəsində gördükləri işlər qeyd olunur.

***Açar sözlər**: İrəvan Müəllimlər Seminariyası, kənd müəllimi, ibtidai təhsil, pansionat, seminariyanın məzunları*

**Резюме.** Следует отметить, что просветительская и литературная среда Иревана сыграла важную и большую роль в развитии образования в нашей стране. В статье содержится информация о многих представителях Азербайджана, получивших первое педагогическое образование в Иреванской Учительской Семинарии, активно работавших в области литературы, культуры и искусства. Упоминаются также работы, проделанные выпускниками Иреванской Учительской Семинарии в районах проживания азербайджанцев, особенно в селах, в создании начальных школ, в распространении науки и знаний среди населения, а также в области ликвидации неграмотности.

***Ключевые слова:** Иреванская Учительская Семинария, сельский учитель, начальное образование, школа-интернат, выпускники семинарии*

**Summary.** It should be noted that the education and literary environment of Irevan played an important role in the development of education in our country. The article contains information about many representatives of Azerbaijan, who received their first pedagogical education at the Irevan Teacher's Seminary, and who are active in the field of school, literature, culture, and art. The work done by the graduates of the Irevan Teacher's Seminary in the areas where Azerbaijanis live, especially in the villages, in the establishment of primary schools, in spreading science and knowledge among the people, and in the field of eliminating illiteracy, is noted.

***Key words:** Irevan Teachers' Seminary, village teacher, primary education, boarding school, graduates of the seminary*

İrəvan Müəllimlər Seminariyası Azərbaycanda təhsilin, xalq maarifinin, pedaqogika elminin inkişafında əhəmiyyətli rol oynamış təhsil ocaqlarından biridir. "İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında" Azərbaycan Respublikasının Prezidenti, cənab İlham Əliyevin 29 dekabr, 2021-ci il tarixdə imzaladığı Sərəncamda qeyd edilir: "İrəvan şəhəri tarixən azərbaycanlıların köklü yaşadığı böyük elm, maarif və mədəniyyət mərkəzlərindən biri kimi şöhrət tapmışdı. Şəhərdə Azərbaycan xalqına məxsus son dərəcə zəngin ədəbi-mədəni mühit formalaşmışdı. İrəvan xanlığı çar Rusiyasının tərkibinə qatıldıqdan sonra burada dünyəvi təhsilə xüsusi diqqət yetirilməsində həmin mühit əhəmiyyətli rol oynamışdır. XIX əsrin ikinci yarısından etibarən, Cənubi Qafqazda maarifçilik hərəkatı geniş vüsət aldı. Regionda dünyəvi təhsil verən yeni tipli məktəbin – İrəvan Müəllimlər Seminariyasının açılması da məhz bu vaxtlara təsadüf edir" [1]. Bu sərəncam İrəvanda azərbaycanlıların illər boyu yaratdığı tarixi, mədəni irsə sahib çıxaraq, yaddaşımızı bərpa etməyə və strateji hədəflərə nail olmağa yönəlmişdir.

1881-ci il noyabrın 8-də yaradılan bu təhsil ocağının nəzdində hazırlıq sinfi, ibtidai məktəb və pansionat (yataqxana) da fəaliyyət göstərirdi. Burada azərbaycanlılarla yanaşı, erməni, gürcü, rus və digər xalqların nümayəndələri təhsil alırdı. Seminariya fəaliyyətə böyük hazırlıq qrupu və birinci sinif ilə başlamışdı. Sonrakı dərs ilində ikinci sinif, 1883-cü ildə üçüncü sinif təşkil olunmuşdu. Hər il hazırlıq qrupuna və birinci sinfə qəbul elan olunurdu, II və III siniflərə birbaşa qəbula icazə verilmirdi. Birinci buraxılışı 1883-cü ildə olan İrəvan seminariyasının həmin il 5 azərbaycanlı məzunu olmuşdu.

İlk pedaqoji təhsillərini burada almış azərbaycanlı gənclər sonrakı həyat fəaliyyətlərini azərbaycanlıların yaşadıqları kəndlərdə ibtidai məktəblərin yaradılmasına, yaxud mövcud kənd ibtidai məktəblərində müəllimlik peşəsinə həsr edərək, xalq arasında elm və maarifin yayılmasında, savadsızlığın aradan qaldırılmasında mühüm rol oynamışlar.

Tağı bəy Səfiyev, Həsən Səfərli, Həsən bəy Qazıyev, Haşım bəy Nərimanbəyov, Vahid Musabəyov, Haşım bəy Vəzirov, İbadulla bəy Muğanlinski, Cəfər bəy Cəfərbəyov, Cabbar Məmmədov, Fərəməz Mahmudbəyov və başqaları ayrı-ayrı vaxtlarda seminariyanın məzunları olmuşlar.

Dövrünün görkəmli maarifçilərindən olan Tağı bəy Səfiyev 1893-cü ildə İrəvan Müəllimlər Seminariyasından məzun olduqdan sonra iki il Noraşen (indiki Şərur rayonu, Cəlilkənd) məktəbində dərs demişdir. Həm rus dilini yaxşı bildiyinə, həm də Naxçıvanın bütün bölgələrini yaxşı tanıdığına görə diplomatik missiya daşıyan Tağı bəy 1921-ci ildə Qars müqaviləsinin imzalanması mərasimində Naxçıvanın təmsilçisi olmuşdur. 1923-cü ildə Naxçıvan Xalq Maarif Komissarlığında inspektor vəzifəsində çalışmışdır. 1929-cu ildə "Rusca-türkcə lüğət"i hazırlayan maarifçi "Maarif zərbəçisi" döş nişanına layiq görülmüşdü. Həmçinin o, uzun müddət Naxçıvanın Nehrəm kəndində də müəllim işləmiş və həmin dövrdə onun "Nehrəm kəndi" adlı kitabçası da işıq üzü görmüşdür.

Seminariyada təhsil aldığı dövrdə dram dərnəyinin fəal üzvlərindən olan Həsən Səfərli İrəvanın teatr truppasında epizodik rollar ifa edirdi. 1917-ci ildə təhsilini başa vuraraq Naxçıvana qayıtmış və müəllimlik fəaliyyətinə başlamışdır. Bununla yanaşı, həvəskarlar truppasında, 1931-ci ilə qədər isə Naxçıvan Dövlət Dram Teatrında aktyor, rejissor, baş rejissor kimi çalışmışdır. Rus dilini və riyaziyyatı gözəl bilən Həsən Səfərli 1917-ci ildən 1919-cu ilin ortalarına qədər Naxçıvanda fəaliyyət göstərən "Rüşdiyyə" məktəbində dərs demişdir. O, 1919-cu ildə Naxçıvanda kimsəsiz uşaqlar evinin müdiri işləmişdir. 1960-cı ildə isə Naxçıvan Muxtar Sovet Sosialist Respublikasının əməkdar müəllimi adına layiq görülmüşdür.

1896-cı ildə İrəvan Müəllimlər Seminariyasını bitirən Həsən bəy Qazıyev Uluxanlı məktəbində, sonra isə 1918-ci ilə qədər İrəvanın müxtəlif milli məktəblərində rus dili müəllimi işləmişdir. Həsən bəy həm də İrəvan quberniyası müsəlmanlarının dini icmasının üzvü idi. O, 1918-ci ildə erməni daşnaklarının törətdikləri qətliamlar zamanı Naxçıvana köçmüş və müxtəlif məktəblərdə rus dilini tədris etmişdir. Əməkdar müəllim Həsən bəy ömrünün böyük bir hissəsini Azərbaycan milli maarifçiliyinin inkişafına həsr etmişdir.

İrəvanda maarifin inkişafında böyük rolu olmuş Haşim bəy Nərimanbəyov İrəvan Müəllimlər Seminariyasında təhsilini başa vurduqdan sonra, 1898-ci ildə İrəvanda məktəb açmışdı. H. Nərimanbəyov yaratdığı məktəbdə müdirlik və müəl-

limlik etməklə yanaşı, Ripsime qızlar gimnaziyasında da Azərbaycan dilindən dərs deyirdi. O, İrəvanda ana dilində məktəblərin yaradılmasında fəal iştirak etmiş, digər müəllimlərlə birlikdə Azərbaycan məktəbləri üçün "Ana dili" kitabını tərtib etmişdir. Kitab 1907-ci ildə İrəvanda, daha sonra isə üç dəfə Tiflisdə nəşr olunmuşdur.

Pedaqoji təhsilini İrəvan Müəllimlər Seminariyasında alan Vahid Musabəyov seminariyanın son dərəcə istedadlı və bacarıqlı şagirdlərindən olmuşdur. Onun seminariyada oxuduğu zaman çəkdiyi coğrafi xəritələr böyük marağa səbəb olmuşdu. Xəritələrdə seminariya müəlliminin qeydləri də yer almışdı. 1889-cu ildə seminariyanı müvəffəqiyyətlə bitirdikdən sonra Musabəyov Qutqaşen kəndində birsinifli məktəbə ibtidai sinif müəllimi təyin edilir. 1882-ci ildə açılan bu məktəb Nuxa qəzasında ilk xalq məktəbi idi. Məktəb üç şöbədən ibarət idi. Tədris Azərbaycan və rus dillərində aparılırdı. Burada hesab, coğrafiya, tarix, təbiətşünaslıq və rəsm fənləri tədris edilirdi. Məktəbin müdiri və ilk müəllimi Zaqafqaziya Müəllimlər Seminariyasının ilk məzunlarından, məşhur Azərbaycan pedaqoqu və maarifçisi Rəşid bəy Əfəndiyev idi.

Dövrünün məşhur mühərrirlərindən (redaktor) biri olan Haşım bəy Vəzirov seminariyanı bitirdikdən sonra əvvəl Böyük Vedi kəndində, daha sonra isə Cavanşir qəzasının Alpout, Şəki qəzasının Kiçik Göynük, Cavanşir qəzasının Bərdə kəndlərində müəllimlik etmişdi. Bir müddət sonra isə Şuşada yaradılan müsəlman-rus məktəbinə direktor vəzifəsinə təyin olunmuşdu.

Uzun müddət ədəbi jurnalistika sahəsində fəaliyyət göstərən Haşım bəy "Tazə həyat" (1907-1908), "İttifaq" (1908-1909), "Səda" (1909-1911), "Kavkazets" (1911, rus dilində), "Sədayi-vətən" (1911), "Sədayi-həqq" (1912), "Sədayi-Qafqaz" (1915–1916) qəzetlərini və "Məzəli" (1914-1915) jurnalını nəşr etdirmişdir. "Məzəli", "Molla Nəsrəddin"dən sonra mətbuat tarixində ən görkəmli, cəmiyyətin siyasi həyatını kəskin bir qələm ilə əks etdirən məşhur məzhəkə jurnalı hesab olunurdu.

İbadulla bəy Muğanlinskinin İrəvanda azərbaycanlı uşaqları gimnaziyaya hazırlaşdırmaq üçün açdığı pansionatın Azərbaycan elminin inkişafında mühüm rolu olmuşdur. 1906-cı ildə pansionatda 19 nəfər uşaq yaşayırdı. Onlardan on biri İrəvandan, səkkizi Naxçıvandan idi. Uşaqlar arasında gələcəyin akademiki Mustafa bəy Topçubaşov, qardaşı Mehdi Topçubaşov, Mirməmməd Miryəhyayev, Əziz Şərif və başqaları var idi. 1912-ci ildə İbadulla bəy pansionatı yaxın dostu və yeznəsi olan Cabbar Məmmədova tapşıraraq, həmişəlik İrana köçür. O, bir müddət İranda müxtəlif sahələrdə çalışmış, hətta bir müddət İranda olan rus zabitlərinə dərs demişdir.

Cəfər bəy Cəfərbəyov 1897-ci ildə İrəvan Oğlan Gimnaziyası nəzdində hazırlıq məktəbini, 1901-ci il də İrəvan Müəllimlər Seminariyasını bitirmişdir. O, əvvəl Məhəmmədqulu bəy Kəngərlinskinin məktəbində tərbiyəçi, daha sonra isə Yengicədə və Aleksandropolda müəllim kimi fəaliyyət göstərmişdir. Cəfər bəy Cəfərbəyov türk dilindən başqa, qalan fənlərin rus dilində tədris edilməsi şərti ilə III dərəcəli xüsusi təhsil müəssisəsi açmış və eyni zamanda, açdığı pansionata rəhbərlik etmişdir. "Kavkazskiy kalendar" məcmuəsinin 1909-cu il nömrəsində Cəfər bəy Cəfərbəyovun İrəvan Müəllimlər Seminariyasında müsəlman şöbəsinin müdiri vəzifəsində işləməsi göstərilmişdir [2].

Seminariyanın 1902-ci il məzunlarından biri olan Cabbar Məmmədov seminariyanı bitirdikdən sonra Nehrəm, Qəmərli və İmanşalıda müəllim kimi fəaliyyət göstərmişdir. 1906-cı ildə İ. Muğanlinskinin pansionunda rus dili müəllimi, bir il sonra isə İrəvan Müəllimlər Seminariyasında türk dili müəllimi vəzifəsində çalışmışdır. C. Məmmədov iki il Naxçıvan Ali İbtidai məktəbində rus və türk dillərini tədris etmişdir. Həmin illərdə onun üç kitabı ("Самоучитель тюркского языка для русских", "Самоучитель русского языка для тюрок", "Самоучитель русского языка для персов") nəşr olunmuşdur. 1920-ci ildə Azərbaycan Dövlət Universitetində, bir müddət sonra Azərbaycan Politexnik İnstitutunda Azərbaycan dilindən mühazirələr demişdir. 1932-ci ildə Kooperativ İnstitutuna türk dilləri üzrə kafedra müdiri vəzifəsinə təyin olunmuşdur. 1935-ci ildə ona dil və ədəbiyyat elmləri üzrə elmlər namizədi və professor, 1937-ci ildə isə müəllifi olduğu "Azərbaycanda tədris metodikası tarixi" əsərinə görə pedaqoji elmlər doktoru adı verilmişdir.

Uzun müddət xalq maarifi sahəsində fəaliyyət göstərən Əli İbrahimov 1914-cü ildə seminariyanı bitirdikdən sonra inqilabi hərəkata qoşulmuş və bu hərəkatın fəallarından biri ol-

muşdur. O, 1914-cü ildən 1916-cı ilə qədər Böyük Vedi kəndində müəllim işləmişdir. 1916-cı ilin əvvəllərində Ağdam rayonuna köçmüş və burada rus dilini tədris etmişdir.

Fərəməz Mahmudbəyov 1912-ci ildə Vedi ikisinifli məktəbini bitirdikdən sonra təhsilini İrəvan Müəllimlər Seminariyasında davam etdirmişdir. Seminariyanı1917-ci ildə bitirsə də, baş vermiş siyasi hadisələr onun müntəzəm olaraq müəllimlik etməsinə imkan verməmişdir. O, Naxçıvanın, Şərurun və Ordubadın erməni daşnaklarından qorunmasında yaxından iştirak etmiş və 1919-cu ildə Ordubadda müdafiə komitəsinin rəhbəri olmuşdur. Naxçıvanda sovet hökuməti qurulandan sonra bir müddət Naxçıvan İnqilab Komitəsinin üzvü olmuş, sonralar isə Şərur və Ordubad rayonlarının icraiyyə komitəsinin sədri vəzifələrində çalışmışdır.

İrəvan Müəllimlər Seminariyasını bitirdikdən sonra təhsillərini Rusiya və Avropanın müxtəlif ali təhsil müəssisələrində davam etdirən bir sıra azərbaycanlı maarifçilər vətənlərinə geri qayıdaraq ölkəmizdə elmin, maarifin, mədəniyyət və incəsənətin inkişafında yaxından iştirak etmişlər. İrəvan Müəllimlər Seminariyası fəaliyyət göstərdiyi müddət ərzində Cənubi Qafqazda, o cümlədən Azərbaycanda təhsilin və mədəniyyətin inkişafında böyük əhəmiyyət kəsb edirdi.

**Problemin aktuallığı.** İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi tarixi hadisə kimi böyük əhəmiyyətə malikdir. Bununla bağlı ölkəmizdə müxtəlif tədbirlərin keçirilməsi, elmi tədqiqatların aparılması, məqalələrin dərc olunması aktuallıq kəsb edir.

**Problemin elmi yeniliyi** İrəvan Müəllimlər Seminariyasının yetişdirdiyi görkəmli şəxsiyyətləri ilə bağlı tədqiqatların aparılması təhsil tariximizin öyrənilməsi və gənc nəsillərə çatdırılması baxımından vacibdir.

**Problemin praktik əhəmiyyəti**. Tədqiqat nəticəsində üzə çıxarılmış faktlar Azərbaycan cəmiyyətinin, gənc nəslin məlumatlandırılmasında böyük əhəmiyyət kəsb edir.

**Ədəbiyyat:**

1. https://president.az.
2. Zeynalov, Ə.M. İrəvan məktəbləri. / Ə.M. Zeynalov. Bakı: Mütərcim, 2011, 56 s.
3. Zeynalov Ə.M.. İrəvan Müəllimlər Seminariyası. // Bakı: Respublika, 14 may, 2022, s.5.
4. Cəbrayılov İ.H. Seminariyanın Azərbaycan təhsilinə verdiyi töhfələr: İrəvan Müəllimlər Seminariyası – 140. // Azərbaycan müəllimi. 2022, 22 aprel, s.11.
5. Məhərrəmov Z.H. İrəvanda məktəbdarlıq və maarifçilik (1800–1920-ci illərdə ədəbi-mədəni mühit). Bakı: Nurlan, 2010, 320 s.
6. Mərdanov M.C., Allahverdiyev C.V. Azərbaycan təhsil tarixinin şərəfli səhifəsi. İrəvan Müəllimlər Seminariyası – 140. // 525-ci qəzet, 2021, 28 avqust, s.8-9;14;15.
7. Rüstəmov F.A. Milli müəllim kadrları hazırlayan təhsil ocağı: İrəvan Müəllimlər Seminariyası – 140. // Azərbaycan müəllimi. 2022, 7 yanvar, s.6.

**E-mail:** g.huseynzade@arti.edu.az
**Rəyçi:** *ped.elm.dok., prof.* **İ.H. Cəbrayılov**
**Redaksiyaya daxil olub:** 31.10.2022.

## *ÜMUMPEDAQOJİ PROBLEMLƏR*
## *ОБЩЕПЕДАГОГИЧЕСКИЕ ПРОБЛЕМЫ*
## *GENERAL PEDAGOGICAL PROBLEMS*

*UOT 37.0*

***Həsən Əhməd oğlu Hüseynov***
*texniki elmlər doktoru, professor*
*Azərbaycan Texniki Universiteti*

# ELM, TƏHSİL VƏ İSTEHSALAT ƏLAQƏLƏRİ QLOBAL ÇAĞIRIŞLAR KONTEKSTİNDƏ

***Гасан Ахмед оглы Гусейнов***
*доктор технических наук, профессор*
*Азербайджанский Технический Университет*

# СВЯЗИ НАУКИ, ОБРАЗОВАНИЯ И ПРОИЗВОДСТВА В КОНТЕКСТЕ ГЛОБАЛЬНЫХ ВЫЗЫВОВ

***Hasan Ahmed Huseynov***
*doctor of technical sciences, professor*
*Technical University of Azerbaijan*

# LINKS OF SCIENCE, EDUCATION AND PRODUCTION IN THE CONTEXT OF GLOBAL CHALLENGES

**Xülasə.** Məqalədə elm, təhsil və istehsalat əlaqələrinin vahid mərkəzdən idarə olunmasının yeni arxitekturasının formalaşdırılmasında texnoloji inkişaf etmiş ölkələrin qabaqcıl təcrübəsi təhlil olunmuş, qlobal çağırışlar kontekstində intellektual kapitalın əsas aparıcı amilə çevrilməsi və onun təmini üçün müasir elm, təhsil sistemində müvafiq institusional və struktur islahatlarının həyata keçirilməsinin vacibliyi vurğulanmışdır.
***Açar sözlər:*** *elm, təhsil, istehsalat, yüksək texnoloji avadanlıq, tədqiqat universiteti, biznes məktəb, kooperativ tədqiqat mərkəzi, tərəfdaşlıq proqramı, distant təhsil*

**Резюме.** В статье проанализирован передовой опыт технологически развитых стран в формировании новой архитектуры централизованного управления связями науки, образования и производства, подчеркнута важность проведения соответствующих институциональных и структурных реформ в современной системе науки и образования для превращения интеллектуального капитала в основной ведущий фактор в контексте глобальных вызовов.
**Ключевые слова:** *наука, образование, высокотехнологичное оборудование, исследовательский университет, бизнес школа, кооперативный исследовательский центр, программа партнерства, дистанционное образование*

**Summary.** The article analyzed the best practices of technologically developed countries in the formation of a new architecture of centralized management of the links of science, education and production, emphasized the importance of carrying out appropriate institutional and structural reforms in the modern system of science and education to turn intellectual capital into the main leading factor in the context of global challenges.
***Key words:*** *science, education, high-tech equipment, research university, business school, cooperative research center, partnership program, distance education*

Prezident Fərmanına əsasən, Azərbaycan Respublikasının Təhsil Nazirliyi Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyi adlandırılmışdır. Elm-təhsil-istehsalat vektoru üzrə inteqrasiyanı davamlı iqtisadi inkişafın əsas resursuna çevirmək, istehsaledici bilikləri (productive knowledge) və innovasiyaları yeni məhsullara və texnologiyalara transformasiya etmək, ölkə üçün prioritet əhəmiyyət kəsb edən sahələrdə milli texnoloji platformalar formalaşdırmaq, yüksək ixtisaslı kadr hazırlığına diqqəti artırmaq ölkə iqtisadiyyatının mövcud və perspektiv təhdidlərə qarşı dayanaqlığının təminatı üçün yeni nazirliyin qarşısında duran əsas vəzifələrdir.

Elm-təhsil-istehsalat vektoru üzrə inkişafın klassik anlayışına görə, elm, istehsalat tərəfindən müəyyənləşdirilmiş fundamental və tətbiqi problemlər və onların arasındakı əlaqələr üzrə tədqiqatlar aparır, nəticələri monoqrafiyalar, dərsliklər, məqalələr, konstruktiv-texnoloji işləmələr, yeni materiallar, kəşflər, ixtiralar, normativ materiallar və s. şəklində təhsilə və istehsalata ötürür; təhsil bir tərəfdən biliyin istifadəçisi, digər tərəfdən isə yaradıcısı kimi elm və istehsalat üçün kadr hazırlığı həyata keçirir; istehsalat elmin və təhsilin təklif etdiyi yeni texnika və texnologiyalar əsasında məhsul istehsal edir, elmin qarşısında fundamental və tətbiqi problemlər qoyur və təhsil sisteminin hazırladığı mütəxəssisləri işlə təmin edir.

Təcrübə göstərir ki, elm-təhsil siyasəti və menecmentinin müxtəlif mərkəzlərdən həyata keçirilməsi "fundamental tədqiqatlar-tətbiqi tədqiqatlar-sənaye istehsalı" tsiklinin komponentləri arasında əlaqələrin, nəticədə isə elm-təhsil simbiozundan yaranan sinerqetik effektin zəifləməsinə səbəb olur. Beləliklə, elmi-tədqiqat sektorunun inkişaf tempi ölkə iqtisadiyyatının inkişaf tempindən geri qalır və sahibkarlığın yeni texnologiyalara olan ehtiyaclarına cavab vermir.

Elm, təhsil və istehsalat əlaqələrinin vahid mərkəzdən idarə olunmasının yeni arxitekturasının formalaşdırılmasında texnoloji inkişaf etmiş ölkələrin qabaqcıl təcrübəsindən istifadə etmək səmərəli olardı. Bu ölkələrdə son illərdə həyata keçirilən islahatlar həm elmin institusion təşkili və funksional formaları, həm də dövlət menecmenti tstili üzrə xarakterikdir. Məsələn, ABŞ-da elm, təhsil və istehsalat əlaqələrinin inteqrasiyası məqsədilə aparıcı universitetlərin və sənaye şirkətlərinin elmi potensialları kooperativ tədqiqat mərkəzləri çərçivəsində konsentrasiya edilərək prioritet problemlərin həllinə yönəldilmişdir. Fransanın "Ali təhsil və elm haqqında" qanununda elm və təhsil birlikləri arasındakı əlaqələri daha da möhkəmləndirmək və müxtəlifləşdirmək, mütəxəssislərin ixtisas səviyyələrini və tədqiqatların keyfiyyətini yüksəltmək, tədqiqatların nəticələrini iş yerlərinə transformasiya etmək imkanı verən elm-təhsil-iqtisadiyyat əlaqələrinin hibrid modelinin yaradılmasına üstünlük verilmişdir.

Almaniya, Böyük Britaniya və Yaponiyada fundamental elmi-tədqiqatların konkret nəticələrə istiqamətləndirilməsi trendi çərçivəsində elmə dövlət dəstəyinin yeni strukturu işlənmiş, elmi inkişafın maliyyə qaynaqlarının diversifikasiya mexanizmləri yaradılmış, elmə və işləmələrə yatırım edən müəssisələrə vergi stimullarının təkmilləşdirilməsi sistemi tətbiq olunmuşdur. Elmi-tədqiqatlara bank kreditləri, dövlət subsidiyaları və vergi kreditlərinin verilməsi, innovasion qrantlardan və intellektual mülkiyyətdən gələn gəlirlərin vergi ilə yüklənməsində əlavə güzəştlərin nəzərdə tutulması kimi stimullaşdırma formaları ölkəmiz üçün də xarakterik ola bilər.

Qərb universitetləri, bir qayda olaraq, sənaye və texnoloji mühitlə sıx əlaqələri ilə fərqlənir. Məsələn, Almaniyada elm çoxplanlı quruluşa malikdir və əsas aksent elmi-tədqiqatların nəticələrinin praktik reallaşdırılma alətlərinə yönəldilir. Böyük Britaniyada elmi-tədqiqatların ölkə iqtisadiyyatına yönəldilməsinin oturuşmuş modeli mövcuddur. Bu model universitetlərdə müvafiq strukturlar kompleksi: texnologiyaların transfert mərkəzləri; xüsusi dövlət fondları, texnoparklar və s. vasitəsilə fəaliyyət göstərir. Ali məktəb elminə investisiya yeni yaradılmış şirkətlərdən vergilər, yeni iş yerləri, perspektivli mütəxəssislər, sertifikasiya üçün hazır olan innovasion məhsullar və s.. şəklində dövlət üçün də preferensiyalar yaradır [1, s. 4].

Texnoloji inkişaf etmiş ölkələrdə elm, təhsil və istehsalat əlaqələrinin inteqrasiyasında tədqiqat universitetlərinin, biznes-məktəblərin və tərəfdaşlıq proqramlarının tətbiqinə böyük önəm verilir. Tədqiqat universitetində tədqiqat və təhsil prosesləri sintez edilərək həm biliyə çevrilir, həm də texnoloji, iqtisadi və sosial innovasiyalar həyata keçirə bilən mütəxəssis formalaşdırılır. Bu universitetlərdə tələbə modeli

iki aparıcı fəaliyyət sahəsini özündə əks etdirir: tədris və tədqiqat işi. Tələbə tədris prosesinin müxtəlif formalarında və elmi cəmiyyət mühitində reallaşdırılan proseslərdə (müsabiqə, konfrans, elmi jurnallarda çap, eksperimentlərin aparılması və s.) iştirak edir. Elm və təhsil proseslərində iştirak tələbədə çeviklik, digər mühitlərə asanlıqla adaptasiya olmaq, elmi cəmiyyətlər, xarici tərəfdaşlar, mərkəzlər və s. arasında qarşılıqlı fəaliyyət qurmaq kimi vacib səriştələr formalaşdırır. Tədqiqat universitetlərində innovasiya təhsil proqramlarının infrastrukturu yeni arxitektura üzrə qurulur. Universitet nəzdində elmi-innovasiya kompleksləri, elmi-tədqiqat və analitik mərkəzlər yaradılır, yüksək texnoloji avadanlıqlarla təminat və mütəxəssislərin məqsədli hazırlığı həyata keçirilir, məzunlara dəstək sistemi yaradılır və tədris prosesinə yüksək ixtisaslı tədqiqatçı-mütəxəssislər cəlb edilir.

Tədqiqat universitetlərində yeni texnologiyaların, tədqiqat və işləmələrin nəticələrinin kommersiyalaşmasını sürətləndirmək məqsədilə texnopark, texnoloji inkubator, *start up* və şəbəkə innovasiya strukturları kimi xüsusi statusa malik innovasiya qurumlardan geniş istifadə edilir. Bu qəbildən olan fəaliyyət meydançalarında elmlə istehsalat arasında ümumi maraqlar formalaşır, təhsilin səviyyəsi yüksəldilir və işçilərin yeni texnologiyalar üzrə təkmilləşdirilməsi həyata keçirilir. Tədqiqat universitetlərinin innovasiya qurumları yeni texnologiyaların kommersiya reallaşdırılmasını həyata keçirir, gənc mütəxəssislər üçün yeni iş yerləri açır və yerləşdiyi məkanın sosial-iqtisadi həyatında aktiv fəaliyyət göstərir. Bu qurumlarda universitetin elm və təhsil xidmətləri və sosial aktivliyi ilə kiçik biznesin iqtisadiyyatı və rəqabət qabiliyyəti vahid bir arxitektura daxilində fəaliyyət göstərir. Vahid bir kompleksdə cəmlənmiş intellektual potensial və yüksək texnologiya tədqiqat universitetinin ümumi innovasiya strukturunu formalaşdırır.

Biznes-məktəblərdə tələbələr əmək bazarı barəsində təsəvvür əldə edir, biznes planların işlənməsində iştirak edir, kommersiya xüsusiyyətləri inkişaf etdirir və sahibkarlıq fəaliyyəti üzrə təcrübə əldə edirlər. Tərəfdaşlıq proqramları vasitəsilə universitetlərdə aparılan tədqiqatların maliyyələşdirliməsinə milli, bəzən də beynəlxalq biznes cəlb edilir. Tədqiqatların nəticələrindən istifadədə və istedadlı tələbələrin seçimində isə bu şirkətlərə üstünlük verilir. Avropa təcrübəsinə görə, elm, təhsil və iqtisadiyyat sisteminin arxitekturasının açar xarakteristikalarını açıqlıq və sadəlik təşkil edir. Açıqlıq anlayışına görə, bütün yaş dərəcələrindəki insanların ali təhsil almaq imkanlarının olması, ömür boyu təhsilin stimullaşdırılması və elm-təhsil sisteminin ölkənin sosial-iqtisadi qurumları və beynəlxalq əməkdaşlıq üçün açıq olması əsas götürülür. Sadəlik anlayışı isə elm və təhsilin təşkilati strukturunun sadələşdirilməsini, sahələrarası baryerlərin aradan qaldırılmasını, təhsil, elm və istehsalat müəssisələri arasında əməkdaşlıq və koordinasiyanı nəzərdə tutur. Başqa sözlə desək, elm-təhsil-iqtisadiyyat əlaqələrinin yeni arxitekturası üç milli strategiyanın vahid maraqlar çərçivəsində reallaşdırılmasına istiqamətləndirilir.

*Mövcud vəziyyət.* Azərbaycanda Avropa ölkələrindən fərqli olaraq elm siyasəti və menecmentində çoxqütblük mövcuddur: universitet elmi Təhsil və Elm Nazirliyindən, Elmlər Akademiyasının institutları Elmlər Akademiyasının Rəyasət Heyətindən, korporativ elm müvafiq nazirliklər və şirkətlər tərəfindən, elmin layihə prinsipi əsasında maliyyələşdirilməsi Dövlət Elm Fondu tərəfindən, Dövlət İmtahan Mərkəzindən, elmi adların və dərəcələrin verilməsi Ali Attestasiya Komissiyası tərəfindən həyata keçirilir. Elm, təhsil və istehsalat əlaqələrinin yüksək səmərəliliyi üçün onun komponentlərinin inkişaf strategiyaları həmahəng olmalıdır. Bu gün milli elmin əsaslarını universitetlərin dövlət büdcəli elmi-tədqiqat institutlarında, kafedralarda, elmi tədqiqat laboratoriyalarında, magistratura və doktoranturada, Elmlər Akademiyasının institutlarında və sahə nazirliklərinin elmi müəssisələrində aparılan tədqiqatlar təşkil edir. Bu qurumların tədqiqat istiqamətləri, əsasən, postsovet məkanı üçün səciyyəvi olan, çağdaş dövrün lokal və qlobal çağırışları ilə çox da səsləşməyən, sahibkarların ehtiyaclarına cavab verməyən, bilavasitə kafedralar, institutlar və ayrı-ayrı alimlərin elmi məktəbləri üçün səciyyəvi olan problemlərin həllinə yönəlmişdir. Ölkənin elm strategiyası iqtisadi və industrial modernləşməyə imkan verə biləcək elmi bazisin formalaşmasına yönəlməlidir. Elmi tədqiqatların əsas problemləri ölkənin iqtisadi yüksəlişi üçün vacib olan çağırışlara istiqamətlənməlidir.

Elm, təhsil və iqtisadiyyat vektoru üzrə inkişafın milli strategiyasında elmi tədqiqatlar

müasir cəmiyyətin qarşılaşdığı qlobal və lokal çağırışlara istiqamətləndirilməli, dövlət və biznes tərəfdaşlığı əsasında texnoloji inkişafın prioritet sahələri müəyyənləşdirliməli, sahibkarlıq fəaliyyəti və yüksəktexnoloji kiçik şirkətlər stimullaşdırılmalı, tədqiqatlara və işləmələrə birbaşa xarici investisiyaların cəlb olunmasına diqqət artırılmalı və beləliklə də, milli elm-təhsil-iqtisadiyyat ekosisteminin cazibədarlığı yüksəldilməlidir.

*İnnovativ texnologiyalar.* Ümumavropa təhsil məkanı üçün çoxsəviyyəli təhsil sisteminin daha da şaxələnməsi: peşə bakalavrı, tədqiqatçı bakalavr, peşə magistri, tədqiqatçı magistr səviyyələri üzrə mütəxəssis hazırlığı səciyyəvidir. Avropa təcrübəsinin öyrənilməsində və tətbiqində elm və innovasiyanın inkişafı üzrə 8-ci çərçivə proqramı – Horisont 2020, Erasmus Plus layihələri və Tüninq metodologiyası çox vacib alətlərdir. Müasir tədris proqramları və planlarının tərtib olunmasında Avropanın 28 ölkəsində Tüninq metodologiyasından geniş istifadə edilir. Tüninq metodologiyası təhsil proqramına 14 parametr üzrə nəzarət nəzərdə tutur: təhsil prosesinə 9 parametr, təhsilin nəticələrinə 2 parametr, təhsil resursları və avadanlıqlarına 3 parametr üzrə. Metodologiyada ali təhsil üçün 30 ümumi kompetensiya təklif edilir: onlardan 10-u alət, 10-u münasibət, 10-u isə sistem kompetensiyalarıdır.

Tüninq metodologiyasının təklifləri əsas götürülən Erasmus plus KA2 layihələrində, birinci növbədə, əmək bazarının konyukturası öyrənilir, iqtisadiyyatın müvafiq sahəsinin peşəkarları arasında tədqiqatlar aparılmaqla prioritet ixtisaslar, uyğun ümumi və səciyyəvi kompetensiyalar, müvafiq kompetensiyanı təmin edəcək təhsil tələbləri müəyyənləşdirilir, kompetensiyalarla fənn modulları arasında korrelyasiya əlaqələri qurulur və bu əsasda da kreditlərin modul prinsipi üzrə fənlər arasında obyektiv paylanması həyata keçirilir. Başqa sözlə desək, təhsil kafedranın profilinə və müəllimin biliyinə deyil, əmək bazarının tələb etdiyi kompetensiyaların təmin olunmasına istiqamətləndirilir. Bu kontekstdə təhsil proqramlarını Avropa təhsil proqramları ilə harmonikləşdirmək, məzunlara milli təhsil sənədləri ilə birgə Europass sənədləri: ikili və ya birgə diplom, diploma Avropa əlavəsi, Avropa CV-si, mobillik pasportu, dil pasportu və s. sənədlər vermək üçün müvafiq pilot layihələri tərəfindən işlənmiş platformalardan istifadə məqsədyönlü olardı. Elm, təhsil və istehsalat əlaqələrinin keyfiyyətinin yüksəldilməsində akkreditasiya institutuna yüksək önəm verilməlidir. Ali təhsil müəssisələrinin ali təhsildə keyfiyyətin təminat assosiasiyası – ENQA tərəfindən işlənmiş standartlar və təkliflər – ESG əsasında beynəlxalq akkreditasiya keçməsi onların reytinqinin yüksəldilməsi və beynəlxalq aləmdə tanınması istiqamətində çox önəmli addım olardı.

Qlobal iqtisadiyyatın təzyiqləri gücləndikcə yüksək texnoloji avadanlıqların layihələndirilməsi, istehsalı və istismarının ölkənin iqtisadi suverenliyi üçün nə qədər önəm daşıdığı özünü büruzə verir. Bu baxımdan reversiv injinirinq, rəqəmsal surət (digital dublikat), rəqəmsal platforma, CALS texnologiyaları (*Continuous Acquisition and Life cycle Support),* additiv texnologiyalar, yaşıl enerji, 7D texnologiyaları ölkə iqtisadiyyatının inkişafı və şaxələnməsi baxımından geniş maraq doğurur. Reversiv injinirinq yüksək texnoloji məhsulun mövcud prototip əsasında qısa müddətdə layihələndirilmə və istehsalına imkan verir. Yüksək texnoloji sənaye məmulunun rəqəmsal modelinin işlənməsində aktuallıq kəsb edən digər bir istiqamət rəqəmsal platformadır. Vahid rəqəmsal mühitdə müvafiq platformadan istifadə etməklə müxtəlif texnoloji sahələri təmsil edən çoxsaylı layihələr üzərində eyni vaxtda işləmək mümkündür. CALS konsepsiyasının əsasını məmulun həyat tsiklinə dəstək göstərən inteqrasiya olunmuş informasiya sistemləri təşkil edir.

Elm, təhsil və istehsalat əlaqələrinin inteqrasiyasının CALS standartları çərçivəsində həyata keçirilməsi məmulun rəqəmsal maketi, modeli və strukturu səviyyəsində işlənmiş elektron layihənin tərkibinə ənənəvi tərkib hissələrindən əlavə həndəsi və struktur modellərlə assosiativ əlaqələndirilmiş fiziki, texnoloji, çoxfunksiyalı xarakteristikaları da daxil etməyə imkan verərdi. Məmulun rəqəmsal strukturunun yaradılması kontekstində ən müasir istiqamətlərdən biri 7D layihələndirmə texnologiyalarıdır. 7D holoqrafik texnologiyalar iqtisadiyyatın elm, təhsil, biznes, telekommunikasiya, səhiyyə, müdafiə sənayesi və s. sahələrinin gələcək inkişafının azimutlarını müəyyənləşdirərək texnoloji inkişafı əlavə reallığa yaxınlaşdırır. 3D model obyektin görünüşünün 3 ölçüdə regenerasiyasını verir. 4D modelə dördüncü ölçü kimi zaman daxil edilərək, zaman daxilində dinamika əks etdirilir.

5D və daha çox ölçülü modellərdə görünməyən, amma müəyyən oluna bilən əlavə ölçülərin dinamikası nəzərdə tutulur, məsələn, mühəndis texnologiyaları üçün xarakterik olan material tutumu, enerji tutumu, informasiya tutumu və s. parametrlərin dəyişməsi. Elmi tərəqqi inkişaf etdikcə əlavə D-ölçülərin də nəzərə alınacağı istisna edilmir. Hər bir ölçü müəyyən dərəcədə görmək və hiss etmək üsulu – məkanı dərk etməyə yönəlmiş reallıqdır. Müasir texnoloji durum səviyyəsində qurulmuş elm, təhsil və istehsalat əlaqələrində bu texnologiyalar öz yerini tapmalıdır. Bu gün çağdaş dünyanın yüksək texnologiyalar məkanında "Additiv texnologiyalar"da prioritet əhəmiyyət kəsb edirlər. AF-texnologiyalardan istifadə etməklə xammala 75% qənaət etmək mümkündür. Kifayət qədər yüksək intellektual potensiala və texnoloji imkanlara malik ölkəmizdə iqtisadiyyat üçün prioritet əhəmiyyət kəsb edən bir sıra yüksək texnoloji məhsullara olan tələbat və onların yerli istehsalının təşkilinin vacibliyi yuxarıda sadalanan texnologiyalar üzrə milli platformaların formalaşması və kadr hazırlığının həyata keçirilməsi kimi təxirəsalınmaz məsələlərin həllini tələb edir.

Bu gün elm, təhsil və istehsalat əlaqələrinin beynəlmiləlləşdirilməsinə böyük ehtiyac vardır. Ali təhsil həm də böyük perspektivli təhsil xidmətləri bazarıdır. Bu bazarın genişləndirilməsi digər ölkələrlə qarşılıqlı sərfəli iqtisadi əməkdaşlığa, yeni informasiya mənbələrinin, texnoloji platformaların əldə edilməsinə və ölkə büdcəsinə əlavə vəsaitlərin daxil olmasına şərait yaradardı. Ölkə universitetlərinin elmi-pedaqoji potensialının kifayət qədər yüksək olmasına baxmayaraq, elmi nəticələrin kapitallaşmasından gələn gəlir cüzidir; təhsil, elm və istehsalat müəssisələri arasında qarşılıqlı fəaliyyət lazımi səviyyədə formalaşmamışdır; yeni texnologiyalardan kifayət qədər istifadə edilmir. Mövcud texnoloji durumun irəli sürdüyü trendlərə vaxtında və keyfiyyətli cavab verə bilmək üçün ölkənin elm-təhsil potensaialı tam səfərbər olunmalı, yaşlı nəsil alim və müəllimlərin qabaqcıl təcrübələrinin orta və gənc nəslə ötürülmə mexanizmləri inkişaf etdirilməli, elm və təhsildə yaş senzi aradan götürülməlidir.

Təhlilin nəticələri göstərir ki, dünya iqtisadiyyatını silkələyən qlobal istiləşmə, Covid 19 pandemiyası, müharibələr, aparıcı dövlətlərin bir-birinə qarşı tətbiq etdikləri sanksiyalar və dünya bazarlarında kəskinləşən rəqabət yeni yüksək texnoloji məhsulların istehsalında və əhalinin həyat səviyyəsinin yüksəldilməsində intellektual kapitalı əsas aparıcı amilə çevirərək elm-təhsil-istehsalat əlaqələrinin inteqrasiyasına daha diferensial yanaşma tələb edir. Bu baxımdan Elm və Təhsil Nazirliyinin yaradılması qlobal çağırışlar kontekstində vaxtında qəbul edilmiş qərardır və nazirlik qarşısında elm sahəsində dövlət siyasətinin və tənzimlənmənin həyata keçirilməsi, elmi müəssisə və təşkilatların elmi fəaliyyətinin əlaqələndirilməsi və istiqamətləndirilməsi ilə bağlı qabaqcıl təcrübəyə, yeni trendlərə və innovasion texnologiyalara əsaslanan titanik fəaliyyətin həyata keçirilməsi kimi ümdə vəzifələr qoyur.

**Problemin aktuallığı.** Elm, təhsil və istehsalat əlaqələrinin qlobal çağırışlar kontekstində araşdırılması Elm və Təhsil Nazirliyinin yaradılması ilə əlaqədar Prezident Fərmanı ilə səsləşən aktual problemdir.

**Problemin yeniliyi.** Elm təhsil və istehsalat əlaqələrinin inteqrasiyasında müasir texnologiyalara əsaslanan təkliflər paketi işlənmişdir.

**Problemin praktik əhəmiyyəti.** Təhsil müəssisələri üçün metodik vəsait kimi istifadə oluna bilər.

**Ədəbiyyat:**


1. https://naukarus.com/sintez-nauki-obrazovaniya-i-biznesa
2. Hüseynov H.Ə. Distant təhsil elmi-texnoloji və sosial inkişafın tərkib hissəsidir // -Bakı: Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, -2022. № 3.
3. Нурутдинова А.Р. Основные направления интеграции науки, образования и производства. // Современные наукоемкие технологии. -2012. № 4. -с.24-27
4. Иванкин Д.И., Емельяненко Е.Е. Синтез «Большой науки» и профессиональной подготовки в модели научно-исследовательской деятельности студента. // Вестник науки Сибири, -2017, № 2


**E-mail:** tk_xt2001@mail.ru

**Rəyçilər:** *ped.elm.dok., prof.* **M.İ. İlyasov,**
*ped.elm.dok., prof.* **M.C. Mahmudov**
**Redaksiyaya daxil olub:** 01.12.2022.

*UOT 37.0*

***İradə Böyükağa qızı Əmirəliyeva***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı elmi işçisi*
https://orcid.org/0000-0002-3319-7466

# ŞAGİRDLƏRİN ŞƏXSİYYƏTLƏRARASI MÜNASİBƏTLƏRƏ HAZIRLANMALARI

***Ирада Боюкага гызы Амиралиева***
*доктор философии по педагогике*
*ведущий научный сотрудник Института Образования Азербайджанской Республики*

# ПОДГОТОВКА УЧАЩИХСЯ К МЕЖЛИЧНОСТНЫМ ОТНОШЕНИЯМ

***Irada Boyukagha Amiraliyeva***
*doctor of philosophy in pedagogy*
*leading scientific worker at the Institute of Education of theRepublic of Azerbaijan*

# PREPARING STUDENTS FOR INTERPERSONAL RELATIONSHIPS

**Xülasə**. İnsanlar cəmiyyətdə, müəyyən kollektivdə, qrupda birgə yaşayıb fəaliyyət göstərirlər. Odur ki, istər-istəməz onların arasında qarşılıqlı münasibətlər baş verir. Həmin münasibətlərə sosial psixologiyada şəxsiyyətlərarası münasibətlər deyilir. Ona görə də hər bir insan uşaqlıq illərindən şəxsiyyətlərarası münasibətlərə hazırlanmalıdır. Məqalədə şagirdlərin şəxsiyyətlərarası münasibətlərə hazırlanmalarından bəhs edilir.

***Açar sözlər**: münasibətlər, şəxsiyyətlərarası münasibətlər, şagirdlər, şəxsiyyətlərarası münasibətlərə hazırlamaq, şagird şəxsiyyəti*

**Резюме.** Люди живут и работают вместе в обществе, в определенном коллективе, группе. Поэтому неизбежно возникают взаимоотношения между ними. Эти отношения в социальной психологии называются межличностными отношениями. Поэтому каждый человек должен быть готов к межличностным отношениям с детства. В статье говорится о подготовке учащихся к межличностным отношениям.

***Ключевые слова**: отношения, межличностные отношения, ученики, подготовка к межличностным отношениям, личность ученика*

**Summary**. People live and work together in a society, in a certain collective, group. Therefore, a relationship between them inevitably arises. These relationships in social psychology are called interpersonal relationships. Therefore, every person should be ready for interpersonal relationships from childhood. The article talks about preparing students for interpersonal relationships.

***Key words**: relationships, interpersonal relationships, students, preparation for interpersonal relationships, student's personality*

Şagirdin şəxsiyyətinin formalaşmasında son dərəcə əhəmiyyətli vəzifələrdən biri şəxsiyyətlərarası qarşılıqlı münasibətlərin inkişaf etdirilməsi məsələsidir. Ayrı-ayrı şəxslərlə, o cümlədən sinif yoldaşları ilə, tələbə dostlarla valideynlərlə, müəllimlərlə, qonşularla, bacı-qardaşlarla, qohumlarla qarşılıqlı münasibətlər şəxsiyyətin formalaşması üçün əsasdır.

Ünsiyyət fəaliyyəti məktəbəqədər yaşda meydana gəlir və kiçik məktəb yaşlarında intensiv şəkildə inkişaf edir. Böyüklər və həmyaşıdları ilə ilk qarşılıqlı təcrübənin nə olacağı uşağın şəxsiyyətinin inkişafında həlledici rol oynayır.

Şəxsiyyətlərarası qarşılıqlı münasibətlər ünsiyyət prosesində yaranır. Bu fikir baxımından demək mümkündür ki, məktəblilər arasında

şəxsiyyətlərarası münasibətlərin inkişafının və formalaşmasının özünəməxsus xüsusiyyətləri və çətinlikləri olacaqdır.

Kiçikyaşlı məktəblilər artıq sosial norma və tələblərə uyğun hərəkət etməyə alışır. Başqa bir tərəfdən, məktəbə davam etdiyi ilk günlər kollektiv əlaqələrin səviyyəsində azalma olur. Bunu, ibtidai sinif şagirdlərinin yeni qrupa (şagird kollektivinə) daxil olması, yeni sosial vəziyyətin və təhsil fəaliyyətinin formalaşması, nəticədə uşaqların uyğunluq səviyyəsinin yüksəlməsi ilə izah etmək mümkündür.

Ümumi təhsilin birinci pilləsində həmyaşıd qrupları şagirdlərin yaşadıqları ailələrin cinsinə, yaşına, sosial-iqtisadi vəziyyətinə görə formalaşır. Məktəblilər arasındakı münasibətlərdə fərqli xüsusiyyətlər özünü göstərir. Bu onların dostluğunun bir sıra xarici şərtlərə əsaslanması ilə bağlıdır. Belə ki, onlar eyni partada otururlar, qonşu evlərdə yaşayır, valideynləri birlikdə işləyirlər.

Qrupdaxili münasibətlər sistemində şagirdin mövqeyinə xarici görünüş, yüksək/aşağı məktəb göstəriciləri, ünsiyyətcillik səviyyəsi, temperament, istedadlılıq kimi amillər öz təsirini göstərir.

Həmyaşıdları arasında qarşılıqlı münasibətlərin müsbət inkişafına müəllimin böyük təsiri vardır. Bu isə, şagirdlərin statusunun formalaşmasına kömək edir.

Müəllim kiçikyaşlı məktəbliləri məzmunca maraqlı olan birgə fəaliyyətlərlə məşğul olmağa təşviq edir (oyun, o cümlədən rol oyunu, Analar Günü üçün səhnəcik hazırlamaq, konsert təşkil etmək, şeir demək və s.).

Kiçikyaşlı məktəblilər hələ də oyuna fəal maraq göstərirlər ki, bu da şəxsiyyətlərarası münasibətlərin formalaşmasına imkan verir.

İnsanlar cəmiyyətdə, müəyyən kollektivdə, qrupda birgə yaşayıb fəaliyyət göstərirlər. Odur ki, istər-istəməz onların arasında qarşılıqlı münasibətlər baş verir. Həmin münasibətlərə sosial psixologiyada *şəxsiyyətlərarası münasibətlər* deyilir. Şəxsiyyətlərarası münasibətlər birgə fəaliyyət və ünsiyyət zamanı insanlar arasında olan subyektiv qarşılıqlı təəssüratdır.

Hər bir şəxs dünyaya gəldiyi vaxtdan münasibətlər sisteminə daxil olur. Bu münasibətlər ayrı-ayrı şəxslərin bir-birində qavrayıb qiymətləndirdiyi yönəlmələr, stereotiplər, meyl, gözləmə, və s. sistemi özündə birləşdirir.

Şəxsiyyətlərarası münasibətlərdə subyektiv, psixoloji amillər həll edildiyindən bu amillər münasibətlər sistemində özünəməxsus rol oynayır. Odur ki, bu və ya digər adam qarşılıqlı münasibətdə olduğu şəxsin subyektiv mövqeyini öyrənmək istəyir. Həmin proses müxtəlif əlaqələr və yollar və vasitələr vasitəsilə reallaşır.

Sinfin şagird kollektivindəki mövcud şəxsiyyətlərarası münasibətlərdən xəbərdar olmadan onu idarə etmək qeyri-mümkündür. Bildiyimiz kimi, şəxsiyyətlərarası münasibətlər sosial qrupun ümumi fəaliyyətinə əsasən meydana gələn çoxcəhətli rabitə və münasibətlər sistemini təşkil edir.

Sosial psixologiya ilə tanışlıq göstərir ki, şəxsiyyətlərarası münasibətlərin *rəsmi, qeyri rəsmi, şəxsi, işgüzar* və s. növləri vardır.

1. ***Rəsmi*** münasibətlər rəsmi sənədlərə, normalara əsasən reallaşan şəxsiyyətlərarası münasibətlərə deyilir. Həmin münasibətlər rəhbər şəxslə tabe şəxs arasında olur.

2. **Qeyri-rəsmi** münasibətlər isə cəmiyyət üzvlərinin bir-birinə olan şəxsi münasibətləri əsasında qurulur.

Odur ki, bu münasibətlər subyektiv səciyyəyə malik olmaqla vətəndaşların bir-birlərinə olan simpatiyası, antipatiyasında və s. öz əksini tapır. Ona görə də belə qarşılıqlı münasibətlərinə şəxsi münasibətlər deyirlər.

3. Mövcud ədəbiyyatda diqqət **şəxsi** qarşılıqlı münasibətlərin aşağıdakı tiplərinə yönəlir: yoldaşlıq, dostluq, tanışlıq, ər-arvad münasibətləri (Ə.S. Bayramov, Ə.Ə. Əlizadə, R.İ. Əliyev).

Şəxsi qarşılıqlı münasibətlərin əsası insanların hisslər aləmi ilə əlaqədardır və emosional amillər zəminində təşəkkül tapır. Şəxslərarası münasibətlər hər bir insanın ümumi fiziki və emosional xoşbəxtliyindən ötrü önəmlidir.

Münasibətlər tənhalıqla mübarizədə şəxsiyyətə kömək göstərir, həm də insana həyatda məqsəd hissi bəxş edir.

4. Şəxsiyyətlərarası münasibətlərin digər növü ***işgüzar*** **münasibətlərdir.** Belə qarşılıqlı münasibətlər işgüzar əlaqələrin həyata keçirilməsi zamanı baş verir və tərəflərin əlbir fəaliyyətinin səmərəliliyinə təsirini edir.

Rəğbət və xoş niyyətin təzahürləri sayəsində kiçikyaşlı məktəblinin hər biri üçün rahatlıq və azadlıq mühiti formalaşdırılır. Bəzi göstəricilər şagirdin mövqeyinə mənfi, yaxud müsbət təsir göstərə bilər. Bununla belə, onun qrupdakı statu-

sunu aşağı salan başqa amillər də vardır. Məsələn: affektiv davranış, inadkarlıq, kobudluq.

Şəxsiyyətlərarası münasibətlər işgüzar, şəxsi, dostluq, ailə, yoldaşlıq münasibətləri kimi səciyyələnir. Bu münasibətlər, bir qayda olaraq "qarşılıqlı" sözü ilə xarakterizə olunur – qarşılıqlı əlaqə, qarşılıqlı güzəştəgetmə, qarşılıqlı anlaşma.

Şəxsiyyətlərarası münasibətlərin növləri ikidir: 1) rəsmi işgüzar münasibətlər; 2) şəxsi qeyri-rəsmi işgüzar münasibətlər. Bu münasibətlər idarənin, həmçinin bu və ya digər vəzifəli şəxsin müəyyən etdiyi hər hansı rəsmiyyətə, qaydalara riayət olunması ilə bağlıdır. Belə münasibətə nümunə kimi müəllimlə şagirdin, rəhbərlə tabeçiliyin münasibətini göstərmək mümkündür.

Şəxsiyyət münasibətləri şəxsi münasibətlər əsasında qurulur. Onlar müəyyən edilmiş formal qaydalarla məhdudlaşmır.

Başqa şəxslərin sizinlə bağlı xoş təəssürata malik olması və kollektivdə münasibətlərin yaxşılaşması üçün bəzi faydalı məsləhətlər nəzərə alınmalıdır. Diqqət yetirək:

1. Lüzumsuz, yersiz söhbətlər etməyin.
2. Davranışınıza, hərəkətlərinizə, oturuşunuza-duruşunuza nəzarət edin.
3. Yerinə yetirmək üçün sizə tapşırıq verilərkən tələsib onun icrasına hazır olduğunuzu göstərməyin.
4. Görünüşünüzə diqqət yetirin.
5. Diksiyanıza fikir verin.

Şagirdlərdə tolerantlığın, yəni səbirli, təmkinli, hövsələli, dözümlü olmaq, müsahibini axıra qədər dinləməyi, onu başa düşməyi və olduğu kimi qəbul etməyi bacarmaq tərbiyə olunması onların şəxsiyyətlərarası münasibətlərə hazırlanmalarında mühüm yer tutur. Məhz intoletantlıq, başqa sözlə səbirsizlik, hövsələsizlik, dözümsüzlük, tez özündən çıxmaq şəxsiyyətlərarası münasibətlərin normal axarda getməsinə maneçilik törədir, münasibətləri, ünsiyyəti çətinləşdirir.

Kiçikyaşlı məktəblilər arasında müsbət münasibətlərin zəif inkişafı çox da uğurlu olmayan sosial strategiyalardan təsirlənir. Şagirdlərin dörd davranış növü formalaşır.

*Birinci tip* – yararlanmağa əsaslanan qarşılıqlı münasibətlərin üstün tutulması.

*İkinci növ* – diqqətdə olmaq üçün hər şeyə hazır olmaq. Bu tip özünü xoşagəlməz davranışda, yersiz hərəkətlərdə büruzə verir.

*Üçüncü növ* – özünü böyüklər kimi görünməyə çalışmaq, özünü böyük yerində görmək. Belə şagird bir sıra hallarda sinif yoldaşları ilə qarşılıqlı münasibətlər qurmağa, ünsiyyət bağlamağa çalışmır.

*Dördüncü tip* – özündən kiçik və zəif, idarə oluna bilən uşaqların sıxışdırılması. Necə deyərlər, bu "qolu zorlu" uşaqlar, adətən rəhmsiz və iri cüssəli olurlar.

Uşağın həmyaşıdları ilə ünsiyyətində emosional iştirak dərəcəsi müəyyən olunmalıdır. Təlim prosesində, istərsə də ondan kənarda mehriban ünsiyyət dəstəklənir. Dost ünsiyyəti faydalıdır. Oğlanlarla qızlar arasında qarşılıqlı münasibətlərdə və ünsiyyətdə də müəyyən xüsusiyyətlər özünü büruzə verir.

Simpatiya və yoldaşlıq inkişaf etdikdə ünsiyyət istəyi meydana gəlir.

Sinifdəki ixtilaflı vəziyyətlər həm münaqişə vəziyyətində olanlara, həm də bütün komandaya mənfi təsir göstərir.

Psixoloqlar münaqişə vəziyyətində kiçikyaşlı məktəblilərin davranışı və rəftarı üçün beş ümumi strategiya üzərində dayanırlar:

*Rəqib strategiyası*. Münaqişə iştirakçısı istədiyinə çatana qədər öz mövqeyində dayanır. Dostun maraq və istəklərini nəzərə almadan onunla açıq qarşıdurma yaradır.

*Razılığagəlmə*. Şagirdlər hər iki tərəfin maraqlarına cavab verən qarşılıqlı razılığa gəlirlər, lakin ehtiyaclar hələ tam ödənilmir.

*Münaqişədən yayınmaq*. Tərəflər həm öz maraqlarına, həm də tərəfdaşın mənafelərinə rəğmən münaqişədən yayınmaq qərarına gəlirlər. Həmin strategiya münaqişə tərəflərindən birinin qalib mövqedə olan digərindən aşağı səviyyədə olmasını nəzərdə tutur. Daha məhsuldar və işlək strategiya əməkdaşlıq hesab edilir.

Münaqişə tərəfləri hər iki tərəfin maraqlarına cavab verə biləcək birgə hərəkətlərə dair razılıq əldə edirlər.

Deyilənlərdən görünür ki, hər bir şəxs, o cümlədən şagirdlər ailədə və məktəbdə şəxsiyyətlərarası münasibətlərə hazırlanmalıdırlar.

**Problemin aktuallığı**. Şagirdlər, o cümlədən kiçikyaşlı məktəbliləri şəxsiyyətlərarası münasibətlərə hazırlamaq öz aktuallığı ilə seçilir.

**Problemin yeniliyi**. Şagirdlərin şəxsiyyətlərarası münasibətlərə hazırlanmaları kimi mühüm bir məsələ diqqət mərkəzinə gətirilir.

**Problemin praktik əhəmiyyəti**. Məqalə doktorant, dissertant və magistrantlar üçün faydalı olacaqdır.

**Ədəbiyyat**:

1. Bayramov, Ə.S. Psixologiya: Ali təhsil müəssisələri üçün dərslik. / Ə.S. Bayramov, Ə.Ə. Əlizadə. Bakı: Çinar-Çap, 2002.
2. Abbasov, A.N. Pedaqogika nəzəriyyəsi və tarixi: Ali təhsil müəssisələri üçün dərslik. / A.N. Abbasov, L.A. Məmmədli, İ.B. Əmirəliyeva. Bakı: Mütərcim, 2022.

**E-mail**: amiraliyeva_i@mail.ru

**Rəyçilər**: *ped.elm.dok., prof.* **A.N. Abbasov**,
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub**: 05.12.2022.

*UOT 37.0*

***Nigar Eldar qızı Zeynalova***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dillər Universitetinin Pedaqogika kafedrasının müdiri,*
https://orcid.org/my-orcid?orcid=0000-0002-5107-8540

***Firuzə Namiq qızı Əliyeva***
*Azərbaycan Dillər Universitetinin müəllimi*

# MONTESSORİ METODİKASININ MAHİYYƏTİ VƏ PEDAQOJİ SİSTEMDƏ YERİ

***Нигяр Эльдар гызы Зейналова***
*доктор философии по педагогике, доцент*
*заведующий кафедрой Педагогики Азербайджанского Университета Языков*

***Фируза Намиг гызы Алиева***
*преподаватель*
*Азербайджанского Университета Языков*

# СУТЬ МЕТОДОЛОГИИ МОНТЕССОРИ И ЕЕ МЕСТО В ПЕДАГОГИЧЕСКОЙ СИСТЕМЕ

***Nigar Eldar Zeynalova***
*doctor of philosophy in pedagogy, associate professor*
*head of the department of Pedagogy at Azerbaijan University of Languages*

***Firuza Namiq Aliyeva***
*teacher at*
*Azerbaijan University of Languages*

# THE ESSENCE OF MONTESSORI METHODOLOGY AND ITS PLACE IN THE PEDAGOGICAL SYSTEM

**Xülasə.** Məqalədə Mariya Montessorinin özünütərbiyə, özünütəhsil və özünüinkişafı təmin edən yanaşmasınının metodik mahiyyəti açıqlanmışdır. O qeyd edir ki, uşaq daxili imkanlarından yararlanaraq müstəqil şəkildə şəxsiyyətinin inkişafını təmin etməlidir. Bunun üçün Montessori xüsusi inkişafetdirici mühit formalaşdırmış, uşağa sərbəst və müstəqil hərəkət etməsi, fəaliyyət göstərməsi üçün imkan yaratmışdır. Azadlıq və müstəqillik uşağa təbii inkişaf tempində dünyanı qavramağa, özünü müstəqil hiss etməyə, öyrənmə fəaliyyətinə olan marağı qoruyub saxlamağa təkan vermişdir.
***Açar sözlər:*** *uşaq, ətraf mühit, müəllim, inkişaf, müstəqillik, azadlıq*

**Резюме.** В статье раскрывается методический характер подхода Марии Монтессори к самовоспитанию, самообразованию и саморазвитию. Она отмечает, что независимо от возможностей внутри школы, индивидуальность ребенка должна обеспечивать развитие. Для этого Монтессори создала свободную и открытую для детей среду и возможность для движения и активности. Свобода и самостоятельность позволяют ребенку познавать мир в темпе естественного развития, чувствовать себя самостоятельным, дают толчок к сохранению и поддержанию интереса к активному обучению.
***Ключевые слова:*** *ребенок, окружающая среда, учитель, развитие, независимость, свобода*

**Summary.** The article reveals the methodical nature of Maria Montessori's approach to self-education, self-education and self-development. She notes that regardless of the opportunities within the school, its individuality must ensure development. To do this, Montessori created a free and open environment for children, created an opportunity for movement and activity. Freedom and independence allow the child to explore the world at the pace of natural development, to feel independent, gave impetus to the preservation and maintenance of interest in active learning.

***Key words:*** *child, environment, teacher, development, independence, freedom*

Mariya Montessori XIX əsrdə özünün pedaqoji sistemini irəli sürmüş ilk qadın pedaqoqdur. Psixiatrik klinikada həkim köməkçisi vəzifəsində çalışarkən inkişaf xüsusiyyətləri fərqli olan uşaqlarla ünsiyyət qurmuş, onların diqqətdən kənarda qalmasının qarşısını almaq məqsədilə inkişaf yanaşmasını hazırlamışdır. Sonralar bu yanaşma "Montessori inkişaf yanaşması" adlandırılmışdır.

Onun uşaq təhsili ilə bağlı fikir və təcrübələri təhsildə intibah kimi qəbul edilir. O, uşaqların böyüklərin surəti olmadığını, onlara böyüklər kimi yanaşılmasına qarşı çıxır, uşaqların "xüsusi həyat tərzi"nə hörmət duymağın vacibliyini irəli sürürdü. Montessorinin uşağa yanaşmasını nəzərə alsaq, onun Russonun ideyalarından bəhrələndiyini anlamaq o qədər də çətin olmaz. O, uşağı müstəqil bir fərd və Tanrının hədiyyəsi kimi görür, "Allah uşağa həyat yolunu müəyyən etmək üçün öyrənmə gücü verib" fikrini müdafiə edirdi. Montessori pedaqogikasının özəyində uşağın öz gələcəyini təyin etmək bacarığı dayanır. Təhsilin vəzifəsi uşağa yaşamaq üçün kömək göstərməkdir. Ana, ata və tərbiyəçilər uşağa özünü anlamağa, qavramağa yardım etməlidir. Bu fikri "bacarmağıma kömək edin" kimi ümumiləşdirmək olar. Montessori 0 - 18 yaş dövrlərinin uşağın sağlam bir fərd kimi inkişafında xüsusi rol oynadığını bildirirdi. Montessori yanaşmasında diqqətin cəmlənməsi, uyğun mühitin və təlim materiallarının qurulması mühüm yer tutur. Montessorinin prinsipləri və təhsil anlayışı bugünkü təhsil konsepsiyası ilə tam uzlaşır. Bu baxımdan Montessorinin pedaqoji yanaşmasına əsaslanan məktəblər dünyada geniş yayılmaqdadır. Mariya Montessorinin nəzəriyyəsi uşağa təlim fəaliyyətinin mərkəzi və lideri kimi yanaşmağa zəmin yaradır. Montessori pedaqogikası təhsilin təbii bir proses olmasını dəstəkləyir və uşağın öz daxili səsini dinləyərək hərəkət edəcəyinə inanır, belə ki, kiçikyaşlı həm özünənəzarəti, həm də öyrənməni reallaşdırır. Montessori yanaşması kiçikyaşlılara araşdırma aparmaq, cəhd etmək, səhvlər buraxmaq və səhvlərini düzəltmək imkanı verir, uşaqlara materialların, formaların və rənglərin naməlum xüsusiyyətlərini hiss orqanları ilə araşdırmaq üçün mühit formalaşdırır. Həmin mühitdə uşaqlar həmyaşıdları və böyüklərlə qazandıqları təcrübələr vasitəsilə öyrənir və bundan zövq alırlar. Böyüklər də həmçinin uşaqlarla birlikdə kəşf etməkdən həzz alırlar. Uşaqlar bilik qazanmaq üçün oyun müşahidələrindən və emosiyalarından yararlanır, biliklərini nizamlamaq üçün işarələrdən istifadə edir və ətraf mühitlə qarşılıqlı əlaqədə olur, beləliklə, təcrübə toplayırlar. Montessori siniflərində uşaqlara sinifdə və açıq havada istədikləri kimi fəaliyyət göstərməyə icazə verilir. Uşaqlar bu ərazilərdə sərbəst hərəkət edə bilərlər. Hərəkətlərdəki bu sərbəstliyə görə Montessori yanaşmasına əsaslanan təlim müəssisələrində məşğulluq ənənəvi məktəblərdəki kimi dərs, istirahət və ya oyun vaxtlarına bölünmür. Montessori sinfində uşaq istədiyi fəaliyyəti özü seçir. Uşağa öz təhsilini seçə bilməsi üçün müxtəlif fəaliyyət növləri təklif olunur.

Montessori siniflərində uşağın ətrafındakı əşyalar onun bədən quruluşuna və fiziki gücünə uyğunlaşdırılmalıdır. Kiçikyaşlıların rahat hərəkət edə biləcəyi yüngül mebellər, əlini uzadıb çata biləcəyi şkaflar, qıfıllar, çəkməcə və qapılar, əlləri asanlıqla çatan paltar asılqanları, barmaqları ilə tuta biləcəkləri fırçalar, əllərinə sığacaq sabunlar, qısa və düz tutacaqlı süpürgələr, rahat geyinib çıxara biləcəkləri paltarlar olmalıdır. Bunlar həm də uşaqların özlərini inkişaf etdirmələrinə və müstəqil fərd kimi yetişməklərinə şərait yaradacaqdır.

Montessori uşağın təbiətlə təmasda olmasının vacibliyinə diqqət çəkmişdir. Montessorinin fikrincə, uşaqlar təbiətin nizamını, harmoniyasını, gözəlliyini dərk etməli və ondan ilham almalıdırlar. Çünki təbiət qanunları elmin və sənətin əsasını təşkil edir. Montessori mühitinin təbiətlə sıx bağlı olan elementlərindən biri də həyata müsbət reaksiya verməyə stimullaşdıran gözəllik və atmosferdir. Bu səbəbdən Montesso-

ri sinfi yaxşı və cəlbedici şəkildə qurulmalıdır. Rənglər canlı, maraqlı və ahəngdar olmalıdır. Montessori mühitinin mühüm elementlərindən biri Montessori alətləridir. Montessori uşaqların səhvləri özlərinin tapmasını, onların müstəqil təhsilini dəstəkləyir. Müəllim uşağın səhvini demir. Əgər uşaq öz səhvini görə bilmirsə, bu, uşağın kifayət qədər inkişaf etmədiyini göstərir. Montessori siniflərində sağlam mühit olmalıdır və uşaqlar layihələrin müddətini və kiminlə işlədiklərini özləri seçməlidirlər. Rahat mühit uşaqda şəxsi nizam-intizamı inkişaf etdirir. Montessori yanaşmasında müəllim ətraf mühitin hazırlanmasına və uşaqların ətraf mühitlə qarşılıqlı əlaqəsinə şərait yaratmağa cavabdehdir. Mariya Montessori tərəfindən hazırlanmış "erkən uşaqlıq" təhsil sistemində üç əsas element vardır: *uşaq; ətraf mühit; müəllim.*

Erkən uşaqlıq təhsili sisteminin əsasında uşağı böyüklərin istədiyi kimi deyil, olduğu kimi müşahidə edib anlamağa çalışmaq ideyası dayanır.

Montessori metodu uşaqların özlərinin tətbiq edərək öyrənməyin ən yaxşı və asan yolunu tapmasına imkan yaradır. Uşaqlar öz maraqlarına səbəb olan fəaliyyətləri seçməkdə sərbəstdirlər. Beləliklə, kiçikyaşlılar "əsərlərində" azadlıq hissini yaşaya bilərlər. Çünki onlar başqasının tələb etdiyini deyil, öz istədiklərini (öyrənərkən xoşbəxtlik və arzu içində) edirlər. Montessori metodu uşağın öyrənmək istəyinə əsaslanır. Bu sistem davamlı öyrənmə üçün ömür boyu motivasiya təmin edir. Montessori yanaşması uşağın təbii böyüməsinə və inkişafına uyğun gələn, fəaliyyətləri həyata keçirməyə imkan yaradan sistemdir. Montessori materialları müəllimin sinif otağına gətirdiyi hər cür sadə, kiçik, asan hazırlanan alətlərdir. Həmin materiallarla uşaq həm fərdi, həm də dostları ilə öyrənir, öz seçimlərini edir, sinifdə qaydalara uyğunlaşmağı öyrənir, hətta dostlarını onlara riayət etmələri üçün məlumatlandırır. Hər bir uşağın uğur qazanma ehtimalı daha yüksəkdir, çünki o, fəaliyyətini seçir və onu öz sisteminə uyğunlaşdırır. Beləliklə də, uşağın böyüklərin təzyiqindən uzaq, öz dünyasını kəşf edə biləcəyi, zehnini və bədənini inkişaf etdirə biləcəyi rəqabətsiz bir mühitdə böyüməsi təmin olunur. Montessori sistemində tətbiq olunan yaşayış sahələri vardır. Uşaq bu sahədə özünü təmin etməyi və ətrafına qayğı göstərməyi öyrənir. Bu sahədə o, düyməni vurmağı, ayaqqabı bağını bağlamağı, əşyalarını yığıb şkafına və çantasına qoymağı, stolu silməyi, dostlarına kömək etməyi, dərs təşkil etməyi, xidmət etməyi, kağızın necə əldə edildiyini və s. kimi həyati fəaliyyətləri öyrənir. Montessori sistemində uşağa emosional şəkildə dünyanı öyrənmək üçün duyğularından istifadə etmək (müxtəlif boyları, uzunluqları, çəkiləri, rəngləri, səsləri, qoxuları, formaları qavramaq) öyrədilir. Xarici dil, elm – təbiət, rəsm, musiqi, riyaziyyat uşağın intellektual inkişafına kömək göstərir. Rəqs və gimnastika kimi bədən məşqləri onun fiziki inkişafına təkan verir. Montessori metodu unikaldır, çünki xüsusilə kiçikyaşlı uşaqlar üçün hazırlanmış, nizam və azadlıq arasında məntiqi tarazlıq üzərində qurulmuşdur. O, uşağın təbii ehtiyaclarına uyğunlaşan, diqqətlə hazırlanmış materiallarla xoş bir mühit təmin edir. Montessori təhsilinin əsasında aşağıdakı elementlər dayanır: normallıq və kənarlaşma. Normallıq ideal uşaq kimi deyil, fərdin fitri qabiliyyətləri ilə mövcud həyat və təhsil şəraitində ən yaxşı inkişafa nail olmaq kimi başa düşülməlidir. O, "kənarlaşma" anlayışını yanlış tərbiyə ilə üzləşən, empatiya göstərilmədiyini hiss edən uşaqlarda yaranan sərtlik kimi dəyərləndirir. Bu maneələr ruh düşkünlüyü, "sınma" asılılıqla nəticələnir, uşaqda xəyalpərəstlik, aqressiya, tənbəllik kimi hisslər baş qaldırır. "Normallaşdırılmış" uşaq aşağıdakı xüsusiyyətlərə malikdir: nizam-intizam, həvəs və həqiqətə, səssizliyə, tək işləməyə meyl, müstəqillik, sahibkarlıq, qarşılıqlı yardım, özünüintizam.

Montessori uşağın ruhunu boş vərəq kimi göstərən təhsil baxışlarına qarşı çıxmış və öz nəzəriyyəsini beş mühüm konsepsiyada birləşdirmişdir. Montessorinin fikrincə, hər bir insan dünyaya müəyyən potensialla gəlir:

*a) həyati qüvvət:* uşaqda anadangəlmə bir fəaliyyətdir;

*b) psixi yaşam:* insan zehni orqanizmdir;

*c) potensial:* fitri hazırlıq vəziyyəti;

*d) mentalitet:* uşaq doğulduğu andan etibarən ətrafını bütünlüklə qavrayır.

Ətrafındakı hər şeyi hissləri ilə qəbul edə bilir. Bunu edərkən qavrayış şüursuz şəkildə gedir. Uşağın tənqidi bacarıqlara sahib olana qədər keçdiyi proses çox önəmlidir. Bu mövzuda valideynlərin üzərinə böyük öhdəliklər düşür: düzgün davranış nümunələri, düzgün tərbiyəvi söhbətlər, uşağa sevgi və şəfqətlə yanaşmaq.

*e) Həssas mərhələlər:* uşağın duyğu və zehni fəaliyyəti həssaslığa əsaslanır. Montessori həssaslığın təsadüfi olmadığını düşünür. Kiçikyaşlılar ətraf mühitlə qarşılıqlı əlaqədə inkişaf edirlər. Dil bacarıqları, sosial və hərəkət bacarıqları üçün ayrıca həssaslıq mərhələləri vardır. Burada əsas amil həm yetkinləşmə, həm də öyrənmədir. Montessori öyrənməyə daha çox diqqət yetirmişdir, çünki yetkinləşmə ətrafdan daim stimullarla qidalanır. Yetkinləşmə pillələrini daha asan və ən yüksəyə qalxmaq üçün ətrafın dəstəyinə uşağın ehtiyacı vardır. Təhsil vasitəsilə uşaq yaxşı qurulmuş mühit və hazırlanmış öyrənmə imkanları ilə öz potensialını maksimum dərəcədə artıra bilər. Montessori 0-3, 3-6, 6-12 və 12-18 yaş üçün səciyyəvi xüsusiyyətləri və həmin yaşlara uyğun temp barədə geniş məlumat vermişdir. Hər bir mərhələnin öz həssaslıqları, ehtiyacları və xüsusiyyətləri vardır. Montessori nəzəriyyəsinin məqsədi uşağa təzyiq olmadan, qrup məcburiyyəti tətbiq etmədən onun fərdi inkişafını və müstəqilliyini dəstəkləyən tapşırıqlar hazırlamaq, intizamlı təhsil proqramı yaratmaq idi. Montessorinin fikrincə, təhsilin əsas vəzifəsi uşağı onun inkişafını dəstəkləyən, müstəqilliyinə imkan verən, sərbəst şəkildə kəşf edə biləcəyi mühitə hazırlamaqdır. Yaşadığımız mühitdə hər bir element böyüklər üçün yaradılmışdır. Bu səbəbdən də uşağın fəaliyyətinə, öyrənmə və araşdırma motivasiyasına məhdudiyyətlər qoyulur. Belə bir mühitdə uşağın müstəqil öyrənməsi, potensialını inkişaf etdirməsi, həmçinin əsas hadisələri və davranışları qavraması mümkün deyil. Montessori "hazırlıq mühiti"nin önəmini vurğulamışdır. Hazırlıq mühiti uşağın şəxsiyyətinin formalaşması üçün mədəniyyətyönlü inkişaf sahəsidir. Bu prinsipə sadiq qalaraq, kiçikyaşlının istifadə edəcəyi bütün əşyalar uşağın psixoloji və fizioloji imkanlarına uyğunlaşdırılmalıdır. Uşağın zəruri ehtiyaclarını qarşılayacağı hamam və mətbəx kimi mühitlər də önəmlidir. Kiçikyaşlının istifadə etdiyi bütün materiallarda, tapşırıqlarda, ümumiyyətlə hər bir fəaliyyətində fərdi harmoniyaya diqqət yetirilməli, çətinliklər minimuma endirilməlidir. Bütün materiallar açıq şkaflarda və uşağın əli çatan yerdə yerləşdirilməlidir. Uşaq öz maraq və bacarıqlarına uyğun şəkildə böyüklərdən asılı olmadan tapşırıq və ya obyektləri seçməyi öyrənməlidir.

Montessori kiçikyaşlının həyatında və inkişafında oyunun əhəmiyyətini vurğulamaq məqsədilə uşağın fəaliyyətini "iş" anlayışı ilə paralel etmişdir. O, uşağın yemək bişirməsi, masanı düzməsi və yığması kimi fəaliyyətlərə, tapşırıqlara xüsusi diqqət yetirmişdir. Uşaqların özləri tərəfindən icra edilən fəaliyyətlər təhsilin bir hissəsidir. Montessori uşaq bağçasının qurulmasında yuxarıda qeyd olunan prinsiplərlə yanaşı, müəssisənin strukturu və tərtibatı da böyük rol oynayır. Hər alətdən yalnız bir ədəd olmalıdır, çünki artıqlıq uşağı hərəkətsizliyə sövq edir. Montessori metodunda bölünmüş öyrənmə sahələri və hər sahə üçün material qrupu vardır:

– ***Gündəlik həyat tətbiqləri guşəsi***: bu qrupda gündəlik həyat üçün gərəkli bütün materiallar uşağa uyğun şəkildə təqdim olunur. Özünəxidmət və həyatin təmizlənməsi, bitkilərə, heyvanlara qulluq üçün lazım olan bütün alətlər öncədən sinifdə yerləşdirilməlidir;

– ***Sensor materiallar:*** bu qrupa duyğuların inkişafına zəmin yaradan materiallar daxildir. Bütün sensor materiallar açıq şkaflarda (çəhrayi qala, qüllə şəklində) yerləşdirilməlidir. Hər bir uşaq tərbiyəçinin rəhbərliyi ilə materialı istədiyi fəaliyyətə daxil edə bilər. Beləliklə, həmin materiallar ilə yalnız duyğu stimulları təmin edilmir, həm də motor bacarıqları haqqında fikir formalaşdırılır;

– ***Riyazi materiallar və "danışan" materiallar guşəsi:*** maddi guşələrdən əlavə, oyunlar və fəaliyyətlər də Montessori təhsilinin bir hissəsidir. Belə zəngin nəzəri baza sayəsində Montessori yanaşması hələ də öz aktuallığını qoruyur.

Montessori yanaşmasında əsas məqsəd uşağın azad, məsuliyyətli, müstəqil konstruktiv şəxsiyyət kimi formalaşdırılmasıdır. Bu səbəbdən də Montessori yanaşması ilə təhsil verən məktəblərdə hamam, mətbəxdən tutmuş qapı dəstəklərinə qədər hər bir element uşağa uyğun düzülür. Uşağın zəruri ehtiyaclarını özünün ödəmək potensialı var və düzgün istiqamətləndirildikdə bu potensial maksimum səviyyədə üzə çıxacaqdır.

*Montessori pedaqogikasının üstünlükləri:*

- yanaşmanın əsas üstünlüyü uşaqları şəxsi inkişaf tempinə uyğun, həmyaşıdları ilə yarışmadan, proqramsız öyrətməkdir. Montessori otaqlarında uşaqlar darıxmır, təşəbbüskarlıq göstərir, öyrənməyə həvəslə yanaşır, özlərinə maraqlı məşğuliyyətlər tapır, yoldaşları ilə əməkdaşlıq edir, vəzifələrinin öhdəsindən gələ bilirlər;

- montessori yanaşması uşaqyönlüdür, burada avtoritar üslub qəbulolunmazdır;
- Montessori yanaşması hər bir uşağın psixoloji xüsusiyyət və imkanlarını nəzərə alır;
- pedaqoqun hazırladığı xüsusi mühit uşağın müstəqil və təbii inkişafına zəmin yaradır;
- didaktik materiallar cəlbedicidir, uşağın yaş xüsusiyyətlərinə müvafiqdir. Materialların özünənəzarət imkanları uşağa səhvlərini müəyyənləşdirmək imkanı verir və onun özünə – hörmət hissini zədələmir;
- uşaq yaxın inkişaf zonasında fəaliyyət göstərir, buna görə fəaliyyətin müvəffəqiyyəti təmin edilir. Uşağın şəxsi fəaliyyət tempi və seçimi olduğu üçün onun özünü göstərmək və müvəffəqiyyət qazanmaq imkanları genişdir. Bu, yüksək özünüqiymətləndirməni formalaşdırır. Montessori pedaqogikasında yarış yolverilməzdir.

*Yanaşmanın çatışmazlıqları:*

- intellektin və praktik bacarıqların inkişafına yönəlmişdir;
- yaradıcılığın inkişafı bir qədər diqqətdən kənarda qalır, uşaqların yaradıcı fəaliyyəti üçün xüsusi zona, guşə nəzərdə tutulmamışdır;
- hərəkətli və rollu oyunlar yox səviyyəsindədir;
- Montessori yanaşmasından sonra uşaqlar adi bağça və məktəblərin kollektiv fəaliyyətinə, nizam-intizamına alışmaqda çətinlik çəkirlər;
- uşaqların marağını cəlb edən vəsaitlər kifayət qədər bahalıdır.

**Problemin aktuallığı**. Müasir dövrdə təhsilalanın özünütərbiyə, özünütəhsil və özünüinkişaf amilləri pedaqoji prosesin ən aktual problemlərindən biri hesab olunur. Bu baxımdan Mariya Montesorrinin inkişaf yanaşması nəzəri baxımdan aktuallıq kəsb edir.

**Problemin elmi yeniliyi.** Montesorrinin inkişaf yanaşmasının pedaqoji üstünlükləri və çatışmazlıqlarının təhlilinin təqdim olunmasındadır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən gənc tədqiqatçılar, eləcə də pedaqoji fəaliyyətdə olan müəllimlər faydalana bilər.

**Ədəbiyyat:**


1. AAMR/American Association on Mental Retardation (1993) Mental Retardation: Definition, Classification and Systems of Supports. (9th Edition) Washington, DC.
2. Beghetto, R.A. (2005) Does Assessment Kill Student Creativity? The Educational Forum, 254–263.
3. Bender, M., Valletutti, P.J., (1982). Teaching Functional Academics: A Curriculum Guide for Adolescents and Adults with Learning Problems. Baltimore: University Park Press.
4. Black, P., Harrison C., Lee C., Marshall B., Wiliam D. (2004) Working Inside the Black Box: Assessment for Learning in the Classroom. Phi Delta Kappan, 86(1), 9-21.
5. Brockling, U. (2006) “On creativity: A brainstorming session”, Education Philosophy and Theory, vol. 38, no. 4, pp. 513–521.
6. Brolin, Donn E. (1991). Life Centered Career Education A Competency Based Approach. (3th Edition) Published by the Councel for Exceptionel Children, USA.
7. Glen, E.Thomas (1996). Teaching Students with Mental Retardation: A Life Goal Curriculum. Planning Approach Prentice-Hall, Inc, USA.
8. Gathercole C.E., (1984). Residential Alternatives for Adults who are Mentally Handicapped. Published by British Institute of Mental Handicapped.
9. Goffin G.S., (1994). Curriculum Models and Early Childhood Education. Macmillan Collage Publishing Company, New York.
10. Lillard, P.P, (1972). Monressori a Modern Approach-schocken. Books New York.
11. Montessori, M. (1995). The Aduanced Montessori Method, Vol I. Introduced by Leffrey Stern, Unifacmanu, Thoemmes Press, England.
12. Montessori, M. (1966). The Montessori Method, Interoduction by J. Mc. V.Hunt. Seventh Printing. New York. Schocken Books.
13. Patton, J.R., Smith, G.M. Clark, E.A. Polloway, E. Edgar, "Individuals with Mild Mental Retardation: Postsecondary Outcomes and Implications for Educational Policy", 75-85.
14. Tuckman, W.B., (1991). Educational Psyhology. Harcourt Brace Javanovich College Publishers. New York U.S.A.18-22.


**E-mail:** nigarzeynalova777@gmail.com

**Rəyçilər:** *ped.elm.dok., prof.* **İ.H. Cəbrayılov,**
*ped.ü.fəls.dok., dos.* **V.P. Bəşirov**
**Redaksiyaya daxil olub**: 30.11. 2022.

*UOT 37.0*

***Adilə Həsən qızı Nəzərova***
*filologiya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı elmi işçisi*

# TƏHSİLİN MÜASİR PROBLEMLƏRİ VƏ ELMİ-PEDAQOJİ ƏSASLARINA DAİR

***Адила Гасан гызы Назарова***
*доктор философии по филологии, ведущий научный сотрудник*
*Института Образования Азербайджанской Республики*

# О СОВРЕМЕННЫХ ПРОБЛЕМАХ ОБРАЗОВАНИЯ И НАУЧНО-ПЕДАГОГИЧЕСКОЙ ОСНОВЕ

***Adila Hasan Nazarova***
*doctor of philosophy in philology, leading scientific employee at the*
*Institute of Education of the Republic of Azerbaijan*

# ON MODERN PROBLEMS OF EDUCATION AND THE SCIENTIFIC AND PEDAGOGICAL BASIS

**Xülasə.** Təhsil bir sistem və sosial hadisədir. Bu hadisəni meydana gətirən və onu sistemə çevirən dəyişikliklər düzgün təhlil edilməlidir. Təhsil siyasəti, təhsil fəlsəfəsi, kurikulum, məktəb mədəniyyəti, məktəb rəhbərləri, müəllimlər, şagirdlər və valideynlər təhsilin əlaqəli tərəfləri sayılır. Təhsil müxtəlif dəyişiklikləri ehtiva etdiyi və bu sistemlərdə baş verən hər cür dəyişikliklərdən, təhsil problemlərindən təsirləndiyi üçün qarşımızda mürəkkəb bir proses kimi dayanır.
***Açar sözlər:*** *təhsil, təhsil siyasəti, təhsil fəlsəfəsi, təhsil proqramı, təhsili idarə edənlər*

**Резюме.** Образование – это система и социальное явление. Изменения, формирующие это явление и превращающие его в систему, должны быть надлежащим образом проанализированы. Образовательная политика, образовательная философия, курикулум, школьная культура, руководители школ, учителя, ученики и родители считаются связанными сторонами образования. Образование предстает перед нами как сложный процесс, поскольку объединяет различные изменения и подвергается влиянию всевозможных изменений и образовательных проблем, возникающих в этих системах.
***Ключевые слова:*** *образование, образовательная политика, образовательная философия, образовательная программа, управляющие образованием*

**Summary.** Education is a system and a social phenomenon. The variables that generate this phenomenon and bring it into a system must be analyzed properly. The policy of education, the philosophy of education, curriculum, school culture, school administrators, teachers, students and parents can be considered as systems that education is associated. Because of involving different variables and being influenced by all kinds of changes that occur in these systems problems of education stay as a complex process.
***Key words:*** *education, policy of education, curriculum, philosophy of education, the education manager*

Təhsilin əsas funksiyalarını yerinə yetirmək üçün təhsil sistemində problemlər və çatışmazlıqlar aradan qaldırılmalıdır. Məktəbəqədər təhsil təhsilin mühüm pillələrindən biridir. Bu təhsillə uşaqların cəmiyyətə uyğunlaşması və həyatlarını daha yaxşı idarə etməsi üçün zəruri olan əsas bilik və bacarıqlar əldə edilir. İlkin mərhələdə uşaqlar savad, ana dilindən düzgün və səmərəli istifadə, oxuyub anlama, əsas riyazi əməliyyatlar, mühüm ictimai və təbiət hadisələri haqqında ilkin biliklərə yiyələnirlər.

Təhsilin istənilən pilləsində problemlər, həllər və dəyişikliklər həm əvvəlki, həm də sonrakı addımlara təsir göstərir. Məktəbəqədər təhsilin problemləri təhsil siyasəti, kurikulum, təhsil fəlsəfəsi, müəllim və şagird ixtisasları, təhsil meneceri və maliyyə məsələləri çərçivəsində həll edilir. Bu sahədə yaranan problemlər aşağıdakı cədvəldə göstərilir.

| Müəllimlərin ixtisaslaşması məsələsi | Təhsil proqramı məsələsi | Təhsil siyasəti məsələsi |
|---|---|---|
| ➢status məsələsi<br>➢maaş məsələsi<br>➢müəllimlə şagirdin empatiya qura bilməməsi<br>➢ümumi mədəniyyət çatışmazlığı<br>➢pedaqoji bilgilərin çatışmazlığı<br>➢peşəkar biliyin olmaması<br>➢qərarla razılaşmamaq<br>➢ixtisasartırma təlimində çatışmazlıqlar | ➢mərkəzi proqram tətbiqi tərcümə proqramlarından istifadə<br>➢təhsil fəlsəfəsi dərsinin olmaması məzmunla bağlı problemlər<br>➢prosesdən irəli gələn problemlər qiymətləndirmədən yaranan problemlər<br>➢proqramın təşkilində təhsillə bağlı insanların iştirakının olmaması və ya yetərsizliyi | ➢beynəlxalq təhsil siyasətinin olmaması<br>➢dinamik, müasir və dəyişən təhsil siyasətinin olmaması<br>➢rəhbərliklə birgə təhsil siyasətinin davamlı dəyişməsi |

↓

Təhsilin əsas problemləri

↑

| | | | |
|---|---|---|---|
| ➢İdarə edənlərin mütəxəssis olmaması<br>➢İdarə edənlərin səlahiyyət və məsuliyyət məsələləri<br>➢İdarəçilikdə mütəxəssislərin olmaması və ya az olması | ➢Məktəblərdə fiziki qüsurluların hərəkətlərinə təsir edən problemlər<br>➢Məktəblərdə material çatışmazlığı məktəblərdə maliyyə çatışmazlığı<br>➢Alət və aparat çatışmazlıqları<br>➢Birləşdirilmiş sinif, ikili təhsil və daşınan təhsil tətbiqləri | ➢ Şagird hazırlığı<br>➢Məktəbəqədər təhsilin yetərsizliyi<br>➢İmkan bərabərsizliyi məsələsi<br>➢Ailənin sosial-iqtisadi və mədəni durumu<br>➢Ailənin təhsilli olub-olmaması<br>➢Sosial medianın mənfi təsiri | ➢Təhsil siyasətinin Qərbyönlü olması<br>➢Milli təhsil fəlsəfəsinin olmaması<br>➢Öyrədənlərin, təcrübə keçənlərin təhsil fəlsəfəsindən xəbərsiz olması |
| Təhsilin idarə edilməsindən irəli gələn problemlər | Maliyyə məsələsi | Şagirdlərin ixtisas seçimi məsələsi | Təhsil fəlsəfəsi məsələsi |

*Təhsil siyasətindən yaranan problemlər*. Təhsil siyasəti milli bir layihədir və keçmişin izlərini daşıyır, digər tərəfdən bu günün tələblərini ödəməklə gələcəyə dair təsəvvürləri də özündə ehtiva edir. Təhsil siyasəti davamlı, əhatəli və inkişaf etdirilə bilən olmalıdır. İdeologiyaları fərqli olsa da, hər bir ölkənin milli təhsil siyasəti var. Ölkə Prezidentinin təhsil siyasətindəki prinsipləri və islahatları Azərbaycan Təhsil Sisteminin əsas siyasətini təşkil edir ki, bunu onun təhsillə bağlı dediyi *"Təhsilin inkişafı dövlət siyasətinin əsas prioritetlərindəndir"* sözləri ilə ümumiləşdirmək olar.

Təhsil proqramları hazırlanarkən, təhsil siyasətinin təşkili zamanı inkişaf etmiş ölkələrdən faydalanmaq lazımdır. Lakin faydalanmaq, o ölkələrin təhsil siyasətini tam şəkildə götürüb istifadə etmək kimi şərh edilməməlidir. Keyfiyyətdən çox kəmiyyətə əsaslanan təhsil siyasətimizə baxmayaraq, təhsilimizdə say baxımından gözlənilən səviyyədə olduğumuzu demək çətindir.

*Təhsil proqramlarından yaranan problemlər.* İnkişafı təmin etmək üçün təhsil sisteminin elementləri dövrün tələbləri ilə ayaqlaşmalıdır. Bu elementlər təhsilin keyfiyyətinə bilavasitə təsir edən elementlərdir və bunlar təkmilləşdirilmədikcə ixtisaslı təhsil sisteminin mövcudluğundan danışmaq mümkün deyil. Bu kontekstdə verilməli olan bəzi suallar aşağıdakı bəndlərlə göstərilir:

a) Təhsil proqramları:

➢ dünya və ölkə reallıqlarına əsaslanırmı?

➢şagirdlərə yaşın tələb etdiyi bilik və bacarıqları verirmi?

➢ araşdırmağı və əməkdaşlığı öyrədirmi?

➢ danışıq və müzakirə bacarıqlarını inkişaf etdirirmi?

b) Öyrənmənin üsulları və texnikası:

➢ müasir və effektivdirmi?

➢ birdən çox hiss orqanına müraciət edirmi?

➢ tələbə mərkəzlidirmi?

➢ şagirdlərin fərdi fərqliliklərini nəzərə alırmı?

➢ fərdi yanaşma şagirdləri həvəsləndirir və öyrənməyi asanlaşdırırmı?

c) Ölçmə və qiymətləndirmə vasitələri – müsahibə, testlər və imtahan:

➢ o, məlum olanı naməlumdan ayıra bilirmi?

➢ o, öyrənmənin baş verib-vermədiyini göstərə bilərmi?

➢ təhsildə məhsuldarlığın və keyfiyyətin ölçülməsində həssasdırmı?

➢ ölçmə nəticələri müəllimin istifadə etdiyi tədris materiallarının, tədris metod və üsullarının, qiymətləndirmənin səmərəliliyi barədə rəy verirmi?

Yeni təhsil təcrübələrini nəzərdə tutan təhsil proqramları və modelləri hazırlanarkən inkişaf etmiş ölkələrdən faydalanmaq və onlarla əməkdaşlıq etmək lazımdır. Ancaq siyasətdə olduğu kimi, təhsil proqramlarında inkişaf etmiş ölkələrin təhsil proqramlarını götürüb istifadə etmək də problemlər yaradır.

*Təhsil fəlsəfəsi problemləri.* Təhsil fəlsəfəsi təhsil və fəlsəfənin qarşılıqlı əlaqəsinin təhsildə tətbiqidir. Fəlsəfə fənlərin istiqamətləndirilməsi, işlənməsi və qiymətləndirilməsi üçün əsas rəhbər fəndir və təhsil fəlsəfəsi də təhsilin fəaliyyətində bələdçi rolunu oynayır (3, s. 3).

"Brauner və Burns fəlsəfədən uzaq bir təlim və təhsilin vəziyyətini yanında bələdçi olmadan yolunu azacaq görmə qabiliyyəti olmayan bir şəxsin vəziyyəti ilə müqayisə edirlər" (5, s. 301). Bu bənzətmədən də göründüyü kimi, fəlsəfə və təhsil qarşılıqlı əlaqədə olaraq bir-birini formalaşdırır.

Təhsil fəlsəfəsi təhsil siyasətinin müəyyənedicisi kimi keçmişin izlərini daşıyan, günün tələblərini nəzərə alan, həm də gələcəyə dair təsəvvürləri özündə ehtiva edən bir araşdırma sahəsidir (3, s .4).

Təhsilin əsas prinsiplərindən biri də Ekzistensial (mövcudluq) təhsildir ki, məqsədi insan azadlığının hər şeydən üstün olduğunu öyrətməklə fərdə öz fərdiliyini inkişaf etdirmək imkanı verir. Nəzərə alaq ki, təhsil həm də xarakter yaratmaq üçün fəaliyyətdir. Təhsildə əsas məsələ insanın öz gücünü və vəziyyətini görməsinə mane olan çaşqınlıqlardan zehni xilas etməkdir. Ekzistensial təhsildə şagirdin özünü dərk etməsi üçün müxtəlif proqramlar daxil edilməli, alətlər, materiallar, mövzular və resurslar müxtəlif olmalıdır.

Alimlər qeyd edirlər ki, milli təhsil fəlsəfəsini reallaşdırsaq, görərik ki, inkişaf etmiş ölkələrdə tətbiq edilənləri köçürmək bacarıq deyil, bu səhv uzun illərdir, hətta bu gün də davam edir. Bu sahədə tədqiqatlar aparılmalı, ölkəmizin bu sahədə ehtiyacları düzgün təhlil edilməli və imkanlardan tam istifadə edilməklə səylər göstərilməlidir.

*Müəllimlərin ixtisaslaşması problemləri.* Müəllim səriştələri mövzusu təhsilin ən mühüm problem sahələrindən biridir.

Müəllim öz sahəsindəki biliyi, ümumi mədəniyyəti və bir pedaqoq kimi formalaşması baxımından yaxşı hazırlanmalı və mütəxəssisi olduğu sahədə səriştəsini artırmalıdır. Müəllimin rolu təkcə öyrətməkdən ibarət deyil, rəhbərlik ölçüsündən (Konseptual, münasibət, sosial) xəbərdar olmaq da çox vacibdir. "Müasir dövrdə həya-

tın bütün sahələrində, o cümlədən, təhsildə baş verən dəyişikliklər insanda sosial istiqaməti formalaşdırmaq, baş verən dəyişikliklərə uyğun reaksiya vermək, yeni şəraitdə özünütənzimləmə, özünütəyinetmə, özünütəsdiq kimi xüsusiyyətləri aşkara çıxarmaq üçün vacibdir" (1, s. 203).

Mənfi ünsiyyət mühiti təhsilin keyfiyyətini aşağı salır. Müəllim şagirdi yaxşı tanımalıdır və çalışmalıdır ki, onu düzgün başa düşə bilsin. Tədris fəaliyyətinə təsir edən müəllim-şagird münasibətlərində şagirdlərin bioloji inkişafı, müxtəlif maraqları, ehtiyacları, qabiliyyətləri, davranışları, uğurları, sağlamlığı, iqtisadi və sosial mühiti haqqında məlumatların nəzərə alınması, şagirdlərin ailə vəziyyətinin araşdırılması və bilinməsi çox vacibdir.

Təhsilin mühüm problemlərindən biri də müəllimlərin şagirdlə sinifdənkənar məşğul olmamasıdır. Yaxşı müəllim gözəl nitqi olan, pafosla danışan deyil, şagirdinin gücünü ən çox səfərbər etməyi bacarandır. Bunu bacaran müəllim şagirdini öyrənməyə həvəsləndirir.

*Şagirdlərin ixtisas seçimindəki problemlər.* Səmərəli təlim-tədris prosesinin həyata keçirilməsi üçün müəllimlər şagirdlərinin hazırlıq səviyyələrini nəzərə almalıdırlar. Şagird hazırlığının yetərincə olmaması, müəllimlərin bu məsələyə kifayət qədər diqqət yetirməməsi arzuedilməzdir.

Ailənin sosial-iqtisadi vəziyyəti, təhsili də şagirdin hazırlıq keyfiyyətinə təsir edir. Məktəbəqədər dövrdə uşaqların fiziki, əqli və sosial inkişafı bütövlükdə təmin edilir ki, bu da uşaqları valideynlərindən asılı olmaqdan xilas edir, yaradıcılıq qabiliyyətlərinin yaranmasına imkan verir. Həm də bu dövr uşağın oyun vasitəsilə ana dilini inkişaf etdirdiyi, sosiallaşdığı dövrdür.

Şagirdin keyfiyyət göstəricilərini müəyyənləşdirən ünsürlərdən biri olan ailə, təhsilin ilk başladığı yerdir və məktəbdə həyatla əlaqənin əsas nöqtəsidir. Valideynlərin təhsil səviyyəsi uşağın məktəbə yönəlməsinə təsir edir və təhsil səviyyəsi yüksək olan ailələrin uşaqlarının təhsillərini davam etdirmək imkanları daha yüksək olur. İndiki texnologiyadan, texnoloji vasitələrdən təyinatına uyğun istifadə etmək sosiallaşmağa kömək edir. Belə ki, mətbuat, radio, televiziya, kompüter, internet, film kimi ünsiyyət vasitələri uşağı ictimailəşdirir və o, gələcəkdə öz seçimində uğurlu olur.

*Təhsilin idarə edilməsində problemlər.* Problemlərdən biri də təhsilin idarə edilməsində kifayət qədər sayda mütəxəssisin olmamasıdır. İngiltərə, ABŞ, Avstraliya kimi inkişaf etmiş ölkələrdə məktəb idarəçiliyi professional bir peşə kimi qəbul edilir. Məktəb rəhbərlərini məzun səviyyəsində yetişdirmək və peşələrinə başladıqdan sonra belə, onları ixtisasartırma proqramları vasitəsilə inkişaf etdirmək üçün təhsil siyasəti axtarılır. Azərbaycanda isə idarəçiliyin bir ixtisas, idarəçinin isə peşə olması ilə bağlı olduğu bəzən nəzərə alınmır. Məktəblərimizdə və təhsil sistemimizdə akademik cəhətdən təchiz olunan, ən azı magistr dərəcəsi olan, ikinci dil bilən, özünü daim yeniləyən, dəyişikliklərə müqavimət göstərmək əvəzinə uyğunlaşan, yenilikləri izləyən idarəçilərə ehtiyac var. Bu səbəbdən idarəetmədə staj yox, bilik və bacarıq əsas olmalıdır.

Təhsil sistemimizin mərkəzləşmiş strukturu ilə əlaqədar idarəçilərin səlahiyyətləri və vəzifələri arasında tarazlığın pozulması da müxtəlif problemlər yaradır. Onların üzərinə çoxlu vəzifələr düşsə də, məktəb direktorlarının ən mühüm problemlərindən biri səlahiyyətsizlikdir. Hər bir təşkilatda olduğu kimi, təhsil təşkilatının strukturu yaradılarkən səlahiyyət və məsuliyyət balansını təmin edəcək qanunauyğunluqlar və münasibətlər aydın şəkildə göstərilməlidir. Bu problemi həll etmək üçün məktəb direktorlarının səlahiyyət sahələrini məsuliyyətləri ilə paralel olaraq genişləndirmək lazımdır. Problemli mühitdə işləyən məktəb rəhbərliyinin səmərəsizliyinin nəticələri müəllimlərə, şagirdlərə, ailələrə və bütün cəmiyyətə təsir edir.

Təhsil sistemi mərkəzləşdirilmiş yanaşma ilə idarə olunur və təhsillə bağlı problemlərin həlli üçün bu mərkəzləşmə azaldılmalı və mərkəzləşdirilməmiş idarəetməyə diqqət yetirilməlidir.

"XX əsrin son onilliyində dünyanın inkişaf etmiş ölkələrində, o cümlədən keçid iqtisadiyyatı olan ölkələrdə hər sahədə olduğu kimi, elm və təhsil sahəsində də ciddi dəyişikliklər olmuşdur. …Azərbaycanın rəqabət qabiliyyətinin üstünlüyü bir çox cəhətdən təhsillə müəyyənləşən insan potensialının inkişafı ilə bağlıdır. Ulu öndərimiz Heydər Əliyev demişdir: "Həyat böyük bir prosesdir. Bu prosesdə uğurla iştirak etmək üçün insan müasir tələblərə uyğun elmə malik olmalıdır. Təhsil də daim təkmilləşdirilməlidir." (6, s. 448).

Keçmişdə olduğu kimi, bu gün də təhsildə müəyyən problemlər var. Təhsildə problemləri həll edəcək kadrların yetişdirilməsi vacibdir.

**Problemin aktuallığı.** Müəllimlərin müəyyən edilmiş standartlarda təhsil proqramlarını həyata keçirə bilmələri üçün əsas götürülmüş təhsil fəlsəfəsinə asanlıqla uyğunlaşmaları müasir təhsilin əsas problemlərində aktuallığı nəzərə alınmalı məsələlərdən biridir.

**Problemin elmi yeniliyi.** Təhsil təcrübələrimizdə problematika dövrü təhsil və informasiya cəmiyyətinin bugünkü anlayışı nöqtəsində mövcud olan qeyri-adekvatlıqlar və yeni paradiqmalarla ayaqlaşa bilməməkdən qaynaqlanır.

**Problemin praktik əhəmiyyəti.** Tədqiq olunan məsələlər ümumi bir çərçivə yaratmaq məqsədi daşıyır. Belə ki, məqalədən müasir təhsil (tədris) idarəçiləri, orta məktəb direktorları və müəllimlər istifadə edə bilərlər.

**Ədəbiyyat:**


1. Baxışova Ş.A. Məktəbəqədər təhsildə milli-mənəvi dəyərlər və inteqrasiya // Bakı: Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, 2022.- №3, -s.203.
2. Eraslan, L. ve Babadağ, G. (2015). Eğitimin Hukuki Temelleri. Eğitim Bilimine Giriş içinde
3. Erkılıç, T.A. 2008. Felsefi Akımlar ve Eğitim Felsefesi Akımları. A. Boyacı (Ed.) Eğitim Sosyolojisi ve Felsefesi. Eskişehir: Anadolu Üniversitesi Açıköğretim Fakültesi Yayını. s. 3, 4).
4. Gediklioğlu, T. (2005). Avrupa Birliği Sürecinde Türk Eğitim Sistemi: Sorunlar ve Çözüm Önerileri. Mersin Üniversitesi Eğitim Fakültesi Dergisi, 1 (1), 66-80. s.77
5. Həsənova Tamilə. Vətənpərvərlik tərbiyəsinin təlim prosesində rolu s.301. https://www.aesma.edu.az/assets/Files/Beyn%C9%99lxalq%20Konf-2022.pdf
6. Mahmudov M.C. Dünyada təhsil sistemləri. Monoqrafiya / -Bakı: Mütərcim, -2014. -480s., -s. 448
7. https://edu.gov.az/az/news-and-updates/8620
8. https://celt.az/professional-ingilis-dili-mu%C9%99llimi-olmaq-ist%C9%99yirs%C9%99n/
9. https://www.muallim.edu.az/www.old/arxiv/2010/16/16-20.htm
10. https://republic.preslib.az/az_c7-1.html


**E-mail**: adile1970@mail.ru

**Rəyçilər**: *ped.elm.dok., prof.* **A.N. Abbasov,**
*ped.elm.dok., prof.* **M.C. Mahmudov**
**Redaksiyaya daxil olub**: 10.11.2022.

*UOT 37.0*

***Lalə Akif qızı Məmmədli***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı mütəxəssisi*
https://orcid.org/ 0000-0003-0686-3627

## YUXARI SİNİF ŞAGİRDLƏRİNDƏ DEMOKRATİK MƏDƏNİYYƏTİN FORMALAŞDIRILMASININ BƏZİ MƏSƏLƏLƏRİ

***Лала Акиф гызы Мамедли***
*доктор философии по педагогике,*
*ведущий специалист Института Образования Азербайджанской Республики*

## НЕКОТОРЫЕ ВОПРОСЫ ФОРМИРОВАНИЯ ДЕМОКРАТИЧЕСКОЙ КУЛЬТУРЫ У СТАРШЕКЛАССНИКОВ

***Lala Akif Mammadly***
*doctor of philosophy in pedagogy*
*leading specialist at the Institute of Education of the Republic of Azerbaijan*

## SOME TASKS OF THE FORMATION OF DEMOCRATIC CULTURE IN SENİOR CLASS STUDENTS

**Xülasə.** Respublikamızda həyata keçirilən demokratikləşmə məktəb qarşısında demokratik tipli siyasi mədəniyyətə malik vətəndaşların tərbiyə edilməsi vəzifəsini irəli sürmüşdür. Həmin vəzifənin reallaşması ümumtəhsil, orta ixtisas və ali məktəblərdə hüquqi və siyasi təhsilin gücləndirilməsini, xüsusi fənlərin və praktik məşğələlərin tətbiqini zəruri etmişdir.

***Açar sözlər:*** *yuxarı sinif şagirdləri, demokratiya, demokratik mədəniyyət, demokratik mədəniyyətin formalaşdırılması, bəzi məsələlər*

**Резюме.** Проводимая в нашей республике демократизация выдвинула перед школой задачу воспитания граждан с демократическим типом политической культуры. Реализация этой задачи потребовала усиления правового и политического воспитания в общеобразовательной, средней и высшей школе, введения специальных предметов и практических занятий.

***Ключевые слова****: старшеклассники, демократия, демократическая культура, формирование демократической культуры, некоторые задачи*

**Summary.** The democratization carried out in our republic put forward the task of educating citizens with a democratic type of political culture before the school. The implementation of this task required the strengthening of legal and political education in general, secondary and higher schools, the introduction of special subjects and practical classes.

***Key words:*** *senior school pupils, democracy, democratic culture, formation of democratic culture, some problems*

Təhsil müəssisələrinin qarşısında duran mühüm vəzifələrdən biri şagirdlərdə demokratik mədəniyyətin formalaşdırılmasıdır. Bu sahədə aparılan işlərin səmərəliliyinə nail olmaq üçün ailə, ümumtəhsil, orta ixtisas və ali məktəblər məqsədyönlü, sistemli və fasiləsiz fəaliyyət göstərməlidirlər.

İlk növbədə, problemlə sıx surətdə bağlı olan aşağıdakı anlayışlara aydınlıq gətirilməlidir: “demokrat”, “demokratik”, “demokratizm”, “demokratiya”. Biz bu məqsədlə “Azərbaycan dilinin izahlı lüğət”inin birinci cildinə müraciət etdik. Aşağıdakıları aşkarladıq:

"*Demokrat* (yun.) 1. Demokratiya tərəfdarı. 2. Burjua demokrat partiyasının üzvü. 3. məc. Sadəliyi sevən, sadə həyat tərzi keçirən, adi adamlara yaxın olan, onlarla ünsiyyət bağlayan adam.

*Demokratik* (yun.) 1. Demokratiyaya müvafiq ola, demokratiya əsasında qurulmuş prinsiplərə riayət edən. Demokratik idarə üsulu. 2. Zəhmətkeş xalq kütlələrinə xas olan; sadı, adi. Demokratik tərbiyə almış.

*Demokratiklik* (yun.) – demokratiya prinsiplərinə əsaslanma.

*Demokratizm* (yun). 1. Demokratiyanı qəbul edib həyata keçirmə. 2. Həyatda insanlarla münasibətdə və s. sadəlik.

Demokratiya (yun). 1. Dövləti idarə işi xalqın əlində olduğu idarə üsulu, siyasi quruluş; xalq hakimiyyəti. 2. İctimai təşkilatların həyat və fəaliyyətində bütün kollektiv üzvlərinin fəal iştirakı və təsirini təmin edən rəhbərlik üsulu" (1, s. 561).

Demokrat, demokratik, demokratizm, demokratiya sözləri, eyni zamanda, təhsil sistemi ilə də bağlı bir məsələdir. Təhsilə aid sənədlərdə təlim, tərbiyə, pedaqoji prosesin demokratikləşdirilməsindən söz açılır.

"Təhsil haqqında" Azərbaycan Respublikasının qanunun "Təhsil sahəsində dövlət siyasətinin əsas prinsipləri" adlanan 3-cü fasiləsizlik, liberallaşma, inteqrasiya prinsipləri ilə yanaşı *demokratiklik* prinsipi də diqqət mərkəzinə gətirilir.

Təhsilə aid qanunda *demokratiklik* prinsipinin mahiyyətinə aşağıdakı şəkildə aydınlıq gətirilir: "demokratiklik – təhsilalanların azad düşüncə ruhunda tərbiyə edilməsi, təhsilin dövlət-ictimai əsaslarla təşkilində və idarə edilməsində səlahiyyət və azadlıqların genişləndirilməsi, təhsil müəssisələrinin muxtariyyətinin artırılması" (2)

"Təhsil haqqında" Azərbaycan Respublikasının qanunun 4-cü maddəsi "Təhsilin əsas məqsədi" adlanır. Bu maddədə "demokratiya prinsipləri" təhsilin əsas məqsədlərindən biri kimi nəzərdən keçirilir. Diqqət yetirək: "Azərbaycan dövləti qarşısında öz məsuliyyətini dərk edən, xalqının milli ənənələrinə və *demokratiya prinsiplərinə*, insan hüquqları və azadlıqlarına hörmət edən, vətənpərvərlik və azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirmək " (2).

Bundan başqa, təhsil qanununun "Təhsilin məzmununa və təşkilinə dair ümumi tələblər" adlı 11-ci maddəsində "*demokratik təsisatlar*" mühüm tələb kimi nəzərdə tutulur. Diqqət yetirək: "öz üzərinə məsuliyyət götürmək, kollegial qərarların qəbulunda, *demokratik təsisatların* fəaliyyətində və inkişafında iştirak etmək keyfiyyətlərinə malik müstəqil, yaradıcı şəxsiyyət və vətəndaş formalaşdırmaq" (2).

Respublikamızda həyata keçirilən demokratikləşmə məktəb qarşısında demokratik tipli siyasi mədəniyyətə malik vətəndaşların yetişdirilməsi vəzifəsini irəli sürmüşdür. Həmin vəzifənin reallaşması ümumtəhsil, orta ixtisas və ali məktəblərdə hüquqi və siyasi təhsilin gücləndirilməsini, xüsusi fənlərin və praktik məşğələlərin tətbiqini zəruri etmişdir.

Tarixi politologiyada siyasi mədəniyyətin bir sıra növlərinə münasibət bildirilir. Onların arasında demokratik mədəniyyət xüsusi əhəmiyyət kəsb edir.

Şəxsiyyətin demokratik mədəniyyəti tərbiyə işinin məqsədi və nəticəsi ola bilər. Q. Almondun qənaətincə, siyasi mədəniyyət nisbətən müstəqildir, lakin ümumi mədəniyyətə və xüsusilə insanlar arasında etimadın və əməkdaşlığın gücləndirilməsinə əsaslanır.

"Demokratik ünsiyyət formaları", "demokratik münasibətlər", "demokratik məktəb" və s. ifadələr dərk olunma vərdişinə, "demokrat" anlayışı insanın ümumi faydalanma kompleks xarakteristikasına çevrilmişdir. Bu kateqoriyalardan bəziləri dərin elmi əsaslandırma və dəqiq məzmun daşıyır: demokratik idarəetmə üslubu (K. Levin), demokratik (dialoq) ünsiyyət (M.R. Bityanova, J. Makduqall, V.V. Yustitski və b.), ailə münasibətlərinin demokratik üslubu (A.N. Abbasov, E.G. Eidmiller, A.A. Bodalev), müəllimin demokratik üslubu (M.M. Əmirov, K. Levin, R. Lippit, R. Uayt və b.), pedaqoji rəhbərliyin demokratik üslubu (M.M. Mehdizadə, Ə.Ə. Ağayev, N.F. Maslova, L.İ. Krivolap, G.N. Malkovskaya və b.), demokratik təhsil (O.S. Qazman və b.) və s.

Yuxarı sinif şagirdlərində demokratik mədəniyyətin səmərəli şəkildə formalaşdırılması üçün bu istiqamətdə təhsilləndirici və tərbiyələndirici işlər aparan pedaqoji kollektivin üzvləri – müəllimlər, məktəb rəhbərləri və b. aşağıdakı məsələləri özləri üçün aydın etməli, müəyyən hazırlıqlara malik olmalıdırlar:

1. Şagird şəxsiyyətinin demokratik mədəniyyətinin struktur modelini aydın təsəvvür et-

məli, şagird şəxsiyyətinin demokratik mədəniyyətinin formalaşması meyarlarını, göstəricilərini və səviyyələrini bilməlidirlər.

2. Məktəblilərin demokratik mədəniyyətinin tərbiyəsinin hər bir mərhələsində müəllimlərin fəaliyyəti metodik dəstək və tipik vəziyyətlərin işlənib hazırlanması ilə təmin edilməlidir.

3. Məktəb icmasının formalaşması və inkişafı prosesində şagird şəxsiyyətinin demokratik mədəniyyətinin tərbiyəsi üzrə işin forma və üsulları hər bir mərhələ üçün işlənib hazırlanmalıdır.

4. Məktəblilər böyüklərlə birlikdə hüquq normaları əsasında məktəb icmasının şüurlu, könüllü və real idarəçiliyinə daxil edilməlidirlər.

5. Məktəb icması həyatının demokratikləşməsi mərhələləri, hər bir mərhələdə tərbiyə işinin vəzifələri və məzmunu müəyyənləşdirilməlidir.

6. Təhsilin metodologiyası şəxsiyyətin demokratik mədəniyyətinin məzmunu və strukturu nəzərə alınmaqla qurulmalıdır.

7. Şagirdlərdə demokratik mədəniyyətin formalaşdırılması metodologiyasının tətbiqi məqsədi ilə təşkilati və psixoloji-pedaqoji şərtlər konkretləşdirilməlidir.

8. Yuxarı sinif şagirdlərinin demokratik mədəniyyətinin formalaşdırılması prinsipləri sisteminin işlənib hazırlanması lazımdır.

Məktəbli şəxsiyyətinin demokratik mədəniyyətinin struktur modeli, bir-biri ilə sıx bağlı olan dörd komponenti özündə ehtiva edən sistemli təhsildir. Buraya daxildir: tolerantlıq, başqa sözlə, bir-birini anlamaq bacarığı, hüquq normalarına, birgəyaşayış qaydalarına hörmət, qanuna tabelik, onun tələblərini yerinə yetirmək, hüquqi fəaliyyət.

Şəxsiyyətin demokratik mədəniyyəti vətəndaşın, o cümlədən yuxarı sinif şagirdinin sosial inkişafının ölçüsü kimi nəzərdən keçirilir, onun humanizm prinsipləri əsasında səmərəli sosial qarşılıqlı fəaliyyətə olan istək və arzusunu və qabiliyyətini səciyyələndirir.

2. Prinsipləri, mərhələləri, səmərəlilik şərtlərini, görülən işlərin göstəricilərinin dəyərləndirilməsi və qiymətləndirilməsi meyarlarını və göstəricilərini özündə əks etdirən şəxsiyyətin demokratik mədəniyyətinin tərbiyəsi konsepsiyası məlum olmalıdır. Konsepsiyanın başlıca ideyası onunla bağlıdır ki, şagird şəxsiyyətinin demokratik mədəniyyətinin formalaşması yalnız demokratik əsasda fəaliyyət metodlarının inkişafı və dərk edilməsi, məktəbin gündəlik həyatı, qarşılıqlı fəaliyyətin demokratik formalarının təkrar istehsalı yolu ilə reallaşa bilər.

3. Yuxarı sinif şagirdlərinin demokratik mədəniyyətinin formalaşdırılmasına istiqamətlənən kollektiv fəaliyyətinin təşkili metodikası, şəxsiyyətin demokratik mədəniyyətinin tərbiyəsinin bu və ya digər mərhələsi üçün səciyyəvi sayılan məzmun və problem situasiyalarının aşkarlanması. Aşağıdakı mərhələlər diqqət mərkəzinə gətirilir: demokratik islahatların stimullaşdırılması, demokratik normaların qəbulu, demokratik idarəetmə təcrübəsinin məktəb həyatının struktur bölmələrinin fəaliyyətinə şamil edilməsi.

4. Məktəbli şəxsiyyətinin demokratik mədəniyyətinin səmərəli tərbiyəsi şərtləri: pedaqoji kollektiv üzvlərinin demokratik qarşılıqlı fəaliyyətə hazır olmaları, onların nəzəri və metodik savadlılığı, tərbiyə işinin metodik təminatı, etibar. Yuxarı sinif şagirdlərinin həyatlarının mənalı və məzmunlu təşkil etmək, şagird və müəllimlərin istiqamətlərini öyrənmək.

5. Yuxarı sinif şagirdlərində demokratik mədəniyyətin formalaşdırılması məqsədilə pedaqoji taksonomiya hazırlanmalıdır.

Təhsil müəssisəsinin, o cümlədən ümumtəhsil məktəbinin pedaqoji sistemi üçün "şəxsin demokratik mədəniyyəti" kateqoriyası onun fəaliyyətinin məqsədi kimi çıxış edir. Sistemlər nəzəriyyəsindən bilirik ki, sistem o zaman inkişaf edir ki, onun fəaliyyət göstərmə məqsədi daha yüksək səviyyəli sistemin elementi olaraq diqqət mərkəzinə gəlsin

Pedaqoji sistem sosial sistemdən ötrü bir növ alt sistem sayılır. "Fərdin demokratik mədəniyyəti" termini siyasi elmdən alınıb. Bu mənada şəxsiyyətin *demokratiya, demokratikləşmə* və *demokratik* mədəniyyət hadisələrinə siyasi və sosioloji aspektlərdə yanaşmaq, onların xüsusiyyətlərini Azərbaycan mədəni-tarixi ənənəsi və müasir şərait kontekstində aşkarlamaq son dərəcə zəruridir. Bu fikir baxımından sosial münasibətlərdə şəxsi xassələrin rolunu və yerini səciyyələndirən aspektlər daha maraqlı görünür, fərdin və ya kollektivin hər hansı bir cəmiyyətdə yaşayıb fəaliyyət göstərməyə hazır olmasına imkan verən pedaqoji prosesləri diqqət mərkəzinə gəlir.

"Şəxsiyyətin demokratik mədəniyyəti" termini siyasi elmdə siyasi mədəniyyət bir növü kimi qəbul edilir. Cəmiyyətin və şəxsiyyətin siyasi mədəniyyəti ifadələrindən istifadə olunur.

**Problemin aktuallığı**. Şagirdlərdə demokratik mədəniyyətin formalaşdırılması problemi respublikamızda ilk dəfə tədqiq olunur. Yuxarı sinif şagirdlərinin tədqiqat obyekti kimi götürülməsi son dərəcə önəmlidir. Bu şagirdlər müstəqil həyatın astanasındadırlar.

**Problemin yeniliyi**. Demokratik mədəniyyətin formalaşdırılması problemi diqqət mərkəzinə gətirilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gənc tədqiqatçılarda maraq doğuracaqdır.

**Ədəbiyyat**:

1. Azərbaycan dilinin izahlı lüğəti. 4 cilddə. 1-ci cild. -Bakı: Şərq-Qərb, -2006.
2. "Təhsil haqqında" Azərbaycan Respublikasının qanunu. -Bakı: Hüquq ədəbiyyatı, -2009.

**E-mail**: lale23@mail.ru

**Rəyçilər**: *ped.elm.dok., prof.* **A.N. Abbasov**,
*ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva**
**Redaksiyaya daxil olub:** 05.12. 2022.

UOT 37.0

***Xəzəngül Süleyman qızı Babayeva***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət İqtisad Universitetinin Zaqatala filialı*

# TƏHSİLALANLARDA LİDERLİK KEYFİYYƏTLƏRİNİN FORMALAŞDIRILMASI

***Хазангюль Сулейман гызы Бабаева***
*доктор философии по педагогике*
*Загатальский филиал Азербайджанского Государственного Экономического Университета*

# ФОРМИРОВАНИЕ ЛИДЕРСКИХ КАЧЕСТВ У ОБУЧАЮЩИХСЯ

***Khazangul Suleyman Babayeva***
*doctor of philosophy in pedagogy*
*Zagatala branch Azerbaijan State Economic University*

# DEVELOPING LEADERSHIP QUALITIES IN STUDENTS

**Xülasə.** Məqalədə "lider" və "liderlik" anlayışlarının mahiyyəti aydınlaşdırılır. Bu məqsədlə "Azərbaycan dilinin izahlı lüğət"inə müraciət edilir. Eyni zamanda, liderə xas keyfiyyətlər qeyd olunur. "Müdir" və "lider" anlayışlarının fərqi izah edilir.
***Açar sözlər:*** *şagirdlər, lider, liderlik, liderlik keyfiyyəti, liderlik keyfiyyətlərinin formalaşdırılması*

**Резюме**. В статье раскрывается сущность понятий «лидер» и «лидерство». Для этого используется «Толковый словарь азербайджанского языка». При этом отмечаются качества, характерные для лидера. Объясняется различие между понятиями «директор» и «лидер».
***Ключевые слова:*** *учащиеся, лидер, лидерство, лидерские качества, формирование лидерских качеств*

**Summary**. The article reveals the essence of the concepts of "leader" and "leadership". For this, the Explanatory Dictionary of the Azerbaijani Language is used. At the same time, the qualities characteristic of a leader are noted. The difference between the concepts of "manager" and "leader" is explained.
***Key words**: pupils, leader, leadership, leadership qualities, formation of leadership qualities*

Uşaq, yeniyetmə və gənclərdə formalaşdırılması lazım gələn və vacib olan keyfiyyətlərdən biri də liderlikdir. Bu keyfiyyətə yiyələnməklə cəmiyyətdə fəal həyat, fəal vətəndaşlıq mövqeyi qazanmaq mümkün olur. Lider cəsarətli, təşkilatçılıq, təşəbbüskarlıq qabiliyyətinə malik olur, müstəqil və zəruri fikir söyləməyi, öz mövqeyində duran şəxs olur, öhdəsində olanları, ətrafındakıları idarə etməyi, onların sözünü deməyi, onların mənafeyini müdafiə etməyi bacarır.

"Azərbaycan dilinin izahlı lüğəti"ndə "lider" anlayışının mahiyyətinə aşağıdakı şəkildə aydınlıq gətirilir: "Lider [ing. – başçı] 1. Siyasi partiyanın, ictimai-siyasi təşkilatın və s. başçısı. Parlament fraksiyasının lideri. 2. Hər hansı bir yarışda birinci yerdə gedən adam və ya komanda" (1, s. 263).

"Azərbaycan dilinin izahlı lüğəti"ndə "lider" anlayışına verilən tərifin birinci bəndi siyasi partiyanın, ictimai-siyasi təşkilatın və s. başçısı, parlament fraksiyasının lideri kimi aydınlaşdırılmışdır. Təhsilalanların şəxsiyyət keyfiyyəti və fəaliyyət amili kim nəzərdən keçirilmir. İkinci tərəfi ilə də (2. Hər hansı bir yarışda birinci yerdə gedən adam və ya komanda) buna bənzər fikir söyləmək mümkündür. Fikrimizcə, təhsillə bağlılıq mənasında "lider" anlayışını aşağıdakı şəkildə başa düşmək mümkündür: ingilis dilində "*leader"* sözündən götürülmüş bu söz ilk, ön cərgədə, qabaqda gedən, aparıcı, birinci, rəhbərliyi öz üzərinə götürmüş insanları (bizim tədqiqatda şagirdləri, tələbələri) səfərbər edən və istiqamətləndirən, eyni zamanda qrupda

və kollektivdə digərlərinin aparıcılığını qəbul etdiyi nüfuzlu şəxs başa düşülməlidir.

Həmin şəxsə başqaları məsul qərarlar qəbul etmək səlahiyyəti verir Lider qrupun, yaxud kollektivin təşkilatlanmasında və fəaliyyətində başlıca rola malik olur.

Mövcud ədəbiyyatda liderliyin 3 əsas xüsusiyyətlərinə diqqəti cəlb edirlər: 1. Fərdi (şəxsi) keyfiyyətlər. 2. İdarəetmə və təşkilati keyfiyyətlər. 3. Psixoloji və sosial keyfiyyətlər.

Birinci qrup keyfiyyətlərə (fərdi (şəxsi) – özünəinam; fəal həyat tərzi, təşəbbüskarlıq, cavabdehlik; ikinci qrup keyfiyyətlərə (idarəetmə və təşkilati) – rəhbərlik etməyə qabillik, təşkilati bacarıqlar, fürsəti və təhlükəli vəziyyətləri görə bilmək qabiliyyəti, komanda işini və kollektiv üzvlərinin mənafeyini müdafiə edə bilmək, çeviklik; üçüncü qrup keyfiyyətlərə (psixoloji və sosial) – ədalət, humanizm, komanda üzvlərinə öz qüvvələrini və bacarıqlarını inkişaf etdirmək və təsdiqləmək imkanı vermək və s. keyfiyyətlər aiddir.

"Azərbaycan dilinin izahlı lüğəti"nun 3-cü cildində "liderlik" anlayışına da münasibət bildirilmişdir. Fikir verək: "Liderlik. 1. Liderin mövqeyi, vəzifəsi. 2. Hər hansı yarışda birincilik" (1, s. 263)

Bizcə, bu açıqlanmanı bir qədər dəqiqləşdirmək olar. Odur ki, sual belə qoyulur: liderlik nədir? Liderlik dedikdə, başqa şəxsləri bir araya gətirən, məqsədə yetməkdən ötrü onları ruhlandıran sosial təsir anlaşılmalıdır.

Mövcud ədəbiyyatda müdir və lider anlayışlarının, vəzifələrinin fərqinə aydınlıq gətirilir. Diqqət edək:

- "Liderlər vizyon təyin edir, müdirlər isə tapşırıq verirlər;
- Liderlər dəyişikliyin, müdirlər isə status-kvonun təmsilçiləridir;
- Liderlər unikal, müdirlər isə bir-birlərinin surəti olurlar;
- Liderlər risk edir, müdirlər isə riski minimallaşdırırlar;
- Liderlər uzunmüddətli, müdirlər isə qısamüddətli düşünürlər;
- Liderlər uzunmüddətli, müdirlər isə qısamüddətli düşünürlər;
- Liderlər münasibət, müdirlər isə sistem qururlar;
- Liderlərin azarkeşləri, müdirlərin isə işçiləri olur" (2).

Belə bir suala cavab tapmağa çalışaq: liderlər hansı keyfiyyətlərə malik olmalıdırlar?

Mövcud ədəbiyyatda 21 bənddən ibarət olan və inkişafı əsl lider olmağa imkan verən liderlik keyfiyyətləri sadalanır:

1. Həyatınızda lider olmaq – həyatınızı necə idarə edəcəyinizi bilmək, özünüzü motivasiya etmək, qarşınıza hədəflər qoymaq və onlara nail olmaq üçün hərəkətə keçmək – liderliyə doğru ilk addımdır. Məhz bu liderlik keyfiyyəti gələcək uğurunuz üçün əsas olacaq.

2. Perspektiv baxış – bu liderlik keyfiyyəti daimi inkişaf və təlim tələb edir. Nə qədər çox bilik və təcrübəniz varsa, gələcək hadisələri bir o qədər yaxşı və etibarlı təsəvvür edə biləcəksiniz.

3. Açıqlıq – liderin inkişafı davam edir. Hər gün yeni məlumatlar alır, insanlarla ünsiyyət qurur, qərarlar qəbul edir – işi effektiv həyata keçirmək üçün açıqlıq sadəcə zəruridir. Bütün liderlik keyfiyyətlərini müqayisə etsək, açıqlıq ən vaciblərdən biridir.

4. Cəsarət – bu, bəlkə də ikinci ən vacib liderlik keyfiyyətidir. Qorxusunu idarə etmək və qorxuya baxmayaraq hərəkət etmək bacarığı liderin cəsarətidir. Hər kəs qorxur, amma məqsədinə doğru getməyə davam edənlər uğur qazanır.

5. Qətiyyətlilik – istənilən insanın həyatı məhduddur. Ona görə də liderlər boş söhbətlərə vaxt itirmirlər. Qərar vermək üçün kifayət qədər məlumat yoxdursa, onu əldə etmək üçün hər şeyi edəcək və hərəkətə davam edəcəklər.

6. Liderlik keyfiyyətləri enerji əsaslardan biridir. Liderin həyatı böyük emosional və fiziki yük alır. Və buna dözmək güclü enerji sadəcə lazımdır.

7. Şeylərə müsbət baxış – problemlər hər kəs üçün və həmişə yaranır. Yalnız heç nə etməyənlər səhv etmirlər. Pozitivlik liderə diqqətini günah axtarmaqdansa, həll yolu tapmağa yönəltməyə kömək edir.

8. Başqalarını dinləmək bacarığı – heç kim bir anda bütün sahələrdə mütəxəssis ola bilməz. Və lider bunu başa düşür. Liderin gücü mütəxəssisləri tapmaq və onları ümumi işin xeyrinə təşkil etmək bacarığındadır. Bu məqamı da ən mühüm liderlik keyfiyyətlərinə əlavə etmək olar.

9. Zehinlilik və tənqidilik – liderlər faktları diqqətlə toplayır və bütün məlumatları yoxlayır. İstənilən biznesi kiçik bir detal məhv edə bilər.

10. Güvən və sakitlik – soyuqqanlılıq liderin diqqətini həll yolunu tapmağa cəmləməsinə kömək edir. O, emosiyaları idarə edir və onların qərar qəbul etmə prosesinə təsir etməsinə mane olur.

11. Çeviklik və həssaslıq – dünyamız dəyişir. Və dəyişiklik tempi hər il daha da sürətlənir. 5 il əvvəl işləyənlər bu gün artıq təsirsizdir. Davamlı böyümə üçün daim düzəlişlər etmək və liderlik keyfiyyətlərini inkişaf etdirmək lazımdır.

12. Nəticəyönlü – daha böyük uğura daha böyük nəticələr əldə edənlər nail olur. Önəmli olan bunu necə etdiyiniz deyil, nəyə nail olduğunuzdur. Və sizi uğura aparan da nəticələrinizdir.

13. Səhvlərinizi etiraf edin – liderlər də səhv edirlər. Ancaq bunu başqalarına necə etiraf edəcəklərini bilirlər. Bu, irəliləməyə davam etməyə imkan verir. Bütün liderlik keyfiyyətlərini götürsək, bu, ilk növbədə, əhəmiyyət kəsb edir.

14. Daim öyrənmək bacarığı – dünyanın dəyişkənliyi ona gətirib çıxarıb ki, biliklər heyrətamiz sürətlə köhnəlir. Yeni bilik və bacarıqların əldə edilməsi rəqabət qabiliyyətinizi artırmağa imkan verəcək. Yeni biliklər yeni liderlik keyfiyyətlərini inkişaf etdirməyə kömək edəcəkdir.

15. Özünə düzgün qiymət vermək – lider nəyi bacarıb, nəyi bacara bilməyəcəyini aydın şəkildə dərk edir. Və səylərini ən yaxşı etdiyi işə yönəldir. Bu, onun səmərəliliyini artırır, bu da daha yaxşı nəticələr əldə etməyə imkan verir.

16. İşə ehtiras – lider gördüyü işi sevir. Bu ehtiras ona gördüyü işlərə marağı qoruyub saxlamağa imkan verir, onun səmərəliliyini və effektivliyini artırır. Bu maddə bütün digər liderlik keyfiyyətlərini inkişaf etdirməyə imkan verir.

17. İnsanları alovlandırmağı bilir – tərəfdaşları olmayan lider lider deyil. Özünü motivasiya etməyi öyrənən lider insanlarda istək və fəaliyyət alovunu alovlandırmaq, onları məqsəd və vəzifələrini yerinə yetirməyə həvəsləndirmək bacarığına yiyələnir. Və bu liderlik keyfiyyəti sayəsində çox şeyə, çox şeyə nail ola bilərsiniz.

18. Xarizma – düzgün insanları cəlb etməyə kömək edir. Böyük nailiyyətlər effektiv komanda tələb edir. Və lider onu necə yaratmağı bilir.

19. Fokus – bu liderlik keyfiyyəti sizə şeylər arasında ən vacib olanı təcrid etməyə və bütün diqqətinizi ona yönəltməyə imkan verir.

20. Bacarıq – liderin lazım olanı ifadə etmək, lazım olanı planlaşdırmaq və lazım olanı etmək bacarığı və başqalarına aydın olsun ki, bunu necə edəcəyinizi bilirsiniz və onlara aydındır. Onlar sizi izləmək istəyirlər. Liderlik keyfiyyətlərinin əhəmiyyətinə görə bu, ikinci yerdədir.

21. Səxavət – liderin böyüklüyünün ölçüsü ona xidmət edənlərin sayı deyil, xidmət etdiyi insanların sayıdır. Səxavət özünü deyil, başqalarını birinci yerə qoymağı tələb edir. Lider paylaşmağı bilir və bunun müqabilində daha çox şey alır" (3).

Yaxşı lider olmaq üçün istər təhsilalanlar, istərsə də müxtəlif idarə və müəssisələrdə, təşkilatlarda çalışan şəxslər özlərinə nümunə götürməlidirlər.

Belə nümunə Ümummilli liderimiz Heydər Əliyev və Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev ola bilər.

Mənbələrdə oxuyuruq: "Prezident İlham Əliyev Azərbaycan siyasi sisteminə rasional siyasi davranış modeli təqdim etdi. Yəni məntiqi mühakimələrə və analitik təhlilə əsaslanan, mütərəqqi, pozitiv, milli məqsədlərə xidmət edən siyasi realizmə söykənən siyasi fəaliyyət nümunəsi gətirdi. Beləliklə radikalizmi, siyasi şantaj və ekstremizmi siyasi sistemimizdən çıxardı.

İlham Əliyev siyasi sistemimizə qüsursuz siyasi mədəniyyət, milli mənəviyyatımıza uyğun siyasi əxlaq standartı, milli siyasi etika nümunəsi gətirdi.

İlham Əliyev demokratiyanın istismarçı siyasi vasitə deyil, milli mədəniyyətimiz və mentalitetimizlə, eyni zamanda, müsəlman sosial-psixoloji kimliyimizlə uzlaşan bir dəyər və yaşam tərzi olduğunu sübut etməklə intellektual əsaslarda yeni demokratik modernist cəmiyyət formalaşdıra bildi" (4).

**Problemin aktuallığı.** Təhsildə şagirdlər arasında liderliyə canatma halları mövcuddur. Əslində bacarıqlı, səriştəli, təşkilatçılıq qabiliyyətinə, təşəbbüskarlığa malik, müstəqillik nümayiş etdirən, başqalarına düzgün yol göstərməyi, onları düzgün istiqamətləndirən gənc nəslin tərbiyə olunması məqsədəuyğundur. Bu baxımdan liderlik keyfiyyətlərinin şagirdlərdə və tələbələrdə formalaşdırılması lazımdır.

**Problemin elmi yeniliyi**. Təhsilalanlarda liderlik keyfiyyətlərinin formalaşdırılması kimi vacib bir problem üzərində dayanılır.

**Problemin praktik əhəmiyyəti**. Məqalə doktorantlar və gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. Azərbaycan dilinin izahlı lüğəti. 4 cilddə, 3-cü cild. -Bakı: Şərq-Qərb, -2006.
2. https://pmo.az/az/news/lider-nece-olmaq-olar-neyi-bacarmalisan-ve-hansi-idareetme-terzini-secmelisen
3. https://fondeco.ru/az/osnovnye-liderskie-kachestva/
4. https://az.wikipedia.org/wiki/Lider

**E-mail**: xezengul68@mail.ru
**Rəyçilər**: *ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub**: 05.12.2022.

*UOT 37.0*

***Ülviyyə Məmməd qızı İsmayılova***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Gəncə Dövlət Universiteti*

# ÜMUMTƏHSİL MƏKTƏBİNİN MÜHÜM VƏZİFƏLƏRİNDƏN BİRİ: ŞAGİRDLƏRDƏ MÜSTƏQİLLİYİN İNKİŞAF ETDİRİLMƏSİ

***Ульвия Мамед гызы Исмаилова***
*докторант по программе доктора философии*
*Гянджинский Государственный Университет*

# ОДНА ИЗ ВАЖНЫХ ЗАДАЧ ОБЩЕОБРАЗОВАТЕЛЬНОЙ ШКОЛЫ: РАЗВИТИЕ САМОСТОЯТЕЛЬНОСТИ У УЧАЩИХСЯ

***Ulviya Mammad Ismayilova***
*doctorial student in the program of doctor of philosophy*
*Ganja State University*

# ONE OF THE IMPORTANT TASKS OF A COMPREHENSIVE SCHOOL: DEVELOPING STUDENTS' INDEPENDENCE

**Xülasə.** Müstəqilliyin tərbiyə olunması məktəblilərdə özünə inam yaradır, onu müstəqil düşünməyə, öz fikrini, qənaətlərini bildirməyə, müstəqil fəaliyyət göstərməyə sövq edir. Müstəqilliyin əsasları uşaqlıq illərində ailədə qoyulur, sonra müəllimlər tərəfindən inkişaf etdirilir. Müstəqillik insanın şəxsi fəallığı ilə sıx surətdə əlaqədardır. Təhsilalanlarda ətraf aləmdə baş verən hadisələri düzgün təhlil etmək və onları obyektiv qiymətləndirmək bacarıqlarını inkişaf etdirir.

***Açar sözlər:*** *müstəqillik, şagirdlərin müstəqilliyi, müstəqillik mənəvi keyfiyyət kimi, müstəqilliyin formalaşdırılması, təlim prosesi, sinifdənxaric tədbirlər*

**Резюме.** Воспитание самостоятельности формирует у школьников уверенность в себе, побуждает их самостоятельно мыслить, высказывать свое мнение, делать выводы, проявлять самостоятельность. Основы самостоятельности закладываются в семье в детстве, а затем развиваются учителями. Самостоятельность тесно связана с личной активностью человека. У учащихся развивается умение правильно анализировать события в окружающем мире и объективно их оценивать.

***Ключевые слова:*** *самостоятельность, самостоятельность учащихся, самостоятельность как нравственное качество, формирование самостоятельности, учебный процесс, внеклассные мероприятия*

**Summary.** Education of independence forms schoolchildren's self-confidence, encourages them to think independently, express their opinions, conclusions, and act independently. The foundations of independence are laid in the family in childhood, and then developed by teachers. Independence is closely related to the personal activity of a person. Students develop the ability to correctly analyze events in the world around them and evaluate them objectively.

***Key words:*** *independence, independence of students, independence as a moral quality, formation of independence, educational process, extracurricular activities*

Şəxsiyyətin yiyələnməli olduğu müsbət, gərəkli keyfiyyətlərdən biri müstəqillikdir. Müstəqilliyin tərbiyə olunması hər bir yaş dövründə – məktəbəqədər, kiçik, orta və böyük məktəb yaşı dövrlərində diqqət mərkəzində dayanmalıdır. Uşaq və yeniyetmələrdə müstəqilliyin inkişaf etdirilməsinə qayğı ilə yanaşılmalıdır. Bu istiqamətdə aparılan işlər düzgün planlaşdırılmalıdır.

Hər bir uşağın yaşının üstünə yaş gəldikcə onun ata-anaları ilə ilkin fizioloji və sosial-psi-

xoloji əlaqələri qırılır, onda şəxsi müstəqilliyə və azadlığa meyllilik və istək inkişaf edir.

Müstəqilliyin tərbiyə olunması məktəblilərdə özünə inam yaradır, onu müstəqil düşünməyə, öz fikrini, qənaətlərini bildirməyə, müstəqil fəaliyyət göstərməyə sövq edir. Müstəqilliyin əsasları uşaqlıq illərində ailədə qoyulur, sonra müəllimlər tərəfindən inkişaf etdirilir. Müstəqillik insanın şəxsi fəallığı ilə sıx surətdə əlaqədardır. Təhsilalanlarda ətraf aləmdə baş verən hadisələri düzgün təhlil etmək və onları obyektiv qiymətləndirmək bacarıqlarını inkişaf etdirir.

Müəllim və valideynlərin köməyi ilə uşaq və yeniyetmələrin müstəqil bacarıqları möhkəmlənir, bu da müxtəlif fəaliyyət növlərində özünü göstərir. Müstəqillik tədricən şəxsiyyətin fərdi xüsusiyyəti kimi çıxış edir.

Kiçikyaşlı məktəblilərə müstəqil yerinə yetirmək üçün mümkün qədər çox iş tapşırmaq, ona daha çox etibar etmək, onun təşəbbüslərini təqdir etmək, onu həvəsləndirmək, onun müstəqilliyə cəhdini rəğbətləndirmək lazımdır. Ev tapşırıqları ailənin minimal köməyi ilə yerinə yetirilməlidir.

Təhsilalanlarda müstəqilliyin formalaşdırılmasında təlim prosesi və sinifdənxaric tədbirlər mühüm əhəmiyyət daşıyır. Ümumtəhsil fənləri üzrə ayrı-ayrı mövzular öyrənilərkən, eyni zamanda, sinifdənxaric işin təşkili zamanı onların müstəqilliyi üçün şərait yaradılmalıdır. Məktəbli müstəqillik nümayiş etdirdikdə fəal olur. Hər hansı bir işin icrasında fəallıq təhsialanın fəal həyat qazanmasının, başqa sözlə, həyatda fəal mövqe tutmasının şərtidir.

Təlim prosesində, həm sinifdənxaric tədbirlərdə şagirdlərdə müstəqilliyin formalaşdırılması məqsədəuyğundur. Müstəqil fikrə, müstəqil təfəkkürə, müstəqil fəaliyyət göstərməyə öyrəşən adam çətinlikdən qorxmur. O, çətinliklə rastlaşanda onun öhdəsindən gəlir. Həmin məktəblilərdə təxəyyül də inkişaf edir. Onlar ayrı-ayrı məsələlərin həllində inamlı hərəkət edir.

Müəllimlər məktəblilərin, o cümlədən V-IX sinif şagirdlərinin müstəqilliyinə imkan verməlidirlər. Təlimin prinsiplərindən biri şüurluluq və fəallıq prinsipidir. Müəllim həmin prinsipi nəzərə aldıqda təhsilalanlarda özünü büruzə verən əzbərçiliyin qarşısının alınmasına kömək edir. Məlum olduğu kimi, şüurlu mənimsənilmiş bilik təhsilalanın fəallığına imkan verir.

Müəllim şüurluluq və fəallıq prinsipini öz fəaliyyətində rəhbər tutduqda həm də məktəblilərin hər birinin müstəqilliyini təmin edir, onların müstəqil fikir irəli sürmələrinə, proqram materialını aydınlaşdırarkən müstəqillik nümayiş etdirmələrinə, müstəqil şəkildə nümunələr gətirmələrinə çalışırlar.

Pedaqoji prosesin vəzifələrindən biri təhsilalanların müstəqilliyinin inkişaf etdirilməsindən, təshihlərin aparılmasından, müstəqil fəaliyyətin səviyyəsinin artırılmasından, şagirdlərin, o cümlədən yeniyetmələrin tərbiyəsinə qayğı göstərilməsindən ibarətdir. Bəzən bu işə birtərəfli aparılan pedaqoji proses maneçilik törədir. Başqa bir səbəb, təhsilalanların müstəqil həyat fəaliyyətinə aşağı səviyyədə hazırlanmalarıdır. Pedaqoji prosesdə təlim, tərbiyə və inkişaf heç də həmişə vəhdətdə aparılmır, məktəblilərin öz fəaliyyətlərini idarəetmənin vahid prosesinə cəlb edilməsi təmin olunmur. Nəticədə pedaqogikanın mühüm prinsiplərindən biri (təlim, tərbiyə və inkişafın vəhdətdə aparılması prinsipi) nəzərə alınmamış olur.

Paralelizm aşağıdakı cəhətlərdə özünü göstərir:

1) bu vəhdətin təşkilinin aşağı səviyyəli olması;

2) yeni şəraitlərdə yeniyetmələrin qarşılıqlı fəaliyyət və qarşılıqlı münasibətlərini yetərincə təşkil olunmaması, təshihlərin olmaması;

3) şagirdlərin dəyəryönümlərinin pedaqoji prosesinin iştirakçıları ilə fəaliyyət və ünsiyyətə hazırlanmamaları;

4) təlim prosesində, həm də təlim xarakterli sinifdənxaric məşğələlərdə onlar hazır və hamı üçün məcburi olan tapşırıqları və işləri yerinə yetirirlər və s.

Söhbət, müzakirə, görüş, müsabiqə, disput və s. bu kimi sinifdənxaric tədbirlər təşkil olunduqda şagirdlərə tapşırıqlar verilir, onların qüvvəsindən istifadə olunur. Dərsdən sonra təşkil edilən tədbirlərdə şagirdlərin müstəqilliyi aşağıdakı cəhətlərdə əks olunur:

– şagird(lər) müstəqil olaraq tələbə konfransı üçün mövzu seçir və çıxışa hazırlaşır(lar);

– şagird özünüidarə orqanına rəhbərlik edir;

– disputun, müzakirənin, görüşün təşəbbüskarı olur və yüksək səviyyədə onların keçirilməsinə çalışır(lar);

– tədqiqat-axtarıcılıq işlərinə qoşulur, araşdırmalar aparır;

– öz şeirini, rəsm əsərini diqqət mərkəzinə gətirir və s.

Təhsilalanların müstəqilliyi dedikdə, onun öz qarşısına müxtəlif tədris vəzifələri qoyub heç bir kömək və təhrik olmadan yerinə yetirmək başa düşülür. Müstəqillik özü özünün istəyinə əsasən, şüurlu və dərkolunmuş şəkildə hərəkəti yerinə yetirmək, müəyyən bir məsələyə sərbəst olaraq münasibət bildirmək tələbatıdır. Bu zaman, ilk növbədə, yeniyetmənin idrak fəallığı, marağı, yaradıcı qabiliyyəti, təşəbbüsü, qarşısına məqsəd qoyaraq, öz işini planlaşdırması diqqət mərkəzində dayanır.

Şəxsiyyətin müstəqilliyi təfəkkürün, təxəyyülün, hisslərin və iradənin fəal işi ilə sıx surətdə bağlıdır. Haqqında danışılan əlaqə ikitərəflidir: 1) təfəkkür və emosional-iradi proseslər – müstəqil mühakimə və fəaliyyətlərin zəruri amilləridir; 2) müstəqil fəaliyyətin gedişində bərqərar olmuş mühakimə və fəaliyyətlər nəinki şüurlu surətdə motivləşən fəaliyyətlərin yerinə yetirilməsində iştirak etmə qabiliyyətini möhkəmləndirir və formalaşdırır, eyni zamanda, mümkün çətinliklərə baxmayaraq, qərarların müvəffəqiyyətlə yerinə yetirilməsinə şərait yaradır.

Müstəqillik dedikdə nə başa düşülməlidir? Müstəqillik – öz qüvvəsi, imkanları, bacarığı ilə biliklərə, fəaliyyət üsullarına, təşəbbüskarlığa, tənqidiliyə, adekvat özünüqiymətləndirməyə, özünün fəaliyyəti və davranışına görə şəxsi məsuliyyət hissinə yiyələnməkdə təzahür edir.

Yeniyetmələrin hərtərəfli və ahəngdar inkişaf etməsi üçün ailə və məktəb onlarda bir sıra mühüm keyfiyyətlərin formalaşmasına qayğı göstərməlidir. Bu keyfiyyətlər müxtəlifdir: vətənpərvərlik, böyüyə hörmət, sadəlik və təvazökarlıq, nəzakət, nümunəvi davranış, düzlük və doğruçuluq, humanizm, əməksevərlik, yoldaşlıq və dostluq, ədalət, təşəbbüskarlıq, igidlik, təşkilatçılıq, mübarizlik, mərdlik, çətinliklərin öhdəsindən gəlmək, qəhrəmanlıq, qorxmazlıq, balacalara qayğı, tolerantlıq, təmkinlilik və s.

Həmin keyfiyyətlərin sırasında müstəqilliyin formalaşdırılması özünəməxsus yer tutur. Yeniyetməlik yaşında uşaq (təhsilalan) özü müstəqilliyə can atır, onlarda özlərini böyüklər kimi aparmaq, nəsihətə, tabe olmamaq, sözə qulaq asmamaq, cəhdi yaranır. Bu xüsusiyyətlər yaş dövrünün xüsusiyyətləri ilə bağlıdır.

Şagirdlər davranış də rəftarlarına tənqidi yanaşır, yaşlıların hərəkətlərini mexaniki təkrarlamırlar. Həmin yaş dövrü başqa yaş dövrlərindən fərqli olaraq öz ziddiyyətləri ilə fərqlənir.

Təcrübəli müəllimlər təlim prosesində, bu və ya digər fənn üzrə məşğələlərdə tədris materiallarının müstəqil surətdə təhlilini aparmağı, müstəqil fikir söyləməyi, müstəqil nəticəyə gəlməyi, özlərinin doğru-düzgün mövqelərini müdafiə etməyi məktəblilərə öyrətməli, onları bu işə alışdırmalıdırlar. Bu iş sinifdənxaric tədbirlərdə də davam etdirilməlidir.

Şagirdlərə bir sıra tələblər verilir. Həmin tələblərə daxildir:

1. Bilikləri müstəqil qazanmaq bacarığı.
2. Müxtəlif problemlərin həlli üzrə qazanılmış bilikləri təcrübədə tətbiq etmək bacarığı.
3. Müstəqil şəkildə müxtəlif informasiyalarla iş, onları təhlil etmək, ümumiləşdirmək və müəyyən nəticəyə gəlmək səriştəsi.
4. Müstəqil olaraq tənqidi düşünmə qabiliyyəti, problemlərinin həllinin səmərəli yollarını müəyyənləşdirmək bacarığı.

Hər bir dərsin əsas vəzifəsi təqdim olunan materialı şagirdlərə mənimsətmək, oxunanları və təqdim olunan məlumatları təhlil etmək, hadisə, təzahür və faktları müstəqil qiymətləndirmək, onlarda dünyaya, ətraf aləmə öz baxışını formalaşdırmaqdan ibarətdir. Deyilənlər əsasında təhsilalanlarda dünyagörüşü yaranır.

Təlim fəaliyyətində yeniyetmələrin müstəqilliyi səviyyəsinin yüksəldilməsi imkan verir ki:

1) fənlərarası əlaqələrin həyata keçirilməsi səviyyəsində bilik, fəaliyyət və münasibətlərin formalaşdırılması sahəsinin genişləndirilsin;

2) müvafiq biliklərin və fəaliyyətlərin müstəqil axtarışı üzrə tədris vəzifələrinin həyata keçirilməsində müəllimin göstərişlərindən, müəyyən bilik və fəaliyyətlərdən faydalanmanın zəruriliyinə keçid;

3) yerinə yetirilmiş ayrı-ayrı əməliyyatların formalaşdırılmasından bütün fəaliyyətin formalaşdırılmasına keçid;

4) hazır şəkildə olan fəaliyyətlərə yiyələnmədən ayrı-ayrı fəaliyyətlərin müstəqil müəyyənləşdirilməsinə və icrasına keçid;

5) müəyyən bacarıqların məlumatlarına yiyələnmənin zəruriliyinin dərk edilməsindən tədris fəaliyyətinin tamyönlü quruluşuna yiyələnmənin vacibliyinin dərkedilməsinə keçid;

6) reproduktiv xarakterli vəzifələrdən (tapşırıqlardan) yaradıcı tapşırıqlara keçid və s. baş versin.

**Problemin aktuallığı**. Tədqiqatdan alınan nəticələr idraka (dərketməyə) fəaliyyətyönlü yanaşmanın və yeniyetmələrdə müstəqilliyin tərbiyə olunmasının, təlim prosesi və sinifdənxaric tədbirlərin qarşılıqlı əlaqəsinin faydalılığını təsdiq etmiş, xüsusi təşkil olunmuş bitkin və tam təhsil mühitində V-IX sinif şagirdlərinin şəxsiyyətyönlü inkişafı barədə nəzəri təsəvvür yaratmışdır.

**Problemin yeniliyi**. Müstəqillik anlayışının mahiyyətinə aydınlıq gətirilmiş; şagirdlərin müstəqilliyinin inkişaf etdirilməsi prosesinin nəzəri və tətbiqi müddəaları, onun mahiyyəti və məzmunu əsaslandırılmışdır.

**Problemin praktik əhəmiyyəti**. Tədqiqatda yeniyetmələrdə müstəqilliyin formalaşdırılmasının nəzəri və praktik əsasları işlənmişdir. V-IX sinif şagirdlərində müstəqilliyin formalaşdırılması məqsədilə aparılan tədqiqatdan ümumtəhsil məktəblərinin pedaqoji kollektivləri faydalanacaqlar.

**Ədəbiyyat**:

1. Abbasov, M.Ə. Təlim və tərbiyənin vəhdəti vəziyyətində azyaşlı məktəbli şəxsiyyətinin formalaşdırılması məsələsi: / pedaqogika üzrə fəlsəfə doktoru dis. / - Bakı, 2005. -167 s.
2. Abdinova, N.C. Təlimin optimallaşdırılması vəziyyətində şagird şəxsiyyətinin inkişaf mərhələsi (I-IV siniflər): / pedaqogika üzrə fəlsəfə doktoru dis. / - Bakı, 2010. -154 s.
3. Abdullayeva, S.A. Sinifdənxaric tədbirlər yuxarı sinif şagirdlərinin milli mənlik şüurunun formalaşdırılmasının mühüm vasitəsi kimi: / pedaqogika üzrə fəlsəfə doktoru dis. / - Bakı, 2006. -158 s.

**E-mail:** ulviyy.ismayilova@mail.ru
**Rəyçilər:** *ped.elm.dok., prof.* **A.N. Abbasov**, *ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 05.12.2022.

***Gülbəniz Şirinbəy qızı Şirinbəyova***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun mütəxəssisi*

# ƏMƏK BAZARININ DİNAMİK İNKİŞAFI PEŞƏ TƏHSİL MÜƏSSİSƏLƏRİNDƏ MODUL METODİKASININ TƏTBİQİNİ SÜRƏTLƏNDİRİR

***Гюльбениз Ширинбек гызы Ширинбекова***
*специалист Института Образования Азербайджанской Республики*

# ДИНАМИЧНОЕ РАЗВИТИЕ РЫНКА ТРУДА УСКОРЯЕТ ПРИМЕНЕНИЕ МОДУЛЬНОЙ МЕТОДИКИ В УЧРЕЖДЕНИЯХ ПРОФЕССИОНАЛЬНОГО ОБРАЗОВАНИЯ

***Gulbeniz Shirinbey Shirinbeyova***
*specialist of the İnstitute Education of the Republic of Azerbaijan*

# THE DYNAMIC DEVELOPMENT OF THE LABOR MARKET ACCELERATES THE APPLICATION OF THE MODULE METHODOLOGY IN VOCATIONAL EDUCATION INSTITUTIONS

**Xülasə.** Məqalədə əmək bazarının dinamik inkişafı, peşə təhsili müəssisələrində modul metodikanın tətbiqinin vacibliyi qeyd olunur. Mövcud ixtisasların müasir əmək bazarının tələblərinə cavab verməməsi, milli əmək bazarının tələblərinə cavab verən peşə və ixtisas (kvalifikasiya) standartlarının, onların əsasında isə təlim, təhsil və tədris proqramlarının hazırlanması və tətbiqi, əmək bazarında mövcud vəziyyətin dəqiq qiymətləndirilməsi və gələcək meyillərin müəyyən olunması, iş yerində təlimin təşviqi və təşkili qeyd olunur.

***Açar sözlər:*** *peşə təhsil müəssisələrdə modul metodikanın tətbiqi, peşə təhsil müəssisələrin işəgötürənlərlə iş birliyi, ixtisasların müasirləşdirilməsi, iş yerində təlimin təşviqi və təşkili, sosial-iqtisadi inkişafa dair milli prioritetlər*

**Резюме.** В статье отмечается динамичное развитие рынка труда, важность применения модульной методики в профессионально-технических учебных заведениях. Несоответствие существующих квалификаций требованиям современного рынка труда, подготовка и применение профессиональных и специализированных (квалификационных) стандартов, отвечающих требованиям национального рынка труда. А также основанные на них обучающие программы, достоверное оценивание текущей ситуации на рынке труда и определение будущих тенденций, отмечает продвижение на рабочем месте и организацию обучения.

***Ключевые слова: с****отрудничество учреждений профессионального образования с работодателями, модернизирование специальностей, продвижение и организация обучения на рабочем месте, применение модульной методологии в учреждениях профессионального образования, Национальные приоритеты о социально-экономическом развитии*

**Summary.** The article mentions the dynamic development of the labor market, the importance of applying the modular methodology in vocational educational institutions. Failure of existing qualifications to meet the requirements of the modern labor market, preparation and application of professional and specialty (qualification) standards that meet the requirements of the national labor market, and based on them training, education and training programs, accurate assessment of the current situation in the labor market and determination of future trends, in the workplace promotion and organization of training is mentioned.

***Key words: c****ooperation of vocational educational institutions with employers, modernization of qualifications, promotion and organization of workplace training, application of modular methodology in vocational educational institutions, National Priorities for socio-economic development*

Ölkə başçısı cənab İlham Əliyevin 2 fevral 2021-ci il tarixli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər"də təhsil sisteminin hər bir insanın fərdi uğurları və ölkənin uzunmüddətli inkişafı üçün həlledici rol oynadığı xüsusi qeyd olunur. Sənəddə güclü təhsil hesabına yüksək peşə bacarıqlarına malik insan kapitalı formalaşdırmaq təhsil sisteminin qarşısında mühüm vəzifə kimi qoyulur. Bu çağırışlar peşə təhsili müəssisələrində işin təşkilini, modul metodikasının tətbiqini və qabaqlayıcı kadr hazırlığını sürətləndirməlidir.

Müasir dövrdə texnologiyaların sürətlə inkişafı, iqtisadiyyatın dinamikası yerli və xarici əmək bazarındakı peşələrə ciddi təsir göstərir. Peşələr sürətlə dəyişir, bəzi peşələrə tələbat olmadığından onlar sıradan çıxır, yeni peşələr meydana gəlir. Əmək bazarında rəqabətqabilliyi qoruyub saxlaya bilmək, daim tələb olunan mütəxəssis olmaq üçün fasiləsiz öyrənmək, peşəkar bilik və bacarıqlara yiyələnmək, sosial səriştələri inkişaf etdirmək həyati zərurətə çevrilir. Bu mənada hər kəs peşə seçimi ilə bağlı qərar verməzdən əvvəl əmək bazarının tələbləri baxımından öz bilik və bacarıqlarını dəyərləndirməlidir.

İstənilən sahədə (istər kənd təsərrüfatı, istərsə də sənayedə) əmək məhsuldarlığı səviyyəsinin aşağı olması bu sahədə intensiv üsullardan, innovasiya və məsləhət xidmətlərindən zəif istifadə edilməsi, eləcə də işçi qüvvəsinin əksəriyyətinin ixtisassız olması ilə əlaqələndirilir. Digər tərəfdən də mütəmadi hesablamaların aparılması üçün əmək məhsuldarlığı üzrə uçot sisteminin təkmilləşdirilməsinə zərurət yaranır.

Əmək ehtiyatlarının keyfiyyətinin yüksəldilməsi, əmək bazarının və davamlı inkişaf edən iqtisadiyyatın tələblərinə uyğunlaşdırılması, bütövlükdə əmək bazarında işçi qüvvəsinin istifadəsində səmərəliliyin artırılması sahəsində məsələlərin həlli beynəlxalq və milli əmək bazarının tələblərinə cavab verən peşə və ixtisas (kvalifikasiya) standartlarının, onların əsasında isə təlim, təhsil və tədris proqramlarının hazırlanması və tətbiqi vasitəsilə həyata keçirilir. Səriştələr əsasında hazırlanmış peşə standartlarının və modul təlimin tətbiqi milli işçi qüvvəsinin rəqabətqabiliyyətliliyinin artırılması və onun beynəlxalq əmək bazarına inteqrasiyası üçün əsas alətdir.

Əmək bazarında mövcud vəziyyətin dəqiq qiymətləndirilməsi və gələcək meyllərin müəyyən olunması üçün məlumatlara əsaslanan proqnoz sistemi (əhalinin iqtisadi fəallığının müayinəsi, ev təsərrüfatlarının müayinəsi), ekspert rəyləri və hesablamaları əsasında keyfiyyət analizi, ali, orta ixtisas və peşə təhsili məzunları arasında mütəmadi sorğuların keçirilməsi, vakansiyalar bazasının və əmək ehtiyatları balansı üzrə əldə edilmiş məlumatların bir-biri ilə əlaqələndirilmiş təhlili, uzlaşdırılması və monitorinqi nəticəsində müvafiq səmərəli idarəetmə qərarlarının qəbul edilməsi məqsədilə 2019-cu ildə Azərbaycan Respublikasının Prezidentinin sərəncamı ilə Azərbaycan Respublikasında Əmək Bazarı üzrə Milli Observatoriya institutu yaradılmışdır.

Milli Observatoriya institutu əmək bazarının təhlili, insan resurslarının idarə olunması, əmək bazarının real tələblərinə cavab verən ixtisaslı kadrlara olan tələb və təklifin aşkarlanması və uyğunlaşdırılması, perspektiv tələbatın proqnozlaşdırılmasına dair tədqiqatlar, yanaşmalar, metodologiyalar, vasitələr və institusional mexanizmlərin işlənib hazırlanmasında da mühüm əhəmiyyət kəsb edir. Bununla yanaşı, əmək bazarı üzrə Milli Observatoriyanın yaradılmasında qabaqcıl dünya təcrübəsindən istifadəyə xüsusi önəm verilir. Bu istiqamətdə Avropa Təhsil Fondu ilə də əməkdaşlıq edilməkdədir.

Qeyd etdiyimiz kimi, sürətlə dəyişən texnologiya kadr hazırlığından çeviklik tələb edir. Hazırki şəraitdə bir ixtisası bir dəfə öyrənməklə işi bitmiş hesab etmək olmaz. Çünki texnologiyaların sürətlə inkişafı nəticəsində bir sıra ixtisaslar çox qısa zamanda köhnələrək sıradan çıxır, onların əsasında yeni ixtisaslar yaranır. Ona görə də əldə olunmuş bilik və bacarıqların yenilənməsinə və təkmilləşməsinə daima ehtiyac duyulur. Peşə təhsili müəssisələrində resursların məhdudluğu təhsil proqramlarının (kurikulumların) çevikliyini daha zəruri edir. Təhsil proqramları (kurikulumlar) əmək bazarının real tələblərini ödəməklə yanaşı, iqtisadi cəhətdən də sərfəli olmalıdır. Çevik peşə təhsili təhsilalanlar üçün də sərfəlidir, çünki çeviklik məzunların vaxtilə qazandıqları təhsil nəticələrini təlim zamanı nəzərə almağa imkan verir. Peşə təhsili sistemi çevik olduğu qədər də şəffaf və anlaşılan olmalıdır, yəni həm işəgötürənlər, həm də təhsilalanlar təlim proqramlarının (kurikulumla-

rın) nəticələrini qabaqcadan aydın görə bilməli, qabaqlayıcı kadr hazırlığını təmin etməlidir. Bu halda peşə təhsilinin əhatə dairəsini genişləndirmək, işlə təmin olunmaq üçün dövlət məşğulluq xidməti orqanlarına müraciət etmiş vətəndaşların ən azı 20 faizini 2030-cu ilədək peşə hazırlığına cəlb etmək və peşə təhsilinin məzmununun müasir əmək bazarının tələblərinə uyğun olaraq qurmaq, səriştəyönlü modul təlimin tətbiqini genişləndirmək strategiyanın prioritet hədəflərindən sayılır.

Strategiya – Azərbaycan Respublikası Prezidenti İlham Əliyev tərəfindən 2018-ci il 30 oktyabr tarixli Sərəncamı ilə qarşıdakı illərdə icrası nəzərdə tutulan "2019-2030-cu illər üçün Azərbaycan Respublikasının Məşğulluq Strategiyası" (bundan sonra – Strategiya) təsdiq edilmişdir.

Əmək bazarında dinamikliyi nəzərə alaraq strategiyada aşağıdakı prioritet istiqamətlər müəyyənləşdirilmişdir:

- *2030-cu ilədək əmək bazarında mövcud olan bütün prioritet peşələr üzrə peşə standartlarını hazırlamaq, onların müntəzəm yenilənməsi mexanizmini yaratmaq və peşə təhsilində bütün kurikulumların peşə standartları əsasında hazırlamaq;*
- *regional peşə tədrisi mərkəzlərinin sayını artırmaq;*
- *2025-ci ilədək qeyri-formal və informal təhsil vasitəsilə əldə edilən səriştələrin tanınması sistemini formalaşdırmaq;*
- *qisamüddətli peşə hazırlığı kursları təşkil etmək;*
- *işlə təmin olunmaq üçün dövlət məşğulluq xidməti orqanlarına müraciət etmiş vətəndaşların ən azı 20 faizini 2030-cu ilədək peşə hazırlığına cəlb etmək;*
- *özünüməşğulluq proqramının əhatə dairəsini genişləndirmək.*

Əmək bazarında innovativ üsulların tətbiqi, məhsul istehsalının həcminin intensiv artması, texnoloji proseslərin geriliyini aradan qaldırmağı bacaran, rəqabətqabiliyyətli, modern təhsil almış həyati bacarıqlara yiyələnmiş yüksək ixtisaslı, peşəkar səriştəli kadrların hazırlanması peşə təhsili müəssisələrin üzərinə düşür. Məhz bu məqsədlə Prezidenti İlham Əliyev 2016-cı il 6 dekabr tarixli 1138 nömrəli fərmanı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında peşə təhsilinin və təliminin inkişafına dair Strateji Yol Xəritəsi"ndə əmək bazarında strateji məşğulluq sahələrinin müəyyən edilməsi və kadr tələbatının proqnozlaşdırılması xüsusi yer tutur.

Peşə təhsilinin inkişaf etdirilməsi, təhsil və əmək bazarı arasında kəmiyyət, keyfiyyət və gözləntilər baxımından mövcud olan uyğunsuzluqların aradan qaldırılması məqsədilə "Azərbaycan Respublikasında peşə təhsili və təliminin inkişafına dəstək olaraq Azərbaycan Respublikasının Prezidentinin sərəncamı ilə Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyi yanında 20 aprel 2016-cı ildə Peşə Təhsili üzrə Dövlət Agentliyi, Prezidentin digər sərəncamı ilə 20 aprel 2018-ci ildə Azərbaycan Respublikası Mədəniyyət və Turizm Nazirliyinin əsasında Azərbaycan Respublikası Mədəniyyət Nazirliyi və Azərbaycan Respublikası Dövlət Turizm Agentliyi, 22 yanvar 2021-ci il tarixli 1257 nömrəli fərmanı ilə isə "Sumqayıt Kimya Sənaye Parkı" MMC-in əsasında İqtisadi Zonaların İnkişafı Agentliyi publik şəxs kimi yaradılmış və bir çox fundamental sənədlər qəbul edilib. Bütün bunlara baxmayaraq, peşə təhsilinə olan maraq zəifdir.

Təhlil üçün bircə fakta müraciət edək. Hazırda Peşə Təhsili üzrə Dövlət Agentliyinin tabeliyində 9 istiqamət üzrə ödənişli və ödənişsiz 127 **ixtisas olmaqla 72 peşə təhsili müəssisəsi, onlardan 31** yüksək texniki **peşə təhsili məktəbi, 25 peşə təhsili mərkəzi, 16 peşə liseyi fəaliyyət göstərir.**

2021-2022-ci tədris ilində Peşə Təhsili üzrə Dövlət Agentliyi üzrə 65 ixtisas qrupu üzrə 120 ixtisas olmaqla ödənişli əsaslarla 6740 yer, dövlət sifarişi əsasında 13840 yer, Dövlət Turizm Agentliyi üzrə 10 ixtisas üzrə 320 ödənişli,160 ödənişsiz, İqtisadi Zonaların İnkişafı Agentliyi üzrə 10 ixtisas üzrə ödənişli 40 yer, ödənişsiz 160 yer, ümumilikdə ölkə üzrə 140 ixtisas üzrə 21260 yer müəyyənləşdirilmişdir. (2021-ci il 15 sentyabr tarixli 547 nömrəli Sərəncamı ilə təsdiq edilmişdir)

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2011-ci il 31 oktyabr tarixli 178 nömrəli Qərarı ilə təsdiq edilmiş "İlk peşə-ixtisas təhsili üzrə ixtisasların Təsnifat"ında 9 istiqamət üzrə 218 ixtisas qrupu, 708 ixtisas vardır ki, bu da yuxarıda göstərdiyim illərlə müqayisədə dəfələrlə çoxdur.

Yuxarıda qeyd etdiyimiz kimi, bəzi ixtisaslar zaman-zaman köhnələrək müasir əmək bazarının tələblərinə cavab vermədiyi üçün tədrisdən çıxarılmışdır. Məsələn, fakt olaraq VIII bölmədə "İlkin tələbat və ərzaq mallarının texnologiyası" peşə istiqaməti üzrə ixtisas qrupu və s. ixtisasları misal göstərmək olar. Bunun bir səbəbi peşə təhsili müəssisələrində maddi texniki bazanın olmaması, digər səbəbi də iş yerində təlim və ikili peşə təhsili sisteminin ("dual study") təşkil olunmasıdır.

Təhsil sahəsi dövlət başçısı İ. Əliyevin daim diqqət mərkəzindədir. Təhsil sahəsinin inkişafı və dövrün tələblərinə cavab üçün dövlət hər şey edir. Təhsilin, xüsusilə peşə təhsili pilləsinin kifayət qədər geniş spektrdə hüquqi bazası vardır ki, bu da əmək bazarının tənzimlənməsi və institusional strukturun təkmilləşdirilməsini ön plana çəkir.

Azərbaycan Respublikası Əmək Məcəlləsinin "Məşğulluq haqqında" Azərbaycan Respublikası Qanununun və digər normativ hüquqi aktların işsiz və işaxtaran vətəndaşların sosial müdafiəsinin gücləndirilməsi, peşə standartlarının hazırlanması və tətbiqi, işsizlikdən sığorta sisteminin əhatə dairəsinin genişləndirilməsi, bacarıqların inkişafı, virtual müəssisələrin (təcrübə müəssisələrinin) yaradılması, peşəyönümü sisteminin daha səmərəli təşkili, səriştəəsaslı modul təlimin və iş yerində təlimin təşviqi, ömürboyu təhsil üzrə milli kvalifikasiya sisteminin formalaşdırılması, qeyri-formal və informal təhsil vasitəsilə əldə edilmiş səriştələrin tanınması, əlilliyi olan şəxslərin məşğulluğu, əmək standartlarının yüksəldilməsi, əməkçi miqrantların sosial müdafiəsinin gücləndirilməsi, ikili peşə təhsili sisteminin ("dual study") tətbiqi kimi məsələləri öz əksini tapmışdır.

Strategiyanın 4.3-cü bəndində əmək bazarının tənzimlənməsi işçi qüvvəsinin bacarıqlarının inkişaf etdirilməsi və əmək standartlarının təkmilləşdirilməsi hədəfə alınaraq aşağıdakı prioritetlər müəyyən edilmişdir:

- *məşğul əhalinin rəqabətqabiliyyətliliyini və əmək məhsuldarlığını artırmaq məqsədilə bacarıqların inkişaf etdirilməsi üçün şərait yaratmaq;*
- *qeyri-formal və informal təhsil vasitəsilə əldə edilmiş səriştələrin tanınması, işçi qüvvəsinin sertifikasiyası sistemini qurmaq;*
- *ömürboyu təhsil üzrə nəticəəsaslı milli kvalifikasiya sisteminin formalaşdırılması, o cümlədən yaşlıların təhsili üçün peşə təlimi və ixtisasartırma sistemini təkmilləşdirmək;*
- *əmək bazarının tələblərini əks etdirən peşə və kvalifikasiya standartlarının hazırlanması və tətbiqi mexanizmlərinin yaradılması, o cümlədən iqtisadiyyatın əsas sahələri üzrə səriştələri qruplaşdırmaq;*
- *əmək bazarının tələblərini əks etdirən peşə standartları əsasında səriştəyönlü tədris proqramlarının və təlim materiallarının hazırlanmasına dəstək vermək;*
- *əmək bazarında rəqabətqabiliyyətli kadrların hazırlanması məqsədilə peşə təhsili (ilk peşə-ixtisas, orta ixtisas və ali) sisteminin təkmilləşdirilməsi;*
- *iş yerində təlim, ikili peşə təhsili sisteminin ("dual study") təşkili mexanizmlərinin hazırlanması və tətbiqi.*

Son olaraq qeyd edək ki, işəgötürənlərlə əməkdaşlıq əsas fəaliyyət istiqamətlərindən biridir. İşəgötürənlərin peşə təhsilinin təşkili və tədrisində, həm də müəssisələrin idarəetməsində iştirakı vacibdir. Əmək bazarı (işəgötürənlərlə) ilə sıx əlaqə olmadan peşə təhsilinin uzun müddətdə uğuru qeyri-mümkündür.

**Problemin aktuallığı.** Əmək bazarının dinamik inkişafı, peşə təhsilinin məzmununun müasir əmək bazarının tələblərinə uyğunlaşdırmağı və səriştəyönlü modul təlimin tətbiqini tələb edir.

**Problemin elmi yeniliyi.** İşəgötürənlərlə əməkdaşlıq əsas fəaliyyət istiqamətlərindən biri olaraq, peşə təhsilinin təşkili və tədrisində, həm də müəssisələrin idarəetməsində iştirakı vacibdir. İşəgötürənlərlə sıx əlaqə olmadan peşə təhsilinin uzun müddətdə uğuru qeyri-mümkündür.

**Problemin praktik əhəmiyyəti.** Əmək bazarının tələblərini əks etdirən peşə və kvalifikasiya standartlarının hazırlanması, modul metodikanın tətbiqi, qeyri-formal və informal təhsil vasitəsilə əldə edilmiş səriştələrin tanınması, ömürboyu təhsil üzrə nəticəəsaslı milli kvalifikasiya sisteminin formalaşdırılması, o cümlədən yaşlıların təhsili üçün peşə təlimi və ixtisasartırma sistemini təkmilləşdirilməsi məşğul əhalinin rəqabətqabiliyyətliliyini və əmək məhsuldarlığını artıracaqdır.

**Ədəbiyyat:**

1. "2019-2030-cu illər üçün Azərbaycan Respublikasının Məşğulluq Strategiyası", 31 oktyabr 2018-ci il.
2. Peşə təhsili və insan kapitalı. Elmi-praktik, metodik jurnal. Cild 4, №3, -2021.
3. Peşə təhsili və insan kapitalı. Elmi-praktik, metodik jurnal. Cild 5, №3, -2022.

A. Mehrabov, A. Abbasov, M. Mahmudov. Təhsilin modernləşdirilməsinin aktual problemləri. Bakı: Mütərcim, 2013

**E-mail:** gulbeniz-67@mail.ru

**Rəyçilər:** *kənd təs.ü.fəls. dok.* **Ə.N. Yusifov,**
*ped.ü.fəls.dok***. X.A. Talıbova**
**Redaksiyaya daxil olub:** 12.12.2022.

# *TƏHSİLİN İDARƏEDİLMƏSİ MƏSƏLƏLƏRİ*
# *ВОПРОСЫ УПРАВЛЕНИЯ ОБРАЗОВАНИЕМ*
# *İSSUES OF EDUCATIONAL MANAGEMENT*

*UOT 371*

***Bünyamin Təmraz oğlu Baxışov***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şəki filialının müəllimi*

## TƏLİM PROSESİNİN İDARƏ OLUNMASININ BƏZİ AKTUAL MƏSƏLƏLƏRİ

***Биньямин Тамраз оглы Бахышов***
*преподаватель Шекинского филиала*
*Азербайджанского Государственного Педагогического Университета*

## НЕКОТОРЫЕ АКТУАЛЬНЫЕ ЗАДАЧИ УПРАВЛЕНИЯ ОБУЧЕНИЕМ

***Binyamin Tamraz Bakhyshov***
*teacher of Sheki branch of Azerbaijan State Pedagogical University*

## SOME CURRENT TASKS OF LEARNING MANAGEMENT

**Xülasə.** Təlim prosesində idarəetmə dedikdə təhsilverənin, yəni müəllimin, təhsilalanlara, yəni tələbələrə məqsədyönlü və sistemli təsiri başa düşülür. İdarəetmə - prinsiplərin, funksiyaların, metodların və üslubların bilavasitə həyata keçirilməsidir. İdarəetmənin elmi əsasını elmi biliklər sistemi təşkil edir. Elmi biliklər sistemi dedikdə isə idarəetmənin praktikasının nəzəri əsası başa düşülür. İdarəetmə yüksək şüurlu münasibətə əsaslanır, yəni elmə söykənir. Bunun hər ikisi bir-biri ilə əlaqədardır: biri olmadan digəri mümkün deyil.
***Açar sözlər:*** *idarəetmə, təlim, müəllim, tələbə, inkişaf, əsaslar*

**Резюме.** Управление учебным процессом означает целенаправленное и планомерное воздействие обучающего, то есть преподавателя, на обучаемого, то есть на студента. Управление– это непосредственное осуществление принципов, функций, методов и стилей. Научной основой управления является система научных знаний. Система научных знаний означает теоретическую основу практики управления. Управление основано на высоком сознательном отношении, то есть на науке. Оба они связаны друг с другом: существование одного невозможно без другого.
***Ключевые слова:*** *управление, обучение, преподаватель, студент, развитие, основы*

**Summary.** Management of the educational process means a purposeful and systematic influence of the teacher, that is, the teacher, on the student, that is, the student. Management is the direct implementation of principles, functions, methods and styles. The scientific basis of management is the system of scientific knowledge. The system of scientific knowledge means the theoretical basis of management practice. Management is based on a highly conscious attitude, that is, on science. Both of them are connected with each other: the existence of one is impossible without the other.
***Key words:*** *management, learning, teacher, student, development, fundamentals*

Müasir texnoloji cəmiyyət çox intensiv inkişaf edir və bunu təhsil sistemindən də tələb edir. Yəni ölkə iqtisadiyyatının sifarişinə uyğun mütəxəssisin operativ surətdə layihələşdirilməsini və müvafiq məqsədlərin tədris proqramlarının məzmununa daxil edilməsini tələb edir. Bu cür layihələşdirmə nəticəsində geniş mənada – insan, dar mənada – mütəxəssis modeli yaranır, dövlətin mənafeyinə uyğun olaraq şəxsiyyətin intellektual bacarıqları, bilikləri, qabiliyyətləri və onlar arasındakı əlaqələr aydın surətdə müəyyənləşdirilir və dəqiqləşdirilir.

Təhsil prosesinin inkişafı, əslində, onun mürəkkəb fəaliyyət növlərinin daha sadə növlərə parçalanmasından, təlimin isə daha sadə fəaliyyət növlərinə ayrılmasından ibarətdir. Lakin bu cür inkişaf mürəkkəb fəaliyyətin dərin təhlilini, onun struktur elementlərinin müəyyənləşdirilməsini tələb edir. Məqsəd, mürəkkəb professional fəaliyyət növlərinin sadə, elementar fəaliyyət növlərinə parçalanması, sonra isə bu sadə əməliyyatların konstruksiyası nəticəsində mürəkkəb peşəkar fəaliyyət növlərinin yaradılmasıdır.

Təlim prosesində idarəetmə dedikdə isə təhsilverənin, yəni müəllimin, təhsilalanlara, yəni tələbələrə məqsədyönlü və sistemli təsiri başa düşülür.

İdarə etmək – tələbəyə təzyiq göstərmək, onu təbiətinə zidd başqa bir istiqamətə yönəltmək demək deyil, əksinə, prosesin xarakterini, bütün tərkib ünsürlərini nəzərə alaraq pedaqoji təsirləri məntiqi olaraq uzlaşdırmaqdır.

İdarəetmə – prinsiplərin, funksiyaların, metodların və üslubların bilavasitə həyata keçirilməsidir. İdarəetmənin elmi əsasını elmi biliklər sistemi təşkil edir. Elmi biliklər sistemi dedikdə isə idarəetmənin praktikasının nəzəri əsası başa düşülür. İdarəetmə yüksək şüurlu münasibətə əsaslanır, yəni elmə söykənir. Bunun hər ikisi bir-biri ilə əlaqədardır: biri olmadan digəri mümkün deyil. Tərbiyəedənlə tərbiyəolunanın idarəetmədə birgə fəaliyyəti tələbənin sosial çərçivədə təcrübəsini genişləndirir, auditoriyadaxili pozitiv münasibətləri formalaşdırmağa kömək edir, həlledici mərhələlərdə öz fikrini deməyə imkan verir, müəllimlərlə ittifaq yaratmağa, onların yaxın köməkçisi olmağa istiqamətləndirir. Buna görə də müəllim və tələbə idarəetmə orqanlarının birgə qərarının lazımlı, obyektiv və təxirəsalınmaz olması zərurəti meydana gəlir. Pedaqoji sistemdə müəllimlərlə tələbələrin birgə fəaliyyəti mühüm amildir. Təhsil müəssisələrinin məqsədi şəxsiyyətin mədəni inkişafını formalaşdırmaqdır. Bu əsas intellektual, əxlaqi, estetik, əmək, ekoloji, hüquqi və şəxsiyyətin digər mədəni aspektlərini birləşdirir. Ümumi məqsəd təhsil-tərbiyə işinin ayrı-ayrı istiqamətləri üzrə məqsədlərdə konkretləşdirilir. Nəticə həm ayrı-ayrı tələbələrin, həm də ümumiyyətlə, tələbə kollektivlərinin tərbiyəlilik səviyyəsinin müəyyənləşdirilməsini təmin edən daha sabit və real meyarların məcmusudur.

Təlim prosesinin idarəolunmasının özünəməxsus xüsusiyyətləri vardır:

- şüurlu və planlı təsir;
- idarə edən sistemaltı ilə (müəllimlə) idarəetmə obyekti (tələbə) arasında səbəb-nəticə əlaqələrinin mövcudluğu;
- idarəolunan sistemin dinamikliyi;
- etibarlılıq, yəni idarəolunan sistemin müəyyən şəraitdə verilmiş funksiyaları həll edə bilməsi;
- davamlılıq, yəni idarəolunan sistemin daxili və xarici amillərinin təsirinə baxmayaraq, müəyyən olunmuş fəaliyyət rejimini saxlaması.

İdarəetmə – həm fasiləsiz, həm də dövri prosesdir. Bu bir sıra idarəetmə halqalarının eyni zamanda və ardıcıllıqla reallaşdırılması ilə əlaqədardır. İdarəetmə fəaliyyəti məqsədin qoyulması və vəzifələrin müəyyənləşdirilməsi ilə başlayır, onların həlli ilə başa çatır. Bundan sonra qarşıya yeni məqsədlər qoyulur və idarəetmə fəaliyyəti davam edir.

Təlim və tərbiyə prosesi məqsəd, fəaliyyət, nəticə və yeni məqsəd sxemi əsasında idarə olunur. İdarəetmə prosesində müəllimin vəzifəsi idarəolunan prosesin inkişaf strukturunu dəyişmək və onun əvvəlcədən nəzərdə tutulan səviyyəyə çatdırmaqdır. Təlimin idarəolunması bu prosesin hər bir iştirakçısının yerini, vəzifələrini, hüquq və məsuliyyətini dəqiqləşdirməyi, məqsədə çatmaq üçün əlverişli situasiya yaratmağı tələb edir.

İdarəetmə – informasiyaverici prosesdir, o, siqnalların verilməsinin qapalı zənciridir. Obyektin davranışı üzərində daimi nəzarətdir. İdarəetmə orqanından (müəllimdən) idarəetmə siqnalları verilir. Obyektdən idarəedənə (tələbəyə) əks-əlaqə siqnalları ötürür. Sonuncular isə obyektin faktiki vəziyyəti haqqında məlumatlardır. Müəllim aldığı informasiyam işləməli, dərk etməli və təlim prosesinə ediləcək korreksiyaları didaktik ardıcıllıqla müəyyənləşdirməlidir.

Təhsili idarəetmə nə qədər geniş anlayış olsa da, onun funksiyaları ayrı-aynlıqda deyil, bir-biri ilə əlaqəli şəkildə həyata keçirilməlidir. Hər bir funksiyanın iş prosesində uğuru və ya uğursuzluğu bir-birinə təsir göstərir. Təhsil sistemində idarəetmənin dörd əsas funksiyası qeyd edilir: planlaşdırma, təşkiletmə, motivasiya, nəzarət. İdarəetmə fəaliyyətinin təşkilində aşağıdakı məsələlərin həlli nəzərdə tutulur:

– idarəetmənin quruluşunun müəyyənləşdirilməsi;

– hər dövr üçün quruluş, məzmun və funksional komponentlərin ayrılması;

– idarəetmənin bütün dövrlərində işdə olan çətinlikləri aradan qaldırmaq üçün qarşılıq, fəaliyyətin təşkil edilməsi;

– pedaqoji və tələbə kollektivləri səviyyəsində idarəetmə bacarığının öyrənilib həyata keçirilməsi;

– əks-əlaqə, koordinasiya və idarəetmədə münasibətlərin yaradılması.

Təlim və tərbiyə prosesi məqsəd, fəaliyyət, nəticə və yeni məqsəd sxemi əsasında idarə olunur.

İdarəetmə prosesində müəllimin vəzifəsi idarə olunan prosesin inkişaf strukturunu dəyişmək və onu əvvəlcədən nəzərdə tutulan səviyyəyə çatdırmaqdır.

Təlimin idarəolunması bu prosesin hər bir iştirakçısının yerini, vəzifələrini, hüquq və məsuliyyətini dəqiqləşdirməyi, məqsədə çatmaq üçün əlverişli situasiya yaratmağı tələb edir.

Təlim prosesində əks-əlaqənin yaradılması iki məqsəd daşıyır:

• əks-əlaqə məzmununun müəyyənləşdirilməsi – təlim məqsədlərinə və təlimin qanunauyğunluqlarına uyğun olaraq nəzarət olunacaq xarakteristikalar məcmusunun müəyyənləşdirilməsi (bu, tədris proqramlarının tərtibi zamanı baza kimi götürülür);

• əks-əlaqənin tezliyinin müəyyənləşdirilməsi.

Təlim prosesinin tənzimlənməsi isə idarəolunan sistemin fəaliyyətinin elə təşkili deməkdir ki, bu zaman idarəolunan sistemin nəzərdə tutulmuş səviyyəyə qalxması təmin olunur. Tələbənin bu və ya digər tədris fənnini və yaxud həmin fənnin hər hansı bir bölməsini, mövzusunu bilməməsi nəticəsində yol verdiyi səhvlər fərdi formada özünü göstərir. Tələbə mövzunu xatırlaya bilmir, izah edə bilmir, bu və ya digər faktı üzə çıxarmaqda, qanunauyğunluqları dərk etməkdə çətinlik çəkir. Deməli, ali məktəb müəllimi tələbənin fəaliyyətinə düzəlişlər etmək üçün təlim – idrak proseslərinin əsas parametrlərini diqqət mərkəzində saxlamalıdır.

Təlimin özünəməxsusluğu ondadır ki, bu prosesin idarəolunması konkret tələbə – müəllim tərəfindən həyata keçirilir. Aydındır ki, tədris proqramının tərtibi zamanı müəllimin şəxsiyyəti ilə bağlı mürəkkəb və çoxçalarlı faktorları nəzərə almaq mümkün deyil. Ən yaxşı halda, proqram müəyyən təhsilalanlar qrupunun tipik xüsusiyyətləri sisteminə uyğunlaşdırıla bilər. Konkret qrupda təlim prosesində elə əlavə xüsusiyyətlər aşkarlana bilər ki, onların nəzərə alınması qarşıya qoyulmuş məqsədə daha tez çatmağa imkan verər.

Tələbə tərəfindən biliklərin mənimsənilməsinin idarəedilməsi prosesində müəllim onların (tələbələrin) real bilik səviyyəsini nəzərə almaqla faktları müqayisə etmək və ümumiləşdirmək, nəticələr çıxarmaq, alınmış məlumatları tənqidi surətdə təhlil etmək bacarıqlarının formalaşmasına xüsusi diqqət yetirməli, dərslik materiallarını necə mənimsədiklərinə, mənimsəməyə nə qədər vaxt sərf etdiklərinə nəzarət etməli, korreksiya işi aparmalı və təlim-idrak fəaliyyətinin səmərəli təşkilinə nail olmalıdır.

Təlim prosesinin effektivliyinin təmin edilməsi tələbələrin idrak fəaliyyətinin formalaşması və onların ümumi təcrübədən fərdi təcrübəyə keçməsi prosesi kimi başa düşülməlidir.

**Problemin aktuallığı.** Təhsilin idarəolunması məsələsi bütün zamanlarda ən vacib, böyük əhəmiyyət kəsb edən problemlərdən biri olmuşdur. Yeni təhsil islahatları tətbiq edildiyi ölkəmizdə və indiki dövrdə bir daha bu məsələnin araşdırılması öz aktuallığı ilə diqqəti cəlb edir.

**Problemin elmi yeniliyi.** Təlim prosesinin tənzimlənməsi idarəolunan sistemin fəaliyyətinin elə təşkili deməkdir ki, bu zaman idarəolunan sistemin nəzərdə tutulmuş səviyyəyə qalxması təmin olunur.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərinin müəllimləri və magistrantları istifadə edə bilərlər.

**Ədəbiyyat:**


1. Abbasov, A.N. Pedaqogika: orta ixtisas məktəbləri üçün dərs vəsaiti. / A.N. Abbasov -Bakı: Mütərcim, 2010.
2. Bayramov, H. Təhsilin idarə edilməsinin əsasları. / H. Bayramov -Bakı: Beynəlxalq Universitet, -2010.
3. Cabbarov, R.H. Təhsil müəssisələrinin idarə edilməsi məsələləri. / R.H. Cabbarov -Bakı: Müəllim, -2011.
4. Mehrabov, A.O. Təhsil sisteminin idarə olunmasının pedaqoji-psixoloji problemləri. / A.O. Mehrabov, A.N. Abbasov və b. -Bakı: Mütərcim, -2011.

5. Əliyev, P.B. Təhsil müəssisələrində tərbiyə işinin təşkilinin nəzəri və praktik problemləri. / P.B. Əliyev, R.Ş. Mustafayeva., S.H. Həsənova və b. -Bakı: Mütərcim, -2011.
6. Rüstəmov, F. Ali məktəb pedaqogikası. / F. Rüstəmov, T. Dadaşova. -Bakı: Nurlan, -2007.

**E-mail:** bunyamin_1953@mail.ru
**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **M.S. Kazımov,**
*ped.ü.fəls.dok.* **X.A. Həmidova**
**Redaksiyaya daxil olub:** 18.11.2022.

*UOT 371*

***Nərgiz Edvinovna Əhmədova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*

# TƏLƏBƏLƏRDƏ KOMMUNİKATİV BACARIQLARIN FORMALAŞDIRILMASI SƏRİŞTƏLİ MÜƏLLİM HAZIRLIĞININ ƏSAS İSTİQAMƏTLƏRİNDƏN BİRİ KİMİ

***Наргиз Эдвиновна Ахмедова***
*старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

# ФОРМИРОВАНИЕ КОММУНИКАТИВНЫХ НАВЫКОВ У СТУДЕНТОВ КАК ОДНО ИЗ ОСНОВНЫХ НАПРАВЛЕНИЙ КВАЛИФИКАЦИИ ПЕДАГОГИЧЕСКОГО ПОДГОТОВКИ

***Nargiz Edvinovna Ahmadova***
*senior lecturer,at Azerbaijan State Pedagogical University*

# FORMATION OF STUDENTS' COMMUNICATION SKILLS AS ONE OF THE MAIN DIRECTIONS OF SKILLED TEACHER TRAINING

**Xülasə.** Səriştəli müəllim hazırlığının əsas istiqamətlərindən biri gələcək müəllimlərdə kommunikativ bacarıqların formalaşdırılmasından ibarətdir. Təcrübə və tədqiqatlar sübut edir ki, hələ tələbəlik illərindən onlarda müəllim üçün vacib hesab edilən bir sıra kommunikativ bacarıqların əsaslarının öyrədilməsi onların gələcəkdə bir müəllim kimi formalaşmasına əsaslı təsir göstərir. Bu baxımdan, ilk növbədə, bu bacarıqların formalaşmasına sistemli, səriştəli və aksioloji (dəyər kimi) yanaşma lazımdır ki, bunlara da məqalədə toxunulmuş və onların vacibliyi vurğulanmışdır. Bunlarla yanaşı, bu prosesdə bir sıra şərtlərin yerinə yetirilməsi vacibdir. Məqalədə bunlar, əsasən, aşağıdakı kimi müəyyənləşdirilmişdir:

– növündən və formasından asılı olmayaraq bütün təhsil prosesinə şəxsiyyətyönümlü təhsil prinsipi mövqeyindən yanaşılması;

– təhsilin məzmununun praktik yönümlülük istiqamətində zənginləşdirilməsi;

– təhsilin məzmununa tələbələrdə şəxsi keyfiyyətləri inkişaf etdirən fənn bloklarının daxil edilməsi;

– gələcək müəllimlərdə pedaqoji qabiliyyət və bacarıqların, o cümlədən kommunikativ bacarıqların formalaşdırılması üçün xüsusi metodikanın hazırlanması və s.

***Açar sözlər:*** *kommunikativ bacarıqlar, dayanıqlı inkişaf, təhsil, sistemli yanaşma, səriştə*

**Резюме.** Одним из основных направлений компетентной подготовки учителей является формирование коммуникативных навыков у будущих учителей. Опыт и исследования показывают, что обучение их основам ряда коммуникативных навыков, важных для учителя, со студенческих лет оказывает существенное влияние на их будущее развитие как учителя. С этой точки зрения, прежде всего, необходим системный, грамотный и аксиологический (как ценностный) подход к формированию данных умений, что также затрагивается в статье и подчеркивается их важность. Однако при этом важно соблюдать ряд условий. В статье они в основном определяются следующим образом:

– подход ко всему образовательному процессу с точки зрения принципа личностно-ориентированного воспитания независимо от вида и формы;

– обогащение содержания образования в направлении практической направленности;

– включение в содержание обучения предметных блоков, развивающих личностные качества учащихся;

– Разработка специальных методик формирования у будущих педагогов педагогических умений и навыков, в том числе коммуникативных и др.

***Ключевые слова:*** *навыки коммуникации, устойчивое развитие, образование, системный подход, компетентность*

**Summary.** One of the main directions of competent teacher training is the formation of communication skills in future teachers. Experience and research show that teaching them the basics of a number of communicative skills that are important to a teacher from their student years has a significant impact on their future development as a teacher. From this point of view, first of all, a systematic, competent and axiological (as a value) approach to the formation of these skills is needed, which is also touched upon in the article and their importance is emphasized. However, it is important to meet a number of conditions in this process. The article mainly defines them as follows:

– approach to the whole educational process from the point of view of the principle of personality-oriented education, regardless of the type and form;

– enrichment of the content of education in the direction of practical orientation;

– inclusion in the content of education of subject blocks that develop personal qualities in students;

– development of special methodologies for the formation of pedagogical abilities and skills in future teachers, including communication skills, etc.

***Key words:*** *communication skills, sustainable development, education, systematic approach, competence*

Ali pedaqoji məktəb tələbələrində dayanıqlı inkişaf kontekstində kommunikativ bacarıqların formalaşdırılması mühüm əhəmiyyətə malikdir. Bu proses onun nəzəri-metodoloji bazasının yaradılması və bu əsasda onlarda bu bacarıqların formalaşdırılmasının pedaqoji şərtlərinin müəyyənləşdirilməsi ilə sıx surətdə bağlıdır.

Əvvəlcə dayanıqlı inkişaf kontekstində pedaqoji təhsilin bu konsepsiyanın qəbulundan əvvəl mövcud olan ənənəvi pedaqoji təhsildən müasir təhsilin, yəni əməkdaşlıqla təhsilin fərqlərinin nədən ibarət olduğunu nəzər yetirək.

Tədqiqatımız göstərir ki, təlimat kimi dərk edilən təhsildən birgə iştirak kimi dərk edilən təhsilə keçid təhsil prosesində müəyyən fərqli cəhətlərin olması ilə xarakterikdir. Bu fərqlər əsasən aşağıdakılardan ibarətdir.

***Ali pedaqoji təhsildə ənənəvi və müasir təhsil proseslərinin müqayisəli səciyyəsi***

| Ənənəvi təhsil prosesi (təlimatlı təhsil) | Müasir təhsil (əməkdaşlıqla təhsil) |
|---|---|
| 1) ənənəvi təhsil əsasən keçmişin təcrübəsinin öyrənilməsinə köklənir, bilik də müasirliyin nailiyyətlərindən geri qalır; | 1) dayanıqlı inkişaf kontekstində təhsilin məzmunu gələcək nəsillərin həyat şəraitinə zərər yetirmədən indi yaşayan nəsillərin tələbatlarının formalaşdırılmasına istiqamətlənir; |
| 2) ənənəvi təhsildə təkcə müasir dövr üçün aktual olan problemlər öyrənilir; | 2) dayanıqlı inkişaf kontekstində təhsil təkcə aktual problemləri öyrənməməli, həm də gələcəkdə yarana bilən neqativ problemlərin qarşısını almalıdır, proqnozlaşdırma, modelləşdirmə, strateji planlaşdırma dayanıqlı inkişaf kontekstində pedaqoji təhsilin əsas komponentlərindən olmalıdır; |
| 3) ənənəvi təhsil prosesi daha çox reproduktiv xarakter daşıyır, müəllimlə tələbə arasında ünsiyyət subyekt-obyekt tiplidir, tələbə lazımi aktivlik nümayiş etdirməyən passiv dinləyici, informasiyanın alıcısı kimi çıxış edir; | 3) müasir təhsilin məzmunu dayanıqlı inkişaf kontekstində daima yeniləndirilməli, informasiyanın ötürülməsindən dialoqa (subyekt-subyekt münasibətlərinə) və problemlərin layihə həllinə keçid edilməlidir; |
| 4) təhsil prosesində başlıca amil qavrayış və hafizədir, biliklərin mənimsənilməsində yaddaş əsas amildir; | 4) dayanıqlı inkişaf məqsədlərinə nail olmağa praktiki töhfə vermək üçün müasir təhsildə əsas amil təfəkkürə və təxəyyülə əsaslanan (səmərəli kommunikasiya, anlama, sistemli, məntiqi, yaradıcı və tənqidi təfəkkür) müvafiq səriştələrdir. |

Bir sıra xarici ölkələrdə yaşayan müəlliflərin, o cümlədən V.A.Sadovniçiyin, A.S.Stepanovun, Y.N.Dzyatkovskinin və b. dayanıqlı inkişaf naminə təhsilin məqsədləri, təhsil siyasəti və təhsilin praktikası, təhsildə səriştəliliyin formalaşdırılması, təlimat kimi dərk edilən təhsildən birgə iştirak kimi dərk edilən təhsilə keçidə dair əsas ideyalarının [5,s. 3-9; 6, s. 94-98; 2] təhlili göstərdi ki, gələcək müəllimlərdə kommunikativ bacarıqların formalaşdırılması əməkdaşlıqla təhsilin aparılması ilə sıx bağlıdır və bu formada imkanlar daha genişdir.

Gələcək tələbələrdə kommunikativ bacarıqların mümkün qədər ətraflı, geniş və əsaslı şəkildə formalaşmasına dair irəli sürdüyümüz müəyyən mülahizələr bu müəlliflərin ümumi ideoloji və metodoloji çərçivə olan dayanıqlı inkişaf konsepsiyasına dair ideyalarına söykənir. O ideyalar ki, onlar dayanıqlı inkişaf kontekstində tələbələrdə kommunikativ bacarıqların formalaşdırılmasına dair müəyyən mülahizələrimizin yaranmasına və onun aparılması texnologiyalarının müəyyənləşməsinə müəyyən dərəcədə istiqamət vermiş oldu.

"Dayanıqlı inkişaf Konsepsiyası"na və apardığımız tədqiqat işinin nəticələrinə əsaslanaraq gələcək müəllimlərin kommunikativ bacarıqlarının formalaşdırılmasının metodoloji əsası kimi üç yanaşmanı qeyd edə bilərik:

1) sistemli yanaşma – bu, müəllimin kommunikativ bacarıqlarının formalaşdırılmasını onun pedaqoji fəaliyyətə hazırlığının bir-biri ilə qarşılıqlı bağlı olan və qarşılıqlı şərtlənən komponentlərinin (koqnitiv, motivasiya-dəyərlər, refleksiya) vəhdətini təmin edən bütöv proses kimi nəzərdən keçirməyə imkan verir;

2) səriştə əsaslı yanaşma – bu, gələcək müəllimin kommunikativ bacarıqlarının formalaşdırılmasını onun pedaqoji fəaliyyətə şəxsi, nəzəri və praktiki hazırlığının vəhdəti kimi nəzərdən keçirməyə imkan verir;

3) aksioloji yanaşma – bu, gələcək müəllimlərin dayanıqlı inkişaf kontekstində kommunikativ bacarıqların nə üçün formalaşdırılmalı olduğunu dərk etməsinə, onlarda kommunikativ bacarıqların komponentlərinin inkişaf etdirilməsinə marağın formalaşmasına, onların öz inkişaf yollarını təyin etməsinə imkan yaradır. Həmçinin kommunikativ bacarıqların dəyər funksiyasının nələrdən ibarət olmasını dərk etməyə səbəb olur.

Tələbələrdə kommunikativ bacarıqların formalaşdırılması bir sıra pedaqoji, o cümlədən psixopedaqoji şərtlərin nəzərə alınmasını tələb edir. Bu şərtlərin təmin olunması arzu olunan bacarıqların təşəkkülünə və inkişafına əsaslı dərəcədə müsbət təsir göstərməklə yanaşı, tələbələrdə bu sahədə motivlərin və stimulların da yaradılmasına müsbət təsir göstərir.

Hazırda pedaqoji-psixoloji elmlərdə "pedaqoji şərtlər" anlayışının mahiyyətinə dair bir neçə yanaşmalar vardır. Belə ki, pedaqoji şərtlər pedaqoji tədbirlərin məcmusu və maddi-məkan mühitinin imkanları [1; 7], təlim və tərbiyənin məzmunu, metodları və təşkilati formaları [2, s.12-17] qarşıya qoyulmuş məsələlərin həllinə yönələn məzmun, forma, metod və vasitələrin obyektiv imkanlarının məcmusu [8] kimi səciyyələndirilir.

Gələcək müəllimlərin peşəyönlü bacarıqlarının fomalaşdırılmasını təhlil edərkən biz müəyyən etdik ki, tədris edilən bəzi fənlər tələbələrə yalnız biliklər verir, amma lazımi bacarıqlar formalaşdırmır. Bəzi bacarıqlar isə yalnız axırıncı ildə, pedaqoji praktika prosesində formalaşır. Üç il bakalavr təhsili prosesində nəzəri məşğələlər üstünlük təşkil etdiyindən buna lazımi səviyyədə diqqət yetirilmir. Mühazirə məşğələləri seminar və praktik məşğələlərdən üstünlük təşkil edir ki, bu da lazımi bacarıqların, o cümlədən kommunikativ bacarıqların formalaşması üçün kifayət etmir. Buna görə də bu vəziyyəti dəyişmək üçün ali məktəbi qane edən, həmçinin gələcək müəllimlərdə kommunikativ bacarıqların müəyyən sisteminin formalaşdırılmasına verilən tələblərin ödənilməsini təmin edən təhsil mühitinin yaradılması olduqca vacibdir.

Apardığımız tədqiqat işinin nəticələrinə əsaslanaraq və problemə həsr olunmuş tədqiqatlardakı fikirləri ümumiləşdirərək belə bir qənaətə gəlmək olar ki, ali pedaqoji təhsil alan tələbələrdə kommunikativ bacarıqların formalaşdırılması prosesində optimal nəticə əldə etmək üçün bir sıra zəruri və yetərli pedaqoji şərtlərin nəzərə alınması vacibdir. Bu baxımdan ali pedaqoji məktəb tələbələrində kommunikativ bacarıqların formalaşdırılmasının və inkişaf etdirilməsinin pedaqoji şərtlərini bunlara səbəb olan və aşağıdakı bir sıra amilləri birləşdirən təhsil mühitinin layihələşdirilməsi kimi səciyyələndirmək olar:

a) xarici – təşkilati-pedaqoji (pedaqoji prosesin kommunikativ bacarıqların formalaşdırıl-

ması vəzifəsinin uğurlu həllinə şərait yaradan və məqsədyönlü şəkildə seçilən məzmunu) amillər;

b) didaktik (pedaqoji təsirin forma, metod və vasitələri) amillər;

c) daxili – psixoloji-pedaqoji (tələbə şəxsiyyətinin inkişafına yönələn tədbirlər kompleksi) amillər.

Pedaqoji şərtlərin bu cür səciyyələndirilməsini əsaslandıraraq belə bir fikir söyləmək olar ki, kommunikativ bacarıqlar inteqrativ şəxsi keyfiyyətdir. Buna görə də kommunikativ bacarıqların formalaşdırılması prosesində elə bir pedaqoji şərait yaradılmalıdır ki, bu, gələcək müəllimin şəxsi keyfiyyətlərinin üzə çıxmasına səbəb olsun. Başqa sözlə, müəllimin yaradacağı xarici pedaqoji şərtlər daxili pedaqoji şərtlərin dəyişməsinə səbəb olmaqla gələcək tələbələrdə kommunikativ bacarıqların inkişafına şərait yaradacaqdır. Belə dəyişikliklərə isə bizcə aşağıdakı bir sıra praktik məsələləri yerinə yetirməklə nail olmaq mümkündür:

– növündən və formasından asılı olmayaraq, bütün təhsil prosesinə şəxsiyyətyönlü təhsil prinsipi mövqeyindən yanaşılması;

– təhsilin məzmununun praktikyönlülük istiqamətində zənginləşdirməsi;

– təhsilin məzmununa tələbələrdə şəxsi keyfiyyətləri inkişaf etdirən fənn bloklarının daxil edilməsi;

– gələcək müəllimlərdə pedaqoji qabiliyyət və bacarıqların, o cümlədən kommunikativ bacarıqların formalaşdırılması üçün xüsusi metodikanın hazırlanması və s.

Ali pedaqoji məktəblərdə tədris olunan fənlərin spesifikliyinə baxmayaraq, müşahidələrimiz göstərir ki, tələbələrin kommunikativ bacarıqlarının motivasiya komponenti, yəni kommunikativ akta hazır olma, həmsöhbəti qəbul etmə, dinləmə bacarıqları heç də aşağı səviyyədə deyildir. Buna görə yaranan əsas çətinliklər kommunikasiyaya motivasiya, ona pozitiv münasibət, ona hazır olma ilə bağlı olmur. Tələbələr buna özləri də maraqlıdırlar. Əsas çətinliklər bunu peşəkarcasına, səriştəli şəkildə həyata keçirmək bacarığı ilə bağlı olur. Başqa sözlə, əsas çətinliklər kommunikativ bacarıqların koqnitiv və refleksiya komponenti, yəni mənimsənilən biliklərin nəzəri və praktiki əhəmiyyətinin dərk edilməməsi ilə bağlı yaranır. Buna görə də, bir tərəfdən pedaqoji ali məktəbin spesifikası, tələbələrdə kommunikativ bacarıqların zəif olması, digər tərəfdən də dayanıqlı inkişaf ideyalarının hamıya aid edilməsi ilə əlaqədar tədris edilən bütün fənlərə "nüfuz" edən kommunikativ bacarıqların formalaşdırılmasının aktuallığı pedaqoji prosesi təkmilləşdirmək zərurətini şərtləndirir.

Zənnimizcə, bu, ali pedaqoji təhsildə pedaqoji prosesin təkmilləşdirilməsi istiqamətində atılmalı olan birinci addım pedaqoji təhsilin məzmununun zənginləşdirilməsi, yəni tələbələrdə təkcə peşə əhəmiyyətli bacarıqların deyil, həm də şəxsi keyfiyyətlərin inkişafına şəraitin yaradılması və fənlərin tədrisi metodikasının dayanıqlı inkişaf prinsiplərinə uyğunlaşdırılmasıdır. Bu, təhsilin məzmununun adi proqram çərçivələrindən kənara çıxmasını nəzərdə tutur və əlaqədar fənn proqramlarına bu istiqamətdə müəyyən məsələlərin daxil edilməsini zəruri edir. Bunlar sadəcə olaraq proqramların və ya pedaqoji prosesin mexaniki olaraq "yeniləşdirilməsi" deyil, aşağıdakı bir sıra obyektiv səbəblərlə sıx bağlı olan prosesdir.

Birincisi, dünyada baş verən innovativ dəyişikliklərlə əlaqədar pedaqoji fəaliyyət üçün əhəmiyyətli olan səriştələrin dəyişkənliyi müvafiq terminlərin, anlayışların aktuallaşdırılmasına, dinamik işçi proqramlarının işlənməsinə olan ehtiyacı artırmışdır. İndi artıq tədris planları son, qəti olaraq qərarlaşımış plan deyil. Bu planlar artıq situativ xarakter almalıdır. Burada biz kommunikativ bacarıqların formalaşdırılması üçün əhəmiyyətli olan "kommunikativ situasiya" anlayışına yaxınlaşmış olduq. Kommunikativ situasiyanı səciyyələndirərkən, Y.N.Kulyutkinin tərifinə əsaslansaq deyə bilərik ki, kommunikativ situasiya dedikdə, pedaqoji prosesin tərkib hissəsi, ünsiyyət məsələlərinin həlli zərurəti ilə bağlı olan şərait və halların məcmusu başa düşülür [5, s.7-26]. Bu məsələlər vasitəsilə təhsilverənlər pedaqoji prosesi idarə edir və təlim keçənləri ona qatır, onları öz kommunikativ davranışını təsdiqləməyə yaxud korrreksiya etməyə təhrik edir.

Kommunikativ situasiyaların kommunikativ bacarıqların formalaşmasında əhəmiyyəti ondadır ki, onlar əldə edilmiş bilikləri praktikada tətbiq etməyə, ünsiyyət situasiyasının məzmunu və məsələlərinə, tərəfdaşların gözləntilərinə uyğun hərəkət etməyə, modelləşdirilən situasiyanın real həyatla əlaqəsini müəyyən etməyə,

kommunikativ bacarıqların müxtəlif praktiki, idraki və yaradıcı məsələlərin həllində rolunu dərk etməyə imkan verir. Real şəraitə mümkün qədər yaxınlaşdırılmış situasiyaların təhlili tələbələrə özünü müəllim rolunda görməyə, kommunikativ səriştəlilik baxımından pedaqoji məqbul qərarları axtarıb tapmağa imkan verir ki, bu da onlara gələcəkdə bu kimi real situasiyalarda qərar verməkdə köməklik edəcəkdir.

Məşğələlərə yekun vurarkən tələbələrin səhvlərinin təhlili onların real gerçəklikdə bir daha təkrarlandırılması ehtimalını azaldır. Bu da gənc müəllimin öz peşə vəzifələrinin mükəmməl şəkildə icrasına adaptasiya etməsi üçün lazım olan müddətin azalmasına səbəb olur. Demək olar ki, kommunikativ situasiyalar nəzəriyyə ilə praktika arasında birləşdirici həlqədir. Amma situativ məsələlərlə ali pedaqoji məktəb tələbələrində kommunikativ bacarıqların formalaşdırılması uzun prosesdir və bu prosesdə əsas çətinlik onun təşkili ilə bağlıdır. Bu baxımdan gələcək müəllim elə təlim metodu və priyomları seçilib tətbiq etməlidir ki, onlar konkret bu kommunikativ situasiyada məqbul olsun və kommunikativ situasiyaları analiz etməklə bu metod və priyomları kombinasiya edib, onu buna uyğun başqa şəraitə də köçürmək imkanına malik olsun.

İkincisi, dayanıqlı inkişaf konsepsiyasının əsasında harmoniya, yəni təbiət və cəmiyyət, insan və cəmiyyət arasında balans durduğundan, bu balansı müxtəlif mövqelərin və maraqların uzlaşdırıldığı, yeni dəyərlərin yaradıldığı dialoq kimi təsəvvür etmək olar. Əsası Sokrat tərəfindən qoyulmuş dialoq strategiyası təhsildə dialojiliyi, fəlsəfə və təhsilin bir araya gətirildiyi "dialoq pedaqogikası" ənənəsini daha da genişləndirə bilər.

Nəzərə alaq ki, ali məktəblərdə monoloji paradiqma hələ də öz nüfuzunu qoruyub saxlamaqdadır. Bunu aradan qaldırmaq üçün, yəni monoloji modellə dialoji model arasında gedən mübarizədə qalib gəlmək üçün bilik ötürən və "yeganə düzgün" mövqeyin üstünlük təşkil etdiyi monoloji dərslərdən dialoji dərsə keçidin bütünlüklə həllinə nail olunmalıdır. Buna görə də tələbələrlə müəllimlər arasında dayanıqlı inkişaf problemlərinin yerli, regional və qlobal səviyyələrdə həlli yollarının axtarışı istiqamətində dialoqu inkişaf etdirən problemli dərs tipinə keçid üçün metodoloji təminat və texnologiyalar işlənməlidir.

Üçüncüsü, ali pedaqoji təhsil proqramlarında dayanıqlı inkişaf nəzəriyyəsinə daxil olan bütün biliklərin inteqrasiya edilməsi zərurəti meydana gəlmişdir. Orta məktəbdə, ümumi təhsilin kurikulumunda bu məsələ öz həllini müəyyən dərəcədə tapsa da, qeyd etməliyik ki, ali məktəblərdə kurikulumlar kifayət qədər işlənilmədiyindən belə inteqrativliyə nail olmaq hələlik müəyyən çətinliklər törədir. Lakin bunu vacib hesab edir və tələbələrdə təkcə kommunikativ bacarıqların deyil, digər qabiliyyət və bacarıqların inkişaf etdirilməsində fənlərarası, kurslararası inteqrasiyaya nail olunmasını vacib hesab edirik.

Belə hesab edirik ki, dayanıqlı inkişaf ideyaları fənlərarası xarakter daşıyır və o, bütün elmi biliklərin metodoloji əsasını təşkil etməlidir. Burada fənlərarası inteqrasiya yanlış olaraq fənlərarası əlaqələrlə eyniləşdirilməməlidir. Qeyd edək ki, bunlar fərqli hadisələrdir.

Fənlərarası əlaqələr müxtəlif fənlərdə yanaşı mövcud olan müxtəlif hadisələrin əlaqələndirilməsini nəzərdə tutursa, fənlərarası inteqrasiya müxtəlif fənlərdə öz əksini tapan vahid birləşdirici başlanğıcı nəzərdə tutur. Təbiət, cəmiyyət hadisələri, maddi və mənəvi aləm vəhdətdə olduğundan, dayanıqlı inkişaf həmin vahid birləşdirici başlanğıc kimi pedaqoji təhsilin məzmununa daxil edilməlidir, bir növ "canına işləməlidir".

Fənlərarası inteqrasiyanın həyata keçirilməsi istiqamətində fənlərarası inteqrasiya obyektlərinin müəyyən edilməsi, tədris materialı və peşə fəaliyyətinin spesifikasını nəzərə almaqla fənlərarası inteqrasiya priyomlarının əsaslandırılması kimi didaktik məsələlərin həllinin vacibliyini qeyd etmək lazımdır. Əsas odur ki, fənlərarası inteqrasiya obyektlərinin kontenti sosiomədəni, iqtisadi sferalarda cərəyan edən inteqrasiya proseslərini, bəşəriyyətin qlobal problemlərini, "təmiz" energetika, "yaşıl" iqtisadiyyat, ayrıca götürülmüş bir ölkə və bütövlükdə dünyada iqtisadiyyat və resursların səmərəli idarə edilməsi problemlərini özündə əks etdirmiş olsun. Məsələn, pedaqogika və iqtisadiyyatın, pedaqogika və hüququn, pedaqogika və təbabətin və s. qovuşuğunda dayanıqlı inkişaf ideyalarını həyata keçirmək, o cümlədən bu kontekstdə tələbələrdə onlara gələcəkdə dayanıqlı inkişaf problemlərini həll etmək üçün lazım olacaq kommunikativ bacarıqların formalaşdırılması imkanları araşdırılmalıdır.

Zənnimizcə, fənlərarası inteqrasiyanın düşündüyümüzdən daha da böyük potensialı vardır.

Müvafiq metod və priyomlarla, cavab və həllərin çoxvariantlığını nəzərdə tutan açıq xarakterli məsələlərlə tələbələrdə təkcə qeyd olunan bacarıqların inkişafına deyil, həm də onların müxtəlif sahələrdən olan geniş dairəli elmi-tətbiqi problemlərlə tanış olmasına, onlarda bu problemlərin öyrənilməsinə motivasiyanın güclənməsinə nail olmaq olar. Müsbət hal və irəliyə doğru inamlı addım kimi onu da qeyd edək ki, bu tendensiya ölkəmizin təhsil sistemində qismən də olsa magistr proqramlarında nəzərə alınmışdır.

Yuxarıda qeyd etdiyimiz kimi, dayanıqlı inkişaf naminə təhsilin əsas məqsədlərindən biri yeni dəyərlər sisteminin, əxlaqi imperativlərin, tələbatlar sisteminin formalaşdırılmasıdır. Buna da nail olmağın yolları sosial riskləri, gələcək inkişaf tendeniyalarını görə bilən, çevik, sosial məsuliyyətli, tənqidi təfəkkürə malik mütəxəssis yetişdirməkdir. Bu da onu deməyə əsas verir ki, "dayanıqlı inkişaf problemləri təbiət elmlərinin predmetidir" kimi fikirlər yanlışdır. Dayanıqlı inkişaf kontekstində təhsil proqramlarından, o cümlədən pedaqoji təhsil proqramlarından sosial və humanitar komponent xaric edilməməlidir. Əksinə, bunların daha da inkişaf etdirilməsinə imkan yaradılmalıdır. Hesab edirik ki, dayanıqlı inkişaf kontekstində mütəxəssis yetişdirilməsində məsuliyyət şəxsiyyətin formalaşması və inkişafında roluna görə sosial və pedaqoji funksiya daşıyan dil, humanitar, sosial, iqtisadi və peşə fənlərini tədris edən kafedraların üzərinə düşür ki, bunların da koordinasiyasına ciddi yanaşılmalıdır.

Tələbələrdə kommunikativ bacarıqların formalaşdırılması onların gələcəkdə müəllim-şagird ünsiyyətini düzgün məcraya yönəldən yaxşı bir müəllim kimi olacaqlarına mühüm zəmanət verir. Kommunikativ bacarıqların formalaşdırılmasına pedaqoji təhsil prosesində auditoriya məşğələlərində və auditoriyadankənar tədbirlərdə xüsusi diqqət yetirilməsi bu baxımdan olduqca vacibdir. Bunun üçün bir sıra şərtlərin gözlənilməsinə, xüsusən fənlərarası inteqrasiyanın həyata keçirilməsinə ciddi yanaşılmalıdır.

**Problemin aktuallığı.** BMT-nin dayanıqlı inkişaf məqsədləri kontekstində yeni təfəkkürə malik müəllim kadrlarının hazırlanması olduqca aktuallıq kəsb edən problemlərdəndir. Onun müvəffəqiyyətli həlli gələcək müəllimlərin mühüm dəyərlər sisteminə, əxlaqi keyfiyyətlərə yiyələnmələrinə və pedaqoji prosesin düzgün təşkilinə və aparılmasına səbəb olacaq mühüm amillərlə sıx bağlıdır.

**Problemin elmi yeniliyi.** Gələcək müəllimlərdə kommunikativ bacarıqların formalaşdırılmasına "Dayanıqlı inkişaf məqsədləri" kontekstindən yanaşılması yeni problemdir və ilk dəfədir ki, tədqiqata cəlb edilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gələcək müəllimlərdə kommunikativ bacarıqların formalaşdırılmasının pedaqoji əsasları haqqında təhsilverənlərdə praktik bacarıqlar formalaşdıra bilmək baxımından əhəmiyyətlidir.

**Ədəbiyyat:**


1. Андреев, В.И. Диалектика воспитания и самовоспитания творческой личности / В.И. Андреев – Казань: Изд-во КГУ, - 1988.
2. Гуссерль, Э. Идеи к чистой феноменологии и феноменологической философии / Э.Гуссерль; пер. А.В.Михайлова. - Москва: - Академический проект, - 2009.
3. Дзятковская, Е. Н. Образование для устойчивого развития в школе. Культурные концепты. «Зеленые аксиомы». Трансдисциплинарность. – Москва: - Образование и экология. – 2015.
4. Епишина, Л. В. Педагогические аспекты развития коммуникативных свойств личности / Л.В. Епишина // Начальная школа. - 2007. - №11.
5. Кулюткин, Ю.Н. Психологические особенности деятельности учителя // Мышление учителя. - М.: Педагогика, -1990.
6. Садовничий, В. А., Касимов, Н. С. Становление образования для устойчивого развития в России // Экологическое образование: до школы, в школе, вне школы. – 2006. – № 4.
7. Саммит в Йоханнесбурге 2002. [Электронный ресурс] URL: http://www.un.org/ru/documents/.
8. Яндукова, Т. А. Средства формирования коммуникативной культуры младших школьников [Текст] / Т.А. Яндукова // Психология и педагогика: методика и проблемы практического применения. 2009, № 6-2.


**E-mail:** nargiz_ahmedova@mail.ru

**Rəyçilər:** *ped.elm.dok., prof.* **M.İ. İlyasov,**
*ped.elm.dok., prof.* **İ.H. Cəbrayılov**
**Redaksiyaya daxil olub:** 14.10.2022.

## *TƏLİM TEXNOLOGİYALARI*
## *ОБРАЗОВАТЕЛЬНЫЕ ТЕХНОЛОГИИ*
## *EDUCATIONAL TECHNOLOGIES*

*UOT 371*

***Billurə Zahid qızı Vəliyeva***
*Bakı şəhəri, Nərimanov rayonu 212 nömrəli tam orta məktəbin*
*təsviri incəsənət müəllimi*

# TƏLİMİN TƏŞKİLİ FORMALARINA BİR NƏZƏR

***Биллура Захид гызы Велиева***
*учитель изобразительного искусства полной средней школы № 212*
*Наримановского района города Баку*

# ОБЗОР ФОРМ ОРГАНИЗАЦИИ ОБУЧЕНИЯ

***Billura Zahid Valiyeva***
*teacher of fine arts of complete secondary school No. 212*
*of the Narimanov district of Baku city*

# OVERVIEW OF FORMS OF ORGANIZATION OF TEACHİNG

**Xülasə.** Məqalədə təlimin təşkili formaları üzərində dayanılır. İlk növbədə, təlimin əsas təşkili forması olan dərs faydalılığı yada salınır, dərsə verilən əsas tələblər sadalanır. Daha sonra təlimin başqa təşkili formalarına aid məlumat verilir. Fakültativ məşğələ, tədris ekskursiyası, məsləhət saatları, seminar, əlavə məşğələ və onların mahiyyəti və vəzifələri aydınlaşdırılır.

***Açar sözlər:*** *təlim prosesi, təlimin təşkili, təlimin təşkili formaları, dərs, tədris ekskursiyası, fakültativ məşğələ, məsləhət saatları, seminar, əlavə məşğələ, təsviri incəsənət, texnologiya*

**Резюме.** В статье акцентируется внимание на формах организации обучения. В первую очередь упоминается о полезности урока, который является основной формой организации обучения, и перечисляются основные требования к уроку. Далее приводится информация о других формах организации обучения. Сообщается о факультативном обучении, учебной экскурсии, консилиуме, семинаре, дополнительном обучении, уточняется их характер и задачи.

***Ключевые слова:*** *учебный процесс, организация обучения, формы организации обучения, занятие, образовательная экскурсия, факультативное обучение, консультационные часы, семинар, дополнительное обучение, изобразительное искусство, технология*

**Summary.** The article focuses on the forms of organization of training. First of all, the usefulness of the lesson is mentioned, which is the main form of organization of learning, and the main requirements for the lesson are listed. The following is information on other forms of organization of training. Optional education, educational excursion, consultation, seminar, additional education are reported, their nature and tasks are specified.

***Key words:*** *educational process, organization of education, forms of organization of education, occupation, educational excursion, optional education, consulting hours, seminar, additional education, fine arts, technology*

Təhsil müəssisələrində dərs təlimin əsas təşkili forması kimi qəbul olunub. Mən məktəbdə Texnologiya və Təsviri incəsənət üzrə məşğələləri aparıram. Təbii ki, mənim üçün də təlimin mühüm təşkili forması dərsdir. Təhsilalanlar bu və ya digər fənlər, o cümlədən Texnologi-

ya və Təsviri incəsənət üzrə zəruri bilikləri, bacarıq və vərdişləri məhz dərsdə alırlar. Onlar təlimin təhsilləndirici, inkişafetdirici və tərbiyələndirici vəzifələrinin uğurlu həyata keçirilməsindən faydalanırlar.

Ona görə də mən öz fənnimin nəzəriyyəsinə və təcrübəsinə yüksək səviyyədə yiyələnməyə, ayrı-ayrı mövzuların tədrisini müasir tələbləri nəzərə almaqla qurmağa çalışıram ki, dediyim dərslər səmərəli nəticələnsin. İlk növbədə, əyaniliyə geniş yer verirəm, İnformasiya Kommunikasiya Texnologiyalarının imkanlarından faydalanıram. Diqqət yetirdiyim əsas məsələlərdən biri şagirdlərin müstəqilliyi və şüurluluğunun təmin edilməsidir. Məktəbli tədris materialını şüurlu mənimsədikdə fəal olur, müstəqillik nümayiş etdirir, təşəbbüskar olur.

Təlimin təşkilinin digər formaları da vardır. Lakin dərs həmin formalardan ötrü bünövrə, sütun rolunu oynayır. Tədris materialı dərsdə nə qədər möhkəm və aydın mənimsənilərsə, təlimin təşkilinin o biri formalarının səmərəsi də yüksək olur.

Başqa fənlər üzrə dərslər kimi, Texnologiya və Təsviri incəsənət dərsləri də müəllimin pedaqoji-metodik simasını özündə əks etdirir. Mənim qənaətimcə, dərs müəllimin yaradıcılığının göstəricisi, onun şah əsəridir. Bunu da bilirəm ki, biz müəllimlərin fəaliyyətini keçdiyimiz dərslərin səviyyəsinə görə qiymətləndirirlər. Ona görə də şəxsən mən dərsə məsuliyyətlə yanaşır, dərsə verilən müasir tələbləri nəzərə alıram.

Müasir dərsə hansı tələblər verilir? Mövcud ədəbiyyata əsasən onları diqqət mərkəzinə gətirək: "Dərsə verilən tələbləri iki qrupa bölmək olar: ümumi və xüsusi tələblər. Dərsə verilən ümumi tələblər təlim prinsiplərində ifadə olunmuşdur. Dərsdə didaktik prinsiplər (həyatla əlaqə, elmilik, sistematiklik, şüurluluq və fəallıq, əyanilik, müvafiqlik, fərdi yanaşma və s.) kompleks şəkildə həyata keçirilməlidir.

Xüsusi tələblər isə bilavasitə dərslə bağlı tələblərdir. Onları aşağıdakı əsas qruplara bölmək olar:

1. Dərsdə yüksək təhsil, inkişaf və tərbiyə səmərəsi əldə edilməlidir. Hər bir fəaliyyət nəticə ilə ölçülür. Dərsdə təhsil, tərbiyə və inkişaf vəzifələri vəhdətdə həyata keçirilməli, real nəticələr əldə edilməlidir.

2. Dərsdə təlim materialının optimal məzmunu müəyyən edilməlidir. Müəllim dərsin qarşısında duran məqsəd və vəzifələrdən, şagirdlərin hazırlıq səviyyəsindən çıxış edərək öyrənilən materialın həcmini, çətinlik dərəcəsini, başlıca məsələlərini, fənlərarası əlaqə imkanlarını müəyyənləşdirməli, dərs zamanı məzmunun mənimsənilməsinə nail olmalıdır.

3. Dərsdə səmərəli metodik variant seçilib tətbiq edilməlidir. Dərsin məqsəd və məzmununa, şagirdlərin dərketmə imkanlarına uyğun olaraq müvafiq metod və vasitələr kompleksi müəyyənləşdirilir.

4. Dərs təşkilati cəhətdən mütəşəkkil və çevik olmalıdır. Dərs çevik qurulmalı, şablon və sxematizmdən uzaq olmalıdır. Yaxşı dərs məntiqi və psixoloji cəhətdən tam olmalıdır, yəni dərsdə müəyyən bir məntiqi hissə öyrədilməli (məntiqi tamlıq), şagirdlər nəyi isə tam öyrəndiklərini hiss etməli, onlarda yarımçıqlıq hissi qalmamalıdır (psixoloji tamlıq).

Dərsdə əks əlaqə yaradılmalıdır; müəllim şagirdlərin hissi aləmi, təlimə münasibəti, marağı, mənimsəmə səviyyəsi haqqında vaxtında informasiya əldə etməlidir.

5. Dərsdə əlverişli psixoloji iqlim, müsbət emosional vəziyyət yaradılmalıdır" (1).

Təlimin dərsdən başqa təşkili formaları da vardır. Həmin formalara aşağıdakıları əlavə etmək mümkündür: tədris ekskursiyaları, fakültativ məşğələlər, praktikumlar və seminar məşğələləri, əlavə məşğələlər, məsləhətlər və s.

Texnologiya və Təsviri incəsənət fənlər üzrə mövzuların yüksək səviyyədə qavranılmasından ötrü mən, yeri gəldikcə, təlimin digər təşkili formalarına da müraciət edirəm.

*Tədris ekskursiyaları* – əyanilik baxımından səmərəlidir. Texnologiya və Təsviri incəsənət dərslərində bu və ya digər mövzunun öyrənilməsi zamanı, istər-istəməz əyaniliyin rəngarəng formalarına müraciət edilir. Elə mövzu da vardır ki, onunla bağlı əyaniliyi dərsə gətirmək qeyri-mümkün olur. Bu vaxt təlim prosesi bilavasitə obyektin olduğu yerdə təşkil olunur.

Tədris ekskursiyası müəyyən vaxt ərzində aparılır və tədris proqramında əksini tapmış konkret mövzusu üzrə təşkil edilir.

Bilirəm ki, tədris ekskursiyaları müəllimlərin bu işə yaxşı hazır olmağını tələb edir. Ona görə də mən tədris ekskursiyalarının vəzifələrini

və məzmununu, obyektini qabaqcadan müəyyənləşdirir, obyektlə yaxından tanış olur, ekskursiyanın təşkili planını tərtib edirəm.

*Fakültativ məşğələlər*. Bu tipli məşğələlər dərs, ekskursiya, habelə müxtəlif yaradıcı məsələlərin həlli şəklində keçirilir. Bəzən fakültativ məşğələlərdən məktəblilərin idraki bacarıqlarının və yaradıcılıq qabiliyyətlərinin inkişaf etdirilməsi üçün deyil, təlimdə yetirməyən şagirdlərə kömək məqsədilə istifadə olunur. Bu isə məşğələlərin mənasını və didaktik əhəmiyyətini azaldır.

Fakültativ məşğələ ilə dərsin fərqi var. Prof. A.N. Abbasov həmin fərqi aşağıdakı şəkildə aydınlaşdırır: "1) dərsdə sinfin bütün şagirdləri iştirak edirlər. Onlar tədris proqramına və dərsliyə əsasən fəaliyyət göstərirlər. Fakültativ məşğələlərə isə, sinifdəki məktəblilərin bir qismi – xüsusi qabiliyyətə və istedada malik şagirdlər cəlb edilirlər; 2) məktəblilər axtarışa, tədqiqatçılıq fəaliyyətinə qoşulurlar; 3) fakültativ məşğələlər ali məktəblərdə keçirilən ixtisas kursuna və seminara oxşayır" (2).

*Praktikumlar,* bir qayda olaraq, laboratoriya və emalatxanalarda, tədris kabinetlərində, məktəblilərin istehsalat briqadalarında və s. keçirilir. İbtidai və orta siniflərdə keçirilən laboratoriya işləri və praktik məşğələlərlə müqayisədə praktikum və seminar məşğələləri məktəblilərin böyük müstəqilliyi və tədris tapşırıqlarının yerinə yetirilməsinə yaradıcı münasibətilə fərqlənir. Praktikumlar şagirdlərin politexnik təhsilini, əmək hazırlığını və peşə yönümünü təmin edir.

*Seminar məşğələləri* şagirdlərin özünütəhsilini təmin edir, məlumatlar və referatlarla çıxış etmələrinə, nəzəri materialın sistemləşdirilməsinə, müəyyən bir mövqedə olmalarına və onu müdafiə etmələrinə, rəy və mülahizələrini bildirmələrinə şərait yaradır.

Seminar məşğələlərini yığcam çıxışımla başlayıram. Həmin çıxışda məşğələnin əsas vəzifələrini diqqətə çatdırır, müzakirə üçün bu və ya digər problemi irəli sürürəm.

*Əlavə məşğələlər*. Bildiyimiz kimi, məktəblilərin hamısının təlimdəki uğurları eyni deyil. Şagirdlərin arasında əlaçılar da, əla və yaxşı qiymətlərlə oxuyanlar da, dərslərə yaxşı hazırlaşmayanlar və heç hazırlaşmayanlar olur.

Təlimdə yetirməyən məktəblilərlə işlər səmərə vermədikdə onlarla təlimdənkənar vaxtlarda məşğul oluram.

Təlimin təşkili formaları arasında *məsləhət saatları* da özünəməxsus rol oynayır. Məsləhət saatlarına dərsdənkənar vaxtlarda yer ayrılır. Təlimin təşkilinin bu formasından daha çox imtahanqabağı istifadə edilir.

Məsləhətlərin günü və vaxtı, qabaqcadan elan olunur. Şagirdlər imtahan sualları ilə tanış olur, onlara qaranlıq qalan sualları qeyd edir, məsləhət saatlarında iştirak edərək həmin suallarla müəllimə müraciət edirlər.

Deyilənlərə əsasən, aşağıdakı qənaətə gəlmək mümkündür: hər bir müəllim təlimin səmərəliliyinə nail olmaq, şagirdlərdə öyrənməyə maraq oyatmaq üçün təlimin hər bir təşkili formasından bacarıqla istifadə etməlidir.

**Problemin aktuallığı**. Təlimin təşkili formalarına yeni nəzərlər yanaşma aktuallığı ilə seçilir.

**Problemin yeniliyi**. Təlimin təşkili formaları barədə aydın təsəvvür yaradılır.

**Problemin praktik əhəmiyyəti.** Gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**


1. https://kayzen.az/blog/pedaqoq/1542/d%C9%99rs-t%C9%99limin-%C9%99sas-t%C9%99%C5%9Fkili-formas%C4%B1-kimi.html
2. Abbasov, A.N. Pedaqogika nəzəriyyəsi və tarixi: Ali təhsil müəssisələri üçün dərslik / A.N. Abbasov, L.A. Məmmədli, İ.B. Əmirəliyeva. -Bakı: Mütərcim – 2022.


**E-mail:** vbillure@mail.ru,
veliyevabillure@gmail.com

**Rəyçilər:** *ped.elm.dok., prof.* **A.N. Abbasov**,
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 06.12.2022.

# *MƏKTƏB VƏ PEDAQOJİ FİKİR TARİXİ*
# *ИСТОРИЯ ШКОЛЫ И ПЕДАГОГИЧЕСКОЙ МЫСЛИ*
# *HISTORY OF SCHOOL AND PEDAGOGICAL THOUGHT*

*UOT 37.0*

***Leyla Nizami qızı Həsənova***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*AMEA-nın A.A. Bakıxanov adına Tarix İnstitutu*

## AZƏRBAYCAN XALQ CÜMHURİYYƏTİ VƏ DAĞLI RESPUBLİKASI ARASINDA ƏLAQƏLƏRİN TARİXİNƏ QISA NƏZƏR

***Лейла Низами гызы Гасанова***
*докторант по программе доктора философии*
*Институт Истории имени А.А.Бакиханова НАНА*

## КРАТКИЙ ОБЗОР ИСТОРИИ ВЗАИМООТНОШЕНИЙ МЕЖДУ АЗЕРБАЙДЖАНСКОЙ ДЕМОКРАТИЧЕСКОЙ РЕСПУБЛИКОЙ И ГОРСКОЙ РЕСПУБЛИКОЙ

***Leyla Nizami Hasanova***
*doctoral student of the program of doctor of philosophy*
*Institute of History named after A.A. Bakikhanov of ANAS*

## BRIEF REVIEW OF RELATED HISTORY BETWEEN AZERBAIJAN DEMOCRATIC REPUBLIC AND MOUNTAIN REPUBLIC

**Xülasə**. Rusiya imperiyasının süqutundan və Qafqazda müstəqil dövlətlərin yaranmasından sonra Şimali və Cənubi Qafqaz xalqlarının yaxınlaşması və hətta birləşməsi meylləri üzə çıxdı. 1918-1920-ci illər Azərbaycan xalqının öz müqəddəratını özünün təyin etməyə qadir olduğunu sübut etməyə cəhd göstərdiyi bir dövrdür. Şimali Qafqazda mövcud olmuş müstəqil dövlət (konfederasiya) Dağlılar Respublikası idi.

Azərbaycan hökuməti və ictimaiyyəti Şimali Qafqaz xalqlarını öz müstəqilliklərini və dövlətlərini elan etdikləri ilk gündən müdafiə etmiş və onlara böyük köməklik göstərmişdir. Bu dövrdə dünyanın bir sıra böyük dövlətləri Azərbaycanın istiqlaliyyətini tanımağa başlamış, türk dünyasında və islam aləmində ilk demokratik respublika yaranmışdır.

1919-cu ilin yazında Denikinin Dağıstanı tutması ilə Dağlı hökuməti fəaliyyətini dayandırmış və Şimali Qafqazda da hakimiyyət bolşeviklərin əlinə keçmişdir. AXC 23 aylıq fəaliyyətdən sonra Aprel işğalı nəticəsində Azərbaycanda qurulan bolşevik rejiminin ömrü 70 ildən də çox çəkdi. Nəhayət, bu dövr Azərbaycanın ikinci dəfə işğala məruz qaldığı bir dövrdür.
***Açar sözlər:*** *Azərbaycan Xalq Cümhuriyyəti, Dağıstan, Rusiya dövləti, xalqlar, tarixi əlaqələr*

**Резюме.** После падения Российской империи и возникновения на Кавказе независимых государств выявились тенденции сближения и даже объединения народов Северного и Южного Кавказа. 1918-1920 годы – период, когда азербайджанский народ пытался доказать, что он способен сам определять свою судьбу. Независимым государством (конфедерацией), существовавшим на Северном Кавказе, была Горская республика.

Правительство и общественность Азербайджана защищали и оказывали большую помощь народам Северного Кавказа с первого дня провозглашения ими своей независимости и государственности. В этот период ряд больших государств мира стали признавать независимость Азербайджана, и в тюркском и исламском мире была создана первая демократическая республика.

Весной 1919 года, с захватом Деникиным Дагестана, Горское правительство приостановило свою деятельность, и власть на Северном Кавказе также перешла в руки большевиков. После 23 месяцев деятельности АДР в результате апрельского вторжения в Азербайджане был установлен большевистский режим, просуществовавший более 70 лет. Наконец, этот период является периодом второго вторжения в Азербайджан.

***Ключевые слова:*** *Азербайджанская Демократическая Республика, Дагестан, Российское государство, народы, исторические связи*

**Summary.** After the fall of the Russian Empire and the emergence of independent states in the Caucasus, tendencies of rapprochement and even unification of the peoples of the North and South Caucasus appeared. 1918-1920 - the period when the Azerbaijani people tried to prove that they are capable of determining their own destiny. Gorskaya republic was an independent state (confederation) that existed in the North Caucasus.

The government and public of Azerbaijan have protected and provided greater assistance to the peoples of the North Caucasus since the first day of their declaration of independence and statehood. During this period, a number of large states of the world began to recognize the independence of Azerbaijan, and the first democratic republic was created in the Turkic and Islamic world.

In the spring of 1919, with the seizure of Dagestan by Denikin, the Gorskoe government suspended its activities, and power in the North Caucasus also passed into the hands of the Bolsheviks. After 23 months of ADR activity, as a result of the April invasion, a Bolshevik regime was established in Azerbaijan, which lasted for more than 70 years. Finally, this period is the period of the second invasion of Azerbaijan.

***Key words:*** *Azerbaijan Democratic Republic, Dagestan, Russian state, peoples, historical relations*

Birinci dünya müharibəsi Rusiyada yaşayan xalqların, xüsusilə Şimali Qafqaz xalqlarının həyatında əhəmiyyətli dəyişikliklərə səbəb oldu. Bölgədə gedən müharibə ölkə iqtisadiyyatına və ictimai həyata böyük zərbə vurdu. 1917-ci ilin əvvəllərində baş vermiş inqilab Rusiya İmperiyasının dağılması ilə nəticələndi [1, s. 110]. Beləliklə, ölkədə çar hakimiyyətinin devrilməsi ilə Romanovların uzun əsrlik hakimiyyətinə son qoyuldu.

Rusiya imperiyasının süqutundan və Qafqazda müstəqil dövlətlərin yaranmasından sonra Şimali və Cənubi Qafqaz xalqlarının yaxınlaşması və hətta birləşməsi meylləri üzə çıxdı.

Rusiyanın mərkəzində baş verən inqilabi hadisələr imperiyanın ucqarlarında da təsirsiz ötüşə bilməzdi. 1917-ci ilin fevral ayının 27-dən 28-nə keçən gecə baş vermiş inqilab və 2 mart 1917-ci il tarixində II Nikolayın taxtdan salınması Azərbaycan əhalisinin bütün təbəqələrinin sevincinə səbəb olmuşdu. 3 mart 1917-ci ildə çap edilmiş hökumət bəyannaməsindəki dini və milli məhdudiyyətlərin aradan qaldırılması barədə maddə müsəlman cəmiyyəti tərəfindən böyük rəğbətlə qarşılandı. Qafqaz xalqlarının müstəqillik uğrunda milli hərəkatı yeni inkişaf dövrünə qədəm qoydu. Milli burjuaziya və ziyalılar, kazak icmaları, əhalinin müxtəlif təbəqələri ölkədəki burjua-demokratik dəyişiklikləri dəstəklədilər. Onlar söz və mətbuat azadlığı hüququnu müdafiə edərək milli məktəb və milli idarəetmə tələbini irəli sürdülər [2, s. 58].

XX əsrin əvvəllərinə yaxın Rusiya imperiyasının regionları arasında, o cümlədən də Şimali və Cənubi Qafqaz arasında sıx geosiyasi və sivil əlaqələr mövcud idi. XX əsrin əvvəlləri Rusiya imperiyasında milli-inqilabi hərəkatların oyanışı ilə xarakterizə olunur. Qafqazda isə bu, çar Rusiyası tərəfindən canişinlik idarəetməsinin (1905-ci il) bərpası ilə nəticələndi. Qraf İ.İ. Vorontsov yeni canişin təyin edildi. Eyni zamanda, XX əsrdə yolların – dəmir yolunun, dəniz, çay və hava nəqliyyatının inkişafı və modernləşdirilməsi Qafqaz regionunun iqtisadi və mədəni əlaqələrinin genişlənməsinə xidmət etdi [2, s. 33].

Rus hakimiyyəti dövründə Qafqazın digər yerləri kimi Azərbaycan da hökümətin mənafeyinə uyğun şəkildə quberniyalara, vilayətlərə (oblast), bu sonuncular isə, öz növbəsində, qəzalara bölünmüşdür. Qafqaz Azərbaycanını formalaşdıran inzibati bölgü aşağıdakı şəkildədir:

1. Bütün Bakı quberniyası. Buraya bütün Bakı şəhəri, habelə Cavad, Göyçay, Şamaxı, Quba, Lənkəran qəzaları daxildir.

2. Yelizavetpol (Gəncə) quberniyası. Bu quberniyaya Gəncə, Cavanşir, Nuxa, Ərəş, Şuşa, Cəbrayıl, Zəngəzur və Qazax qəzaları daxildir. Gəncə quberniyasının dağlıq hissəsi

Azərbaycan və Ermənistan respublikaları arasında mübahisə obyekti olaraq qalır.

3. İrəvan quberniyası. Buraya Naxçıvan, Şərur-Dərələyəz, Surməli qəzaları, habelə Yeni Bəyazid, Eçmiəzdin, İrəvan və Aleksandropol qəzalarının bir hissəsi daxildir.

4. Tiflis quberniyasında Borçalı, Tiflis və Sığnaq qəzalarının müəyyən bir hissəsi də Azərbaycan ərazisidir.

5. Zaqatala qəzası.

6. Dağıstan regionunda Kürə və Samur nahiyələrini əhatə edən ərazinin bir hissəsi, habelə Dərbənd şəhəri və onun ətrafı da daxil olmaqla Qaytaq –Tabasaran qəzasının bir hissəsi.

7. Yuxarıda adları çəkilən Irəvan və Tiflis quberniyalarında, habelə Zaqatala qəzasında mənsubluğu Azərbaycan, Ermənistan, Gürcüstan və Şimali Qafqaz respublikaları tərəfindən iddialar doğuran sahəcə çox kiçik ərazilər də mövcuddur.

Dağıstan quberniyasının əhalisi azərbaycanlılardan ibarət olan hissəsi həmişə Azərbaycana birləşmək meylində olmuşdur. Həmin regionun iqtisadi mənafeləri Quba və Bakı şəhərləri ilə o dərəcədə qüvvətli şəkildə bağlıdır ki, Dağıstanı bu siyasi və iqtisadi əlaqələrdən kənarda təsəvvürə gətirmək qeyri-mümkündür. Yerli əhali Azərbaycan dövlətinə çoxlu vətəndaşların imzaladığı petisiyalar göndərir və Sulak çayı boyunca Dağıstanın Azərbaycana birləşdirilməsini tələb edirlər [3, s. 43] .

Şimali Qafqazın dağlı xalqları arasında isə klassik milliyyətçilik cərəyanı formalaşmamışdı. Ümumiyyətlə, baxmayaraq ki, istər türk amili, istərsə də Osmanlı dövləti amili Şimali Qafqazda kifayət qədər nüfuza malik faktorlar sayılırdı, lakin siyasi milliyyətçiliyin burada hər hansı bir formada uğur qazanacağını təsəvvür etmək də çətin idi. Şimali Qafqazın dağlıları İslamın burada birləşdirici faktor olmasını əsas götürərək müsəlman mövhumunu özlərinin milli amili kimi qəbul etməyə üstünlük verirdilər [4, s. 53].

Azərbaycanın əlverişli təbii-coğrafi şəraiti, geostrateji mövqeyi, təbii sərvətləri, əməksevər insanlarının zəhməti hesabına yaranan zəngin var-dövləti və s. bütün uzaq və yaxında yerləşən dövlətlərin diqqətini cəlb etmişdir. Dostluq, əməkdaşlıq və ticarət əlaqələrinə əsaslanan sülh münasibətləri ilə birgə təcavüzkar, iddialı niyyətlər də olmuşdur. Tarix göstərir ki, ikincilər üstünlük təşkil etmiş, Azərbaycan tarixində yadelli hücumlarına qarşı mübarizə, zülm və əsarət əleyhinə çıxışlar xətti başlıca yer tutmuşdur. Təəssüf ki, bəzən düşmən güclü olmuş, öz niyyətlərini həyata keçirməyə nail ola bilmişdir [5, s. 8].

M.Ə. Rəsulzadə yazırdı: “I cahan savaşı olmasaydı, fevral burjua inqilabı olmazdı, fevral burjua inqilabı olmasaydı, Azərbaycan Xalq Cümhuriyyəti olmazdı” [6, s. 3.]. 1918-ci ildə yaranmış və fəaliyyət göstərmiş Azərbaycan Xalq Cümhuriyyəti qısa ömür sürmüş, Sovet imperiyasının işğalçılıq siyasətinin qurbanı olmuşdur. Lakin Azərbaycan Xalq Cümhuriyyəti dövlətçiliyimizin yaranması və inkişafında, xalqımızın tarixi taleyində böyük rol oynamışdır. Azərbaycan Xalq Cümhuriyyəti və onun Parlamenti çox çətin və mürəkkəb bir tarixi dövrdə meydana gəlmişdi. Həmin dövrün mürəkkəb beynəlxalq siyasi şəraiti, müstəqil dövlətimizə xarici təzyiqlərin artması nəticəsində Azərbaycan Xalq Cümhuriyyəti süqut etsə də, xalqın təfəkküründə azadlıq, demokratiya və müstəqil dövlətçilik ideyaları dərin kök salmışdır [7. s. 146].

“İstiqlal Bəyannaməsi” ilə öz müstəqilliyini bütün dünyaya elan etmiş Azərbaycan Xalq Cümhuriyyəti Şərq və müsəlman aləmində xalq hakimiyyəti və insanların bərabərliyi ideyalarına əsaslanan ilk respublika, onun Parlamenti isə dünyanın sivil ölkələrinə xas demokratik prinsiplərə söykənən ilk nümayəndəli qanunvericilik orqanı idi. 1918-20-ci illər Azərbaycan xalqının siyasi və dövlətçilik şüurunun təşəkkül tapdığı, milli mənliyə qayıdış proseslərinin misilsiz vüsət aldığı bir dövrdür. Azərbaycan Xalq Cümhuriyyəti və onun Parlamenti obyektiv və subyektiv amillərin doğurduğu məhrumiyyət və məşəqqətlərlə dolu olan çox mürəkkəb bir tarixi şəraitdə meydana gəlmişdir. Əsrlər boyu xalqları əsarətdə saxlamış çar Rusiyasının süqutundan sonra cərəyan edən qarşısıalınmaz siyasi proseslər 1917-ci ilin oktyabrında bolşeviklər hakimiyyətə gəldikdən sonra keçmiş imperiya ərazisində başlanan qanlı vətəndaş müharibəsi, erməni millətçilərinin azərbaycanlılara qarşı soyqırımının son dərəcə böyük miqyas alması Qafqazda, o cümlədən Azərbaycanda vəziyyəti idarəedilməz şəklə salmışdı [16].

Azərbaycan Xalq Cümhuriyyətinin iqtisadi tədbirləri sırasında ən əhəmiyyətlisindən biri də qonşu və xarici dövlətlərlə iqtisadi əlaqə ya-

ratmaqdan ibarət idi. Bu sahədə AXC hökuməti təkcə qanun layihələri hazırlamaqla kifayətlənməyib, dünyanın bir sıra ölkələri, o cümlədən 1918-ci il iyunun 4-də Türkiyə, 1919-cu il mayın 23-də İran, İngiltərə, ABŞ, Fransa, İtaliya, Gürcüstan, Dağıstan, Orta Asiya dövlətləri ilə iqtisadi əlaqə yaratmağa nail olmuşdu. Bəzi dövlətlərlə ticarət müqaviləsi bağlamış, bəziləri ilə şifahi razılıq əldə edilmişdi [8. s. 512].

*1917-1922-ci illərdə Şimali Qafqazda mövcud olmuş müstəqil dövlət (konfederasiya).* Dağlılar Respublikasının ərazilərinə müasir dövrdə Rusiyanın Çeçenistan, İnquşetiya, Dağıstan və Kabardin-Balkar respublikaları və Qaraçay-Çerkesiya muxtar vilayətləri daxil idi. Rusiyada vətəndaş müharibəsinin getdiyi dövrdə keçmiş Qafqaz İmamətinin əhatə etdiyi ərazidə, o cümlədən, Dağıstan, Çeçenistan, Tersk vilayətinin dağlıq dairələrində 1917-ci ilin noyabrında Dağlı Respublikası (1917-1919) elan olunur. [9.s.51] 16 aprel 1919-cu il tarixində respublikanın rəhbəri Pşemaxo Kosyev Dağıstanın Azərbaycan Demokratik Respublikasının tərkibinə keçməsi barədə qərar qəbul etdi. Dağlılar Respublikasının qurucularından biri Şeyx Şamilin nəvəsi Seyid Şamil olmuşdur. Dövlətin ilk rəhbəri isə Tapa Çermoyev seçilmişdir. Şeyx Əli Hacı Akuşa və Heydər Bamat kimi nüfuzlu bəylər dövlətin idarə olunmasında yaxından iştirak etmişdilər. Dağlılar Respublikası Osmanlı imperiyası, Almaniya, Azərbaycan Xalq Cümhuriyyəti və Gürcüstan Demokratik Respublikası tərəfindən rəsmən tanınmışdır. [17]

1918-ci ilin noyabrından hökumət Teymur-Xan Şurada (indiki Buynaksk) qərarlaşır. 1918-ci ilin axırlarında türk qoşunları çəkildikdən sonra dağlı qurultayı Koalisiya hökuməti yaradır, Pşemaxo Kotseyev başçı seçilir, kazak rəhbərliyi ilə müqavilələr bağlanır, Azərbaycan və Gürcüstanın köməyilə hərbi qüvvələr yaradılır, hərbi-şəriət məhkəmələri təşkil olunur. Lakin 1919-cu ilin yazında Denikinin Dağıstanı tutması ilə Dağlı hökuməti fəaliyyətini dayandırır, hökumət üzvləri Tiflisə mühacirət edir. Bu aralarda Şimali Qafqazda bolşeviklər tərəfindən Tersk Sovet Respublikası (1918-1919), Şimali Qafqaz Sovet Respublikası (1918) da yaradılır [9, s. 52].

Azərbaycan Xalq Cümhuriyyəti, ümumiyyətlə, mövcud olduğu qısa tarixi dövr ərzində, son dərəcə mürəkkəb və ziddiyyətli tarixi şəraitdə olduqca fəal xarici siyasət yeritdi. Azərbaycan dövləti 1920-ci il yanvarın 11-də Paris sülh konfransında Azərbaycan haqqında xüsusi qərar qəbul edilməsinə nail oldu. Həmin qərara əsasən, konfrans iştirakçısı olan ölkələr Azərbaycanı müstəqil dövlət kimi de-fakto tanıdılar. Azərbaycan Xalq Cümhuriyyəti Türkiyə, İran, Ukrayna, Böyük Britaniya, ABŞ, Fransa, İtaliya, Belçika, Hollandiya, Yunanıstan, Polşa, İsveçrə, İsveç, Danimarka, Latviya, Litva, Estoniya, Finlandiya, Rumıniya, Almaniya, Gürcüstan, Ermənistan, Dağlılar Respublikası, Krım və başqa ölkələrlə səfirlik və nümayəndəliklər səviyyəsində diplomatik münasibətlər yaratdı, ikitərəfli və çoxtərəfli müqavilələr, sazişlər imzaladı [10, s. 44].

M.Y. Cəfərov 1919-cu ilin aprel ayının 14-də xarici işlər naziri vəzifəsinə başladıqdan sonra həm nazirliyin mərkəzi aparatında, həm də xaricdəki diplomatik nümayəndəliklərdə bir sıra dəyişikliklər etdi. Aprel ayının 15-də xarici işlər nazirliyi üzrə verilmiş 2 saylı əmrdə nazirliyin şəxsi heyəti və diplomatik missiyaların başçıları öz yerlərinə təsdiq edildilər. Yeni əmrə əsasən, Mir Yusif Vəzirov Ukrayna, Polşa və Krımda, Mahmud bəy Əfəndiyev Batumda, Məhəmməd Xan Təkinski Ermənistanda, Əbdürrəhim bəy Haqverdiyev Dağlılar İttifaqında, Cəfər bəy Rüstəmov Kuban hökumətində, Əkbər ağa Sadıxov Aşqabadda öz diplomatik fəaliyyətlərini davam etdirməli idilər. Tiflisdəki Azərbaycan diplomatik nümayəndəliyinə onun müavini olmuş Fariz bəy Vəkilov başçılıq etməyə başladı [18].

Azərbaycan Xalq Cümhuriyyətinin iqtisadi proqramında xarici iqtisadi-ticarət strategiyası mühüm yer tuturdu. AXC hökuməti və parlamenti xarici iqtisadi siyasət sahəsində mühüm addımlar atmış, bir çox qanunlar layihəsi hazırlamış və qəbul etmişdir. Xarici iqtisadi əlaqələri həyata keçirən Ticarət və Sənaye Nazirliyinin nəzdində “Xarici dövlətlər və bir birinə yaxın sahələrlə əmtəə mübadiləsi komitəsi” fəaliyyət göstərirdi. Qonşu dövlətlərlə iqtisadi əlaqələrin genişləndirilməsinə xüsusi əhəmiyyət verən Azərbaycan Xalq Cümhuriyyəti, hələ özünün mükəmməl iqtisadi bazasını yaradıb başa çatdırmadığı halda, humanizm prinsiplərindən çıxış edərək, Dağıstana 50 mln. manat məbləğində yardım göstərmişdi ki, bu da respublikanın büdcə məxaricinin 1/8 hissəsini təşkil edirdi [11, s. 60].

1920-ci ilin martında Qarabağın dağlıq hissəsində Azərbaycan Cümhuriyyətinə qarşı qaldırılan qiyamda, Qazax və Naxçıvana Ermənistan tərəfindən edilən təcavüzdə məqsəd Azərbaycanın nizami ordu hissələrini Bakıdan çıxartmaq idi. Daşnak quldur dəstələrinin Xankəndi qarnizonuna hücumu ilə başlanan Qarabağ qiyamını yatırtmaq üçün ordu hissələri təcili Bakıdan və Dağıstan sərhədlərindən Qarabağın dağlıq hissəsinə gətirilməyə başladı. Xarici təhlükə ilə yanaşı mart ayının axırlarında hökumətin istefa verməsi də böhranın dərinləşməsində az rol oynamırdı. Lakin yeni hökumət yaradılmadığı üçün köhnə kabinet hələlik öz fəaliyyətini davam etdirirdi. Aprel ayının ortalarında Qırmızı Ordu hissələrinin Azərbaycan sərhədlərində toplaşması Azərbaycan hökumətinin ciddi narahatlığına səbəb olmuşdu. Aprelin 15-də Fətəli xan Xoyski G. Çiçerinə göndərdiyi teleqramda yazırdı ki, Dağıstan denikinçılərdən təmizləndikdən sonra Azərbaycan xalqı bu ümiddə idi ki, şimaldan təhlükə qurtarmışdır; o, qardaş dağlı xalqları və xalqların öz müqəddəratını təyin etmək hüququna təminat vermiş Rusiya ilə dostcasına yaşayacaqdır [18].

"Vahid və bölünməz Rusiya" sərhədlərini bərpa etmək iddiasında olan Denikin 1919-cu ilin yazında Dağıstan Dağlılar Respublikasına soxularaq Dərbəndi işğal etdi. Çar generalının Azərbaycana təcavüzkar niyyətdə olduğu aşkara çıxdı. Parlamentin fövqəladə iclasında qəbul olunmuş qərara əsasən sərhədlərin təhlükəsizliyini təmin etmək məqsədilə Dövlət Müdafiə Komitəsi yaradıldı və bütün hakimiyyət onun ixtiyarına keçdi.

Aprelin 29-da Azərbaycan İnqilab Komitəsi hərbi yardım göstərmək xahişi ilə Sovet Rusiyasına müraciət etdi. Halbuki, rus ordusu aprelin 27-də Azərbaycanın hüdudları daxilində idi. Beləliklə, AXC 23 aylıq fəaliyyətdən sonra süqut etdi.

1920-ci il aprelin 28-də Azərbaycan Sovet Sosialist Respublikası elan olundu.

Aprel işğalı nəticəsində Azərbaycanda qurulan bolşevik rejiminin ömrü 70 ildən də çox çəkdi. Bu rejim özünün bütün varlığı ərzində Şərqdə ilk demokratik respublikanın bayrağını ucaldan qeyrətli soydaşlarımızla, onların haqq işinin davamçıları ilə mübarizə apardı. Lakin xalqın qəlbində yaşayan azadlıq atəşini söndürməyə müvəffəq olmadı. Xalq özünün istiqlal arzularını nəsildən-nəslə ötürdü. Nəhayət, 1991-ci ildə Azərbaycan yenidən öz dövlət müstəqilliyini bərpa etdi, indiki Azərbaycan Respublikasının 1918-ci il mayın 28-dən 1920-ci il aprelin 28-dək mövcud olmuş AXC-nin varisi olduğunu ümumxalq iradəsi ilə təsdiqlədi. [12, s. 23-24]

Şimali Qafqazın şərqində yerləşən Dağıstanla Azərbaycan arasında mədəni əlaqələrin tarixi qədimdir. Bu sahədə zəngin qarşılıqlı mədəni münasibətlərə malik olan hər iki xalq həmişə dostluq və mehriban ünsiyyət şəraitində yaşamışdır. Tarix boyu azərbaycanlılardan qardaşlıq münasibətlərini hiss edən dağıstanlı sənətkarlar, yaxud adi vətəndaşlar öz vətənlərindən Azərbaycana pənah gətirmiş, bu ölkənin əhalisi ilə dinc və əmin-amanlıq mühitində yaşayıb-yaratmışlar. Ona görə də bu gün Azərbaycanın bəzi rayon və kəndlərində dağıstanlı ailələrinə rast gəlmək olur. Onlar haqlı olaraq Azərbaycanı özləri üçün əsil vətən hesab edirlər. Hələ qədimlərdən Azərbaycana gəlmiş dağıstanlılar Azərbaycan dilini öyrənir, onun mədəniyyəti, adət və ənənələri ilə yaxından tanış olurdular. Azərbaycan və Dağıstanın qabaqcıl ziyalıları, ailələri, şair və yazıçıları bir-biri ilə sıx əlaqələr saxlamış, öz yaradıcılıq fəaliyyətlərində bir-birlərinə kömək etmişlər [19].

Azərbaycan xalqının Şimali Qafqazın yerli dağlı əhalisi ilə çoxəsrlik siyasi, iqtisadi və mənəvi əlaqələri 1917-1920-ci illərdə milli müstəqillik uğrunda mübarizə dövründə daha da gücləndi və çoxşaxəli oldu. Azərbaycanın qabaqcıl ziyalıları, ictimai-siyasi xadimləri bəhs olunan dövrdə Şimali Qafqaz xalqlarının milli-azadlıq hərəkatını rəğbətlə izləyir və bütün mümkün vasitələrlə onlara yardım edirlər. [13. s. 29-33]

Dağlı Respublikası və Azərbaycan Xalq Cümhuriyyəti arasındakı qarşılıqlı əlaqələr böyük maraq doğurur. Bu respublikaları birləşdirən əsas cəhətlər demokratik inkişaf kursu, Osmanlı imperiyasına yönəlik xarici siyasət və yaranmış vəziyyətdə ümumi maraqlardan çıxış edərək bolşeviklərə və ağqvardiyaçılara qarşı mübarizə idi. Milli oyanış, Qafqaz xalqlarının sivil cəmiyyət qurmaq səyləri, öz müqəddəratını təyin etmək uğrunda silahlı mübarizə, XX əsrin əvvəllərində müstəqil dövlət qurumlarının elan edilməsi Azərbaycan və Şimali Qafqaz xalqlarının Qafqazda müstəqil yaşamaq istəklərini nümayiş etdirirdi [2, s. 27-28].

Rusiya hakim dairələri ümumi türk dili və vahid din əsasında türk-müsəlman xalqlarının birləşməsi ideyasının yayılmasından ehtiyatlanaraq hesab edirdilər ki, bu proses müxtəlif maarifçi-xeyriyyə cəmiyyətlərinin, türk-tatar məktəblərinin və mətbu orqanlarının açılması ilə həyata keçirilir. Dağıstan vilayətində cəmi iki belə məktəb fəaliyyət göstərirdi: Dərbənd və Petrovsk (Mahaçqala). Temir Xan Şurada (Buynaksk) azərbaycanlı tələbələr tədrisin ana dilində keçirilməsini tələb edirdilər. Azərbaycan milli teatr dərnəkləri meydana gəlirdi. Azərbaycan dilində bir sıra nəşrlər işıq üzü görməyə başladı. Dağıstanda Azərbaycan maarifçiləri tərəfindən nəşr edilən "Molla Nəsrəddin" satirik jurnalı yayılmağa başlamışdı. Azərbaycan xeyriyyəçisi Hacı Zeynalabdin Tağıyev Azərbaycanda və Dağıstanda ilk kitabların nəşrinə köməklik edirdi. Buna misal olaraq Həsən Əl-Qədərinin türk dilində nəşr edilmiş "Asar-i Dağıstan" əsərini göstərmək olar [2, s. 3]. "Beynəlxalq mədəni əlaqələr" kitabında deyilir ki, Azərbaycan xalqının görkəmli ziyalısı, filosof və tarixçisi A. Bakıxanov Dağıstan xalqlarının tarixi ilə yaxından məşğul olmuş sənətkarlardandır. Müəllifin "Gülüstani-İrəm" adlı məşhur əsərində öz doğma xalqının tarixi ilə yanaşı, Dağıstan xalqının da tarixi geniş şəkildə işıqlandırılmış, yadelli işğalçılara qarşı hər iki xalqın mübarizəsi diqqətə çatdırılmışdır. Dağıstan xalqının tərəqqipərvər alimi Həsən Əlqədari Azərbaycan dilini, tarixini və ədəbiyyatını yaxşı öyrənmiş, Azərbaycan dilində əsərlər yazıb-yaratmışdı. Müəllif Azərbaycan dilində yazdığı, eyni zamanda, Bakıda çap etdirdiyi "Asari-Dağıstan" adlı kitabında iki xalqın dostluğuna yüksək qiymət vermişdi. Həsən Əlqədari Azərbaycanın məşhur alimi Həsən bəy Zərdabi, Firudin bəy Köçərli və digər alim və yazıçılarla şəxsən əlaqə saxlamış, hətta dost olmuşdur. Həsən bəy Əlqədari Zərdabinin nəşr etdirdiyi "Əkinçi" qəzetinin abunəçisi və müxbiri olmuş, qəzetin Dağıstanda yayılmasına ciddi kömək göstərmişdi. Bu fakt iki xalq arasında dostluğun bariz nümunəsi idi. Ədəbi əlaqələr sırasında Dağıstanın xalq şairi Süleyman Stalski, şair və yazıçı Xürüklü Tahir, aşıq Seyid, aşıq Abdullah, xalq artisti Səfərbək Ağabalıyev, yazıçı-alim Paşa Salavatov və bir çox başqaları Azərbaycanda olmuş, azərbaycanlı şair, yazıçı, aşıq və digər tərəqqipərvər insanlarla mədəni əlaqə saxlayaraq öz yaradıcılıqlarında onların əlaqələrindən geniş şəkildə bəhrələnmişdilər. Azərbaycanın klassik sənətkarları Dağıstanda həmişə tanınmaqdadır. Xüsusilə, Füzulinin "Divanı", "Leyli və Məcnun"u, Vaqifin şeirləri, Sabirin "Hophopnamə"si, Nəriman Nərimanov, Məmməd Səid Ordubadi və digərləri bu ölkədə həmişə çox maraqla oxunur [19]. Məhəmməd Rəfi Əbdürrəhim oğlu Şirvani – XVI əsrin ikinci və XVII əsrin birinci yarısında yaşamış Azərbaycan alimidir. Azərbaycan və Dağıstan tarixinə aid bəzi əsərləri vardır. "Risaleyi-rüstəm xaniyyə" adlı kitabını Dağıstan xanlarından Rüstəm xanın adına yazmışdır [14, s. 17].

"Gülüstani-İrəm" əsərində A. Bakıxanov Azərbaycan xalqının, xüsusilə Şirvan və Dağıstanda yaşayan tayfa və xalqların tarixini qədim dövrlərdən başlayaraq 1813-cü il "Gülüstan müqaviləsi"nə qədər təsvir edir. Bu əsər, əsas etibarilə, müqəddəmə, beş fəsil və nəticədən ibarətdir. Əsərin müqəddəmə hissəsində müəllif Şirvan və Dağıstan xalqlarının mənşəyi haqqında məlumat verir. O, islam dininin, istifadə etdiyi şərq məxəzlərinin, eyni zamanda, özünün idealist görüşləri əsasında, ümumiyyətlə, xalqların, xüsusilə Şirvan və Dağıstanda yaşayan xalq və tayfaların mənşəyini təhrif edilmiş bir tərzdə izah etməyə çalışmışdır. Dağlılara ləzgi adının verilməsi, Laz qovmilə qarışmaları münasibətilə ola bilər. Lazlar miladın III əsri sonunda Kolxidada yaşayırdılar. Sərmat padşahı Qıpçaq çölündən gəlib, onları məğlub etdi. Lazlar V əsrdə albanlar və iverlər ilə bərabər Rum və İran arasında uzun müddət davam edən müharibələrə qarışırdılar. VI və VII əsrlərdə dəbunların dövləti mövcud idi. Bunların padşahlarından Qubaz və Xoryan şöhrət sahibi olmuşlar. Bu tayfanın qalıqları indi də Qara dənizin cənub-şərqində sakin olub, yazılarında öz adlarını layiqi yazırlar [14, s. 6-7-20].

Azərbaycan çar Rusiyası tərəfindən istila edildikdən sonra rus alimləri Azərbaycan xalqının XIX əsr sosial-iqtisadi, siyasi və mədəniyyət tarixini tədqiq etmək sahəsində müəyyən işlər görmüşlər. Bu alimlərdən İ.N. Berezinin 1849-1852-ci illərdə nəşr olunmuş – "Dağıstan və Zaqafqaziya səfəri" əsərini qeyd etməliyik. S.B. Bronevskinin, O. Yevetskinin, B. Zubovun, Y.A. Qaqameystürin, Q.E. Startsevin, V. Simonoviçin, S.D. Perşkenin, A.Brilinskinin, İ.L. Se-

qalın, N.A. Petrovun, V.İ. Masalskinin və başqalarının özündə Azərbaycanın XIX əsr tarixi məsələlərini əks etdirən əsərlərini də göstərməliyik. Azərbaycanın XIX əsrə qədərki, həmçinin XIX əsrin əvvəlləri tarixinin bəzi məsələlərini özündə cəmləşdirmiş əsərlərin – Qarabağnamələrin müəllifləri Mirzə Yusif Qarabağini, Mir Mehdi Xəzanini, Mirzə Adıgözəl bəyi, Mirzə Camalı, Əhməd bəy Cavanşiri, Məhəmməd Baharlını da unutmamalıyıq. Bu dövrün belə tarixçilərindən danışarkən Abbasqulu Ağa Bakıxanovun "Gülüstani – İrəm" kitabını və əsərlərində XIX əsrin I yarısı tariximizin bir sıra məsələlərini əks etdirən, Dərbənddə doğulmuş, Qazan və Peterburq Universitetində işləmiş Mirzə Məhəmməd Əli Kazım bəyi xüsusilə qeyd etməliyik [14, s. 5].

Azadlıq uğrunda mübarizə simvoluna çevrilmiş şəxsiyyətinin müstəqil Azərbaycan respublikasının vətəndaşlarında tarixi keçmişə düzgün münasibət, Vətənə sədaqət hisslərinin formalaşmasında xüsusi əhəmiyyətini nəzərə alaraq, Ulu öndər Heydər Əliyev 21 oktyabr 1997-ci ildə Şeyx Şamilin anadan olmasının 200 illiyi ilə əlaqədar yubiley tədbirlərinin həyata keçirilməsi üçün qərar qəbul etmişdi. Həmin tədbirdə çıxış edən Heydər Əliyev Şeyx Şamilin tarixi xidmətləri haqqında demişdi: "Azadlıq uğrunda 25 ildən çox vuruşan Şeyx Şamil bir daha sübut etdi ki, xalqın istiqlal amalını, iradəsini və əzmini sındırmaq, məhv etmək mümkün deyil... Azadlığı, sülhü, əmin-amanlığı qorumaq yolunda hər bir Qafqazlıya Şeyx Şamil müdrikliyi, qətiyyəti və fədakarlığı arzulayıram. Əminəm ki, Şeyx Şamil ruhu bizi bir-birimizə daha da doğmalaşdıracaq, Rusiya Federasiyasında yaşayan xalqlarla Azərbaycan xalqı arasındakı dostluq və qardaşlığı daha da möhkəmləndirəcəkdir [15, s. 6].

**Problemin aktuallığı.** Mövzunun məqsəd və vəzifələri onun aktuallığını şərtləndirən səbəblərlə bilavasitə əlaqədardır. Araşdırmanın aparılmasının əsas məqsədi 1918-1920-ci illər Azərbaycan xalqının öz müqəddəratını özünün təyin etməyə qadir olduğunu sübut etməyə cəhd göstərdiyi bir dövrü və xalqımızın yazmış olduğu şanlı tarixi xronoloji ardıcıllıq və əhəmiyyətlilik prinsipləri əsasında tarixi hadisələri dərindən öyrənilməsini göstərməkdir.

**Problemin elmi yeniliyi.** Məqalədə xalqlarımızın əsrlər boyu tarixi əlaqələrindən bəhs edərkən hər zaman hər iki xalqı birləşdirən, zəngin həyat təcrübəsinə söykənən mehriban dostluq, qonşuluq və əməkdaşlıq ənənələrimizin bu gün də davam etdirilməsi qeyd edilir.

**Problemin praktik əhəmiyyəti.** Qədim dövlətçilik tarixinə malik olan xalqımızın keçmişini və bugününü öyrənməyə, ondan güc almağa və daim təcrübə qazanmağa ehtiyacımız vardır.

**Ədəbiyyat:**


1. R. Qurbanov. Qafqaz tarixi. / R. Qurbanov. -Bakı: Zərdabi LTD MMC, - 2008. -583 s.
2. Sevinc Əliyeva. Azərbaycan Xalq Cümhuriyyəti və Şimali Qafqaz Dövlətləri müstəqillik illərində (1918-1920) -Bakı-2020. -322 s.
3. "Azərbaycan Paris Sulh Konfransında" (1919 -1920) -Bakı: "Ozan", -2008. -244 s.
4. A. Göyüşov. 1917-1920-ci illərdə Şimali Qafqaz dağlılarının azadlıq uğrunda mübarizəsi. -Bakı: "Araz"-2000.- 352 s.
5. K. Şükürov. Türkmənçay - 1828, Tarixi xronika, (İxtisarla). -Bakı, 2006, -188 s.
6. A. İsgəndərov. Azərbaycan Xalq Cümhuriyyətinin 95 illiyinə həsr edilmiş Respublika elmi konfransının materialları. -Bakı, -2014.
7. İ. Hüseynova. Tarix. Zaman. Düşüncələr. / İ. Hüseynova. -Bakı: Elm və təhsil, -2016, c.1. - 512 s.
8. Azərbaycan tarixi: [7 cilddə] / -Bakı: Elm. - 2008. - c.5,.+40 s. İllüstrasiya., 696 s.
9. T. Əliyeva. Qafqaz müharibəsi rus ədəbiyyatında. -Bakı: Xəzər Universiteti Nəşriyyatı, 2019.
10. Y. Mahmudov. Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası. I Cild / Bakı: Lider, -2004. - 472 s .
11. Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası: [11. İki cilddə] / - Bakı: Lider, - 2004.
12. A. İsgəndərov. Azərbaycan Xalq Cümhuriyyətinin yaranması və onun tariximizdə yeri // Strateji təhsil, 2018, № 1-2,
13. Azərbaycan Xalq Cümhuriyyətinin Dağlı Respublikasına yardımları haqqında. Q. Əliyev // GEO Strategiya.-2014.-№ 4 .-s.29-33.
14. A. Bakıxanov. Gülüstani-İrəm. -Bakı, -2010. - 153 s.
15. M. Mahmudzadə. Şeyx Şamil və onun varisləri (sənədli publisistik qeydlər). / M. Mahmudzadə. -Bakı: Boz oğuz, -1998, - 174 s.

16. https://axc.preslib.az/az/page/d9JSpahRCP )
17. (https://az.wikipedia.org/wiki/Dağlılar_Respublikasi )
18. Azərbaycan Xalq Cümhuriyyəti dövrü - https: // files. preslib. az/projects/azdiplomacy/a2_1. pdf
19. V. Ömərov. Azərbaycan-Dağıstan mədəni-mənəvi inteqrasiyası; XIX əsr və XX əsrin birinci yarısı https://sesqazeti.az/news/mia/392050.html)

**E-mail:** ley.hasan@gmail.com
**Rəyçilər:** *tarix elm.dok., prof.* **M.İ. Əmrahov,**
*tarix elm.dok.* **H.Y. Verdiyeva**
**Redaksiyaya daxil olub:** 05.12.2022.

## *TƏRBİYƏ TEXNOLOGİYALARI*
## *ВОСПИТАТЕЛЬНЫЕ ТЕХНОЛОГИИ*
## *UPBRİNGİNG TECHNOLOGIES*

*UOT 37.0*

***Emilya Rafiq qızı Hüseynova***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# ÜMUMTƏHSİL MƏKTƏBİNİN ÜMDƏ VƏZİFƏSİ: ŞAGİRDLƏRDƏ FƏAL VƏTƏNDAŞLIQ MÖVQEYİNİN FORMALAŞDIRILMASI

***Эмилья Рафиг гызы Гусейнова***
*доктор философии по педагогике, доцент*
*Азербайджанский Государственный Педагогический Университет*

# ОСНОВНЫЕ ЗАДАЧИ ОБЩЕОБРАЗОВАТЕЛЬНОЙ ШКОЛЫ: ФОРМИРОВАНИЕ АКТИВНОЙ ГРАЖДАНСКОЙ ПОЗИЦИИ У УЧАЩИХСЯ

***Emilya Rafik Huseynova***
*doctor of philosophy in pedagogy, associate professor*
*Azerbaijan State Pedagogical University*

# THE MAİN TASKS OF THE SECONDARY SCHOOL: FORMATION OF ACTIVE CIVIC POSITION IN PUPİLS

**Xülasə**. Məqalədə şagirdlərdə fəal vətəndaşlıq mövqeyinin formalaşdırılmasına ümumtəhsil məktəbinin ümdə vəzifəsi kimi yanaşılır. Fəal vətəndaşlıq mövqeyinin göstəricilərinə aşağıdakılar aiddir: şagirdlərin fəaliyyətinin məqsədyönlü, sistemli və şüurlu olması; fəaliyyətin bu və ya digər növlərində fəallıq və məsuliyyət; məktəblinin fəaliyyətinin və sosial fəallığının fəaliyyətin növünün tələblərinə və cəmiyyətdə həyat şəraitinə uyğun gəlməsi; şagirdin real fəaliyyəti və həyat tərzi

***Açar sözlər**: mühüm vəzifə, fəal mövqe, fəal vətəndaşlıq mövqeyi, fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması, azərbaycançılıq*

**Резюме**. В статье формирование активной гражданской позиции у учащихся рассматривается как основная задача общеобразовательной школы. К показателям активной гражданской позиции относятся следующие: деятельность учащихся должна быть целенаправленной, систематической и осознанной; активность и ответственность в том или ином виде деятельности; соответствие деятельности и социальной активности школьника требованиям вида деятельности и условиям жизни в обществе; реальная деятельность и образ жизни ученика.

***Ключевые слова:** важная задача, активная позиция, активная гражданская позиция, формирование активной гражданской позиции, азербайджанство*

**Summary**. In the article, the formation of an active civic position among students is considered as the main task of a secondary school. The indicators of active citizenship include the following: the activities of students should be purposeful, systematic and conscious; activity and responsibility in a particular type of activity; compliance of the activity and social activity of the student with the requirements of the type of activity and the conditions of life in society; real activity and lifestyle of a student

***Key words:** important task, active position, active civic position, formation of an active civic position, azerbaijanism*

Məktəblilərdə, o cümlədən yuxarı sinif şagirdlərində fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması cəmiyyətimizin inkişafının hazırkı mərhələsində son dərəcə aktuallıq daşıyır. Dövlətin təhsil siyasəti bu istiqamətdə məqsədyönlü, sistemli və ardıcıl işlərin aparılmasını tələb edir. Təhsilə aid qanun və sərəncamlarda vətəndaş tərbiyəsi məsələsi xüsusilə diqqət mərkəzində dayanır. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu, "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" buna əyani sübutdur.

Təhsilalanlarda fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması özündə aşağıdakıları ehtiva edir: şagirdlərdə vətəndaşlıq şüurunun və vətəndaşlıq təfəkkürünün, vətəndaşlıq dünyagörüşünün və vətənpərvərlik hisslərinin formalaşdırılması ilə bağlı olan bir sıra tərbiyəvi vəzifələr; fəal vətəndaşlıq mövqeyi; Azərbaycan Konstitusiyası ilə müəyyən edilmiş vəzifələrinin yerinə yetirilməsi və Azərbaycanın milli maraqlarının müdafiəsi zamanı vətəndaşın və vətənpərvərin mənəvi-psixoloji keyfiyyətlərinin tərbiyə olunması və inkişaf etdirilməsi.

Məktəbdə haqqında danışılan keyfiyyətlərin tərbiyəsi və inkişaf etdirilməsi məsuliyyətli işdir. Şagirdlərdə vətəndaşlıq şüurluluğunun və fəal vətəndaşlıq mövqeyinin tərbiyə edilməsi ümumtəhsil məktəbinin qarşısında dayanan mühüm vəzifələrdəndir.

Qarşıya belə bir sual çıxır: vətəndaşlıq mövqeyinin məzmununu nə təşkil edir?

Pedaqoji ədəbiyyata əsasən, həmin suala belə cavab vermək olar: emosiya və hisslər; vətəndaşlıq şüurluluğunun səviyyəsi; vətəndaşlıq istiqaməti; təfəkkür; davranış; erudisiya; şəxsi, ailə, vətəndaşlıq, milli və digər dəyərlər; sosial vərdişlər və bacarıqlar.

Vətəndaşlıq azərbaycançılığın son dərəcə vacib elementlərindəndir. Azərbaycan dilində "vətəndaşlıq" bir sıra mənalarda işlənir. 1998-ci il sentyabrın 30-da qəbul olunmuş "Azərbaycan Respublikasının vətəndaşlığı haqqında Azərbaycan Respublikasının qanunu"nun birinci maddəsində vətəndaşlıq ölkəmizdə insanın hüquqi statusunu müəyyənləşdirən norma kimi anlaşılır.

Digər ölkələrdə olduğu kimi, Azərbaycan Respublikasında da vətəndaşlıq bu və ya digər şəxsin hüquqi statusu ilə bərabər eyni zamanda onun ictimai-siyasi münasibətlərə mövqeyini ifadə edən psixoloji vəziyyət kimi qəbul olunur.

Fəal vətəndaşlıq mövqeyinin göstəricilərinə aşağıdakılar aiddir:

– şagirdlərin fəaliyyətinin məqsədyönlü, sistemli və şüurlu olması;

– fəaliyyətin bu və ya digər növlərində fəallıq və məsuliyyət;

– məktəblinin fəaliyyətinin və sosial fəallığının fəaliyyətin növünün tələblərinə və cəmiyyətdə həyat şəraitinə uyğun gəlməsi;

– şagirdin real fəaliyyəti və həyat tərzi və s.

Məktəbli, o cümlədən yuxarı sinif şagirdi şəxsiyyətinin hərtərəfli və ahəngdar inkişafı yeni pedaqoji təfəkkür şəraitində obyektiv tələbat kimi nəzərdən keçirilə bilər. Azərbaycan Respublikası inkişaf etdikcə, möhkəmləndikcə, dünya ölkələri sırasında özünəməxsus layiqli yer tutduqca, maddi və mənəvi sərvətləri qibtə doğurduqca onun vətəndaşının hərtərəfli və ahəngdar inkişafına tələbat da artır. Hazırda insanın, vətəndaşın hərtərəfli və ahəngdar inkişafına obyektiv tələbat ölkənin maddi-texniki bazasının yaradılmasının, şəxsiyyətlərarası münasibətlərin təkmilləşdirilməsinin, həyat tərzinin möhkəmləndirilməsinin və inkişafının, yeni tipli insanın tərbiyə olunması qanunauyğunluqlarının təzahürü ilə diqqəti cəlb edir.

Fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması azərbaycançılıq ideyası ilə qırılmaz tellərlə əlaqədardır. Ulu öndər Heydər Əliyev 26 dekabr 2002-ci il tarixində dünya azərbaycanlıları ilə görüşündə demişdir*: "Müstəqil Azərbaycan Respublikası dünya azərbaycanlılarının həmrəyliyinin əsası və güclü dayağıdır. Bu həmrəyliyin qayəsini təşkil edən azərbaycançılıq və Azərbaycan dövlətçiliyi ideyaları məhz müstəqil dövlətimizin yaranması ilə inkişaf etmiş, şüurlarda özünə möhkəm yer tutmuş, soydaşlarımızı birləşdirən milli məfkurəyə çevrilmişdir. Azərbaycan Respublikası indi dünya azərbaycanlılarının birliyi və həmrəyliyi ideyalarının əsas daşıyıcısıdır, müxtəlif vaxtlarda tarixi vətənimizdən uzaq düşmüş soydaşlarımızın milli şüurunun güclənməsinin başlıca mənbəyidir. Dövlətimiz bu gün xaricdə yaşayan azərbaycanlıların insan və vətəndaş hüquqlarının müdafiəçisi və qarantı rolunda çıxış edir. 2001-ci ilin noyabrında Dünya azərbaycanlılarının I qurultayının keçirilməsi, 2002-ci ilin iyulunda Xaricdə Yaşayan Azərbaycanlılarla iş üzrə Dövlət Komitəsinin yaradılması, soydaşlarımızın birliyinin və*

*həmrəyliyinin güclənməsi istiqamətində atılan digər addımlar öz müsbət nəticələrini verməkdədir. Hazırda bütün azərbaycanlıların vahid amal və ideya ətrafında birləşdirilməsi, soydaşlarımızla əlaqələrin gücləndirilməsi dövlət siyasəti səviyyəsinə qaldırılmış, bütün rəsmi və qeyri-rəsmi strukturların diqqəti bu istiqamətə yönəldilmişdir* [1, s. 229 ].

Vətəndaşlıq azərbaycançılıq baxımından şəxsiyyətin öz hüquq və vəzifələrini başa düşməsi əsasında ictimai-siyasi hadisələrə fəal münasibətində təzahürünü tapır. Vətənə məhəbbət, onu sevmək, uğrunda fədakarlığa hazır olmaq, qanunlarına, etik normalara, birgəyaşayış qaydalarına, ana dilinə hörmət, tarixi irsi, xalqın mədəniyyətini, adət və ənənələrini, mənəvi dəyərlərini öyrənmək fəal vətəndaşlıq mövqeyi qazanmaq baxımından dəyərlidir.

Problemin ümumtəhsil məktəblərində təlim və tərbiyə prosesində necə nəzərə alınması az əhəmiyyət daşımır. Bu işin elmi şəkildə təşkili lazımdır. Yeni tipli mənəvi şəxsiyyət tərbiyə etmək istiqamətində səmərəli ola biləcək iş sisteminin yaradılması vacibdir. Fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması mənəvi tərbiyənin mühüm vəzifələrinə daxildir. Fəal vətəndaşlıq mövqeyinin meyarı kimi b yüksək mənəvi əqidə mənəvi problemlərin mahiyyətini anlamaq bacarığı, bu problemlərə uyğun şəkildə özü üçün müəyyən vəzifələr müəyyənləşdirməkdən ibarətdir.

Şagirdlərin hər biri öz mənəvi sağlamlığı qayğısına qalmalıdır. Mənəvi sağlamlığa qayğı yaxşı təhsil almağa və tərbiyələnməyə, normal yaşayışa və normal fəaliyyətə mane olan hərəkətlərə, təzahürlərə mübarizə ilə, ictimai və hüquq qaydalarının, birgəyaşayış normalarının pozulmaması, cəmiyyətdə narahatlığın olmaması ilə nəticələnir. Təsadüfi deyil ki, mənəviyyat problemi təhsil müəssisələri, ailələr, ictimaiyyət nümayəndələri, ictimai təşkilatlarla bərabər həm də hüquq mühafizə orqanlarının fəaliyyətində mühüm yer tutur.

Məktəblilərdə fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması üzrə işin səmərəliliyi bu sahədə iş aparan müəllimin şəxsi keyfiyyətləri ilə, şagirdlərə nümunə olmaq, onların nəzərində nüfuzlu şəxs olmaq bacarığı ilə şərtlənir.

Şagirdin mənəvi şüurunu və mənəvi təfəkkürünün, mənəvi davranış təcrübəsinin formalaşdırılması mexanizmlərinin, eyni zamanda mənəvi tərbiyə məqsədlərinin sistem şəklində öyrənilməsi ilə fəal vətəndaşlıq mövqeyinin tərbiyə olunması prosesinə kompleks münasibətin dərinliyi və perspektivliyi diqqət mərkəzinə gəlir. Fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması üzrə işin qarşısında dayanan vəzifə subyektin fəaliyyətinin elə qurulmasıdır ki, bu, ictimai dəyərə olan mənəvi sərvətlərə şəxsi məna verilməsinə imkan yaratsın və həmin əsasda da mənəvi baxımdan şagird şəxsiyyəti təşəkkül tapsın.

Fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması üzrə işin məqsədlərinə çatmaq üçün vasitələrin müəyyənləşdirilməsi yalnız şagirdin cəmiyyət üçün və ətrafdakılardan ötrü arzu edilən mənəvi keyfiyyətləri haqqında təsəvvürlərlə, başqa sözlə, ideal təsəvvürlərlə deyil, həm də tərbiyə obyektinin xüsusiyyətləri ilə, onun biopsixoloji, sosial, ümummədəni, əxlaqi səciyyələri ilə, habelə tərbiyənin obyektiv imkanları ilə – tərbiyə obyektlərinin həyat fəaliyyətinin sosial şəraitində olan imkanlarla şərtlənir.

Şagirddə fəal vətəndaşlıq mövqeyi yalnız o vaxt formalaşmış hesab edilir ki, o, bu keyfiyyəti həmişə büruzə versin. Başqa sözlə, onda həyatının müvafiq vəziyyətlərində tərbiyə edilmiş mənəvi baxışların, münasibətlərin, davranış tərzlərinin vaxtilə baş verməmiş başqa şəraitə keçirilməsi müşahidə olunsun. Mənəvi tərbiyə heç də təkcə davranış qaydalarından faydalanmağı deyil, bütöv şəxsiyyət tərbiyələndirməkdən ibarətdir. Şagirdin mənəvi siması onun bütün fəaliyyətində, şəxsiyyətlərarası münasibətlərində, nitqində, ünsiyyətində, davranış və rəftarında, hisslərində özünü göstərir.

Məktəblilərdə fəal vətəndaşlıq mövqeyinin tərbiyə olunması – cəmiyyət və şəxsiyyət arasındakı mürəkkəb qarşılıqlı əlaqəsinin dialektikasını özündə ehtiva edir, insanların bir-birinə, cəmiyyətə münasibətlərində irəli sürəcəkləri tələblərin mahiyyətini əks etdirir. Fəal vətəndaşlıq mövqeyinə yiyələnməyin göstəricisi bu ola bilər ki, hər bir ölkə vətəndaşı dövlətimiz, cəmiyyətimiz qarşısında, xalqın mənafeyi naminə hansı səviyyədə cavabdehlik hissi duysun. Bütün bunlar da ölkədə demokratizmin inkişafı, şəxsiyyətin həqiqi azadlığından ötrü etibarlı baza meydana gətirir.

**Problemin aktuallığı**. Şagirdlərdə fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması həmişə olduğu kimi bu gün də aktualdır.

**Problemin yeniliyi**. Şagirdlərdə fəal vətəndaşlıq mövqeyinin formalaşdırılmasına ümumtəhsil məktəbinin ümdə vəzifəsi kimi yanaşılır.

**Problemin praktik əhəmiyyəti**. Məqalə doktorant, dissertantlar və magistrantlar üçün faydalı ola bilər.

**Ədəbiyyat:**

1. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir: [46 cilddə] / H.Ə. Əliyev. -Bakı: Azərnəşr, c. 45. -2013. -384 s.
2. Ağayev, Ə.Ə. Vətəndaş olmağa borclusan / Ə.Ə. Ağayev. -Bakı: Maarif, -1979. -84 s.
3. Abbasov, A.N. Pedaqogika nəzəriyyəsi və tarixi / A.N. Abbasov, L.A. Məmmədli, İ.B. Əmirəliyeva.- Bakı: Mütərcim, -2022.

**E-mail:** emilya.huseynova95@gmail.com
**Rəyçilər:** *ped.elm.dok., prof.* **A.N. Abbasov,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 05.12.2022

*UOT 37.0*

***Нигяр Шыхнеби гызы Мурадова***
*доктор философии по педагогике, доцент,*
*ведущий научный сотрудник Института Образования Республики Азербайджан*
https://orcid.org/0000-0003-1742-7847

# ТЕОРЕТИКО-ПЕДАГОГИЧЕСКИЕ ОСНОВЫ НАЦИОНАЛЬНО-НРАВСТВЕННОГО ВОСПИТАНИЯ УЧАЩИХСЯ ПОСРЕДСТВОМ ИСТРИЧЕСКИХ ПАМЯТНИКОВ ШУШИ

***Nigar Şıxnəbi qızı Muradova***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent,*
*Azərbaycan Respublikası Təhsil İnstitutunun aparıcı elmi işçisi*

# ŞUŞANIN ABİDƏLƏRİ VASİTƏLƏRİLƏ ŞAGİRDLƏRİN MİLLİ-MƏNƏVİ TƏRBİYƏSİNİN NƏZƏRİ-PEDAQOJİ ƏSASLARI

***Nigar Shihnebi Muradova***
*doctor of Philology in Pedagogy, Associate Professor,*
*Leading Researcher, Institute of Education of the Republic of Azerbaijan*

# THEORETICAL AND PEDAGOGICAL FOUNDATIONS NATIONAL AND MORAL EDUCATION OF STUDENTS THROUGH ISTRIC MONUMENTS OF SHUSHI

**Резюме**. В статье рассматриваются теоретико-педагогические основы национально-нравственного воспитания учащихся историческим памятниками Шуши. Делается особый акцент на педагогическую возможность сочетания ценностей национального воспитания и исторических памятников Шуши. Специфика воспитательной работы состоит в том, что воспитание учащихся в сфере национального воспитания эти исторические памятники представляют идеологические основы азербайджанства. Система национальных ценностей, содержащих в исторических памятниках Шуши, создает педагогическую основу пространства национально-духовно-нравственного развития и саморазвития личности.

***Ключевые слова:*** *национальное воспитание, исторические памятники Шуши, общеобразовательные школы, учащиеся, учителя*

**Xülasə.** Məqalədə Şuşanın tarixi abidələri ilə şagirdlərin milli-mənəvi tərbiyəsinin nəzəri-pedaqoji əsaslarından bəhs edilir. Milli təhsil dəyərlərinin və Şuşanın tarixi abidələrini uzlaşmasının pedaqoji imkanlarına xüsusi diqqət yetirilir. Tərbiyə işinin səciyyəviliyi ondadır ki, şagirdlərin milli tərbiyə sahəsində tərbiyəsi, bu tarixi abidələr azərbaycançılığın ideoloji əsaslarını təmsil edir. Şuşanın tarixi abidələrində yer alan milli dəyərlər sistemi şəxsiyyətin milli-mənəvi inkişafı və özünüinkişafı məkanı üçün pedaqoji zəmin yaradır.

***Açar sözləri:*** *milli tərbiyə, Şuşanın tarixi abidələri, orta məktəblər, şagirdlər, müəllimlər*

**Summary**. The article deals with the theoretical and pedagogical foundations of the national and moral education of students by historical monuments. Focuses on the pedagogical possibility of combining the values of national education and the historical monuments of Shushi. The specificity of educational work lies in the fact that the education of students in the field of national education, these historical monuments represent the ideological foundations of Azerbaijanism. The system of national values contained in the historical monuments of Shushi creates the pedagogical basis for the space of national-spiritual-moral development and self-development of the individual.

***Key words:*** *national education, historical monuments of Shushi, secondary schools, students, teachers*

Шуша – душа Азербайджана, которая раскрывает школьникам духовный мир его народа, является *«великим памятником азербайджанского народа»* (Гейдар Алиев). Шуша имеет огромное национально-воспитательное пространство, где много историко-религиозных и историко-культурных памятников под открытым небом. Ее территория является немалым открытым музеем для учащихся.

В Шуше расположено одиннадцать историко-культурных памятников Азербайджана. Каждый памятник по отдельности содержит в себе дорогие национально-исторические и культурные ценности азербайджанского народа. (схема 1).

***Схема 1***. *Исторические памятники Шуши. Среди одиннадцать историко-культурных памятников два является религиозными, два – историческими, восемь – культурными. Каждый памятник по отдельности содержит в себе богатые национально-исторические и культурные ценности азербайджанского народа.*




Вопрос национально-нравственного воспитания учащихся посредством исторических памятников Шуши делается актуальным. Данный вопрос определяется возросшими требованиями к самосовершенствованию, саморазвитию достойной личности школьников, их национально-нравственной культуры. В соответствии целесообразно теоретическое рассмотрение сущности основных понятий по отношению к историческим памятникам Шуши, их педагогические интерпретации в национально-духовно-нравственном воспитании учащихся, как предмет научно-педагогического анализа и различные подходы к этому вопросу в этом направлении.

Итак, исторические памятники Шуши в научном понимании – это триединый процесс: 1) познания исторических памятников Шуши; 2) преобразования исторических памятников Шуши в национально-духовно-нравственные и материальные ценности; 3) хранения, использования и передачи ценностей исторических памятников Шуши.

Обобщая пояснения триединого процесса, следует, что исторические памятники Шуши выступают стандартным интегрирующим фактором слагаемых менталитета Азербайджана. Менталитет проявляется в стереотипах поведения людей и мировоззренчес-

ких установках. Стереотипы в контексте патриотизма включают в себя:

– стереотипы внутреннего патриотического облика, то есть весь комплекс идеалов служения Отечеству, которыми руководствуется человек;

– стереотипы патриотического поведения, приписывающим возможность, а часто даже необходимость, поступать по-разному в одних и тех же ситуациях;

– стереотипы в сфере личных, коллективных и общественных отношений существуют как стерео типизированные представления о феномене Отечества.

Вышеуказанные стереотипы по отношению к понятию «исторические памятники Шуши» дают учителю педагогическую установку в воспитательной работе с учащимися, ориентированную на процесс развития и саморазвития национально-высоконравственной личности учащихся, формирования у обучающихся чувства патриотизма и гражданственности, уважения к историческим памятникам в память к древней истории родного края.

Итак, понятие «исторические памятники Шуши» в сфере национально-духовно-нравственного воспитания учащихся представляют идеологические основы азербайджанства, которые значимы и важны в этой сфере, занимают особую роль в ее плодотворной действенности, является необходимыми условиями в этом направлении (схем 2, таблица 1).

***Схема 2**. Важнейшие теоретические основы понятия «исторические памятники Шуши». В сфере национально-духовного воспитания учащихся эти понятия представляют базовые ценности азербайджанства.*




***Таблица 1.** Интерпретация понятий к историческим памятникам Шуши в национально-нравственном воспитании учащихся. Каждое понятие как идеологическая основа национально-нравственного воспитания поясняется с педагогической позиции по отношению к данной теме.*

| **Интерпретация понятий к историческим памятникам Шуши** | |
|---|---|
| **Понятие** *«Историческое и культурное наследие памятников Шуши»* | Историческое и культурное наследие Шуши как духовное-нравственное богатство нации, сформировавшаяся на протяжении столетий, является национальным достоянием Азербайджана.<br>Наследие исторических памятников Шуши формируют менталитет Азербайджана, утверждают преемственность национально-нравственных ценностей, сохраняют вековые традиции азербайджанского народа.<br>Историко-культурное наследие Шуши – это национальные ценности, созданные в прошлом и имеющие великое значение для сохранения и развития современного азербайджанского общества.<br>Историко-культурное наследие Шуши – это материальные и духовно-нравственные ценности, созданные в прошлом и имеющие значение для |

bala qədər olarsa intellektlə kreativlik eyni faktoru təşkil edirlər, sınananın göstəricisi 120 baldan yüksək olarsa, kreativlik intellektdən asılı olmayan faktora çevrilir (2, s. 8).

Ümumtəhsil ocaqlarında tətbiq edilən təlim metodlarının böyük əksəriyyəti orta səviyyəli şagirdlər üçün nəzərdə tutulmuşdur. K. Foqler təklif etmişdir ki, təlim metodlarının istedadlı uşaqların təlim prosesinə tətbiqi zamanı bəzi ümumi prinsiplər nəzərə alınsın. Müstəqil öyrənmə; özünənəzarət imkanları; sual və məsələlərin sərbəst qoyuluşu; diskussiyalar; müxtəlif, əks istiqamətli yanaşmalar; digər şagirdlərdən öyrənməyə istiqamətlənmək; fərdilik; dialoqlara istiqamətlənmə və iştirak; əlavə materiallardan istifadənin təqdir edilməsi və s. bu prinsiplər arasında təqdirə layiq olanlardandır. Diktə və nəzarət; adiliyə meyl; yalnız bir "düzgün cavab"a can atılması və onunla kifayətlənilməsi; cavablarda yekcinslik; şablonçuluq; şagirdlərin səhv etmələrindən qorxmaq kimi prinsiplər isə dəstəklənməyənlər arasındadır (1, s. 197).

Müasir təhsil konsepsiyaları ənənəvi təlimdən fərqli olaraq şəxsiyyətyönümlü xarakter daşıyır. Bu təlimdə fəal təlim metodlarının dərs zamanı tətbiqi sinif şəraitində uşaqların yaradıcılıq keyfiyyətlərinin inkişafında müstəsna rol oynayır. Əvvəlki ənənəvi təlim metodlarından köklü şəkildə fərqlənən yeni təlim metodları sayca çox olsalar da bir neçə istiqamətdə qruplaşdırılmışdır: beyin həmləsi (əqli hücum), müzakirə, rollu oyunlar, təqdimat, tədqiqat. İnteraktiv metodlara tədrisin elə metodları aid edilir ki, onlar şagirdlərin tədris materialları ilə, eyni zamanda ətraf aləmin reallıqları ilə sərbəst iş prosesini təmsil edirlər. Bu metodların tətbiqi ilə şagirdlərin dərs zamanı fəallığı artır, onların əqli bacarıqlarının formalaşması ilə yanaşı, sinifdə yaradıcı mühit yaranır. Dərslər öz qeyri-standartlığı ilə seçilərkən, şagirdin mövqeyi "əzbərçilik"dən "kəşf edən", "tədqiqatçı" mövqeyinə dəyişir. Ənənəvi təhsildə müəllimin hər dediyini qeydsiz-şərtsiz qəbul edən öyrənənlər yerini bu informasiyalarla qane olmayıb yeniliklər axtaran, əlavə mənbələr istəyən şagirdlərə verir. Burada yalnız şagirdlərin deyil, müəllimin də rolu dəyişdi. Müasir təlimdə müəllim fasilitator mövqeyindən çıxış edərək planlı və istiqamətlənmiş surətdə problemli situasiya yaradaraq şagirdləri bu problemin həllinə yönəldir, tədqiqatçı kimi çıxış edən şagirdlərə fəal axtarış və kəşflər prosesində yol göstərir. Dərsi bu cür təşkil edə bilən müəllim böyük mütəfəkkir Sokrat kimi sinfin bir kənarında sakitcə dayanaraq şagirdlərinin birlikdə "beyin fırtınası" edərək diskussiya aparmalarını, yeni ideyalar irəli sürməsini qürurla müşahidə edə bilər.

İnteraktiv təlimdə təfəkkürlə yanaşı təxəyyülün də inkişafı ön plandadır. Müasir təlimdə müəllim interaktiv təlim metodlarından düzgün istifadə edərək yeni dərs haqqında geniş məlumat vermədən, sadəcə həmin mövzu haqqında bir neçə açar söz və yeni ideyalar irəli sürdükdən sonra şagirdlər bir-biri ilə əməkdaşlıq edərək, yeni bilikləri müstəqil olaraq "kəşf edə" bilir, onlarda fikri əməliyyatlar formalaşaraq inkişaf edir.

Bəzən belə hesab edilir ki, öz fənnini kamil bilən hər bir müəllim istedadlı uşaqların təlimi ilə məşğul ola bilər. İstedadlı uşaqların bir çox özünəməxsus xüsusiyyətləri və problemləri olur ki, onların təlimi ilə məşğul olan müəllimlər bunlardan xəbərdar olmalı, təlim prosesi zamanı yaşana biləcək gərginlik, stress, laqeydlik, anlaşılmazlıq və s. kimi qeyri-standart halların tənzimlənməsi bacarığına malik olmalıdır. Bunun üçün yalnız yaxşı pedaqoq və ya psixoloq olmaq kifayət etməyə bilir. İstedadlı uşaqların təlimi ilə məşğul olan öyrədənlərin şəxsi keyfiyyətlərinə də müəyyən ciddi tələblər qoyulur.

İstedadlı uşaqlarla işləyən müəllimin şəxsiyyət və peşəkarlıq mövqeyi daha çox istedadlının fəallaşdırılmasına, inkişaf etdirilməsinə yönəlməlidir. ABŞ-ın "Astor" proqramında istedadlı uşaqlarla işləyən müəllim üçün xeyirxahlıq, həssaslıq, istedadlı uşaq psixologiyasına xüsusi bələd olmaq, onların tələbatını, maraqlarını duymaq bacarığı, yüksək intellektual səviyyə, geniş maraq və bacarıq dairəsi, pedaqoji sahədən əlavə bir sahədə də təhsilli olmaq, canlı və fəal təbiətli olmaq, çevik təfəkkür, bərqərar olmuş baxışları nəzərdən keçirməyə, daim özünü kamilləşdirməyə hazır olmaq, yaradıcı, qeyri-ənənəvi görüşlərə malik olmaq və s. kimi bir sıra keyfiyyətlərin olmasının zəruriliyi qeyd edilmişdir (1, s. 209).

Cəmiyyətimizin müasir problemlərinin həll yolları istedadlı uşaqlarda gizlənir. Bu səbəbdən də, onların vaxtında aşkarlanaraq dəstəklənməsi, inkişaflarının təmin edilməsi təlimin

prioritet vəzifələrindəndir. Cəmiyyətimizə yalnız bilikli, savadlı deyil, yaradıcı keyfiyyətlərə malik, professional mütəxəssis, həm də "hərtərəfli" insan kimi yetişmiş vətəndaşlar lazımdır. İstedadlı uşaqlar problemi ilə məşğul olan bir sıra dünya alimlərinin ciddi şəkildə qeyd etdiyi bir məsələni Ə. Bayramov və Ə. Əlizadə öz əsərlərində lakonik şəkildə belə ifadə etmişlər: "İstedadlıların taleyini istedadsızların ixtiyarına buraxmaq olmaz!" (1, s. 39).

**Problemin aktuallığı.** Dövrümüzdə istedad və yaradıcılıq potensialının strateji ehtiyat kimi cəmiyyətin inkişafında oynadığı mühüm rol, dövlət qurumlarının və təhsil müəssisələrinin istedadlılara xüsusi qayğı məsələsi aktualdır.

**Problemin yeniliyi.** Şəxsiyyətyönlü təlimdə "parlayan" istedadların "sönmədən" "gənc tədqiqatçılar"a çevrilməsi yolları və onlara ən böyük dəstəyin mənbəyi olan müəllimə verilən tələblər.

**Problemin praktik əhəmiyyəti.** Məqalə doktorantlar, gənc müəllimlər və tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. İstedadlı uşaqlarla təlimin təşkili və məzmunu. -Bakı: Şahin-MB, -2016. -222 s.
2. Bəylərov E.B., Quliyeva R.E., Bəylərova-Ələkbərova B.E. İstedadlı uşaqların inkişaf məsələləri. -Bakı: Vahid –M, -2018. -414 s.
3. Mehrabov, A.O. Şagirdin intellektinin inkişafı / A.O. Mehrabov, E.B. Bəylərov -Bakı: Adiloğlu, -2006. - 208 s.
4. Bəylərov E.B. Uşaqlarda istedadın müəyyənləşdirilməsi və inkişaf etdirilməsi. İstedadın işçi konsepsiyası.- Bakı : Təhsil, -2008. -224 s.
5. Бурменской Г.В. Слуцкого В.М. Сушество проблемы // Одаренные дети / Общ.ред -М., 1991, -с.149-168
6. Богоявленская Д.Б. Психология творческих способностей. -М., 2002, -258 с.
7. Bəylərov E.B. İstedadlı uşaqlar probleminə şəxsiyyətin, cəmiyyətin və dövlətin maraqları baxımından yanaşılmalıdır. "Azərbaycan müəllimi" qəz., -06 fevral 2016-cı il.
8. Əlizadə H.Ə. Dərsin müasirliyinin psixopedaqoji sirləri "Azərbaycan müəllimi" qəz., -28 fevral 2020-ci il
9. Qasımova, L.N. Pedaqogika: Dərslik. / L.N. Qasımova, R.M. Mahmudova. -Bakı, -2019.
10. "Xüsusi istedada malik olan uşaqların (gənclərin ) yaradıcılıq potensialının inkişafı üzrə Dövlət Proqramının (2006 -2010-cu illər)" təsdiq edilməsi haqqında (e-qanun.az)
11. İstedadlı şagirdlərlə işin təşkili (muallim.edu.az)

**E-mail:** rzayevav@list.ru
**Rəyçi:** *prof.* **H.Ə. Əlizadə**
**Redaksiyaya daxil olub:** 08.12.2022.

*UOT 37.0*

***Günel Azad qızı Nağıyeva***
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*Bakı Dövlət Universiteti*
https://orcid.org/0000-0003-2251-0821

# NEQATİV DEMOQRAFİK AMİLLƏRİN TƏLİM-TƏRBİYƏ PROSESİNƏ TƏSİRİNİN PEDAQOJİ-PSİXOLOJİ ƏDƏBİYYATDA QOYULUŞU

***Гюнель Азад гызы Нагиева***
*диссертант по программе доктора философии*
*Бакинский Государственный Университет*

# ПОСТАНОВКА В ПЕДАГОГИКО-ПСИХОЛОГИЧЕСКОЙ ЛИТЕРАТУРЕ ПРОБЛЕМЫ ВЛИЯНИЯ НЕГАТИВНЫХ ДЕМОГРАФИЧЕСКИХ ФАКТОРОВ НА УЧЕБНО-ВОСПИТАТЕЛЬНЫЙ ПРОЦЕСС

***Gunel Azad Naghiyeva***
*doctorial student in the program of doctor of philosophy*
*Baku State University*

# THE IMPACT OF NEGATIVE DEMOGRAPHIC FACTORS ON THE EDUCATIONAL PROCESS IN THE PEDAGOGICAL PSYCHOLOGICAL LITERATURE

**Xülasə.** Məqalədə neqativ demoqrafik amillərin təlim-tərbiyə prosesinə eləcə də, ailədaxili münasibətlərə təsiri məsələsinə diqqət göstərilmişdir. Eləcə də neqativ demoqrafik təsirlərə məruz qalmış şagirdlərin inkişafına ailədaxili münasibətlərin təsiri barəsində nəticələr verilir.
***Açar sözlər:*** *demoqrafik amillər, şagird, ailə, məktəb*

**Резюме.** В статье акцентируется внимание на влиянии негативных демографических факторов на учебно-воспитательный процесс, а также на внутрисемейные отношения. Также были показаны результаты о влиянии внутрисемейных отношений на развитие учащихся, подвергавшихся негативным демографическим воздействиям.
***Ключевые слова:*** *демографические факторы, ученик, семья, школа*

**Summary.** The article focuses on the impactof negative demographic factors on the educational process, as well as on family relations. Also, results were shown about the influence of family relationships on the development of students who were exposedto negative demographic influences.
***Key words:*** *demographic factors, student, family, school*

XX əsrin əvvəllərindən başlayaraq, demoqrafik proseslər öz intensivliyini artıraraq, dünyanın həll etməli olduğu qlobal problemlərdən birinə çevrilmişdir. Həmin proseslər insanların həyat fəaliyyətinin müxtəlif sahələrində olduğu kimi, təlim-tərbiyə prosesinə də daxil ola bilmiş, öz neqativ təsirini göstərə bilmişdi. Aparılan tədqiqatlar göstərir ki, bu təsirlər birbaşa xarakter daşımır. Demoqrafik amillər, ilk növbədə, ailədaxili münasibətlərə təsir göstərir. Ailə münasibətlərində yaranan gərginliklərin içərisində yaşayan şagirdin, başqa sözlə desək, neqativ demoqrafik təsirlərə məruz qalmış, mənəvi-psixoloji dəstəyə, diqqət və qayğıya ehtiyac duyan şagirdin məktəb həyatını təsəvvür etmək çətin deyil. Gərginlik içərisində məktəbə gələn şagirdin müəllim və şagirdlərlə münasibətləri görəsən necə olur? Bu sual şagirdin inkişafına qayğı ilə yanaşan hər bir müəllimi, hər bir alimi həmişə düşündürmüşdü. Tarixin müxtəlif dövrlərində problemə şifahi

xalq yaradıcılığında, elmi və bədii əsərlərdə, dissertasiya işləri, monoqrafiyalar, məqalələr, dərslik, dərs vəsaitlərində fərqli aspektlərdə yanaşmalara rast gəlirik.

Şərqin böyük mütəfəkkiri Nəsirəddin Tusinin dəyərli "Əxlaqi-Nasiri" adlı əsəri müəllim-şagird münasibətlərinin tənzimlənməsində tərbiyə metodlarının önəminə yer verilir. Burada, həmçinin şagirdlərin fəaliyyətinin tənzimlənməsi və stimullaşdırılması baxımından rəğbətləndirmə metodunun səmərəli nəticə verməsi qeyd olunmuşdur. "Cəza metodunu seçərkən burada, uşağa verilən cəzanı aydın şəkildə dərk etdirmək, mahiyyətini antalmaq mütləqdir. "Müəllim cəzadan ilk dəfə istifadə edərkən diqqət etməlidir ki, o az, lakin bərk olsun ki, uşağın bir də həmin səhvi etməyə cəsarəti çatmasın. Xüsusi səbəb olmadıqda uşaqları danlamamalı, günahları olduqda isə təhrik etməli, yaxşı iş gördükdə, kömək göstərdikdə tərifləməli, mükafat verilməlidir ki, insanlara yardım etmək onun qanına işləsin, adətə keçsin (7, s. 171). Nəsirəddin Tusi Əxlaqi-Nasiri əsərində övlad tərbiyəsindən bəhs edərkən qeyd edir: "Tərbiyənin ikinci şərti odur ki, uşağı onun təbiətini korlaya biləcək adamlarla, şeylərlə oturub-durmağa, oynamağa qoymayasan, çünki uşaq nəfsi sadə olar, ətrafındakıların xasiyyətini tez götürər. Uşağı mehribanlıq və məhəbbətlə tərbiyə etmək lazımdır, xüsusi ilə ağıla, şüura, idraka təsir edən başa salmaq yolu ilə" (7, s. 168). Dahi alimin əsərində təlim-tərbiyə məsələlərinin analizi dəyərləndirilməsi baxımından qədim dövr mütəfəkkir, alim və filosoflarının fikirləri ilə bağlı çoxsaylı nümunələrə də yer verilmişdir. "Həkim Sokratdan soruşur: "Sən nə üçün çox vaxt yeniyetmələrlə həmsöhbət olursan?" Dedi: "Ona görə ki,, nazik və tər budaqları düzəltmək asandır, təravəti getmiş, qabığı qurumuş, üzü bərkimiş ağacı düzəltmək isə mümkün deyildir" (7, s. 173).

V.A. Suxomlinski "Ürəyimi uşaqlara verirəm" adlı kitabında yazır: "Tərbiyə hər şeydən əvvəl müəllimin və uşağın daimi mənəvi ünsiyyəti deməkdir... Yalnız özünün uşaq olduğunu heç vaxt unutmayan adam həqiqi müəllim ola bilər. Bir çox müəllimlərin bədbəxtliyi ondadır ki, onlar şagirdin, hər şeydən əvvəl, idrak, yaradıcılıq, insani qarşılıqlı münasibətlər aləminə qədəm qoyan canlı insan olduğunu unudurlar. Tərbiyə hər şeydən əvvəl insanşünaslıqdır. Tərbiyədə insana təcrid edilmiş şəkildə təsir göstərən pərakəndə şeylər yoxdur". O göstərirdi ki, uşaq ailənin güzgüsüdür. Uşağın bütün xüsusiyyətləri ailənin fəaliyyətinin nəticəsidir. V.A. Suxomlinski uşaqların inkişafı və formalaşması prosesinə ailələrin demoqrafik göstəricilərinin təsirini də ön plana çəkib qeyd edirdi: "Uşaqları yaxşı tanımaq üçün onun ailəsini – atasını, anasını, qardaşlarını, bacılarını, babalarını, nənələrini tanımaq lazımdır. "Fərəh məktəbi" açılana bir neçə həftə qalmış, mən hər bir ailə ilə tanış oldum, məni ən çox narahat edən ayrı-ayrı ailələrdə valideynlərlə uşaqları, ata ilə ana arasında dostluğun, hörmətin olmaması idi. Bunsuz isə uşağın xoşbəxt həyatı ola bilməz (6, s. 6-8; s. 17-21).

A. S. Makarenko "Valideynlər üçün kitab" adlı əsərində ailə tərbiyəsinin bir sıra məqamlarına toxunur: "Ailə tərbiyəsinin müvəffəqiyyətində valideynlərin vətəndaşlıq borclarını fəal surətdə, daimi, şüurlu yerinə yetirmələri həlledici əhəmiyyətə malikdir. Hansı ailələrdə ki, valideynlər bu borcu dərindən dərk edirlər, o ailələrdə heç bir müvəffəqiyyətsizlik baş verə bilməz". Makarenko övlad tərbiyəsində qayğı və sevginin roluna diqqət çəkir, məhəbbət göstərilmədən böyüdülən uşaqların ailələrini sərt tənqid edərək qeyd edirdi: "əgər siz övlad həyata gətirib, ona valideyn məhəbbəti göstərmədən ötüşmək istəyirsinizsə, onda zəhmət çəkin, cəmiyyəti xəbərdar eləyin ki, belə bir murdar iş tutmaq arzusundasınız. Valideyn məhəbbəti görmədən tərbiyə olunmuş adamlar əksərən şikəst olurlar (5, s. 16, 29).

Demoqrafik amillərin təlim-tərbiyə mövzusuna, eləcə də ailədaxili münasibətlərə təsiri, yaranan gərginliklərin içərisində yaşayan şagirdin həyatı, fəaliyyəti və formalaşması ilə bağlı növbəti dövrlərdə pedaqoq alimlərin diqqətini çəkmiş, tədqiqat işləri səviyyəsində qabardılmışdır. Dəyərli müəlliflərin əsərlərində mövzu ilə bağlı bir sıra məqamlar əks olunmuş bölmələrinə nəzər saldıqda, müəlliflərin, əsasən, ailə münasibətləri, övlad tərbiyəsi, müəllimin pedaqoji ustalığı, ailə və məktəbin birgə işi ilə bağlı ümumi xarakter daşıyan fikirlərə rast gəlirik.

Professor Müseyib İlyasov "Müəllim peşəkarlığı və pedaqoji səriştəliliyin müasir problemləri" adlı monoqrafiyası müəllimin pedaqoji səriştəliliyi və peşə mədəniyyətinin formalaşdırılması ilə bağlı dəyərli fikirlərlə zəngindir.

Monoqrafiya müəllimin peşə səriştəliliyinin şagird şəxsiyyətinin formalaşmasına təsiri məsələləri öz əksini tapmışdır. Əsərdə qeyd olunur ki, müəllim şagirdlərin imkan və bacarıqlarını düzgün qiymətləndirməli, onların şəxsiyyətinə hörmətlə yanaşmalı, inanmalı, imkanlarının reallaşdırılmasına şərait yaratmalıdır. Eyni zamanda, monoqrafiya gələcək müəllimlərin hazırlığı üçün müstəsna əhəmiyyətə malikdir.

Prof. M.Ə. Muradxanovun "A.S. Makarenko uşaqların ailə tərbiyəsi haqqında" əsərində uşaqların tərbiyəsində məktəb və ailənin rolunu xüsusi vurulamışdır. Burada uşaqların məktəbə başlamazdan əvvəl ailədə gördüyü tərbiyəyə diqqət yetirilərək deyilir ki, 7 yaşına qədər ailənin verdiyi tərbiyə məktəbin və müəllimin işini asanlaşdıra da bilər, ləngidə də bilər.

Prof. H.Ə. Əlizadə "Tərbiyənin demoqrafik problemləri" adlı tədqiqat işində demoqrafik proseslərin neqativ təsirləri dərindən araşdırılmışdır. Burada ölüm və boşanma səbəbindən yaranan çətinliklərin tərbiyə prosesinə təsirinə diqqət yetirilmişdir. Prof. H.Ə. Əlizadənin tədqiqatından aydın olur ki, demoqrafik proseslərin uşaqların şəxsiyyət kimi formalaşmasına göstərdiyi bir sıra təsirləri tədqiqata cəlb olunsa da, boşanma, ölüm, təkrar nikah və s. halların təsiri hələ də sistemli şəkildə araşdırılmamışdır. Problemlə bağlı aparılan tədqiqatlarda demoqrafik amillərin neqativ təsirlərinin aradan qaldırılması üçün aparılan işin formaları araşdırılmış, problemin həlli üçün müvafiq yollar təklif edilmişdir.

1986 və 1989-cu illərdə professor Əbdül Əlizadə və professor Akif Abbasovun yazmış olduqları "Ailə" dərsliyi diqqət etdiyimiz dəyərli əsərlərdəndir. Dərslik əsasən ailə-nikah məsələləri, ailədaxili münasibətlər, ailədə övladların tərbiyəsi və yetişdirilməsi ilə bağlı məqamları özündə əks etdirir. Eyni zamanda, burada müəllim-şagird, valideyn-müəllim, məktəb-ailə əlaqələri, onların birgə işi məsələsinə toxunulmuşdur. Lakin dərslikdə birgə işin aparılması zamanı baş vermiş ziddiyyətlərin yaranma səbəbləri müəyyənləşdirilib ona təsir göstərən amillər haqqında qeydlər verilməmişdir.

Prof. L.N. Qasımova və dos. R.M. Mahmudovanın "Pedaqogika" dərsliyinin bölmələrinə nəzər saldıqda mövzu ilə bağlı dəyərli faktlara rast gəlmişik. Dərsliyin "Pedaqoji fəaliyyətin xüsusiyyətləri" adlı bölməsində müəllimin pedaqoji fəaliyyəti, müəllimlik işinə verilən tələblər, eyni zamanda, onun bacarıq və vərdişlərindən danışılır. Müəlliflər dərslikdə müəllimin ünsiyyət modellərinin, rəhbərlik üslublarının, ayrı-ayrı qruplaşdırıb sistemli şərh etmişlər. Dərsliyin "Tərbiyənin metodları" adlı bölməsində tərbiyə üsullarının geniş izahına rast gəlirik. Müəlliflər əsərdə tərbiyə metodlarının sistemini, səciyyəsini vermiş, metodları ayrı-ayrı sistemləşdirmiş, şərhini vermişlər. Dərslikdə "Ailə tərbiyəsinin nəzəri əsasları və texnologiyası" adlı bölməsində, ailədə övlad tərbiyəsi, ailə tərbiyəsinin prinsipləri, eyni zamanda, şagirdlərin tərbiyəsində ailə, məktəb, ictimaiyyətin birgə işi ilə bağlı məqamlara aydınlıq gətirilmişdir (4, s. 212).

Prof. A.N. Abbasovun "Ailə pedaqogikası" dərsliyində ailə və məişət məsələləri, ailə münasibətləri məsələlərinə geniş yer verilmişdir. Əsərdə ailə tərbiyəsinin prinsipləri, metodları açılmış, ailənin tipləri, funksiyaları, xüsusiyyətləri problemlərinə toxunulmuşdur. Dərslik ailədə qarışıqlı münasibətlərin, uşaqların tərbiyəsinin düzgün qurulması, valideynlərin üzərinə düşən öhdəliklər və onların yerinə yetirilməsi ilə bağlı müstəsna əhəmiyyətə malik fikirlərlə əhatə olunmuşdur.

Prof. Ə.Ə. Ağayevin "Seçilmiş əsərlər"inin IV cildində şagirdlərə davranış normalarının aşılanması ilə bağlı dəyərli fikirlər yer alır. Professor əsərdə gənc nəslin formalaşdırılması üçün məktəb və ailənin birgə işinin qurulmasının vacibliyi qeyd edir. Tərbiyə məsələlərində səmərəli nəticəyə nail olmaq üçün valideynlərə ən zəruri pedaqoji biliklərin verilməsinin vacib hesab edən müəllif, gənc analar üçün xalq universitetlərinin yaradılması fikrini irəli sürmüşdü.

Prof. H.Ə. Əlizadə və dos. R.M. Mahmudovanın "Sosial pedaqogika" dərsliyinin bütün fəsillərində demoqrafik problemlərin təlim prosesinə təsiri ilə bağlı bir sıra məqamlara toxunulmuşdur. Müəllim-şagird ünsiyyətindən bəhs edən X fəsildə əsas diqqət müəllimin üslubu məsələsinə yönəldilmişdir. Burada müəllimin avtoritar, liberal demokratik üslubları ayırd edilmişdir. Demokratik üslubun müəllim-şagird münasibətlərində optimal nəticə verməsi qeyd olunmuşdur. "Demokratik müəllimlər demoqrafik amillərin təsiri ilə ailədə yaranmış sosial inkişaf şəraitinin xüsusiyyətlərini öyrənir. Təlim-tərbiyə prosesində onların pedaqoji nəticələrini

müxtəlif yollarla nəzərə alırlar. Təcrübəli müəllimlər valideynlərə səmərəli pedaqoji məsləhətlər verir, şagirdlərlə fərdi söhbətlər keçirir, onları şagird özünüidarə orqanlarına cəlb edir, sosial fəallıqlarını artırır. Müəllim-şagird münasibətlərinin humanstləşdirilməsini qabaqcıl müəllimlər tərbiyə işinin başlıca vasitəsi sayırlar" (2, s. 233).

"Avtoritar müəllimlərin (5%) təlim tərbiyə prosesində şagirdlərin ailəsində baş verən demoqrafik proseslər haqqında məlumat toplaya bilir və hətta öz pedaqoji təcrübələrində şagirdlərin davranış və rəftarlarında əmələ gələn dəyişikliklərin neqativ-demoqrafik təsirlərlə bağlı olduğunu başa düşürlər, lakin bu dəyişiklikləri pedaqoji yönümdə mənalandıranda həmin hadisələrə avtoritar münasibət nəticəsində pedaqoji məharət baxımından ciddi səhvlərə yol verirlər (2, s. 232). Göründüyü kimi, avtoritar üslubu seçən müəllimlər həm təlim, həm də tərbiyə prosesində neqativ hallara yol verilməsinə gətirib çıxarır. Lakin demokratik üslubu seçib, humanist münasibətdə olan müəllimlər təlim-tərbiyə prosesində səmərəli nəticə əldə edir, eyni zamanda, ailə-məktəb münasibətlərinin düzgün qurulmasına nail ola bilirlər.

Tədqiq etdiyimiz problemlə bağlı prof. H. Əlizadə, prof. Q. Abbasova, dos. R. Mahmudovanın "Təhsilin sosial-pedaqoji məsələləri" tədris vəsaitində dəyərli fikirlərə rast gəlmək olar. Vəsaitin IV fəslində sosial tərbiyə, çətin uşaqlarla iş, ailə həyatına hazırlıq ilə bağlı məsələlərə toxunulmuşdur. Eyni zamanda, əsərin bu hissəsində ailə tərbiyəsi, tərbiyə işində məktəbin rolu məsələlərinə aydınlıq gətirilmişdir. Əsərin problem baxımından önəmini artıran məqamı ondan ibarətdir ki, burada tam və natamam ailələrin şərhi və həmçinin təlim-tərbiyə prosesində neqativ demoqrafik təsirlər problemi ilə bağlı dəyərli izahlar verilmişdir. Müəlliflər təlim prosesində neqativ demoqrafik təsirlərin aradan qaldırılması üçün dolayı təsir priyomlarından istifadənin effektivliyini qeyd edirlər. Lakin müəllimlər arasında bu üsula diqqətin lazımınca olmaması və ya istifadəsində çətinlik çəkdikləri səbəbindən təlim-tərbiyə prosesində neqativ demoqrafik təsirlərin azaldılmasına nail ola bilmədikləri vurğulanır.

Prof. Q. Əzimovun "Psixi inkişaf və tərbiyənin müasir problemləri" adlı 5 fəsildən ibarət tədris vəsaitində uşaqların fərqli yaş dövrləri üçün xarakterik olan psixoloji xüsusiyyətlərini ətraflı şərh etmişdir. Müəllif hər yaş dövrünün xüsusiyyətlərinin izahını verərkən övlad-valideyn, şagird-müəllim münasibətləri haqqında da maraqlı fikirlər söyləmişdir. Belə ki, müəllif ünsiyyətə tələbatı artan yuxarı sinif şagirdlərinin müəllimlərlə əlaqə yaramağa marağının çoxalmasının onlar tərəfindən həvəslə qarşılanmadığını qeyd edir: "Böyük məktəblilər müəllimin pedaqoji ustalığına xüsusi əhəmiyyət verirlər. Öz fənnini yaxşı bilən, şagirdləri öyrədən müəllimlərə xüsusi münasibət bəsləyirlər. Lakin müəllimlərin bir çoxu şagirdlərlə ünsiyyətə əhəmiyyət vermirlər. Müəllimlərin çoxu şagirdlərin yaxşı oxumasına çalışsalar da, onların fərdi xüsusiyyətlərini çox vaxt görmür, bu mühüm məsələyə psixoloq gözü ilə baxa bilmirlər. Müəllif yeniyetmə şagirdlərdə baş verən çətin və mürəkkəb məqamlara mahiyyət və məzmun baxımından münasibət bildirmiş, bu yaş dövrünün ziddiyyətli xüsusiyyətlərinin müəllim-şagird münasibətlərinin gərginləşməsi üçün zəmin rolunu oynaya biləcəyini vurğulamışdır.

Tədqiqat işimizlə bağlı nəzər yetirdiyimiz əsərlərdə problem baxımından dəyərli araşdırmalar öz əksini tapmışdır. Bu əsərlərdə ailə və ailədaxili münasibətlərin dinamikası, müxtəlif dövrlərə xas olan məktəb və müəllim anlayışı, müəllim-şagird münasibətləri, valideyn-məktəb əlaqəsi ilə bağlı dəyərli faktlar yer tutmuşdur. Lakin qeyd etmək lazımdır ki, aparılan bütün bu araşdırmalara baxmayaraq, demoqrafik amillərin müəllim-şagird münaqişələrinə təsiri prosesi və onun aradan qaldırılması yolları konkret tədqiqat obyekti olmamışdır.

**Problemin aktuallığı.** Neqativ demoqrafik amillərin təlim-tərbiyə prosesinə təsiri mövzusu bütün dövrlərdə aktual sosial pedaqoji problemlərdən biridir. Problemin və onun işlənmə səviyyəsinin araşdırılması vacib məqamlardandır.

**Problemin elmi yeniliyi.** Neqativ demoqrafik amillərin təsirinə məruz qalan şagirdin inkişafı və formalaşması probleminin tarixi və müasir durumu xüsusi ilə qeyd edilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə müəllimlər və valideynlər üçün yenilikçi ideyalara malikdir.

**Ədəbiyyat:**


1. Əlizadə, H.Ə. Tərbiyənin demoqrafik problemləri. / H.Ə. Əlizadə. -Bakı: Maarif, -1993, -201 s.
2. Əlizadə, H.Ə. Sosial Pedaqogika. / H.Ə. Əlizadə, R. M. Mahmudova -Bakı: Bakı nəşriyyatı, 2013, -368 s.
3. Abbasov, A.N. Ailə pedaqogikası: Ali təhsil müəssisələri üçün dərslik / A.N. Abbasov. - Bakı: 2019.
4. Qasımova, L.N. Pedaqogika. / L.N. Qasımova, R.M. Mahmudova. -Bakı: Çaşıoğlu, -2012, 371 s.
5. Makarenko, A. S. "Valideynlər üçün kitab" / A. S. Makarenko. -Bakı, Azərtədrisnəşr, -1964, -410 s.
6. Suxomlinski, V.A. Ürəyimi uşaqlara verirəm / V.A. Suxomlinski. -Bakı: Maarif, 1979, -324 s.
7. Tusi, N.X. Əxlaqi Nasiri. / N.X. Tusi. -Bakı: Elm, -1989, -255 s.


**E-mail:** guneloruj@gmail.com

**Rəyçilər:** *ped.elm.dok., prof.* **L.N. Qasımova,**
*ped.elm.dok., prof.* **H. Ə. Əlizadə**
**Redaksiyaya daxil olub:** 09.12.2022.

***PSİXOLOGİYA, YAŞ FİZİOLOGİYASI VƏ İNKLÜZİV TƏHSİL MƏSƏLƏLƏRİ***
***ВОПРОСЫ ПСИХОЛОГИИ, ВОЗРАСТНОЙ ФИЗИОЛОГИИ И ИНКЛЮЗИВНОГО ОБРАЗОВАНИЯ***
***ISSUES OF PSYCHOLOGY, AGE PHYSIOLOGY AND INCLUSIVE EDUCATION***

*UOT 159.9*

***Sahil Nizam oğlu Cəfərov***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Lənkəran Dövlət Universiteti*

***Rəna Oruc qızı Qurbanova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi*

# İNKLÜZİV TƏHSİL REAL HƏYATIN MƏKTƏBDƏ ƏKS OLUNMASIDIR

***Сахил Низам оглы Джафаров***
*доктор философии по педагогике, доцент*
*Ленкоранский Государственный Университет*

***Рена Орудж гызы Гурбанова***
*преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

# ИНКЛЮЗИВНОЕ ОБРАЗОВАНИЕ – ОТРАЖЕНИЕ РЕАЛЬНОЙ ЖИЗНИ В ШКОЛЕ

***Sahil Nizam Jafarov***
*doctor of philosophy in pedagogy, associate professor*
*Lankaran State University*

***Rena Oruj Gurbanova***
*teacher at Azerbaijan State Pedagogical University*

# INCLUSIVE EDUCATION IS A REFLECTION OF REAL LIFE IN SCHOOL

**Xülasə.** Təqdim olunan məqalə “İnklüziv təhsil nədir?” mövzusundadır. Müəllif burada qeyd edir ki, bu gün təhsil sahəsində dövriyyədə olan anlayışlardan biri də “inklüzyon” terminidir. İnklüzivlik bütün vətəndaşların, ilk növbədə, bütün əlillərin cəmiyyətdə iştirak səviyyəsinin artırılması prosesidir.

Məqalədə vurğulanır ki, inklüziv təhsil müxtəlif növ əlilliyi və öyrənmə ehtiyacı olan şagirdlərin əlil olmayan və adətən inkişaf edən şagirdlərlə siniflərdə oxuduğu məktəbə yanaşmadır.

Məqalədə bütün uşaqlar kimi sağlamlıq imkanları məhdud uşaqların da öz gələcəkləri ilə bağlı ambisiyaları və arzuları olmasından bəhs edilir.

Müəllif tələbələrin istisnalara səbəb ola biləcək maneələri azaltmaq və aradan qaldırmaq üçün ümumi öyrənmə mühitində iştirak etməklə təhsil proqramında dəstəklənməsini tövsiyə edir.

***Açar sözlər:*** *inklüziv təhsil, inklüziya, əlil şagird, yanaşma, keyfiyyətli təhsil, ambisiya, effektiv üsul*

**Резюме.** Представленная статья посвящена теме «Что такое инклюзивное образование»? Автор отмечает, что одним из понятий, циркулирующих сегодня в сфере образования, является термин «инклюзия». Инклюзия – это процесс повышения уровня участия в жизни общества всех граждан, в первую очередь, людей с инвалидностью.

В статье подчеркивается, что инклюзивное образование – это подход к школьному обучению, при котором учащиеся с различными видами инвалидности и учебными потребностями учатся в классах с обычными и нормально развивающимися учащимися.

В статье также говорится о том, что, как и у всех детей, у детей с ограниченными возможностями есть амбиции и мечты относительно своего будущего.

Автор рекомендует поддерживать студентов в образовательной программе, участвуя в общей учебной среде, чтобы уменьшить и преодолеть барьеры, которые могут привести к исключению.

***Ключевые слова:*** *инклюзивное образование, инклюзия, учащийся-инвалид, подход, качественное образование, амбициозность, эффективный метод*

**Summary.** The presented article is about "What is inclusive education?" The author notes here that one of the concepts circulating in the field of education today is the term "inclusion". Inclusion is the process of increasing the level of participation in society of all citizens, first of all, all people with disabilities.

The article emphasizes that inclusive education is an approach to schooling where students with different types of disabilities and learning needs study in classes with non-disabled and typically developing students.

The article also discusses that, like all children, children with disabilities have ambitions and dreams for their future.

The author recommends that students be supported in the educational program by participating in a common learning environment to reduce and overcome barriers that may lead to exclusion

***Key words:*** *inclusive education, inclusion, disabled student, approach, quality education, ambition, effective method*

Bu gün təhsil sahəsində dövriyyədə olan anlayışlardan biri “inklüziya” terminidir. İnklüziya (inclusion – daxiletmə) – bütün vətəndaşların, ilk növbədə, əlilliyi olan bütün insanların cəmiyyətdə iştirak səviyyəsinin artırılması prosesidir. İnklüziv təhsil isə ümumi təhsilin elə bir inkişaf mərhələsidir ki, burada hamının, ilk növbədə, sağlamlıq imkanları məhdud şəxslərin təhsilə ehtiyacı təmin edilir [ 4; 1].

İnklüziv təhsil müxtəlif növ əlilliyi və öyrənmə ehtiyacı olan şagirdlərin əlil olmayan və adətən inkişaf edən şagirdlərin olduğu siniflərdə təhsil aldığı məktəbə yanaşmadır.

İnklüziv tənzimləmədə əlavə ehtiyacı olan tələbələr dəstək və xidmətlər vaxtlarının çoxunu ayrı-ayrı sinif otaqlarında və ya məktəblərdə deyil, əlil olmayan həmyaşıdları ilə keçirirlər. Bu məqalə inklüziv təhsilin müəyyən edilməsi yollarının qısa nəzərdən keçirilməsi və demokratik cəmiyyətlərdə vətəndaş hüquqları uğrunda daha geniş hərəkatlarda inklüzivliyin köklərinin tədqiqi ilə başlayır.

Bunun ardınca inklüziv sinfin idarə edilməsi ilə bağlı problemlərin müzakirəsi və “inklüzivlik mədəniyyəti”nin yaradılması vasitəsilə müəllimlərə bu problemləri həll etməyə kömək edə biləcək bir neçə strategiya müzakirə edilir [1; 1].

*Hər bir uşağın keyfiyyətli təhsil və öyrənmə hüququ var.*

Dünyada 240 milyon əlil uşaq olduğu təxmin edilir. Bütün uşaqlar kimi, əlilliyi olan uşaqların da öz gələcəkləri ilə bağlı ambisiyaları və arzuları var. Bütün uşaqlar kimi, onların bacarıqlarını inkişaf etdirmək və bütün potensiallarını reallaşdırmaq üçün keyfiyyətli təhsilə ehtiyacları var.

Bununla belə, əlilliyi olan uşaqlar çox vaxt siyasətin formalaşmasında diqqətdən kənarda qalır, onların təhsil almaq imkanlarını və sosial, iqtisadi və siyasi həyatda iştirak etmək imkanlarını məhdudlaşdırır. Dünya miqyasında bu uşaqlar məktəbdən kənarda qalma ehtimalı yüksək olan uşaqlar arasındadır. Onlar ayrı-seçkilik, stiqma və qərar qəbul edənlərin əlilliyi məktəb xidmətlərinə daxil etməkdə müntəzəm uğursuzluqlarından qaynaqlanan təhsil qarşısında davamlı maneələrlə üzləşirlər. Əlillik bütün dünyada təhsilə ən ciddi maneələrdən biridir.

*Bütün uşaqları məktəbə gətirmək və öyrətmək.*

Bütün uşaqlara məktəbə getmək, inkişaf etmək, lazım olan bacarıqları öyrətmək və inkişaf etdirmək, ədalətli şans vermək üçün ən effektiv üsul inklüziv təhsil üsuludur.

İnklüziv təhsil dedikdə bütün uşaqların eyni siniflərdə, eyni məktəblərdə oxuması nəzərdə tutulur. Bu, ənənəvi olaraq kənarlaşdırılan qruplar üçün real öyrənmə imkanları deməkdir – təkcə əlilliyi olan uşaqlar deyil, azlıqların dillərində danışanlara da aiddir.

Müxtəlif qruplarda hamının xeyrinə yan-yana böyüməsinə imkan vermək üçün inklüziv sistemlər bütün mənşəli tələbələrin sinfə gətirdiyi unikal töhfələri qiymətləndirir və bütün mənşəli tələbələrə hamının faydası üçün yan-yana öyrənməyə və böyüməyə imkan verir.

Ancaq irəliləyiş yavaş-yavaş gəlir. İnklüziv sistemlər cəmiyyətin bütün səviyyələrində dəyişikliklər tələb edir.

Məktəb səviyyəsində müəllimlər hazırlanmalı, binalar təmir edilməli və şagirdlər əlçatan təlim materialları almalıdırlar. İcma səviyyəsində stiqma və ayrı-seçkiliklə mübarizə aparılmalı və fərdlər inklüziv təhsilin faydası barədə maarifləndirilməlidir.

Milli səviyyədə hökumətlər qanunları və siyasətləri Əlilliyi olan Şəxslərin Hüquqları haqqında Konvensiyaya uyğunlaşdırmalı və uşaqların səmərəli xidmətlərlə təmin olunmasını təmin etmək üçün məlumatları müntəzəm toplamalı və təhlil etməlidir [2; 4-5].

*UNICEF-in inklüziv təhsili təşviq etmək işi:*

Əlilliyi olan uşaqlar üçün təhsil boşluğunu aradan qaldırmaq üçün UNICEF inklüziv təhsil sistemlərini inkişaf etdirmək və monitorinq etmək üçün hökumətin səylərini dəstəkləyir. Bizim işimiz dörd əsas sahəyə yönəlib:

• Təbliğat: UNICEF müzakirələrdə, yüksək səviyyəli tədbirlərdə və siyasətçilərə və geniş ictimaiyyətə yönəlmiş digər təbliğat formalarında inklüziv təhsili təşviq edir.

• Maarifləndirmə: UNICEF tədqiqatlar aparmaq və hökumət tərəfdaşları üçün dəyirmi masalar, seminarlar və digər tədbirlər keçirməklə əlilliyi olan uşaqların ehtiyaclarını diqqət mərkəzində saxlayır.

• Potensialın yaradılması: UNICEF müəllimləri, idarəçiləri və icmaları öyrətməklə və Hökumətlərə texniki yardım göstərməklə tərəfdaş ölkələrdə təhsil sistemlərinin potensialını artırır.

• İcra dəstəyi: UNICEF siyasət və praktika arasında icra boşluğunun aradan qaldırılması üçün tərəfdaş ölkələrdə monitorinq və qiymətləndirməyə kömək edir [ 2, s. 6].

*İnklüziv təhsil nədir ?*

Daxil olmanın hamılıqla qəbul edilmiş tərifi və onu həyata keçirmək üçün riayət edilməli olan standartlaşdırılmış prosedurlar toplusu haqqında konsensus yoxdur.

İnklüzivliyi əsas axın adlanan digər qeyri-seqreqasiyaçı yanaşmadan ayırmağın bir yolu inklüziv sinifdə bütün şagirdlərin müxtəlif öyrənmə ehtiyaclarını sinifdən kənarlaşdırmadan qarşılamağa çalışmaq üzərində güclü vurğunun olmasıdır.

Əksinə, xüsusi qayğıya ehtiyacı olan uşaqlara ümumi təhsil verildikdə, bu, adətən (ən azı 2 prinsipdə), fərqlərindən asılı olmayaraq, sinifdəki hər kəsin bir standart kurikuluma əməl etməsini nəzərdə tutur [5, s. 202-208].

İnklüziv təhsil o deməkdir ki, bütün şagirdlər yaşadıqları məktəblərdə yaşa uyğun, müntəzəm dərslərdə iştirak edir və onları qarşılayırlar və məktəb həyatının bütün sahələrində öyrənmək, töhfə vermək və iştirak etmək üçün dəstəklənirlər.

İnklüziv təhsil bütün şagirdlərin birlikdə öyrənməsi və iştirak etməsi üçün məktəblərimizi, sinif otaqlarımızı, proqramlarımızı və fəaliyyətlərimizi necə inkişaf etdirdiyimiz və dizayn etdiyimizlə bağlıdır.

İnklüziv təhsil bütün şagirdlərin müxtəlif ehtiyaclarına cavab verən, qəbuledici, hörmətli və dəstəkləyici şəkildə effektiv şəkildə cavab verməklə onların keyfiyyətli təhsilə çıxışını təmin etməkdən ibarətdir. Şagirdlər təhsil proqramında ümumi öyrənmə mühitində iştirak edərək, istisnalara səbəb ola biləcək maneələri azaltmaq və aradan qaldırmaq üçün dəstək verirlər.

İnklüziv təhsil ümumi təhsil mühitində həyata keçirilir; yəni müxtəlif mənşəli və müxtəlif qabiliyyətlərə malik şagirdlərin inklüziv mühitdə birlikdə öyrəndiyi təhsil mühiti. Ümumi öyrənmə mühitləri şagirdlərin müntəzəm dərs saatlarının əksəriyyəti üçün istifadə olunur və bunlara sinif otaqları, kitabxanalar, idman zalı, tamaşa teatrları, musiqi otaqları, yeməkxanalar, oyun meydançaları və yerli icma daxil ola bilər. Ümumi öyrənmə mühiti əqli qüsurlu və ya digər xüsusi ehtiyacları olan şagirdlərin həmyaşıdlarından təcrid olunmuş şəkildə öyrəndikləri yer deyil [ 1, s. 3].

*Effektiv ümumi öyrənmə mühitləri:*

• Hər bir şagirdin bütün şagirdlər üçün nəzərdə tutulmuş və seçilmiş təhsil mühitində həmyaşıdları ilə paylaşılan öyrənmə mühitində tam iştirakına şərait yaratmaq;

• Müsbət iqlim təmin etmək, aidiyyət hissini təşviq etmək və müvafiq şəxsi, sosial, emosional və akademik məqsədlərə doğru şagird irəliləyişini təmin etmək;

• Kifayət qədər səviyyəli dəstək təmin etməklə və şagird mərkəzli tədris təcrübə və prinsiplərini tətbiq etməklə fərdi öyrənmə ehtiyaclarına cavab verir.

• Ümumi öyrənmə mühiti: inklüziv mühitdir ki, burada təlimat qarışıq qabiliyyətə malik olan şagirdlərə və onların icma məktəbində həmyaşıdları qrupu ilə birlikdə çatdırılmaq üçün nəzərdə tutulmuşdur, eyni zamanda, onların bir şagird kimi fərdi ehtiyaclarına cavab verir və müntəzəm dərs saatları tələbələrin əksəriyyəti üçün istifadə olunur [ 6, s. 239 ].

"İnklüziv təhsil" termini daha çox hissiyyat və ya hərəkətlilik məhdudiyyətləri, əqli qüsurlar, öyrənmə əlilləri, dil pozğunluqları, davranış pozğunluqları və autizm spektri pozğunluqları kimi fiziki və əqli qüsurları olan şəxslərin daxil edilməsi üçün istifadə olunur.

Bəzi pedaqoqlar və nəzəriyyəçilər də daha geniş mənada, cəmiyyətdə və məktəblərdə təcrid olunmuş bütün qrupların çıxışını təmin etmək üçün nəzərdə tutulmuş təhsil sisteminə istinad edərək "inklüzyon"dan istifadə edirlər.

Beləliklə, inklüzyon bəzən bütün məktəb və sinif mühitinin məqsədyönlü və şüurlu şəkildə qurulması kimi nəzərdə tutulur ki, onlar təkcə əlilliyi olan şagirdlər üçün deyil, həm də etnik mənsubiyyətinə, sosial sinfinə, cinsinə, mədəniyyətinə, dininə, immiqrasiya tarixinə və ya digər atributlarına görə təcrid olunma və ya səlahiyyətlərindən məhrum edilmə ilə üzləşə bilənlərə əlçatan olsunlar. İnklüzivlik də daha geniş mənaya malik olduğundan, bəzən sosial ədalətin daha əhatəli formasına nail olmaq vasitəsi kimi təsdiqlənir. [ 2, s. 3-4]

**Problemin aktuallığı.** Məqalədə hər zamana actual olan, hal-hazırda cəmiyyətimizdə baş verən müəyyən səbəblərdən daha da aktuallaşan inkluziv təhsilin mahiyyətinə aydınlıq gətirilmiş, inklüziv sistemlərin yaradılması, inkişafı və əhəmiyyətindən bəhs edilmişdir.

**Problemin elmi yeniliyi.** Müasir dövrdə inklüziv sinfin idarə edilməsi ilə bağlı problemlərin müzakirəsi və "inklüzivlik mədəniyyəti"nin yaradılması vasitəsilə müəllimlərə bu problemləri həll etməyə kömək edə biləcək bir neçə strategiya tətbiq edilir. İnkluziv təhsilin daha səmərəli tətbiqi yeni-yeni araşdırmalar tələb edir. İnklüziv təhsil – müxtəlif növ əlilliyi və öyrənmə ehtiyacı olan şagirdlərin əlil olmayan və adətən inkişaf edən şagirdlərin olduğu siniflərdə təhsili real həyatın aynasıdır.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** Məqalədə şərh olunmuş nəzəri biliklər və praktik təcrübələr inklüziv siniflərdə şagirdlərlə işləyən hər bir müəllim üçün yararlı mənbə ola bilər.

**Ədəbiyyat:**


1. Suzanne R. Kirschner IN: W. George Scarlett (Ed.) Sage Encyclopedia of Classroom Management (Sage, 2015).1.
2. https://www.unicef.org Inclusive education | UNICEF,
3. Convention on the Rights of Persons with Disabilities (CRPD), Convention, May 2022 Status: Ratifications/Accessions: 185, Signatories: 164
4. İnklüziv Siniflərdə Təlimin Təşkili. -Bakı – 2018, -68 səh.
5. Florian, L. (2008). Special or inclusive education: Future trends. British Journal of Special Education, 230 p.
6. Hehir, T. & Katzman, L.I. (2012). Effective inclusive schools: Designing successful schoolwide programs. San Francisco: Jossey-Bass.


**E-mail:** ceferovsahil610@gmail.com,
rena_qurbanova@bk.ru
**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **T.Ə. Vahabova,**
*ped.ü.fəls.dok.* **G.T. Eminova**
**Redaksiyaya daxil olub:** 16.11.2022.

*UOT 159.9*

***Nərminə Şamil qızı Qurbanova***
*Bakı Dövlət Universitetinin müəllimi*

# ETNİK QRUPLARIN SOSİAL-PSİXOLOJİ ADAPTASİYASINA TƏSİR EDƏN AMİLLƏR

***Нармина Шамиль гызы Гурбанова***
*преподаватель*
*Бакинского Государственного Университета*

# ФАКТОРЫ, ВЛИЯЮЩИЕ НА СОЦИАЛЬНО-ПСИХОЛОГИЧЕСКУЮ АДАПТАЦИЮ ЭТНИЧЕСКИХ ГРУПП

***Narmina Shamil Gurbanova***
*teacher at*
*Baku State University*

# FACTORS AFFECTING SOCIAL-PSYCHOLOGICAL ADAPTATION OF ETHNIC GROUPS

**Xülasə.** Əsrlər boyu Azərbaycanda çoxsaylı etnik qruplar məskunlaşmış və bu gün də yaşamaqdadır. Yeni sosial və siyasi şəraitdə Azərbaycanda yaşayan milli-etnik qrupların sosial-psixoloji adaptasiyasının istiqamətlərini öyrənmək və adaptasiya prosesində özünü göstərən problemləri aradan qaldırmaq olduqca aktualdır.

Bu gün inkişaf edən Azərbaycan dünya dövlətləri içərisində özünün tolerantlığına və milli-etnik tərkibinə görə öncül yerlərdən birini tutur. Təsadüfi deyil ki, respublikamızda multikulturalizmə həsr olunmuş bir neçə Forum keçirilmiş və dünya dövlətləri Azərbaycan Respublikasında mövcud olan multikulturalizmi dünyaya nümunə kimi təqdim edirlər. Belə bir şəraitdə milli-etnik qrupların uğurlu sosial-psixoloji adaptasiyasının mexanizmlərinin tədqiqi bir tərəfdən dini, mədəni və milli tolerantlığın artırılmasına, digər tərəfdən isə sosial adaptasiya ilə bağlı yeni elmi faktların ortaya çıxarılmasına zəmin yaradır.

***Açar sözlər:*** *etnik qruplar, sosial-psixoloji adaptasiya, etnik identiklik, etnik stereotip*

**Резюме.** На протяжении веков Азербайджан заселяли многочисленные этнические группы, которые проживают здесь и по сей день. Важно изучить направления социально-психологической адаптации этнических групп, проживающих в Азербайджане в новом социальном и политическом контексте.

Сегодня Азербайджан занимает одно из первых мест по толерантности. Не случайно в нашей стране было проведено несколько форумов, посвященных многонациональности, и наша республика представлена миру как образец мультикультурализма. В этом случае изучение механизмов успешной социально-психологической адаптации национально-этнических групп привело к росту религиозной, культурной и национальной толерантности, с одной стороны, и появлению новых научных фактов о социальной адаптации – с другой.

***Ключевые слова:*** *этнические группы, социально-психологическая адаптация, этническая идентичность, этнический стереотип*

**Summary.** Throughout the centuries, numerous ethnic groups have been settled in Azerbaijan and live today. It is important to study the directions of the socio-psychological adaptation of ethnic and ethnic groups living in Azerbaijan in the new social and political context and to address the problems that are present in the adaptation process.

Today, developing Azerbaijan is one of the foremost places for its tolerance and ethnicity. It is no coincidence that several Forums dedicated to multinationalism have been held in our country and presented to the world as a model of multiculturalism of the world states in the Azerbaijan Republic. they do. In such a

case, the study of the mechanisms of successful socio-psychological adaptation of national-ethnic groups has led to a rise in religious, cultural and national tolerance on the one hand, and the emergence of new scientific facts about social adaptation on the other.

***Key words:*** *ethnic groups, socio-psychological adaptation, ethnic identity, ethnic stereotype*

Milli-etnik qrupların müasir şəraitə adaptasiyasının sosial-psixoloji məsələlərini tam aydınlığı ilə müəyyənləşdirmək üçün adaptasiya prosesinin özünəməxsus cəhətlərini aydınlaşdırmaq lazımdır.

Aparılmış tədqiqatlarda milli-etnik qrupların adaptasiyasının daxili və xarici tərəfləri xüsusi qeyd edilir. Daxili adaptasiya psixoloji adaptasiya adlanır ki, bu da milli-etnik qrupların həyatdan məmnunluq hissində təzahür edir. Bununla yanaşı adaptasiyanın xarici tərəfini də ayırd edirlər ki, bu da sosial-psixoloji adaptasiya adlanır (4; 5; 7).

Adaptasiyanın bu cəhəti milli-etnik qrupların sosial və mədəni həyatda yeni qruplara uyğunlaşmasında, şəxsiyyətlərarası münasibətdə bərabərhüquqlu üzv kimi çıxış etməsində özünü göstərir.

Qeyd etmək lazımdır ki, sosial-mədəni və psixoloji adaptasiya qarşılıqlı şəkildə bir-biri ilə əlaqəlidirlər: "Bu zaman sosial baxımdan qeyri-adekvat davranış təcridolunmaya aparır və psixoloji zədə yaradır ki, bu zaman psixoloji halsızlıq davranışda və bir sıra sosial vərdişlərdə öz əksini tapır" (9, s. 692).

Fərdin bütünlüklə adaptasiyası üçün onun kompleks adaptasiya olunması zəruridir. Yeni sistemə adaptasiya yeni dəyərlərin formalaşmasına və onların cəmiyyətin tələblərinə müvafiqliyinə cavab verməsi vacibdir.

Faktlar göstərir ki, insanın adaptasiyası təbii, irsi, coğrafi amillərin ona kompleks təsirindən də asılıdır. Adaptasiya dəyişiklikləri özündə bu və ya digər dərəcədə şüurlu dəyişilmələri əks etdirir ki, bu da şəxsiyyətin daxili prizmasından keçərək, yeni dəyərlərə transformasiyası sayəsində mümkündür.

İstər uyğunlaşma, istərsə də dəyişiklik daima insanı izləyir. Buna görə də insan bu və ya digər dəyişikliyə həmişə hazır olmalı, situasiyanın variasiyalarını dəqiq şəkildə əks etdirməyə nail olmalıdır. Bütün bunlar isə dəyişən şəraitə şəxsiyyətin daim hazırlığını özündə əks etdirir və insanın adaptasiya qabiliyyətlərini yüksəldir.

Adaptasiyanın növləri içərisində psixoloji adaptasiya mühüm rol oynayır. Psixologiyada adaptasiya hiss üzvlərinin uyğunlaşması kimi təqdim olunur. Psixoloji adaptasiya prosesi fasiləsiz baş verir, ona görə ki, sosial-iqtisadi şəraiti dəyişir, bu yönümdə şəxsiyyətin əxlaqi-etik yönümü də dəyişir. Məhz bu nöqteyi-nəzərdən psixoloji adaptasiya digər adaptasiya növlərindən fərqlənir. Uğurlu uyğunlaşma, adətən, ətraf aləmlə harmonik münasibətlərin qurulması kimi təqdim olunur. Burada əsas diqqət milli-etnik qrupların həyatdan məmnunluğuna və psixoloji sağlamlığına yönəldilir (8).

Təbii ki, başqa mədəniyyətə adaptasiyada mədəni şok o zaman müşahidə olunmur ki, onda həmin mədəniyyətin dəyərləri fərd tərəfindən qəbul edilir və müsbət emosiyalar yaradır, onun mədəni dəyərlərinə heç bir təhlükə yaratmır. Belə psixoloji vəziyyətdən çıxış edən C. Berri mədəni şok anlayışı ilə bərabər, "akkulturasiya stressi" anlayışını da işlətməyə başlamışdır. Onun qənaətincə, mədəni şok yalnız neqativ təcrübə ilə bağlı deyil, o həm də yeni mədəni dəyərlərin qavranılmasında ortaya çıxan problemlərin həll edilməməsi qorxusundan meydana çıxan qorxu hissidir.

Sosial-mədəni mühitin dəyişməsi şəxsiyyətdən yeni sosial əlaqələr qurmağı və bu əlaqələr kontekstində özünün dəyərlər sistemini, peşəyönünü, peşəkar özünütəsdiqini və potensial imkanlarını bu istiqamətdə aktuallaşdırmağı tələb edir. Sosial mədəni mühitdən irəli gələn həmin tələblər şəxsiyyət qarşısında həm sosial mühitin tələblərinə uyğun, həm də özünün dəyərlərini gerçəkləşdirməyə imkan verən davranış strategiyası və ya adaptasiya mexanizmi seçmək məqsədi qoyur.

Əgər fərd özünün sosial-psixoloji adaptasiya prosesində geniş əlaqələr sistemi yaratmırsa və bu əlaqələri iqtisadi, siyasi, psixoloji əsaslara söykənmirsə, onda onun sosial mühitə müvəffəqiyyətlə adaptasiya oluna biləcəyindən danışmaq çətindir.

Sosial adaptasiyanın müvəffəqiyyətini təmin edən amillərdən biri də etnos üzvünün fərdi-

psixoloji xüsusiyyətləridir. Lakin faktlar göstərir ki, yalnız fərdi-psixoloji xüsusiyyətlər deyil, həm də fərddə pozitiv sosial identikliyin yaranması, onun sosial və etnomədəni xüsusiyyətləri də mühüm rol oynayır. Məsələn, türk toplumunun etnik-psixoloji xüsusiyyətlərindən biri ailəyə emosional bağlılığı, ondan aralıda yaşaya bilməyin çətinliyi və s. xarakterikdir. Yəni onların etnopsixoloji keyfiyyətləri bu və ya digər yad şəraitə və ya sosial-mədəni mühitə adaptasiyasını çətinləşdirir. Belə xüsusiyyətlər, yəni həssaslıq, kövrəklik, öz yurduna bağlılıq və s. onların adekvat adaptasiyasına mane olan amillərdəndir.

İnsanın adaptasiyasının və etnik aləminin psixoloji xüsusiyyətlərinin anlaşılması üçün sosial davranışın bəzi tənzimləmə mexanizmlərinin, məsələn, "Mən – konsepsiya" baxımından nəzərdən keçirilməsi zəruridir. Özü haqqında düşünərkən insan çox nadir hallarda neytral ola bilir, o həmişə özünə hansısa münasibət mövqeyindən yanaşır. Bununla əlaqədar olaraq, insanın özü haqqında düşüncələri həmişə emosional çalara malik olub, çox zaman özünün, şəxsiyyətinin, fəaliyyətinin müxtəlif tərəflərini qiymətləndirmə xarakteri daşıyır. İnsanın özü haqqında fikirləri, rəyi onun davranışında, başqa insanlara münasibətində, onun gələcəkdə özündən nələr gözləyə biləcəyi haqqında olan ümidlərində reallaşır. Bütün bunlar dayanıqlı şəxsiyyət qurumu olan "Mən – konsepsiya"nın təməlini yaratmış olur.

"Mən – konsepsiya" özündə insanın özü haqqında bütün biliklərini, həmçinin onun özünü necə qiymətləndirməsini birləşdirir. O, təkcə dərkolunmuş səviyyədə mövcud deyil, eləcə də qeyri-şüuri səviyyədə mövcud olmaqla, özünə qarşı yönləndirilmiş dərk edilməmiş daxili göstərişlərini duyğular şəklində də büruzə verir (6).

"Mən – konsepsiya"nın, adətən, üç əsas komponentini ayırd edirlər: koqnitiv, emosional-qiymətləndirmə və davranış.

Koqnitiv komponent olan "Mən obrazı" insanın özü haqqında təsəvvürlərinin mahiyyətini səciyyələndirir. "Mən obrazı" özündə insanın öz qabiliyyət və bacarıqları haqqında, ətrafında olanlarla münasibətləri, zahiri görkəmi, sosial dairəsi, maraqları, şəxsi keyfiyyətləri və s. haqqında təsəvvürlərini birləşdirir. Bu sadalama sırası, praktiki olaraq, sonsuz ola bilər. Belə ki, "Mən obrazı" insan üçün əhəmiyyətli olan hər bir şeyi, onun, bir tərəfdən, başqa insanlarla birliyini hiss etməyə, özünü onlarla birləşdirməyə, digər tərəfdən isə özünü onlardan fərqləndirməyə, özünü xüsusi, təkrarolunmaz şəxsiyyət kimi dərk etməyə imkan verən hər bir şeyi özündə birləşdirə bilər. Bu səbəbdən "Mən – konsepsiya" obrazının məzmununu iki tərkib hissəsi xarakterizə edir:

a) fərdin digər insanlarla birliyini təmin edən "birləşdirici" hissə;

b) insanın digərləri ilə müqayisədə seçici olmasına imkan yaradan və insanda özünün təkrarsızlığı, unikallığı hissləri üçün əsas yaradan "ayırıcı" tərkib hissə.

Etnik psixoloji xüsusiyyətlərin öyrənilməsinə həsr olunmuş tədqiqatlar göstərir ki, insanlar, prinsip etibarilə, öz milli mədəniyyətlərinə tənqidi yanaşmağı bacarırlar və eləcə də başqasına xas olan əcnəbi bir şeyi müsbət qiymətləndirməyə qadirdirlər.

"Mən-konsepsiya"nın ikinci komponenti özünə qarşı emosional-qiymətləndirmə münasibəti insanın (etnoforun) bütövlükdə özünə qarşı, yaxud şəxsiyyətinin, fəaliyyətinin və s. ayrı-ayrı tərəflərinə münasibətini əks etdirir və bu, özünəhörmətdə, şəxsi ləyaqət hissində, özünüqiymətləndirmədə və iddiaların səviyyəsində təzahür olunur.

İkinci komponentin təməlini özünəhörmət və ya şəxsi ləyaqət hissi, şəxsiyyətin dəyərləndirilməsi təşkil edir. Özünəhörmət öz gücünə və imkanlarına inam hissidir. Bu, konkret olaraq heç bir sahə ilə əlaqədar deyildir və qiymətləndirmədən çox, insanın özünə qarşı ümumi münasibətini ifadə edir. Özünəhörmət özünü olduğu kimi qəbul etmək, özünü sevməkdir.

Özünüqiymətləndirmə iddialarının səviyyəsi, yəni insanın qarşısına qoyduğu hədəflərin çətinlik səviyyəsi ilə sıx əlaqədardır; o, insanın hansı nailiyyətləri uğursuzluq, hansılarını isə müvəffəqiyyət kimi qəbul edəcəyini (qavrayacağını) müəyyən edir. Konkret fəaliyyət sahəsində özünüqiymətləndirmə və iddiaların səviyyəsi kifayət qədər dəqiq müəyyən oluna bilər. Bu səbəbdən də konkret fəaliyyət sahəsinə nəzərən qiymətləndirmə və iddiaların səviyyəsi yüksək, orta və aşağı ola bilər.

Belə hallarda özünüqiymətləndirmənin adekvatlığı haqqında da danışmaq lazım gəlir. Özünüqiymətləndirmə o zaman adekvat hesab

olunur ki, insan hər hansı fəaliyyət sahəsində real uğurlu fəaliyyətinə müvafiq gəlmiş olsun. Özünüqiymətləndirmə fəaliyyətin uğurluluğu ilə müvafiq olmadığı hallarda söhbət qeyri-adekvat özünüqiymətləndirmədən gedir. Qeyri-adekvat qiymətləndirmə həqiqi dəyərdən yüksək (subyekt öz aktual imkanlarını olduğundan xeyli dərəcədə yüksək qiymətləndirir) və həqiqi dəyəri azaldılmış (subyekt aktual imkanlarını olduğundan aşağı səviyyədə qiymətləndirərkən) ola bilər. Həm qeyri-adekvat yüksəldilmiş, həm də qeyri-adekvat olaraq azaldılmış özünüqiymətləndirmə həm ümumi inkişafı, həm də hər hansı fəaliyyət növündə uğurlu olmanı güclü əngəlləyə biləcək bir amildir.

Özünəhörmətin aşağı səviyyəsinin təzahürlərindən biri natamamlıq kompleksidir. Bu hadisə tanınmış psixoanalitik A. Adler (1870-1937) tərəfindən kəşf edilmişdir. Natamamlıq kompleksi insanın öz həyat problemlərinin həllində iqtidarsız, qabiliyyətsiz olmasına dayanıqlı əminliyində təzahür edir.

Belə insanlar onları əhatə edənlərin tərəfdaşlığına və köməyinə, daha mürəkkəb hallarda isə xüsusi psixoloji və psixoterapevtik köməyə ehtiyac duyurlar.

“Mən-konsepsiya”nın üçüncü komponenti davranış komponentidir. Bu komponent insanın özünütənzimləmə imkanlarını, insanın müstəqil qərarlar vermək qabiliyyətini, davranışını idarə etmək, onu nəzarətdə saxlamaq, öz əməllərinə görə cavab vermək kimi məqamları müəyyən edir.

Davranış komponentində həyatın insan qarşısında qoyduğu problemləri, eləcə də onun özünün qarşısına qoyduğu məsələləri həll edə bilib-bilməməsi, çətinliklərin öhdəsindən gələ biləcəyi, öz məqsədinə çata biləcəyi ilə əlaqədar təsəvvürləri və keçirdiyi hisslər əks olunur. Bütün bunlar isə şəxsin özünə inamlı və ya qeyri-inamlı olması şəklində təzahür edir.

“Mən-konsepsiya”nın vacib ölçülərindən biri də davranışda daxili və ya xarici nəzarətə istiqamət götürülməsidir. Buna əsasən insanları eksternal və internal kimi qruplara ayırmaq olar. Xarici nəzarətə istiqamətlənmə hallarında eksternalların özünü qiymətləndirməsi, əsasən, belə şəxslərə digər insanların münasibəti ilə müəyyən olunur, həyatlarında baş verən hadisələri isə onlar müvafiq olaraq tale, qəzavü-qədər, digər insanların təsiri ilə izah edirlər. İnternallar daxili nəzarətə yönlənir və başlıca olaraq şəxsi özünüqiymətləndirməni nəzərə alırlar və hesab edirlər ki, həyatda hər şey yalnız onların özündən asılıdır. Lakin bu tiplərdən hər birinin tamamilə bir-birinə zidd olan təzahürləri qeyri-məhsuldardır, o cümlədən də etnik münasibətlərdə özünü neqativ yönümdə təzahür etdirir. Göründüyü kimi, milli-etnik qrupların sosial-psixoloji adaptasiyanın komponentləri olduqca müxtəlif və mürəkkəb psixoloji mexanizmə malikdir. Bu baxımdan müasir dövrdə milli-etnik qrupların sosial-psixoloji adaptasiyanın komponentlərinin mürəkkəbliyi nəzərə alınmalı və hər bir etnosun müasir şəraitə uğurla adaptasiyasının sosial-psixoloji mexanizmləri öyrənilməlidir.

**Problemin aktuallığı.** Müasir şəraitdə milli-etnik qrupların sosial-psixoloji adaptasiyasının əsas istiqamətlərinin öyrənilməsi və yeni şəraitə uyğunlaşma imkanlarının aydınlaşdırılması məqalənin aktuallığını şərtləndirir.

**Problemin elmi yeniliyi.** Elmi yenilik onunla bağlıdır ki, məqalədə Azərbaycanda yaşayan milli-etnik qrupların sosial-psixoloji adaptasiyasının psixoloji məsələləri araşdırılır.

**Problemin tətbiqi əhəmiyyəti.** Məqalədən seçmə fənlərin tədrisində istifadə oluna bilər.

**Ədəbiyyat:**


1. Azərbaycanda yaşayan azsaylı xalqların adət və ənənələrinin təbliğində kitabxanaların rolu: Metodik vəsait. -Bakı, -2012, -45 s.
2. Bayramov, Ə.S. Psixologiya. / Ə.S. Bayramov, Ə.Ə. Əlizadə. -Bakı, 2003, -540 c.
3. Bayramov, Ə.S., Əlizadə Ə.Ə. Sosial psixologiya. / Ə.S. Bayramov, Ə.Ə. Əlizadə. -Bakı: “QAPP - POLIQRAF” Korporasiyası, -2003.
4. Bayramov, Ə.S. Etnik psixologiya. / Ə.S. Bayramov -Bakı: Renessans, -2001, -374 c.
5. Алексеева, Т. И. Адаптивные процессы в популяциях человека. / Т. И. Алексеева -М., -1986. -С.150.
6. Татарко, А.Н. Методы этнической и кросскультурной психологии. / А.Н. Татарко Н.М. Лебедева. -М.: НИУ ВШЭ, -2011
7. Стефаненко, Т.Г. Этнопсихология:Учебник для вузов. / Т.Г. Стефаненко. -М.: Аспект Пресс, -2009.

8. Таранов, Е.В. Социально-психологические проблемы адаптации молодого рабочего: / Дис. ... канд.психол наук. /-М., -1976. -200 с.
9. Уорд К. Азбука аккультурации // Психология и культура. - СПб: -2003, -709 с.
10. Berry J.W. Immigration, Acculturation and Adaptation. -Ontario, -1996.

**E-mail:** narminagurbanova@yahoo.co.uk
**Rəyçilər:** *fəls.ü.e.d., dos.* **İ.M. Məmmədli,**
*f.ü.e.d., dos.* **E.A. Piriyeva**
**Redaksiyaya daxil olub:** 15.11.2022

*UOT 159.9*

***Ли Исюань***
*докторант по программе доктора философии*
*Азербайджанский Государственный Педагогический Университет*

# КЛИНИКО-ПСИХОЛОГО-ПЕДАГОГИЧЕСКИЕ ОСОБЕННОСТИ РАЗВИТИЯ ДЕТЕЙ С ДЕТСКИМ ЦЕРЕБРАЛЬНЫМ ПАРАЛИЧОМ

***Li Yixuan***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# SEREBRAL İFLİCLİ UŞAQLARIN İNKİŞAFININ KLİNİK, PSİXOLOJİ VƏ PEDAQOJİ XÜSUSİYYƏTLƏRİ

***Li Yixuan***
*doctorial student in the program of doctor of philosophy*
*Azerbaijan State Pedagogical University*

# CLINICAL, PSYCHOLOGICAL AND PEDAGOGICAL FEATURES OF THE DEVELOPMENT OF CHILDREN WITH CEREBRAL PALSY

**Резюме.** Детский церебральный паралич (ДЦП) – это группа заболеваний, которые влияют на способность человека двигаться и сохранять равновесие и осанку. ДЦП – наиболее распространенная двигательная инвалидность в детском возрасте. Церебральный означает имеющий отношение к мозгу. Паралич означает слабость или проблемы с использованием мышц. ДЦП вызывается аномальным развитием мозга или повреждением развивающегося мозга, что влияет на способность человека контролировать свои мышцы.

***Ключевые слова:*** *детский церебральный паралич, типы параличей, реабилитация*

**Xülasə.** Serebral iflic (SP) insanın hərəkət, tarazlığı və duruşunu qorumaq qabiliyyətinə təsir edən bir qrup pozğunluqdur. Serebral iflic uşaqlıqda ən çox rast gəlinən motor qüsurudur. Serebral beyinə aid olan deməkdir. İflic zəiflik və ya əzələlərin istifadəsində çətinlik deməkdir. Serebral iflic anormal beyin inkişafı və ya insanın əzələlərini idarə etmək qabiliyyətinə təsir edən inkişaf edən beynin zədələnməsi nəticəsində yaranır.

***Açar sözlər:*** *serebral iflic, iflicin növləri, reabilitasiya*

**Summary.** Cerebral palsy (CP) is a group of disorders that affect a person's ability to move and maintain balance and posture. Cerebral palsy is the most common motor disability in childhood. Cerebral means pertaining to the brain. Paralysis means weakness or trouble using the muscles. Cerebral palsy is caused by abnormal brain development or damage to the developing brain that affects a person's ability to control their muscles.

***Key words:*** *cerebral palsy, types of paralysis, rehabilitation*

Детский церебральный паралич (ДЦП) – это группа двигательных расстройств, которые появляются в раннем детстве. Признаки и симптомы различаются у разных людей и со временем, но включают плохую координацию, скованность мышц, слабость мышц и тремор. Могут быть проблемы с чувствительностью, зрением, слухом и речью. Часто дети с церебральным параличом не переворачиваются, не садятся, не ползают и не ходят так рано, как другие дети их возраста. Другие симптомы включают судороги и проблемы с мышлением или рассуждениями, каждое из которых встречается примерно у одной трети

людей с ДЦП. Хотя симптомы могут стать более заметными в течение первых нескольких лет жизни, основные проблемы со временем не ухудшаются.

Детский церебральный паралич поражает людей с древних времен. В медицинской литературе древних греков обсуждается паралич и слабость рук и ног. В работах школы Гиппократа (460–370 гг. до н. э.) и, в частности, в рукописи «О священной болезни» описана группа проблем, которая очень хорошо согласуется с современным пониманием детского церебрального паралича.

Современное понимание ДЦП как результата проблем с мозгом началось в первые десятилетия XIX века с ряда публикаций по аномалиям головного мозга Иоганна Кристиана Рейля, Клода Франсуа Лаллемана и Филиппа Пинеля. Позже врачи использовали это исследование, чтобы связать проблемы в мозге с конкретными симптомами. Английский хирург Уильям Джон Литтл (1810–1894) был первым, кто подробно изучил ДЦП. В своей докторской диссертации он заявил, что ДЦП был результатом проблемы во время рождения. Позже он определил тяжелые роды, преждевременные роды и перинатальную асфиксию, в частности, как факторы риска. Спастическая форма диплегии ДЦП стала известна как болезнь Литтла. Примерно в это же время немецкий хирург также работал над церебральным параличом и отличал его от полиомиелита. В 1880-х годах британский невролог Уильям Гауэрс, опираясь на работу Литтла, связал паралич у новорожденных с тяжелыми родами. Он назвал проблему «параличом при рождении» и разделил паралич на два типа: периферический и церебральный.

Работая в США в 1880-х годах, врач канадского происхождения Уильям Ослер (1849-1919) изучил десятки случаев ДЦП, чтобы дополнительно классифицировать расстройства по локализации проблем в организме и по первопричине. Ослер провел дальнейшие наблюдения, связывая проблемы во время родов с ДЦП, и пришел к выводу, что проблемы, вызывающие кровотечение внутри головного мозга, вероятно, были основной причиной. Ослер также подозревал полиоэнцефалит как инфекционную причину.

Прежде чем перейти к психиатрии, австрийский невролог Зигмунд Фрейд (1856-1939) внес дальнейшие уточнения в классификацию расстройства. Он создал систему, которая используется до сих пор. Система Фрейда разделяет причины расстройства на проблемы, присутствующие при рождении, проблемы, развивающиеся во время рождения, и проблемы после рождения. Фрейд также провел грубую корреляцию между локализацией проблемы внутри мозга и расположением пораженных конечностей на теле и задокументировал множество видов двигательных нарушений.

В начале XX века внимание медицинского сообщества в основном отвернулось от ДЦП, пока хирург-ортопед Уинтроп Фелпс не стал первым врачом, вылечившим это расстройство. Он рассматривал ДЦП с опорно-двигательной, а не с неврологической точки зрения. Фелпс разработал хирургические методы операций на мышцах для решения таких проблем, как спастичность и мышечная ригидность. Венгерский специалист по физической реабилитации Андраш Петё разработал систему обучения детей с ДЦП ходьбе и другим основным движениям. Система Пето стала основой для кондуктивного обучения, широко используемого сегодня для детей с ДЦП.

В 1997 году Роберт Палисано и соавторы представили систему классификации общей двигательной функции (СКОДФ) в качестве улучшения по сравнению с предыдущей грубой оценкой ограничения как легкой, умеренной или тяжелой степени. Ограничение СКОДФ оценивается на основе наблюдаемого владения конкретными базовыми навыками передвижения, такими как сидение, стояние и ходьба, и принимает во внимание уровень зависимости от вспомогательных средств, таких как инвалидные коляски или ходунки. СКОДФ была дополнительно пересмотрена и расширена в 2007 году.

Детский церебральный паралич в наше время определяется как «группа постоянных нарушений развития движений и осанки, вызывающих ограничение активности, которые связаны с непрогрессирующими нарушениями, возникшими в развивающемся мозге плода или младенца». Обычно считается, что

мышечные сокращения у людей с церебральным параличом возникают из-за чрезмерной активности.

Детский церебральный паралич характеризуется аномальным мышечным тонусом, рефлексами или двигательным развитием и координацией. Неврологическое поражение является первичным и постоянным, тогда как ортопедические проявления являются вторичными и прогрессирующими. При церебральном параличе неравномерный рост мышечно-сухожильных единиц и кости в конечном итоге приводит к деформации костей и суставов. Деформации в целом и статические деформации в частности (контрактуры суставов) вызывают нарастающие трудности походки в виде походки на цыпочках из-за напряжения ахиллова сухожилия и ножницеобразной походки из-за напряжения приводящих мышц бедра. Эти модели походки являются одними из наиболее распространенных нарушений походки у детей с церебральным параличом. Однако ортопедические проявления ДЦП разнообразны. Кроме того, среди детей, способных ходить, распространена походка с приседанием (походка с чрезмерным сгибанием колена). Последствия церебрального паралича относятся к континууму моторных дисфункций, которые могут варьироваться от легкой неуклюжести на легком конце спектра до нарушений настолько серьезных, что они делают практически невозможными скоординированные движения на другом конце спектра. Хотя у большинства людей с ДЦП возникают проблемы с повышенным мышечным тонусом, у некоторых наблюдается нормальный или пониженный мышечный тонус.

Дети, рожденные с тяжелым церебральным параличом, часто имеют неправильную осанку; их тела могут быть либо очень гибкими, либо очень жесткими. Врожденные дефекты, такие как искривление позвоночника, небольшая челюстная кость или маленькая голова, иногда возникают вместе с ДЦП. У детей, рожденных с церебральным параличом, симптомы проявляются не сразу. Классически ДЦП становится очевидным, когда ребенок достигает стадии развития в возрасте от 6 до 9 месяцев и начинает двигаться, когда наблюдается преимущественное использование конечностей, асимметрия или задержка крупного моторного развития.

Среди детей с церебральным параличом часто встречается слюнотечение, которое может иметь различные последствия, включая социальное неприятие, нарушение речи, повреждение одежды и книг, а также инфекции полости рта.

У ребенка с церебральным параличом могут возникнуть проблемы с речевой моторикой. Чтобы говорить, мы используем сложную комбинацию мышц лица, горла, шеи и других частей тела. Детский церебральный паралич может поражать часть мозга, отвечающую за речь. У ребенка с церебральным параличом могут возникнуть проблемы с построением предложений или использованием правильных слов. В некоторых случаях ребенок может испытывать трудности с самовыражением. Это может вызвать социальные трудности в более позднем возрасте.

Речевые и языковые расстройства, связанные с церебральным параличом, включают:

Нарушения артикуляции: у пациентов с ДЦП может наблюдаться плохой орально-моторный контроль и мышечная слабость лица и горла. Эти условия влияют на способность ребенка издавать звуки и образовывать слоги.

Нарушения беглости: прерывания, такие как заикание, нарушают течение речи.

Нарушения голоса: неравномерная высота тона, регулировка громкости и качество голоса, затрудняют общение детей.

Дизартрия: нарушение движения мышц языка, губ и голосовых связок, что приводит к невнятной речи и замедлению темпа речи.

Дисфагия: трудности с глотанием или перевариванием пищи, вызывающие слюнотечение, кашель, рвотные позывы и срыгивание.

Афазия: повреждение части мозга, которая влияет на язык и речь. Это затрудняет речь, понимание общения, чтение и письмо.

Рецептивная борьба: проблемы с обработкой и пониманием языка затрудняют извлечение смысла из языка и общения.

Экспрессивные расстройства: трудности с подбором слов для передачи идей.

В среднем 55,5% людей с церебральным параличом испытывают симптомы нижних мочевыводящих путей, чаще проблемы с чрезмерным накоплением, чем проблемы с мочеиспусканием. Те, у кого проблемы с мочеиспусканием и гиперактивность тазового дна, могут ухудшаться во взрослом возрасте и испытывать дисфункцию верхних мочевыводящих путей.

ДЦП классифицируется по типам двигательных нарушений конечностей или органов, а также по ограничениям деятельности, которую может выполнять больной человек. Расширенная и пересмотренная система классификации функций крупной моторики и система классификации мануальных способностей используются для описания подвижности и ловкости рук у людей с церебральным параличом.

Различают три основные классификации ДЦП по двигательным нарушениям: спастические, атаксические и дискинетические. Кроме того, существует смешанный тип, который показывает сочетание признаков других типов. Эти классификации отражают области мозга, которые повреждены.

Церебральный паралич также классифицируется по топографическому распределению мышечной спастичности. Этот метод классифицирует детей как диплегических (двустороннее поражение с вовлечением ног больше, чем поражение рук), гемиплегию (одностороннее поражение) или квадриплегию (двустороннее поражение с поражением рук, равным или большим, чем поражение ног).

**Спастическая тетраплегия** – одна из самых тяжёлых форм ДЦП, являющаяся следствием аномалий развития головного мозга, внутриутробных инфекций и перинатальной гипоксии с диффузным повреждением полушарий головного мозга. У 50% детей наблюдаются эпилептические приступы. Для данной формы характерно раннее формирование контрактур, деформаций туловища и конечностей. Почти в половине случаев двигательные расстройства сопровождаются патологией черепных нервов: косоглазием, атрофией зрительных нервов, нарушениями слуха, псевдобульбарными расстройствами. Довольно часто у детей отмечают микроцефалию, которая, разумеется, носит вторичный характер. Тяжёлый двигательный дефект рук и отсутствие мотивации исключают самообслуживание и простую трудовую деятельность.

**Спастическая диплегия** – наиболее распространённая разновидность церебрального паралича (3/4 всех спастических форм), известная ранее также под названием «болезнь Литтла». Нарушается функция мышц с обеих сторон, причём в большей степени ног, чем рук и лица. Для спастической диплегии характерно раннее формирование контрактур, деформаций позвоночника и суставов. Преимущественно диагностируется у детей, родившихся недоношенными (последствия внутрижелудочковых кровоизлияний, перивентрикулярной лейкомаляции, других факторов). При этой форме, как правило, наблюдается тетраплегия (тетрапарез), с мышечной спастикой заметно преобладающей в ногах. Наиболее распространённые проявления – задержка психического и речевого развития, наличие элементов псевдобульбарного синдрома, дизартрия и т. п. Часто встречается патология черепных нервов: сходящееся косоглазие, атрофия зрительных нервов, нарушение слуха, нарушение речи в виде задержки её развития, умеренное снижение интеллекта.

**Гемиплегическая форма** – характеризуется односторонним спастическим гемипарезом. Рука, как правило, страдает больше, чем нога. Причиной у недоношенных детей является перивентрикулярный (околожелудочковый) геморрагический инфаркт, и врождённая церебральная аномалия, ишемический инфаркт или внутримозговое кровоизлияние в одном из полушарий (чаще в бассейне левой средней мозговой артерии) у доношенных детей. Дети с гемипарезами овладевают возрастными навыками позже, чем здоровые. Поэтому уровень социальной адаптации, как правило, определяется не степенью двигательного дефекта, а интеллектуальными возможностями ребёнка. Клинически характеризуется развитием спастического гемипареза (походка по типу Вернике-Манна, но без циркумдукции ноги), задержкой психического и речевого развития. Иногда проявляется монопарезом.

**Дискинетическая форма** – одной из самых частых причин данной формы является перенесённая гемолитическая болезнь новорождённых, которая сопровождалась развитием «ядерной» желтухи. Также причиной является *status marmoratus* базальных ганглиев у доношенных детей. При этой форме, как правило, повреждаются структуры экстрапирамидной системы и слухового анализатора. Характеризуется непроизвольными движениями (гиперкинезами), повышением мышечного тонуса, одновременно с которыми могут быть параличи и парезы. Речевые нарушения наблюдаются чаще в форме гиперкинетической дизартрии. Интеллект развивается в основном удовлетворительно. Отсутствует правильная установка туловища и конечностей. У большинства детей отмечается сохранение интеллектуальных функций, что прогностично благоприятно в отношении социальной адаптации, обучения. Дети с хорошим интеллектом заканчивают школу, средние специальные и высшие учебные заведения, адаптируются к определённой трудовой деятельности. Выделяются атетоидный и дистонический (с развитием хореи, торсионных спазмов) варианты данной формы ДЦП.

**Атаксическая форма** – характеризуется низким тонусом мышц, атаксией и высокими сухожильными и периостальными рефлексами. Наблюдается при преобладающем повреждении мозжечка, лобно-мосто-мозжечкового пути и, вероятно, лобных долей вследствие родовой травмы, гипоксически-ишемического фактора. Клинически характеризуется классическим симптомокомплексом (мышечная гипотония, атаксия) и различными симптомами мозжечковой асинергии (*дисметрия, интенционный тремор, дизартрия*). При этой форме ДЦП может быть задержка развития интеллекта в редких случаях.

**Смешанные формы** – несмотря на возможность диффузного повреждения всех двигательных систем головного мозга (пирамидной, экстрапирамидной и мозжечковой), вышеупомянутые клинические симптомокомплексы позволяют в подавляющем большинстве случаев диагностировать конкретную форму ДЦП. Последнее положение важно в составлении реабилитационной карты больного. Часто сочетание спастической и дискинетической (при сочетанном выраженном поражении экстрапирамидной системы) форм, отмечается и наличие гемиплегии на фоне спастической диплегии (при асимметричных кистозных очагах в белом веществе головного мозга, как последствие перивентрикулярной лейкомаляции у недоношенных).

**Актуальность проблемы.** Данная патология является многофакторным заболеванием и несмотря на достаточно долгое изучение нет единого мнения о преимущественном влиянии ДЦП на социализацию и развитие детей. Также существует проблема ранней диагностики и начала лечебных мероприятий, что в свою очередь во многом определяет течение заболевания.

**Научная новизна проблемы.** В данной работе рассмотрены возможные причины развития ДЦП, что позволяет классифицировать болезнь по проявлениям и, возможно, предотвращать его появление.

**Практическая значимость проблемы.** Важное значение в современном обществе уделяется социализации детей с ДЦП, изучение данной проблемы поможет лучше ознакомиться с данной болезнью и, соответственно, лучше понять как принимать особенных людей в своем окружении.

**Литературы:**


1. National Institute of Neurological Disorders and Stroke. "Cerebral Palsy: Hope Through Research". July 2013.
2. Oskoui, M; Coutinho, F; Dykeman, J; Jetté, N; Pringsheim, T. "An update on the prevalence of cerebral palsy: a systematic review and meta-analysis". 2013.
3. Журнал «Жизнь с ДЦП. Проблемы и решения». Что такое детский церебральный паралич (ДЦП). 2009.
4. Хольц Ренате. Помощь детям с церебральным параличом. 2007.
5. Цукер М. Б., Детские церебральные параличи. 1965.


**E-mail:** 2689460251@qq.com

**Рецензент:** *док.фил.по пед.,доц.* **Н.Т. Гусейнова**
**Redaksiyaya daxil olub:** 25.11.2022.

*UOT 159.9*

***Nərminə Seyfəl qızı Mirzəliyeva***
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*Bakı Dövlət Universiteti*
https://orcid.org/0000-0002-04221543

## AİLƏDƏ YENİYETMƏLƏRİN SOSİALLAŞMASINA VƏ SOSİAL BACARIQLARININ FORMALAŞMASINA TƏSİR EDƏN ƏSAS AMİLLƏR

***Нармина Сейфаль гызы Мирзалиева***
*диссертант по программе доктора философии*
*Бакинский Государственный Университет*

## ОСНОВНЫЕ ФАКТОРЫ, ВЛИЯЮЩИЕ НА СОЦИАЛИЗАЦИЮ ПОДРОСТКОВ В СЕМЬЕ И ФОРМИРОВАНИЕ СОЦИАЛЬНЫХ НАВЫКОВ

***Narmina Seyfal Mirzaliyeva***
*doctorial student in the program of doctor of philosophy*
*Baku State University*

## TO THE SOCIALIZATION OF TEENAGERS IN THE FAMILY AND THE FORMATION OF THEIR SOCIAL SKILLS MAIN INFLUENCING FACTORS

**Xülasə.** Məqalədə ailədə yeniyetmələrin sosiallaşmasına və sosial bacarıqlarının formalaşmasına təsir edən əsas amillər göstərilir. Yeniyetmənin sosiallaşmasında, inkişafında ailə, ailədaxili münasibətlərin təsiri barəsində nəticələr göstərilmişdir.
***Açar sözlər:*** *sosiallaşma, yeniyetmə, ailə, məktəb, sosial mühit*

**Резюме.** В статье показаны основные факторы, влияющие на социализацию подростков в семье и формированию у них социальных навыков. Приведены результаты о влиянии семьи и внутрисемейных отношений на развитие социализации подростка.
***Ключевые слова:*** *социализация, подросток, семья, школа, социальная среда*

**Summary.** The article shows the main factors affecting the socialization of teenagers in the family and the formation of their social skills. The results about the influence of family and intra-family relations on the socialization development of the adolescent have been shown.
***Key words:*** *socialization, adolescent, family, school, social environment*

Ailə evlilik bağları ilə başlanan, qohumları ilə qohumluq və ictimai bağlarla bağlanan, bir-biri ilə qarşılıqlı əlaqədə olan və ümumiyyətlə, eyni dam altında yaşayan fərdlərdən ibarət olan, psixoloji, sosial, mədəni və iqtisadi ehtiyacların ödənildiyi bir vahiddir. Ailənin fərdin həyatdan zövq almasına, yaşadığı cəmiyyətə uyğunlaşmasına mühüm təsiri var. Yeniyetməlik dövründə fərdlər ailələrindən uzaqlaşıb həmyaşıd qruplarına qoşulsalar da, valideyn münasibəti fərdin şəxsiyyətinin inkişafı üçün əhəmiyyətini qoruyub saxlayır, çünki fərdin ailədən kənar həyatı valideynlər vasitəsilə qiymətləndirilərək süzülür. Bu səbəbdən, yeniyetmənin şəxsi və ictimai harmoniyasının keyfiyyəti və valideynləri ilə əlaqəsi əhəmiyyət qazanır. Bildirilir ki, ailə üzvləri arasında münasibətlərin keyfiyyətinin və onun həyat keyfiyyətinə təsirinin qeyri-sağlam olduğunu bildirən şagirdlərin ailə üzvləri ilə tanışlıq, təhsil və iqtisadi çətinliklərlə bağlı problemləri var. Məlumdur ki, ailə münasibətlərinin sağlam olduğunu düşünən fərdlər problemlərini ailə üzvləri ilə bölüşür, sağlam olduğunu düşünməyənlər isə problemlərini heç kimlə bö-

lüşmək istəmirlər (1). Valideynlər və yeniyetmələr arasında zəif münasibətin yeniyetmədə depressiv hisslərə səbəb olduğu da məlumdur.

Yeniyetməlik bir çox cəhətdən əhatə olunmaq deməkdir. Yeniyetmə əvvəlcə özü ilə (fiziki dəyişikliklər, idrak proseslərinin sürətləndirilməsi və s.), sonra isə ətrafı ilə əhatə olunur. Ailə üzvləri çox vaxt yaxşı dəstək olsalar da, bəzən yeniyetməni məhdudlaşdıran davranışlar nümayiş etdirirlər. Parmanın fikrincə, yeniyetmənin bu dövrdən necə keçdiyi valideynləri arasındakı dinamika və onların öz yeniyetməlik dövrünü necə keçdiyi ilə sıx bağlıdır.

Ailə və yeniyetmə bir-birini tamamlayan iki mühüm elementdir. Yeniyetmənin ailəsi ilə münasibətini sağlam görməməsi uyğunlaşma pozğunluğuna səbəb olur və olacaq. Buna görə də ailənin fərdin yaşadığı cəmiyyətə uyğunlaşmasına və ondan zövq almasına mühüm təsiri vardır. Ailədə sağlam problem həlletmə üsullarından istifadə etməyi öyrənə bilməyən fərd, yaşadığı mühitdə qarşılaşacağı problemlərin öhdəsindən gələ bilməyəcək və beləliklə də emosional və davranış problemləri yaratmağa meylli olacaq. Ailədəki təhsil mühiti və ya valideynlərin uşağa münasibəti fərdin məktəbdə öyrəndiklərini gücləndirə və ya onun atrofiyasına səbəb ola bilər. Valideynlərin uşağa münasibəti, davranışları və uyğunsuzluğu uşağın akademik uğurunun azalmasında mühüm amilidir (6). Həmçinin bildirilir ki, yeniyetmələrin valideynləri ilə münasibətlərinin keyfiyyəti yüksəldikcə yeniyetmələrin zorakılıq davranışları azalır və həmyaşıdları ilə münasibətləri müsbət istiqamətdə artır.

Yeniyetmə üçün müxalifət ətrafındakı böyüklərlə, xüsusən də valideynləri ilə münasibətdə özünü yerləşdirməyin ən imtiyazlı yoludur. Nə qədər dözümlü olduğunu görmək və göstərmək istəyərkən, "müxalifətini nümayiş etdirərək" ayrılıq hərəkatına başlayır. Özünü "başqaları" ilə müqayisə edərək kim olduğunu kəşf edir. Eyni zamanda, o, hələ də ehtiyac duyduğu valideynlərinin qoruyucu varlığından geri çəkilir. Əgər ailədəki həyat fərdin uşaqlıqdan hərəkət edə biləcəyi bir sahə və fərqlilik üçün kifayət qədər geniş bir açılış təmin edərsə, yeniyetmə çox münaqişə yaşamadan öz sərhədlərini tapa bilər və ətrafdan uzaqlaşa bilər. Burada unudulmaması lazım olan mühüm məqam, valideynlərin bu prosesdə çox sərt qaydalar və məhdudiyyətlər qoyması, yeniyetmənin avtonom olmasına, yəni "özü" olmasına mane olur (7).

Psixo-sosial-mədəni varlıq kimi insanlar yaşadığı cəmiyyətlə sıx qarşılıqlı əlaqədə olurlar. Həyatın bütün dövrlərində davam edən bu qarşılıqlı əlaqənin mühüm elementlərindən biri də sosial mühitdə dostluq etmək və var olmaqdır. Fərdlər həyatları boyu bir araya gəlir, həmyaşıdlarına təsir edir və onlardan təsirlənirlər. Bu, həm də sosial inkişaf üçün vacibdir. Bir dövr olan yeniyetməlik dövrünün dostluq şəbəkəsinin genişlənməsi və romantik əlaqələrin ortaya çıxması ilə ictimai inkişafa töhfə verdiyi ifadə edilir (9).

Fərd yeniyetməlik dövrünə yaxınlaşdıqca onun yaşıdları ilə münasibəti getdikcə artır və həmyaşıdları tərəfindən qəbul olunmaq yeniyetmə üçün böyük güc olmağa başlayır. Həmyaşıd qrupları yeniyetmənin muxtariyyətinə böyük töhfə verir (4). Çünki həmyaşıd qrupları mənsubiyyət hissini təmin edir və yeniyetmənin özünə inamının və özünə hörmətinin inkişafına mühüm təsir göstərir. Bununla belə, həmyaşıdların yeniyetmələrə təsiri həmişə müsbət olmur. Sosial bacarıqların olmaması və aqressiv davranışın olması, normal həmyaşıdları tərəfindən rədd edilməsi asosiallığa səbəb olur. Bu, qeyri-sağlam və aqressiv valideyn rəftarları ilə birləşdikdə, yeniyetmələr antisosial şəxsiyyətə malik oxşar həmyaşıd qrupları ilə bir araya gəlirlər (10).

Yeniyetmələrin romantik münasibətlərində yaşadıqları problemlər hədələmə, sillə vurma, döymə və.s şəklində inkişaf edə bilər. Yeniyetməlik dövründə fərdin psixi sağlamlığına töhfə verən tanışlıq əlaqələri bəzən stressli olur və narahatlıq doğurur. Bu vəziyyət, yeniyetmənin tanışlıq münasibətlərindən qaçmasına və qeyri-funksional sosial davranışlar göstərməsinə səbəb olur. Tanışlıq narahatlığı, əks cinsdən biri ilə və ya yeniyetmənin öz partnyoru ilə ünsiyyət zamanı yaşanan gərginlik, utancaqlıq və stress vəziyyətidir. Bu vəziyyətdə yeniyetmə tanışlıq əlaqəsinə başlamaq və ya davam etdirməkdən narahat olur. Tanışlıq narahatlığı olan şəxs tanışlıq zamanı şifahi və şifahi olmayan ünsiyyətdə gərginlik hiss edir, göz təmasından qaçır, kəkələyir və ya alçaq səs tonu ilə danışır və uyğun sözləri tapa bilmir. İzlənildiyini anladıqda gərginləşir və özünü lazımi şəkildə apara bilmir (11). Bu şəxslər xarici görünüşlərinə çox vaxt

sərf etsələr də, gözəl, yaraşıqlı olmadıqlarını düşünürlər. Uşaqların böyük əksəriyyəti üçün dostluqlar, ilk növbədə, öz növlərindən başlayır. Yeniyetməlik dövründə həmyaşıdlarla münasibətlər daha fərqliləşir və asudə vaxtların əksəriyyəti həmyaşıdları ilə ünsiyyətdə olur. Yeniyetməlik dövrünə doğru həmcinsləri, həm də həmyaşıd qruplarını əhatə edən münasibətlər və ikitərəfli romantik münasibətlər gənclərin əksəriyyəti üçün getdikcə daha vacib olur.

Yeniyetməlik dostluq bağlarının genişləndiyi, yaxın dostluqların artdığı, romantik münasibətlərin ortaya çıxdığı kritik bir dövrdür. Yeniyetməlik dövründə yaxın dostluqlar mühüm sosial dəstək mənbəyi kimi ailəni əvəz edir və bu, yeniyetmənin mənlik anlayışına və sağlamlığına töhfə verir (8). Bu dövrdə yeniyetmələrin çoxu ailələrinə nisbətən tanışlıq münasibətində olduqları insanlarla daha çox vaxt keçirdiklərini ifadə etmişlər.

***Cədvəl. Yeniyetmə yaşlı şagirdlərin yaşadıqları inkişaf problemlərinin cədvəli: valideynlərin, müəllimlərin və şagirdlərin nöqteyi-nəzərindən***

| **İNKİŞAF PROBLEMLƏRİ** | **N (şəxs)** | **F (tezlik)** |
|---|---|---|
| **1. AİLƏVİ**<br>a. Valideynlərlə problemlər | 58 | 238 |
| b. Bacı-qardaş və digər ailə üzvləri ilə problemlər | 12 | 22 |
| **2. HƏMYAŞIDLARLA BAĞLI**<br>a. Həmyaşıdların təzyiqi ilə bağlı problemlər | 38 | 158 |
| b. Qarşı cinslə və romantik münasibətlərlə bağlı problemlər | 25 | 54 |
| **3. TƏHSİL VƏ İXTİSAS SEÇİMİ İLƏ BAĞLI**<br>a. akademik uğursuzluq | 49 | 157 |
| b. Müəllim-şagird münasibətindən yaranan problemlər | 38 | 137 |
| c. Məktəbə uyğunlaşma problemi | 16 | 37 |
| d. Gələcək planlarla bağlı problemlər | 20 | 29 |
| e. İmtahan qorxusu | 45 | 184 |
| **4. ŞƏXSİ**<br>a. Duyğuları ifadə etməkdə problemlər | 38 | 142 |
| b. sosial narahatlıq | 35 | 80 |
| c. koqnitiv təhrif | 32 | 71 |
| d. Özünü qavrayışla bağlı problemlər | 29 | 53 |
| e. Depressiya ilə bağlı problemlər | 19 | 41 |
| **CƏMİ** | **1403** | |

Yaxın dostluq və romantik münasibətlərin formalaşması yeniyetmələr üçün mühüm sosial inkişaf vəzifəsidir. Təbii ki, romantik münasibətlərin həm faydalı, həm də zərərli tərəfləri var. Bunu müəyyən edən amil, şübhəsiz ki, münasibətlərin keyfiyyətidir. Yeniyetmənin çox erkən yaşda bir çox partnyorla münasibət qurmasının uyğunlaşma problemləri ilə əlaqəli olduğu ifadə edilir. Tədqiqatçılar bu vəziyyətin tam təsirini bilməsələr də, romantik təcrübələrin özləri ilə çətinliklər də gətirdiyini söyləmək olar. Uyğunlaşma problemi olan yeniyetmələrin uyğunlaşma problemi olmayan həmyaşıdları ilə müqayisədə romantik münasibətlərə yetkinləşməmiş və həddindən artıq dərəcədə girə bilmələri də ehtimal olunur. Bundan əlavə, romantik münasibətlərin uzunluğu və keyfiyyətinin uyğunlaşma ilə necə əlaqəli olduğuna dair çox məlumat olmadığını söyləmək olar.

Yeniyetmələrin həyatının mərkəzində dayanan romantik həyat təcrübələri və gözləntiləri onların valideynləri və yaşıdları ilə, bir sözlə, yaxın ətrafları ilə münasibətləri ilə sıx bağlıdır. Buna görə də romantik münasibətlərdə emosional ağrıların, ümumiyyətlə, irrasional əlaqə inanclarından qaynaqlandığını söyləmək olar. Ailəsinin və ya ətrafının təsiri altında olan fərd, öz ictimai həyatı ilə əlaqədar olaraq, zorakılığa və ya zorakılığa qarşı davranışlar göstərə bilər.

Tədqiqatlar göstərir ki, tanışlıq münasibətlərində zorakılıq və sui-istifadəyə məruz qalan şəxslər aşağı özgüvən, depressiya, ümidsizlik, maddi asılılıq, silah saxlamaq, intihar düşüncələri və cəhdləri kimi problemli və təhlükəli davranışlara meyllidirlər. Yeniyetmələrin romantik münasibətlərində yaşadıqları problemlər hədələmə, sillə vurma, döymə və.s şəklində inkişaf edə bilər. Yeniyetmələr arasında ümumi olan bu problemlərin həlli üçün tədbirlər görülməzsə, bu, fərdi və cəmiyyəti təhdid edəcək.

Fərdlərin inkişaf dövründə qazanması lazım olan işləri tamamlamaq, özünü tanımaq və özünü olduğu kimi qəbul etmək fərdi uyğunlaşmanı asanlaşdıran ən əsas xüsusiyyətlərdir. Bu baxımdan psixoloji məsləhət və bələdçilik xidmətlərinin fərdin harmoniyasına, ruh sağlamlığının qorunmasına və beləliklə də dinc ictimai həyata qatqı təmin edəcəyi bildirilir. Problemlərin mənbəyi nə olursa olsun, şübhəsiz ki, onların "şəxsi" ölçüsü var. Məsələn, peşəkar sahədə yaşanan problem şəxsi xüsusiyyətdən qaynaqlana bilər. Fərd qərarsızlıq yaşaya bilər. Yenə də onun təhsil mənasında akademik uğursuzluğunun səbəbi özünə inamı və motivasiyasının olmaması ilə bağlı ola bilər. Bir sözlə, problem təhsil, peşəkar və şəxsi ölçüləri əhatə edə bilər. Bununla belə, bu kateqoriyaya aid olan problemlərin digər problem sahələrindən kənarda həll edilə bilən problemlər olduğuna diqqət yetirilmişdir, xüsusən də fərd onları birbaşa yaşayırsa. Burada "maddi sui-istifadə, oğurluq və intihar da fərdin yaşadığı şəxsi problemlər olaraq görülə bilər" ağlına gələ bilər. Lakin qeyd etmək lazımdır ki, bunlar "travmatik problemlər" kateqoriyasındandır. Eynilə, "əks cinsdən və romantik əlaqələrdən qaynaqlanan problemlər"in də şəxsi problemlərə daxil edilməli olduğu düşünülə bilər. Daha əvvəl qeyd edildiyi kimi, yaşanan problemlərin əksəriyyətinin şəxsi aspekti ola bilər. Burada isə həmyaşıdlarla münasibətlərin daha sıx olması səbəbindən "yaşıdlarla problemlər" kateqoriyası altında müzakirə edilmişdir.

Koqnitiv təhriflər fərdlərin sosial münasibətlərində "möhtərəm", "gərəkdir" və digər imperativ əhval-ruhiyyə ilə formalaşan mütləq ifadələrdən ibarət disfunksional düşüncələrə aiddir. Qısaca desək, bunlar həddindən artıq ümumiləşdirmə, ixtiyari nəticə çıxarma, fərdiləşdirmə, həddindən artıq şişirtmə və ya minimuma endirmə, ya hər şey, ya da heç bir bipolyar "naxışlar" (Beck, Rush) şəklində təqdim olunan sistematik məntiq səhvləridir. Məlumatın mənfi şəkildə təhrif edildiyini ifadə edən koqnitiv səhvlər, ümumiyyətlə, üç şəkildə baş verir:

1. Əsas məqsədlərinə çatmaq istəyərkən fərdlərin səylərini yoran və onlara mane olan düşüncələr (Mən istedadlı, uğurlu və bacarıqlı olmalıyam, həyatımda bütün insanların gözündə yaxşı yerlərdə olduğumu sübut etməli və qazanc əldə etməliyəm);

2. Fərd, özündən, başqasından və dünyadan, real olaraq əsassız tələblər irəli sürmək (bütün insanlar mənə qarşıdır!);

3. Şəxslər hadisələri ifrat və neqativist şəkildə şərh edirlər (İstədiyim dərhal və heç bir çətinlik çəkmədən yerinə yetirilməlidir, əks halda bu, dəhşətli vəziyyət olardı. Mənə mane olmaqlarına dözə bilmirəm!).

Yeniyetməlik dövründə baş verən kritik hadisələrin fərdin şəxsiyyətinin formalaşmasında mühüm rol oynadığını və bu dövrə nəzər saldığımız zaman irrasional inancların hələ də "sümükləşmədiyini", buna görə də uşaqlıqda bu idrak səhvlərini necə təyin etmək olar və yeniyetməlik və onların digər psixoloji dəyişənlərlə necə əlaqəsi var? Koqnitiv səhvlər narahatlıq, qəzəb və stress, xüsusilə depressiya kimi bir çox psixoloji pozğunluqlara səbəb ola bilər və beləliklə, yeniyetmələr üçün onsuz da çətin olan bu prosesi daha da çətinləşir. Ancaq yeniyetmələrin ilk yeniyetməlik dövründə daha mücərrəd və məntiqli düşünə bildiklərini nəzərə alsaq, ilk yeniyetməlik dövrünün disfunksional mənfi duyğulara səbəb olan irrasional inanclar yerinə daha funksional düşüncələr yaratmağa çalışması istiqamətində işləmək vacibdir bu baxımından inkişaf baxımından üstünlük təşkil etdiyi məlumdur.

Sosial narahatlıq, cəmiyyətdə və ya performans tələb olunan vəziyyətlərdə başqaları tərəfindən müşahidə olunma hissi, həmçinin alçaldılma qorxusu və buna uyğun olaraq şiddətli narahatlıq ilə xarakterizə olunan bir xəstəlikdir.

Yeniyetmələrin sosial mühitlərdə yaşadıqları narahatlıq səviyyəsinin tək olduqları zamana nisbətən daha yüksək olduğu müşahidə edilir. Sosial mühitlərin eyni olması fərdlərin yaşadıqları narahatlığın şiddət dərəcələrindəki fərqlərə mane olmur. Məsələn, bəzi insanlar bu narahatçılığın öhdəsindən çox asanlıqla çıxa bilsələr də,

bəziləri yaşadıqları yüksək narahatlığa görə ünsiyyətdə belə ciddi problemlər yaşaya bilər.

Yeniyetmə cəmiyyətdə olarkən bütün gözlərin onun üzərində olduğunu hiss etmək, tənqidə məruz qalmaq, alçaltmaq və rüsvay edilmək qorxusunu o qədər yaşayır ki, artıq olduğu yerdə qala bilmir. İçində olduğu vəziyyətdən və mühitdən dərhal xilas olmaq istəyir. Fərd bu sıxıntılı vəziyyətdən xilas olmaq və ya bu qorxunu bir daha yaşamamaq üçün performans tələb edən vəziyyətlərdən qaçmağa və cəmiyyətdən uzaqlaşmağa çalışır. Yaşanan narahatlıq son dərəcə güclü olsa da, müxtəlif fiziki simptomlara da səbəb ola bilər. Bunlar; tərləmə, qızartı, nəfəs darlığı, ürək bulanması, titrəmə meydana gəlir və fərd üçün həyatı dözülməz edir (3). Bədənin əlamətləri zəiflik kimi qəbul edildiyi üçün, başqası tərəfindən fərq edildiyində özünün alçaldılacağına inanmaq qorxunu bir daha qaçılmaz edir. Özünü reallaşdıran fərd olmağın yollarından biri; özünü tanımaq, özü ilə barışmaq, cəmiyyətdə insanlarla yaşamağın tələb etdiyi sosiallaşma və yaxınlığa nail olmaq, başqa insanlara nümunə olmaq kimi ifadə edilir. Məlum olduğu kimi, müasir cəmiyyətlər təhsil, səhiyyə və iqtisadi siyasətlərini fərdlərin özünü dərk etmələrinə kömək etmək və onların biopsixo-sosial optimal inkişafına töhfə vermək əsasında qururlar. Buradan da başa düşüldüyü kimi, sosial narahatlıq fərdlərin özünü dərk etməsinə, bacarıqlarını ortaya qoyaraq özünü inkişaf etdirməsinə, istehsal edən və paylaşmağı bilən fərdlər ola bilməsinə, cəmiyyətlə harmoniya içində yaşamasına mane olan fenomendir (2).

Suomalainen və digərləri (2011: 490-497) 4 ay sonra silahlı hücuma məruz qalan yeniyetmələrin psixoloji nəticələrini araşdırmaq üçün apardıqları nəzarətli təqib tədqiqatında yeniyetmələr arasında silahlı təzyiqin uzunmüddətli təsirini araşdırmağı məqsəd qoydular. Bunun üçün 2007-ci ilin noyabrında Jokela Liseyində bir şagirdin əvvəlcə 8 nəfəri, sonra isə özünü güllələdiyi Finlandiyadakı məktəbi nümunə götürdülər. Araşdırmanın nəticələrinə görə, məktəbdəki qız şagirdlərin yarısının, oğlan şagirdlərin isə üçdə birinin travma sonrası stress yaşadığı müşahidə edilib (5). Post-travmatik stress pozğunluğu yüksək səviyyədə travma sonrası stress yaşayan qızların 27% və oğlanların 7%-ində müşahidə edilmişdir. Travmatik bir hadisəyə həddindən artıq və ya şiddətli məruz qalmanın və qadınlarda risk amilini artırdığı aşkar edilmişdir. Qadınların 42% və kişilərin 16%-i psixiatrik pozğunluqdan əziyyət çəkirdi; qəbul edilən ailə və dost dəstəyinin qoruyucu funksiyaya malik olduğu müəyyən edilmişdir. Nəticədə müşahidə edilən risk və qoruyucu amillərin əvvəlki tədqiqatlara bənzədiyi, yeniyetməlik dövründə travma ilə bağlı amillərin müəyyənləşdirilməsinin sonrakı tədqiqatlar üçün zəruri olduğu vurğulanıb. “Yeniyetmələrin fiziki zorakılığı: yeniyetmələrdə psixiatrik pozğunluq üçün risk faktoru” adlı araşdırmanın məqsədi digər məlum risk faktorlarına nəzarət edildikdən sonra fiziki zorakılığın yeniyetmə psixopatologiyası üçün əlavə risk faktoru olub-olmadığını yoxlamaqdır. Nyu-York Dövlət Sosial Xidmətlər Departamentində fiziki zorakılığı sənədləşdirmiş 12-18 yaşlı 99 yeniyetmə işə götürüldü. Yeniyetmələr yaşı, cinsi, irqi və sosial-iqtisadi vəziyyətinə görə zorakılığa məruz qalmayan 99 yeniyetmə ilə eyniləşdirildi. Diaqnostik müsahibələr və tədbirlər psixopatologiya üçün seçilmiş risk faktorları yeniyetmələrə və onların ailələrinə tətbiq edilmişdir. Sonra çoxlu logistik reqressiya modelindən istifadə edərək fiziki zorakılığın əlavə etdiyi riskin yeniyetmənin psixopatologiyasına töhfə verib-vermədiyi yoxlanılmışdır. Nəticədə fiziki zorakılıq: major depressiya, distimiya, davranış pozğunluğu, maddə istifadəsi və siqaretin bu diaqnozları nəzərə alaraq, digər risk faktorlarına əhəmiyyətli dərəcədə təsir etdiyi aşkar edilmişdir. Fiziki zorakılığın yeniyetmələrin unipolar depressiv pozğunluqları, pozucu davranış pozğunluqları, siqaret çəkmə və digər psixiatrik xəstəliklər üçün çox ciddi risk faktoru olduğu müəyyən edilmişdir.

**Problemin aktuallığı.** Ailədə yeniyetmələrin sosiallaşmasına və sosial bacarıqlarının formalaşmasına təsir edən əsas amillər mövzusu bütün dövrlərdə aktual sosial pedaqoji problemlərdən biridir.

**Problemin elmi yeniliyi.** Ailədə yeniyetmələrin sosiallaşmasına və sosial bacarıqlarının formalaşmasına təsir edən əsas amillərin araşdırılması və bununla bağlı aparılan tədqiqatların statistik məlumatlar şəklində verilməsi aktualdır. Yeniyetmələrin sosiallaşmasına və sosial bacarıqlarının formalaşmasında ailənin rolunu da xüsusi ilə qeyd edilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə yeniyetmə, valideynlər, pedaqoqlar, psixoloqlar üçün maraqlı yenilikçi ideyalara malikdir.

**Ədəbiyyat:**


1. Abbasov AN. Milli əxlaq və ailə etikası: Ali təhsil müəssisələrinin magistratura pilləsi üçün dərslik. Bakı: Mütərcim, 2016, 226 s.
2. Adams, G. (2000). Adolescent Development the Essential Readings. Blackwell Publishers Ltd. UK: Oxford
3. Adams, G.R. and Berzonsky, M.D. (2003). Blackwell Handbook of Adolescence, Australia: Blackwell Publishing.
4. Asarnow, J.R., Tompson, M., Hamilton, E.B., Goldstein, M.J. and Guthrie, (1994). Family-expressed emotion, childhood-onset depression, and child hood-onset schizophrenia spectrum disorders; is expressed emotion a nopecific correlate of child psychopathology or a specific risk factor for dep ression Journal of Abnormal Child Psychology, 22(2), 129-146.
5. Aviles, A.M., Anderson, T.R. and Davila, E.R. (2006). Child and adolescent social-emotional development within the context of school. Child and Ad lescent Mental Health, 11(1), 32-39.
6. Bayramov Ə.S., Əlizadə Ə.Ə. Sosial psixologiyanın aktual məsələləri: Nəzəriyyə. Metodika. Axtarış-lar. Bakı, 1998.
7. Barzilay, S. and Apter, A. (2014). Psychological models of suicide. Archives of suicide research, 18(4), 295-312.
8. Beck, A.T., Rush, A.J., Shaw, B.F.and Emery, G. (1987). Cognitive therapy of depression. New York: The Guildford PressBergeron, D. B. (2007).
9. Əliyev R.İ. Şagird şəxsiyyətinin formalaşmasının etnopsixoloji əsasları: psix.elm.dok. ... dis. Bakı, 2004, 270 s.
10. Abbasov A.N. Ailə pedaqogikası: Ali təhsil müəssisələri üçün dərslik. Bakı: Mütərcim, 2019.
11. N.B. İmamverdiyeva, N.S. Mirzəliyeva. Yeniyetməlik və yetginlik yaşına çatmış uşaqların sosiallaş-masına ailədaxili münasibətlərin təsiri: Metodik vəsait. Bakı: Müəllim, 2022. 207 s.


**E-mail:** mirzeliyevanermine@gmail.com,

**Rəyçilər:** *ped.elm.dok., prof* **R.L. Hüseynzadə,**
*ped.elm.dok., prof* **L.N. Qasımova**
**Redaksiyaya daxil olub:** 11.11.2022.

Xalqımızın tarixinin əsasını təşkil edən bütün mərhələlərdə, keçmiş əsrlərdə yüksək mənəviyyat olmuşdur. Keçmiş tariximizdən bizə qalan simaları bu gün dünyada məşhurlaşdıran və bizim üçün örnək edən, bizim üçün nümunə edən onların yüksək mənəviyyatıdır, yüksək amallarıdır. Ona görə də bu gün mənəvi tərbiyə bəlkə də keçmiş illərdən daha çox lazımdır. Gənclərimiz milli ruhda tərbiyə olunmalıdır, bizim milli-mənəvi dəyərlərimizin əsasında tərbiyələnməlidir. Gənclərimiz bizim tariximizi yaxşı bilməlidir, milli dəyərlərimizi yaxşı bilməlidir. Milli dəyərlərimizi, milli ənənələrimizi yaxşı bilməyən, tariximizi yaxşı bilməyən gənc vətənpərvər ola bilməz” (3, s. 82-83).

Müasir dünya təhsilə və ümumilikdə sosial-mədəni siyasətə yanaşmalarda köklü dəyişikliklərə məruz qalır. Heç şübhəsiz, bu, cəmiyyətin insanın şəxsi keyfiyyətlərinin inkişafı və formalaşması yönündə yenidən istiqamətlənməsi ilə bağlıdır. XXI əsr hər bir sosial inkişafın əsas məqsədinin yalnız fərdin özünü dərketməsi ilə xarakterizə olunur. İctimai şüurda baş verən bu dəyişikliklər müasir təcrübənin işləyib hazırladığı yanaşma və konsepsiyalara əsaslanan yeni təhsil paradiqmasının yaranmasına səbəb olmuşdur ki, burada xüsusilə, “inklüziv təhsil” konsepsiyası mühüm yer tutur.

İnklüziv təhsil (*fr. inclusif* – daxil olma, *lat. include* – daxil etmək) – bütün uşaqların müxtəlif ehtiyaclarını ödəmək, beləliklə, xüsusi ehtiyacı olan uşaqların təhsilə çıxışını təmin etmək baxımından hər kəs üçün təhsilin mövcudluğunu nəzərdə tutan ümumi təhsilin inkişafı prosesidir. İnklüziv təhsil bütün uşaqların müxtəlif öyrənmə ehtiyacları olan fərdlər olduğunu qəbul edən xüsusi metodologiyanı inkişaf etdirən təhsil konsepsiyasıdır. Bu təhsil konsepsiyası müxtəlif öyrənmə ehtiyaclarını ödəmək üçün daha çevik olan tədris və öyrənmə yanaşmasını inkişaf etdirməyə çalışır. Əgər inklüziv təhsilin tətbiq etdiyi dəyişikliklər nəticəsində tədris və öyrənmə daha effektiv olarsa, bütün uşaqlar (yalnız xüsusi qayğıya ehtiyacı olan uşaqlar deyil) bundan faydalanacaqlar.

Ümumiyyətlə, inklüziv təhsilin inkişafı ilə bağlı bu günədək beynəlxalq səviyyədə bir sıra müddəaların yer aldığı müvafiq qanunlar, bəyannamələr, proqramlar qəbul edilmişdir.

1924-cü ildə ilk dəfə olaraq uşaqların əqli və fiziki zəifliyinə görə xüsusi müdafiəyə ehtiyacı olması haqqında müddəalar Millətlər Liqasının Uşaq Hüquqlarının bəyannaməsində (Cenevrə Bəyannaməsi) öz əksini tapmışdır. 1947-1948-ci illərdə isə BMT-də Ümumdünya İnsan Hüquqları Bəyannaməsinin 2-ci maddəsində hər bir insanın irqi, dərisinin rəngi, cinsi, dili, dini, siyasi və digər əqidələri, milli və sosial mənsubiyyəti, əmlak vəziyyəti və digər vəziyyətlərinə görə heç bir fərq qoyulmadan bütün hüquqlara və azadlıqlara malik olması qeyd olunmuşdur (5, s. 49-58).

1989-cu ildə qəbul edilmiş Uşaq Hüquqları Konvensiyası (Uşaq Hüquqları Bəyannaməsi) uşaqların sosial, iqtisadi, mədəni, mülki, siyasi və müdafiə hüquqlarını əhatə edən və uşaqların fikirlərinin nəzərə alınmalı olduğunu bildirən ilk bütöv insan hüquqları müqaviləsidir. Konvensiya həm imkan bərabərliyi əsasında təhsil hüququnu, həm də uşağın mümkün qədər tam inkişafına kömək etmək baxımından təhsilin ümumi məqsədlərini özündə əks etdirir. Konvensiyanın 2-ci maddəsində ilk dəfə olaraq dövlətin hər bir uşağın bütün hüquqlarının ayrı-seçkilik olmadan, o cümlədən əlilliyə görə həyata keçirilməsini təmin etmək öhdəliyi önə çəkilir. 23-cü maddədə isə əlilliyi olan uşaqların sosial inklüzivliyini təşviq edən təhsilə çıxış əldə etmələrinə köməklik hüququna toxunulur. Bununla yanaşı, Uşaq Hüquqları Komitəsi əlilliyi olan uşaqların hüquqlarına dair 9-cu Ümumi Şərhdə həmçinin vurğulamışdır ki, inklüziv təhsil əlilliyi olan uşaqların təhsilində məqsəd olmalıdır (https://www.ohchr.org/ru/treaty-bodies/crc).

BMT-nin Təhsil, Elm və Mədəniyyət Təşkilatının ixtisaslaşmış təşkilatı YUNESKO da inklüziv təhsilin ən universal tərifini bütün uşaqlar üçün istisnasız olaraq keyfiyyətli təhsilə bərabər çıxışı nəzərdə tutan vahid fenomen kimi vermişdir (9, s. 182). O, ilk növbədə humanizmə, intellektin və yaradıcılıq qabiliyyətlərinin inkişafına, şəxsiyyətin intellektual, etnik, emosional və fizioloji komponentlərinin tarazlığına əsaslanır.

1994-cü il iyunun 7-10-da YUNESKO-nun dəstəyi ilə İspaniyada Salamankada keçirilən Xüsusi ehtiyacı olan şəxslər üçün təhsil: əlçatanlıq və keyfiyyət üzrə Ümumdünya Konfransında sağlamlıq imkanları məhdud uşaqların təhsili üçün innovativ təhsil konsepsiyası təqdim edilmişdir. Əlilliyi olan şəxslərin təhsili

üçün konseptual çərçivə Salamanka Bəyannaməsində və Xüsusi ehtiyacı olan şəxslərin təhsili üzrə fəaliyyət çərçivəsində müəyyən edilmişdir. Məhz YUNESKO-nun himayəsi altında xüsusi qayğıya ehtiyacı olan şəxslərin təhsili üzrə ümumdünya konfransında bütün ölkələrin hökumətlərinə müraciətdə inklüziv təhsil prinsipi elan edilmişdi.

2006-cı ilin dekabrında Birləşmiş Millətlər Təşkilatının Baş Assambleyası tərəfindən qəbul edilmiş "Əlilliyi olan şəxslərin hüquqları haqqında" Konvensiya unikal beynəlxalq hüquqi müqavilə hesab olunur ki, o, 185 dövlət və Avropa İttifaqı tərəfindən imzalanmışdır. Konvensiyanın 1-ci maddəsində əlilliyi olan uşaqların hamı kimi bərabər səviyyədə bütün insan hüquqları və azadlıqlardan tam şəkildə istifadə etməsi, həmçinin ictimai həyatda hamının bərabər qaydada iştirakına diqqət yetirilməsi vurğulanmışdır. Bununla yanaşı, əlilliyi olan uşaqların oynamaq, idman tədbirlərində və mədəni həyatda digərləri ilə birgə iştirak etməsinin əhəmiyyəti də qeyd edilmişdir.

Son illər Azərbaycanda inklüziv təhsilin inkişafına böyük diqqət yetirilir. Bu da başa düşüləndir: bütün dünyada olduğu kimi, ölkədə də bu tip təhsilə ehtiyacı olan uşaq və gənclərin sayı sürətlə artır. Əgər əvvəllər bu vətəndaşlar kateqoriyasına yalnız fiziki imkanları məhdud olan insanlar daxil idisə, bu gün bu problemin əhatə dairəsi daha genişdir. Bunun isə bir çox səbəbləri var. Belə ki, müxtəlif psixoloji pozğunluqları olan uşaqların sayının artmasını təkcə ASP-nin (Autizm spektr pozuntusu) yayılması ilə deyil, həm də uşağın köç etməsi, yeni yerə uyğunlaşması, ailə-məişət çətinlikləri, pisləşən ekologiya və s. səbəblərdən asılıdır. Bununla yanaşı, müasir vunderkind uşaqları da bu, xüsusi uşaqlar kateqoriyasına daxil etmək olar. Axı, onların inkişafı ümumi qəbul edilmiş normalara uyğun gəlmir, belə uşaqlar nəinki ətraf mühitdə, hətta valideynləri tərəfindən də həmişə başa düşülmür və qəbul edilmir.

Mövzunu dərindən araşdıranda görürük ki, bu gün inklüziv təhsil, daha doğrusu, onun inkişafı və bu sahədə problemlərin həlli əslində bəşəriyyətin qarşısında duran ən qlobal vəzifələrindən biridir. İnsan sosial varlıq olduğundan cəmiyyətdən kənarda onun inkişafı mümkün deyil. Təbii ki, daxil olmaq təkcə fiziki maneələrlə bağlı deyil, həm də sosial, psixoloji xarakter daşıyan məsələdir. Bu, cəmiyyətin bütün uşaqların birlikdə öyrənməsinə hazır olması məsələsidir. Bu baxımdan inklüziv təhsil konsepsiyası hər bir dövlətin siyasətində xüsusi yerə malik olmalıdır.

Respublikamızda inklüziv təhsilin təşkil edilməsi sahəsində Təhsil Nazirliyi tərəfindən 2005-2009-cu illərdə "Xüsusi qayğıya ehtiyacı olan (sağlamlıq imkanları məhdud) uşaqların təhsilinin təşkili ilə əlaqədar İnkişaf Proqramı" həyata keçirilmişdir. Bu baxımdan xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsil almaq hüququnun təmin edilməsi, eləcə də inklüziv təlimə keçid edilməsi, təhsil müəssisələrində bütün uşaqların təhsili üçün bərabər imkanların yaradılması istiqamətində olduqca mühüm işlər görülmüşdür. Qeyd edək ki, müvafiq proqram çərçivəsində 2005-ci ildən başlayaraq nazirlik və YUNİSEF tərəfindən Azərbaycanda birgə inklüziv təhsil layihələri həyata keçirilməyə başlanmışdır.

Bununla yanaşı, 2008-ci ildə Azərbaycan Respublikası "Əlillərin hüquqları haqqında" Konvensiyanı ratifikasiya etmiş və qanun 2009-cu ildən qüvvəyə minmişdir. Bu konvensiyanın əsas məqsədi onun 1-ci maddəsində göstərilir. Burada qeyd olunur ki, "bütün əlil insanların insan hüquqları və əsas azadlıqlarından tam və bərabər imkanlarla yararlanmalarına təkan vermək, bunu müdafiə və təmin etmək, habelə onların ləyaqətinə hörmətlə yanaşılmasını dəstəkləməkdir". Hazırda əlilliyi olan şəxslərin hüquqi statusu Azərbaycan Respublikası Konstitusiyası və "Əlilliyin və uşaqların sağlamlıq imkanları məhdudluğunun qarşısının alınması, əlillərin və sağlamlıq imkanları məhdud uşaqların reabilitasiyası və sosial müdafiəsi haqqında" Azərbaycan Respublikasının Qanunu ilə müəyyən edilir.

2009-cu ildə qəbul olunmuş Azərbaycan Respublikası "Təhsil haqqında" Qanununun 5-ci maddəsinə əsasən "Dövlət hər bir vətəndaşın təhsil alması üçün müvafiq şəraitin yaradılmasına təminat verir və təhsilin hər hansı pilləsindən, səviyyəsindən və formasından məhrum edilməsinə yol vermir, cinsindən, irqindən, dilindən, dinindən, siyasi əqidəsindən, milliyyətindən, iqtisadi və sosial vəziyyətindən, mənşəyindən, sağlamlıq imkanlarından asılı olmayaraq hər bir vətəndaşa təhsil almaq imkanı yaradılmasına və inklüziv siniflərdə təlimin təşkilində ayrı-seçkiliyə yol verilməməsinə təminat verilir" (1).

Təhsil Nazirinin 18 mart 2015-ci il tarixli, 311 nömrəli əmrinə əsasən, "İbtidai təhsil səviyyəsi üzrə inklüziv təhsilin tətbiqi" layihəsinin icra olunmuşdur. Layihədə sağlamlıq imkanları məhdud uşaqların təhsilə cəlb olunması qaydalarının yenilənməsi, xüsusi təhsil sahəsində yeni metodikaların tətbiqi və ümumtəhsil məktəblərində sağlamlıq imkanları məhdud uşaqlar üçün yeni xidmətlərin yaradılması nəzərdə tutulmuşdur. Əlilliyi olan uşaqların ümumtəhsil məktəblərində təhsilə cəlb olunması məqsədilə Azərbaycanda ibtidai təhsil səviyyəsində inklüziv təhsil modelinin hazırlanması işlərinə başlanılmış, fəaliyyət planı və yol xəritəsi tərtib edilmişdir.

2017-ci ildə isə "2018-2024-cü illərdə Azərbaycan Respublikasında sağlamlıq imkanları məhdud şəxslər üçün inklüziv təhsilin inkişafı üzrə Dövlət Proqramı" təsdiq olunmuşdur. Bu proqramın məqsədi isə sağlamlıq imkanları məhdud şəxslərin təhsil hüququnu təhsilin bütün pillələri üzrə digər şəxslərlə bərabər səviyyədə təmin etməkdən və onların təhsili üçün maneəsiz mühit yaratmaqdan ibarətdir.

Ümumilikdə tarixi inkişaf prosesində sağlamlığı məhdud olan uşaqların təhsil sistemi təcriddən inklüzivliyə doğru getmişdir. İnklüziv təhsilə cəlb olunan uşaqların məktəbdə tədrisinin tarixini aşağıdakı mərhələlərə bölmək olar. XX əsrin 60-cı illərinin əvvəlindən ortalarına qədər – əlilliyi olan insanların təcrid olunmasına səbəb olan **"tibbi model"**. 1960-cı illərin ortalarından 1980-ci illərin ortalarına qədər əlilliyi olan insanları ictimai həyata inteqrasiya edən **"normallaşma modeli"**. XX əsrin 80-ci illərindən bu günədək **"daxil etmə modeli"**, yəni, inklüziya.

"Tibbi model" ictimai şüurda ən çox yayılmış modeldir. O, əlilliyi şəxsin xəstəliyi, zədələnməsi və ya sağlamlığına başqa təsirlər nəticəsində yaranmış hadisə hesab edir. Bu model tibbi müdaxilənin və mütəxəssislər tərəfindən müalicənin zəruriliyini vurğulayaraq, eyni zamanda cəmiyyətin də qarşısında əlilliyi olan insanlara kömək etmək, onların oxuya biləcəyi, işləyə biləcəyi və ünsiyyət qura biləcəyi ixtisaslaşdırılmış müəssisələr yaratmaq öhdəliyi qoyur. Buna baxmayaraq, tibbi model əsasən əlilliyi olan insanların təcrid olunmasının tərəfdarı olaraq çıxış edir (8, s. 256).

"Normallaşma" konsepsiyasının fundamental özəyi isə ondan ibarət idi ki, uşağın tərbiyəsi onun yaşadığı cəmiyyətin qəbul etdiyi mədəni normalar ruhunda həyata keçirilməlidir. Bu konsepsiya ABŞ-da, Kanadada, sonra isə bir sıra başqa ölkələrdə qəbul edilmiş və daha da inkişaf etdirilmiş, həmçinin növbəti illər üçün əlilliyi olan uşaqlarla bağlı siyasəti müəyyən etmişdir. "Normallaşma" modeli ümumiyyətlə uşağın məktəb və cəmiyyət tərəfindən qəbul olunmağa hazır olmasını nəzərdə tutur (7, s. 19-23).

İnklüziya və ya "daxil etmə modeli" xüsusi ehtiyacı olan uşaqların ümumi məktəblərdə təhsilini təsvir edən termindir. Eyni zamanda, bu təhsil adi, xüsusi və inteqrasiyadan fərqlidir. Belə ki, inklüzivlik əlilliyi olan şagirdlərə özlərinə inam vermək və onları digər uşaqlar – dostlar və qonşularla birlikdə məktəbdə oxumağa həvəsləndirmək imkanıdır. İnklüziv məktəbin əsas prinsipi ondan ibarətdir ki, xüsusi təhsilə ehtiyacı olan uşaqlar sağlam həmyaşıdları ilə birlikdə, aralarındakı çətinliklərə və ya fərqlərə baxmayaraq ümumi maraqlara cavab verən təhsilə yiyələnməlidirlər. İnklüziv təhsil problemi ilə bağlı tədqiqatların təhlili inklüzivliyin aşağıdakı prinsiplərini qeyd etməyə imkan verir:

– bütün təhsilalanların və müəllimlərin cəmiyyət üçün bərabər dəyərinin tanınması;

– şagirdlərin məktəblərin mədəni həyatında iştirak dərəcəsinin artırılması və eyni zamanda bəzi şagirdlərin ümumi məktəb həyatından təcrid olunması səviyyəsinin azaldılması;

– maneələri aradan qaldırmaq və ayrı-ayrı şagirdlər üçün məktəblərin əlçatanlığını yaxşılaşdırmaq cəhdlərinin təhlili və öyrənilməsi, bütövlükdə məktəbin bütün şagirdlərinin mənafeyinə yönəlmiş islahatların və dəyişikliklərin həyata keçirilməsi;

– məktəblərin təkcə şagirdlərin akademik göstəricilərinin yüksəldilməsində deyil, həm də sosial dəyərlərin inkişafında rolunun tanınması;

– təhsilə inklüzivliyin cəmiyyətə daxil olma aspektlərindən biri kimi tanınması (10, s. 256).

Bir sıra Avropa ölkələrində inklüziv təhsilin zəngin praktiki təcrübəsi aydın şəkildə göstərir ki, cəmiyyətin və dövlətin müəyyən hüquqi, mədəni və iqtisadi inkişafına nail olmaqla sağlamlıq imkanları məhdud, inklüziya kateqoriyasına aid uşaqların müntəzəm təhsil müəssisələrinə uğurlu inteqrasiyası nəinki mümkün olur, həm də olduqca zəruri məsələdir.

Bu baxımdan, ümumi təhsil müəssisəsində inklüziv təhsilin təşkili üçün aşağıdakı tədbirlərin həyata keçirilməsi mühüm aktuallıq kəsb edir:

***– Kadrların xüsusi hazırlığı.*** Praktik bacarıq və biliklərin olmaması səbəbindən əksər müəllimlər, sadəcə olaraq, əlilliyi olan uşaqlara dərs deməyə hazır olmur. Buna görə də bütün müəllimlər üçün xüsusi təlimin təşkili mühüm vəzifəyə çevrilir. Bundan əlavə, inklüziv təhsil üçün şəraitin uğurlu yaradılması yalnız ümumi təhsil müəssisələrində loqoped, defektoloq, psixoloq və tibb işçilərinin sayının artırılması ilə mümkündür.

***– Bütün səviyyələrdə effektiv qarşılıqlı əlaqənin təmin edilməsi.*** Burada əsas hədəf təhsil müəssisəsi ilə psixoloji yardım mərkəzləri, müvafiq şöbələr və tibb müəssisələri, bu sahədə fəaliyyət göstərən qeyri-hökumət təşkilatları arasında möhkəm əlaqələrin yaradılmasıdır. Əlilliyi olan uşağı böyüdən ailə ilə müəssisə arasında yüksək keyfiyyətli əks əlaqənin təşkili də eyni dərəcədə vacibdir.

***– Müəssisələrin maddi-texniki təchizatı.*** Əlilliyi olan uşaqlar üçün təhsil müəssisəsində əlçatan mühitin yaradılması pandusların, tutacaqların və hasarların quraşdırılmasını, habelə xüsusi tualet kabinələrinin olmasını tələb edir. Bundan əlavə, qapı girişlərinin genişləndirilməsi, sinif otaqlarında əlavə yerlərin ayrılması, elektroakustik qurğuların və siqnal işıqlarının quraşdırılması, sinif otaqlarının adlarının yazılması və Brayl əlifbası ilə dublyaj edilməsi üçün iri kontrastlı lövhələrdən istifadə etmək lazımdır. Əlilliyi olan uşaqlar üçün narahatlıq yaradan bütün digər praktiki cəhətlər də nəzərə alınmalıdır.

Beləliklə, inklüziya təkcə xüsusi təhsilə ehtiyacı olan uşaqlar üçün deyil, həm də sağlam uşaqlar üçün daha inkişaf etmiş, humanist və səmərəli təhsil sistemi kimi tanınır. İnklüziv məktəb sisteminin meyarlarına uyğun olub-olmamasından asılı olmayaraq hər kəsə təhsil almaq hüququ verir. Çünki məktəb təkcə təhsil funksiyalarını yerinə yetirmir, həm də uşağın həyatının əsas sahəsidir. Məktəb onların bir birilərinin fərdiliyinə hörmətlə yanaşması və qəbul etməsi məqsədilə təhsil trayektoriyasına malik şəxsiyyət formalaşdırır. Şəxsiyyətin inkişafında və formalaşmasında isə təlim-tərbiyənin, təhsilin rolu çox böyükdür.

Məktəbdə şagirdlər bir komandada olur, bir-biri ilə ünsiyyət qurmağı, münasibətlər yaratmağı, müəllimlə birlikdə təhsil problemlərini yaradıcı şəkildə həll etməyi öyrənirlər. Əminliklə demək olar ki, inklüziv təhsil bütün uşaqların şəxsi imkanlarını genişləndirir, insanpərvərlik, tolerantlıq, köməyə hazır olmaq kimi keyfiyyətlərin formalaşmasına kömək edir. İnklüziv təhsil prinsipcə yeni sistemdir ki, burada şagird və müəllimlər ümumi məqsəd – istisnasız olaraq bütün uşaqlar üçün əlverişli və yüksək keyfiyyətli təhsil istiqamətində çalışırlar.

**Problemin aktuallığı.** İnklüziv təhsil bütün uşaqların müxtəlif öyrənmə ehtiyacları olan fərdlər olduğunu qəbul edən xüsusi metodologiyanı inkişaf etdirən təhsil konsepsiyasıdır. Bu təhsil konsepsiyası müxtəlif öyrənmə ehtiyaclarını ödəmək üçün daha çevik olan tədris və öyrənmə yanaşmasını inkişaf etdirməyə çalışır.

**Problemin yeniliyi.** Bu gün inklüziv təhsil, daha doğrusu, onun inkişafı və bu sahədə problemlərin həlli əslində bəşəriyyətin qarşısında duran ən qlobal vəzifələrindən biridir. İnsan sosial varlıq olduğundan cəmiyyətdən kənarda onun inkişafı mümkün deyil. Təbii ki, daxil olmaq təkcə fiziki maneələrlə bağlı deyil, həm də sosial, psixoloji xarakter daşıyan məsələdir. Bu, cəmiyyətin bütün uşaqların birlikdə öyrənməsinə hazır olması məsələsidir. Bu baxımdan inklüziv təhsil konsepsiyası hər bir dövlətin siyasətində xüsusi yerə malik olmalıdır.

**Problemin praktik əhəmiyyəti**. Məqalə doktorant və dissertantlar, universitet və orta məktəb müəllimləri üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu. Bakı şəhəri, 19 iyun 2009-cu il. № 833-IIIQ / https://e-qanun.az/framework/18343
2. Birləşmiş Millətlər Təşkilatının (2006) Uşaq Hüquqları Komitəsi, Ümumi Şərh № 9: Əlilliyi olan uşaqların hüquqları, CRC/C/GC/9, fevral 2007 CRC/C/GC/9/Corr.1. https://www.ohchr.org/ru/treaty-bodies/crc
3. Əhmədov H.H. Azərbaycan təhsilinin inkişafı strategiyası / H.H. Əhmədov –Bakı: Elm, 2010. 800 s. 82-83
4. Əhmədov H.H. Pedaqogika. Bakalavr hazırlığı üçün dərslik. II nəşr / H.H. Əhmədov, N.E. Zeynalova. – Bakı: Elm və təhsil, 2018, 455 s.
5. Xudaverdiyeva T. İnklüziv təhsildə təlimin təşkili prinsipləri: perspektivlər və nəticələr // Azərbaycan məktəbi 2021, № 3, s. 49-58

6. George F. Kneller. Introduction to the Philosophy of Education. New York: John Wiley and Sons, 1971. 118 p.
7. Nirje B. The normalization principle and its human management implications // The International Social Role Valorization Journal, 1994, № 2. s. 19-23
8. Епифанова Е. В. Правовые основы медико-социальной экспертизы: учебное пособие. /Е.В. Епифанова. – Краснодар: Краснодарский архитектурно-строительный техникум, 2013. 256 с.
9. Малофеев Н. Н. Специальное образование в России и за рубежом / Н. Н. Малофеев. – Москва, 1997. с. 182.
10. Обучение детей с проблемами в развитии в разных странах мира: Хрестоматия / Сост. Л.М.Шипицына. – СПб., 1997. 256 с.

**E-mail:** ilahamiraslanova@gmail.com
**Rəyçi:** *ped.elm.dok., prof.* **H.H. Əhmədov,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 16.12. 2022

# İNGİLİS DİLİNİN TƏDRİSİ METODİKASI
# МЕТОДИКА ПРЕПОДАВНИЯ АНГЛИЙСКОМУ ЯЗЫКУ
# METHODS OF TEACHING ENGLISH

UOT 372.881.111.1

**Ülviyyə Murad qızı Məmmədova**
*Mingəçevir Dövlət Universitetinin müəllimi*

## SAĞLAMLIQ İMKANLARI MƏHDUD UŞAQLARA İNGİLİS DİLİNİN TƏDRİSİNİN SƏMƏRƏLİ YOLLARI

**Ульвия Мурад гызы Мамедова**
*преподаватель Мингячевирского Государственного Университета*

## ЭФФЕКТИВНЫЕ СПОСОБЫ ОБУЧЕНИЯ АНГЛИЙСКОМУ ЯЗЫКУ ДЕТЕЙ С ОГРАНИЧЕННЫМИ ВОЗМОЖНОСТЯМИ ЗДОРОВЬЯ

**Ulviya Murad Mammadova**
*lecturer at Mingachevir State University*

## EFFECTIVE WAYS OF TEACHING ENGLISH TO CHILDREN WITH DISABILITIES

**Xülasə.** İnklüziv təhsil sağlamlıq imkanları məhdud uşaqların təhsil hüququnun həyata keçirilməsinə, eyni zamanda, cəmiyyətə inteqrasiyasına şərait yaradır. İnklüziv təhsil hər bir uşağın əsas hüquqlarından biridir. Məqalədə sağlamlıq imkanları məhdud olan uşaqlara ingilis dilinin öyrədilməsinin səmərəli yollarından bəhs olunur.

***Açar sözlər:*** *inklüziv, şagird, təlim, ingilis dili, xüsusi qayğıya ehtiyacı olan uşaqlar, təlim metodları*

**Резюме.** Инклюзивное образование обеспечивает доступ к праву на образование для детей с ограниченными возможностями здоровья, позволяя им интегрироваться в общество. Инклюзивное образование является одним из основных прав каждого ребенка. В статье описаны эффективные способы обучения английскому языку детей с ограниченными возможностями здоровья.

***Ключевые слова:*** *инклюзия, ученик, обучение, английский язык, дети с ограниченными возможностями здоровья, методы обучения*

**Summary.** Inclusive education provides access to the right to education for children with limited means, while enabling them to integrate into society. Inclusive education is one of the basic rights of every child. The article describes effective ways to teach English to children with limited health opportunities.

***Key words:*** *inclusion, student, teaching, English, children with disabilities, teaching methods*

Günümüzün aktual problemlərindən biri də sağlamlıq imkanları məhdud olan insanların təhsil almasıdır. Müasir dövrdə dünya təhsil sistemində sağlamlıq imkanları məhdud uşaqların fərdi şəkildə, təcrid olunmuş formada xüsusi təhsil almaları düzgün amil kimi qiymətləndirilmir. Çünki bu cür yanaşma uşaqların cəmiyyətə inteqrasiyasına mənfi təsir göstərir.

Hazırda ölkəmizdə 60 minə yaxın sağlamlıq imkanları məhdud olan uşaq var. Onlardan yalnız 12 mini təhsilə cəlb olunub, o cümlədən onların 1105-i xüsusi məktəblərdə, 2664-ü xüsusi internat məktəblərində, 7750-i evdə, 268-i isə inklüziv təhsil alır. Təhsilə cəlb olunanların əksəriyyəti xüsusi məktəb və internat məktəblərdə oxuyurlar. Belə təlim-tərbiyə uşağın diqqətini onun defektinə cəmləyir. Onlar digər uşaqlarla ünsiyyətə girməkdə çətinlik çəkir və özlərini bir növ cəmiyyətdən təcrid olunmuş kimi hiss edirlər.

Azərbaycanda "İnklüziv təhsil layihəsi"nin icrasına 2005-ci ildən start verilmişdir. Nazirlər Kabinetinin 3 fevral 2005-ci il tarixli, 20 nömrəli qərarına əsasən "Azərbaycan Respublikasında xüsusi qayğıya ehtiyacı olan (sağlamlıq imkanları məhdud) uşaqların təhsilinin təşkili üzrə inkişaf proqramı təsdiq edilmişdir. Bununla yanaşı, Heydər Əliyev Fondu dövlət himayəsində olan uşaqların sosial müdafiəsinin gücləndirilməsi, müvafiq təsnifata uyğun olaraq bütün kateqoriyadan olan sağlamlıq imkanları məhdud uşaqların ölkə üzrə qeydiyyatının aparılması və təhsilə cəlb edilməsi, xüsusi təhsil müəssisələrinin möhkəmləndirilməsi istiqamətində məqsədyönlü işlər görüb.

Ümumi təhsil müəssisələri çərçivəsində əlilliyi olan uşaqların inklüziv təhsili müasir təhsil sisteminin təxirəsalınmaz problemlərindən biridir və bu uşaqların təhsil prosesinə həqiqi və tam cəlb edilməsi və iştirakı üçün ən münbit şəraitin yaradılmasını təmin etmək bütün müəllimlər üçün çətin bir vəzifədir.

Beləliklə, inklüziv təhsil şəraitində əlilliyi olan uşaqlara xarici dilin öyrədilməsi problemi müasir pedaqoji elmlərdə mübahisəli məsələlərdən biridir. Sağlamlıq imkanları məhdud olan uşaqların inklüziv təhsili problemi xüsusilə xarici dilin müəllimləri üçün mürəkkəbdir. Xarici ölkələr uşaqların birgə təhsili üzrə zəngin və uğurlu təcrübə toplamışlar. Lakin xarici tədqiqat ədəbiyyatının təhlili göstərdi ki, inklüziv təhsil şəraitində əlilliyi olan uşaqlara xarici dilin öyrədilməsi üçün effektiv texnologiyanın seçilməsi hələ də mübahisəlidir. Bir tərəfdən, bu problem təhsil sistemində ənənəvi baxışa görədir ki, xarici dilin öyrənilməsi mürəkkəb prosesdir, xüsusilə də psixofiziki qüsurlu uşaqlar üçün. Əlilliyi olan uşaqların təhsil yükünü azaltmaq məqsədilə, bu yaxınlara qədər onlara əlavə dil kimi xarici dil öyrətmək yersiz hesab olunurdu. Xarici dilin tədrisi prosesinin spesifikliyi bu prosesin maksimal individualizasiyasıdır. Bu proses dəyişən tədris texnologiyalarının tətbiqi yolu ilə hər bir şagirdin daxil edilməsi və iştirakının aktivləşdirilməsi ilə bağlıdır. Aydındır ki, əlilliyi olan tələbələr təhsillərinə xüsusi inkişaf etmiş yanaşmaların təqdim olunmasını tələb edirlər.

Sosial-mədəni kontekstdə xarici dilin öyrədilməsi müəllimin şagirdlərin fərdi fərqlərinə maksimum konsentrasiyasını nəzərdə tutur. Bunu iki qrupa bölmək olar: koqnitiv və emosional. Koqnitiv qrupun komponentləri intellektual fəaliyyətin xüsusiyyətləri, dil səriştəsinin səviyyəsi və dilin öyrənilməsi strategiyalarıdır. Emosional sferaya dilə münasibət, motivasiya və dil baryerləri daxildir. Bu komponentlər qarşılıqlı asılılıq və qarşılıqlı asılılıq şəraitində nəzərə alınmalıdır. İnklüziv sinifdə şagirdlərin ünsiyyətcil fəaliyyətinin düzgün təşkil edilməsi imkan verir: istisnasız olaraq sinfin bütün şagirdləri arasında əməkdaşlıq səviyyəsini artırmaq, diferensiallaşdırılmış məşğələlər sistemini inkişaf etdirmək və onların həyata keçirilməsi üçün əlavə vaxt planlaşdırmaq, dərsdə şagirdlər arasında dərhal verilən rəyləri həyata keçirmək. Bu, şagirdlərin dil və nitq bacarıqlarını birləşdirmə və genişləndirmə imkanı yaradır.

Müəllimin əsas vəzifələrindən biri də şagirdin öyrənməyə müvəffəq olması üçün kömək etməkdir. Buna müvafiq olaraq, təlimin uğurlu olması, əsasən, müxtəlif təhsil texnologiyalarının təhsil prosesinə inteqrasiya olunmuş və sistemli şəkildə təqdim edilməsindən asılıdır.

İnklüziv təhsildə ingilis dilinin tədrisinə bəzi yanaşmalar:

1. Etiketə yox, öyrənənə baxın. Sağlamlıq imkanları məhdud öyrənənlər müəyyən şəxsiyyətə malik insanlardır. Disleksiyası olan hər bir insan eyni deyil. Şagird introrvert, ektrovert, yaradıcılıq qabiliyyəti yüksək olan, yaradıcılıq qabiliyyəti heç olmayan, musiqiyə meyl göstərən və göstərməyən ola bilər. İlk öncə öyrənəni tanımaq lazımdır.

2. Dərsdə hər zaman empatiya və anlayış inkişaf etdirən məşğuliyyətləri təşviq edin və istifadə edin. Məsələn, ingilis dili dərslərində fəaliyyət zamanı qarşındakı haqqında müəyyən fikir yürütmək, təxmin etmək və ya yadda saxlamaq kimi tapşırıqlar tətbiq etməklə şagirdlərdə qarşılıqlı anlaşma və fikir söyləmə bacarığı inkişaf etdirmək olar. Bu tip dil fəaliyyət həm da şagirdlərdə dil baryerini aşmağa, ingiliscə danışarkən utanma və çakinmə kimi hisslərdən uzaqlaşmağa kömək edəcək.

3. "Birlikdə öyrənək" başlıqlı sinif müqaviləsi yaradın. Məsələn, sinif otağınızın əsas dəyərlərini aydın şəkildə göstərən qaydalar təyin edin. Məsələn:

- Biz bir-birimizə kömək edirik.
- Bir-birimizi dinləyirik.

- Hər kəsin özünəməxsus olduğunu anlayırıq.

4. Öyrənənlərə ingilis dilini müxtəlif üsullarla və müxtəlif situasiyalarda təqdim etmək imkanı verin.

5. Həmyaşıdların tərbiyəçisi və ya dost sistemini inkişaf etdirin. Burada öyrənənlər bir-birinə kömək edir və bacarıqları bölüşürlər. Qarşılıqlı şəkildə bilmədikləri sözləri və ya qrammatik qaydanı bir-birilərinə ötürürlər.

6. Necə göstəriş verdiyinizi yaxşı düşünün. Verdiyiniz tapşırıqları aydın, səliqəli şəkildə, addım-addım verin. Onları istədiyiniz qaydada və çox sadə şəkildə verin. Ardıcıllardan uzaq durun. Məsələn, "lövhəyə bax, kitablarını aç" demək daha anlaşıqlı olar, nəinki "kitablarını açmazdan əvvəl, lövhəyə bax". Nümunə verərək və öyrənənlərdən nümunə alaraq yoxlayın.

7. Qaydaları və rutinləri gücləndirmək üçün vizuallardan istifadə edin. Dərsin müxtəlif hissələrini göstərən şəkillər qoy: dinləmək (qulaq), danışmaq (ağız), yazı (qələm), oxu (kitab) və dərsin əvvəlində bunları lövhəyə qoyun. Bununla, şagirdlər yeni sözü öyrənməkdə çox əziyyət çəkməyəcəklər.

Beləliklə, ingilis dili dərslərinin müsbət effekt göstərməsi üçün güclü öyrənmə imkanlarını təmin edən əlverişli mühit və təlim modelləri yaradılmalıdır. İnklüziv təhsil bütün uşaqların hüquqlarının təminatı olmaqla yanaşı, insanların sosial rifahının yüksəldilməsinin də qarantıdır.

**Problemin aktuallığı**. Sağlamlıq imkanları məhdud uşaqlara ingilis dilinin tədrisinin səmərəli yollarına aydınlıq gətirilmişdir.

**Problemin elmi yeniliyi.** Sağlamlıq imkanları məhdud uşaqlara ingilis dilinin tədrisinin səmərəli yolları işlənmişdir.

**Problemin praktik əhəmiyyəti**. Məqalə doktorantlar və gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**


1. Məktəbəhazırlıq qruplarında inklüziv təlimin təşkili: Müəllimlər üçün metodik vəsait. -Bakı: Azərbaycan Respublikasının Təhsil İnstitutunun nəşri, -2021.
2. Loreman, T . İnklüziv təhsil. / T . Loreman, J. Deppeler, D. Harvey. -Bakı, -2005.
3. Cummins, J.A Theoretical framework for bilingual special education // Exceptional Children, -2010, № 56.
4. Gardner, R.C. Social Psychology and Second Language Learning: The Role of Attitudes and Motivation. / R.C. Gardner -London: Edward Arnold, -2015.


**E-mail:** mehdiyevaulviyya@gmail.com

**Rəyçilər:** *ped.elm.dok., prof.* **D.Ə. İsmayılova,**
*ped.ü.fəls.dok., dos.* **F.Ə. Rzayeva**
**Redaksiyaya daxil olub:** 30.11.2022.

## *RİYAZİYYATIN TƏDRİSİ METODİKASI*
## *МЕТОДИКА ПРЕПОДАВАНИЯ МАТЕМАТИКИ*
## *METHODS OF TEACHING MATHEMATICS*

*UOT 372.851*

***Musa Tapdıq oğlu Rzayev***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

***Aytac Rüfət qızı Sultanova***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# RİYAZİYYAT TƏLİMİNDƏ PROBLEMLİ YANAŞMADAN İSTİFADƏ TƏFƏKKÜR FƏALLIĞINI İNKİŞAF ETDİRƏN VASİTƏ KİMİ

***Муса Тапдыг оглы Рзаев***
*доктор философии по педагогике*
*Азербайджанский Государственный Педагогический Университет*

***Айтадж Руфат гызы Султанова***
*Азербайджанский Государственный Педагогический Университет*

# ИСПОЛЬЗОВАНИЕ ПРОБЛЕМНОГО ПОДХОДА ПРИ ОБУЧЕНИИ МАТЕМАТИКЕ КАК СРЕДСТВО РАЗВИТИЯ МЫСЛИТЕЛЬНОЙ ДЕЯТЕЛЬНОСТИ

***Musa Tapdıq Rzayev,***
*doctor of philosophy in pedagogy*
*Azerbaijan State Pedagogical University*

***Aytac Rufat Sultanova***
*Azerbaijan State Pedagogical University*

# USING A PROBLEM-BASED APPROACH IN MATHEMATICS EDUCATION AS A MEANS OF DEVELOPING THINKING ACTIVITY

**Xülasə.** Orta ümumtəhsil məktəblərinin riyaziyyat təlimində tətbiq edilən fənn kurikulumlarının, o cümlədən kurikulum əsasında istifadə edilən təlim metodlarında problem situasiyanın qoyuluşu və tətbiqi mühüm əhəmiyyət kəsb edir. Məqalədə problem situasiyadan istifadə etməklə şagirdlərdə təfəkkür fəallığının inkişaf etdirilməsi əsas yerlərdən birini tutur. Bu kimi hallara aşağı siniflərdən başlanılmalı və yuxarı siniflərdə daha da dərinləşdirilməlidir. Riyaziyyat dərslərində problemli yanaşmadan istifadə edildikdə əldə edilən biliklər şagirdlərin təfəkküründə uzun müddət yadda qalır. Bu məqsədlə məqalədə nümunələr əsasında problem stiuasiyanın tətbiq edilməsi qaydası nümunələr əsasında geniş şəkildə şərh edilib.

***Açar sözlər:*** *yaradıcı təfəkkür, tədqiqat, problem situasiya, hərtərəfli inkişaf, təlim metodu, zehni fəaliyyət, istiqamət, məsələ, dialektik qanun, evristik müsahibə, əyrixətli trapesiya, mühakimə yürütmək*

**Резюме.** Важно установить и применить проблемную ситуацию в методах обучения, используемых в предметных программах средних общеобразовательных школ, в том числе в методах обучения, основанных на учебном плане. В статье одно из главных мест занимает развитие мыслительной деятельности учащихся с использованием проблемной ситуации. Такое обучение следует начинать с младших классов и углублять в старших классах. Знания, полученные при использовании проблемного подхода на уроках

математики, надолго запоминаются в сознании учащихся. Для этого в статье широко разъяснена процедура применения проблемной ситуации на примерах.

***Ключевые слова:*** *творческое мышление, исследование, проблемная ситуация, всестороннее развитие, метод обучения, мыслительная деятельность, направление, проблема, диалектический закон, эвристическое интервью, кривая трапеция, выдвигать суждение*

**Summary.** It is important to set and apply the problem situation in the teaching methods used in the subject curricula of the secondary general education schools, including the teaching methods based on the curriculum. In the article, the development of students' thinking activity by using the problem situation takes one of the main places. Such cases should be started from the lower grades and deepened in the upper grades. The knowledge gained when using a problem-based approach in mathematics lessons is remembered for a long time in the thinking of students. For this purpose, the procedure for applying the problem-situation based on examples has been broadly explained in the article.

***Key words:*** *creative thinking, research, problem-situation, comprehensive development, teaching method, mental activity, direction, issue, dialectical law, heuristic interview, curved trapezoid, judgment*

Müstəqillik əldə etdikdən sonra Respublikamızda aparılan uğurlu islahatlar təhsil sahəsindən də yan keçmədi. Təhsil islahatının əsas məqsədlərindən biri də yetişən gənc nəslə dünyəvi biliklərin verilməsindən ibarət idi. Bu baxımdan təlim prosesində yeni pedaqoji texnologiyalardan və interaktiv təlim metodlarından istifadə xüsusi əhəmiyyət kəsb edir. Təlim prosesinin bu aspektdə qurulması şagirdlərin yaradıcı və tənqidi təfəkkürünün formalaşdırılmasında, tədris və tədqiqat fəaliyyətinin səmərəli təşkili əsasında yeni təcrübəyə yiyələnmə imkanların genişləndirilməsində aparıcı rol oynayır. Ona görə də məktəb riyaziyyat təliminin təşkili prosesində yeni təlim metodlarının tətbiqi getdikcə genişlənir. Təlim prosesində problem situasiyadan istifadə şagirdlərin şəxsiyyət kimi formalaşmasına, onların hərtərəfli inkişafına, özlərini ifadə etmələrinə şərait yaradır.

A.X. Mirzəcanzadə: "… insan ömrünü iki mərhələyə bölürlər – əvvəlcə bilik əldə etmək, norma və qaydaları öyrənmək lazımdır, bundan sonra isə yaratmaq dövrü başlayır. Bu bölgü "kökündən səhv və yanlışdır" [2, s. 254]. Belə hesab edirik ki, hazır şəkildə əldə edilən bilik müvəqqəti xarakter daşıyır. Müəyyən vaxt keçdikdən sonra həmin bilikləri yaradıcı tətbiq etməkdə çətinlik çəkirlər. Əksinə, sərbəst və düşünülmüş formada əldə edilən bilik sonralar da öz bəhrəsini verir.

Riyaziyyat fənn kurikulumunun qarşıya qoyduğu əsas tələblərddən biri yuxarıda göstərilən təlim metodlarından istifadə etməklə şagirdlərin riyazi biliklərini yaradıcı və tədqiqat xarakterli çatdırmaqdır. Ona görə də şagirdlərin riyazi hazırlığı xüsusi aktuallıq kəsb edir. Riyaziyyat təlimində problemli yanaşma bir metodik sistem kimi şagirdlərin hərtərəfli inkişafına, həyata hazırlanmasına geniş imkan yaradır.

S. Xəlilov yazır: "Orta təhsil sahəsində informasiyanın prioritetliyindən tədricən sərbəst düşüncənin, yaradıcı təfəkkürün prioritetliyinə keçirilməlidir. Ümumtəhsil məktəblərində riyaziyyat və təbiət elmləri sahəsində ancaq gələcək mütəxəssislər üçün lazım ola biləcək geniş informasiya verilməsinə deyil, riyazi təfəkkürün, rasional düşüncə vərdişlərinin inkişafına üstünlük verilməlidir. Lakin informasiya bolluğu süni çətinləşdirmə meylləri şəraitində təhsilin məhz bu əsas missiyası "yaddan çıxır", onun həyata keçirilməsi sadəcə qeyri-mümkün olur [5, s. 19].

Problemli yanaşmada başlanğıc mərhələ problemli situasiyadır. Problemli situasiya yaradıldıqdan sonra problem qoyulur. Hər iki mərhələdə şagird çətinliklə qarşılaşır və bu çətinliyin aradan qaldırılması üçün müəyyən zehni fəaliyyət göstərir. Birinci mərhələdən ikinciyə keçid zamanı şagirdin fəaliyyət istiqaməti aydın olduqda problemin həllində şagird daha səmərəli işləyə bilir.

Problemli yanaşmanın mərhələləri barədə pedaqoqlar, metodistlər, tədqiqatçılar və müəllimlər müxtəlif fikirlər irəli sürmüşlər [1, 3, 4, 5, 7, 9] ... Aparılan tədqiqatlara, irəli sürülən fikirlərə əsasən qeyd etmək olar ki, problemli situasiya problemin qoyulmasından sonra gəlir və qoyulan problem həll edilir. Müasir təlim texnologiyalarının hal-hazırda tətbiq edildiyi indiki dövrdə bu fikir özünü tam doğrultmur. Aparılan müzakirələrdən və tədqiqatçıların təcrübəsindən aydın olur ki, problemi problem situasiya yaradıldıqdan sonra qoymaq daha yaxşı nəticə verir.

Problem situasiyada şagirdin diqqəti və təfəkkürü sanki "xəbərdarlıq" alır. Bu xəbərdarlıq zamanı şagird əvvəlki bilikləri ilə məchul (axtarılan) arasında ziddiyyət görür, çatışmazlıq hiss edir və müəyyən reaksiya göstərir. Bu reaksiya zamanı şagird çətinliyi dərk edərək öz imkanlarını səfərbərliyə alır və məchulu tapmaq üçün müəyyən fəaliyyət göstərir. Lakin bu fəaliyyətdə şagirdin məqsədi tam aydın olmur. Şagirdin aldığı "xəbərdarlıq" yalnız problemin qoyuluşundan sonra konkret məqsədə çevrilir. M.N. Skatkinin fikrincə desək, şagird "cavaba doğru addım-addım irəliləyir". Deməli, problem situasiya dərk edilir, araşdırılır, problem isə həll edilir.

Araşdırmalardan aydın olur ki, problemli situasiyanın yaradılması problemin qoyulmasından daha çətindir [1]. Çünki problemli situasiyanın yaradılmasında mövcud çətinliyi şagird dərk etmirsə, həllin mümkünlüyünə inanmırsa, buna onun potensial imkanı çatmırsa, o, problem həll edə bilməz. Ona görə də biz çalışırıq ki, şagird, ilk növbədə, məchulu tapmağın, çətinliyi aradan qaldırmağın zəruruiliyini dərk etsin.

Məchulu (axtarılanı) tapmaq üçün şagirdi elə vəziyyətə gətirmək lazımdır ki, onun yeni qazanacağı bilik həmin məchulun yerini tutsun. Şagirdlərin yeni qazanacağı bilik problemli situasiyadan araşdırılır, problemin qoyuluşundan sonra isə konkret məqsəd kimi məchulun yerini tutur.

Riyaziyyatdan nəzəri materialların öyrədilməsində problemli yanaşmadan istifadə etməyin səmərəli yollarından biri mövzuya uyğun misalların həll edilməsi ilə başlamaqdır [8]. Bu zaman şagirdlərin ümumiləşdirmə aparmaq, nəticə çıxarmaq qabiliyyətləri inkişaf edir. Digər tərəfdən nəzəri materialın öyrədilməsinə uyğun misallarla başlamaq vaxta qənaət etməyə imkan verir. Belə ki, az vaxt içərisində şagirdə əsaslı məlumat vermək mümkün olur. Məsələn, "İkiqat arqumentin triqonometrik funksiyaları" düsturunun izahını keçməzdən əvvəl müəllim şagirdlərə tapşırır ki, $cos\frac{2\pi}{3}$ və $sin\frac{2\pi}{3}$ -ni hesablayın. (Problemin qoyuluşu). Şagirdlər $\frac{2\pi}{3}=\frac{\pi}{3}+\frac{\pi}{3}$ kimi yazırlar. Cəmin kosinusu düsturundan istifadə edib $cos\frac{2\pi}{3}=cos\left(\frac{\pi}{3}+\frac{\pi}{3}\right)=-\frac{1}{2}$; $sin\frac{2\pi}{3}=sin\left(\frac{\pi}{3}+\frac{\pi}{3}\right)=\frac{\sqrt{3}}{2}$ alırlar.

Müəllim belə misallardan bir neçəsini də həll etdikdən sonra soruşur ki, ixtiyari bucaqlar üçün $cos2\alpha$ və $sin2\alpha$-nı necə hesablaya bilərsiniz? (Yeni problemin qoyuluşu). Şagirdlər yuxarıda həll etdikləri misala əsasən yazırlar:

$$cos2\alpha=cos(\alpha+\alpha)=cos^2\alpha-sin^2\alpha$$
$$sin2\alpha=sin(\alpha+\alpha)=2sin\alpha cos\alpha$$

Düsturu özləri kəşf etdiklərinə görə şagirdlər fəallaşırlar və onların maraqları əhəmiyyətli dərəcədə artır. Müəllim növbəti problemi qoyur: $cos\alpha$ və $sin\alpha$ məlum olanda $cos2\alpha$ və $sin2\alpha$-nı hesabladınız. Bəs $cos2\alpha$ və $sin2\alpha$ məlum olduqda $cos\alpha$ və $sin\alpha$-nı necə hesablaya bilərdiniz?

Şagirdlər $cos\alpha=\pm\sqrt{\frac{1-cos2\alpha}{2}}$ , $sin\alpha=\pm\sqrt{\frac{1+cos2\alpha}{2}}$ düsturlarını tapırlar. Bu düsturların yaxşı mənimsənilməsi üçün onların tətbiqinə diqqət verilir. Şagirdlərə tapşırılır ki, $8sin10\alpha\cdot cos10\alpha\cdot cos20\alpha\cdot cos40\alpha$ ifadəsini sadələşdirsinlər. Şagirdlər əvvəlki misalı həll etdikləri situasiyadan yeni situasiyaya keçid üçün imkan axtarırlar. İfadəni aşağıdakı kimi sadələşdirərək problemi həll edirlər:

$$8sin10\alpha\cdot cos10\alpha\cdot cos20\alpha\cdot cos40\alpha=4sin20\alpha\cdot cos20\alpha\cdot cos40\alpha=2sin40\alpha\cdot cos40\alpha=sin80\alpha$$

Qazanılmış bilikləri tətbiq etmək və möhkəmləndirmək məqsədilə aşağıdakı məzmunda ev tapşırığı verilə bilər:

1) Hasili hesablayın:
$$16sin5^0\cdot cos5^0\cdot cos10^0\cdot cos20^0\cdot cos40^0$$
2) Eynilikləri isbat edin:
$$a)\ \frac{sin(60^0+\alpha)}{4sin\left(15^0+\frac{\alpha}{4}\right)sin\left(75^0-\frac{\alpha}{4}\right)}=cos\left(30^0+\frac{\alpha}{2}\right);$$
$$b)\ cos8x+\frac{1+cos4x}{2}+sin^2 2x=2-2sin^2 4x.$$

Qeyd edək ki, problemli yanaşmanın dinamikliyi dialektik qanuna əsasən bir situasiyanın digərinə təbii yolla keçməsindən ibarətdir. Yaradılmış situasiyaların birindən digərinə keçid çətin olduğu kimi, həm də çox səmərəlidir. Çünki belə keçid elmi problemlərin tədricən dərk edilməsinə və həllinə hazırlıq rolunu icra edir.

Məlumdur ki, problemli yanaşmanın tətbiqi, əsasən, biliyin problemli şərhi, evristik müsahibə və tədqiqatçılıq metodları ilə həyata keçirilir. Bu metodlar isə bir-birindən şagirdlərin müstəqillik səviyyələrinin müxtəlifliyi ilə fərqlənirlər.

Tədqiqat metodunda şagirdin müstəqilliyi maksimum səviyyədə olur və problemli yanaşmanın dinamikliyi həyata keçirilir.

Məsələn, əyrixətli trapesiyanın sahəsini hesablamağa aid bir neçə misal həll etdikdən sonra müəllim təklif edir ki, $y = \frac{x^2}{4}$ və $y = 4 - \frac{3x^2}{4}$ əyriləri arasında qalan fiqurun sahəsini hesablayın.

Şagirdlər müstəqil olaraq məsələnin şərtinə uyğun şəkili qururlar. Şəkildən aydın olur ki, fiqur əyrixətli deyil (problemlə qarşılaşırlar). Müəllimin kiçik göstərişindən sonra şagirdlər bir situsiyadan digərinə keçidlə qoyulmuş problemi aşağıdakı kimi həll edirlər:




$$S = 2\left(\int_0^2 \left(4 - \frac{3}{4}x^2\right)dx\right) - \int_0^2 \frac{x^2}{4}dx) = 10\frac{2}{3}$$

Belə misallarla şagirdlərin müstəqilliyi artır, fikirləşmək, mühakimə yürütmək bacarıqları formalaşır. Uyğun çalışmalar üzərində şagirdlərin evdə müstəqil işləri, bacarıqları daha da möhkəmlənir.

Təcrübəyə və aparılan müşahidələrə əsasən deyə bilərik ki, problemli situasiya yaradıldıqdan sonra həmişə problemin qoyuluşu zəruri deyildir və müəllim adi şərh ilə dərsi davam etdirə bilər. Bu zaman yaradılmış problemli situasiya şagirdləri fəallaşdırır. Bizə elə gəlir ki, yeni anlayışların çoxu iştirak etdiyi mövzuların problemli yanaşmadan istifadə etməklə tədrisi məqsədəuyğun deyildir.

Məsələn, "Funksiyanın araşdırılmasına törəmənin tətbiqi" mövzusunu keçərkən ilk dərsdə problem qoymaq məsləhət deyil. Müəllim problem situasiyanı yaradır, problem qoymadan adi şərh ilə ilk dərsi keçir. Sonra şagirdlərə tapşırır: $f(x) = 3x^2 + 6x - 7$ funksiyasını araşdırın və qrafikini qurun.

Şagirdlər müxtəlif üsullarla tapşırığı yerinə yetirirlər. Müəllim bunları nəzərdən keçrir və bildirir ki, funksiyanın araşdırılmasında ən yaxşı üsullardan biri də törəmənin tətbiqidir. Bu yolla aparılan işin ardıcıllığını göstərir, sonra misallar həll etdirir. Problem isə növbəti dərslərdə qoyulur.

**Problemin aktuallığı.** Yeni təlim texnologiyalarının tətbiqi yeni yanaşmalar tələb edir. Ona görə də tədris prosesində riyaziyyat təliminin məzmun xətlərinə uyğun problem-sitiuasiyaların tətbiqi şagirdlərə bilikləri əsaslı şəkildə əldə etmələrinə müsbət təsir göstərir.

**Problemin elmi yeniliyi.** Riyaziyyat təlimində yeni təlim texnologiyalarının prinsiplərindən istifadə edərək öyrənilən mövzulara problemli yanaşma şagirdlərdə məntiqi, tənqidi təfəkkürün inkişafına səbəb olur.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə şərh olunan məsələlər günün tələblərinə uyğun olduğuna görə tələbələr, şagirdlər, orta məktəb müəllimləri və tədqiqatçılar üçün faydalıdır.

**Ədəbiyyat:**

1. Adıgözəlov A.S., Əliyeva T.M. Orta məktəbdə riyaziyyatın tədrisi metodikası. Ümumi metodika. I və II h. -Bakı, -1993.
2. Mirzəcanzadə, A.X. İxtisasa giriş. / A.X. Mirzəcanzadə. -Bakı, -1991.
3. Əlizadə, Ə.Ə. Şagirdlərin yaradıcı fəaliyyətinin psixologiyası. / Ə.Ə. Əlizadə. -Bakı, -1968.
4. Veysova, Z. Fəal və interaktiv təlim. (Müəllimlər üçün vəsait). Z. Veysova. -Bakı, -2007.
5. Qədimova X. İnteraktiv təlim metodları və onların tətbiqi yolları. / X. Qədimova. -Bakı, -2006.
6. Гнеденко Б.В. Формирование мировоззрения учащихся в процессе обучения математике. / Б.В. Гнеденко. -М.: Просвещение, -1982.
7. Гусев В.А. Психолого-педагогические основы обучения математике. / В.А. Гусев -М.: 000 «Издательство», «Вербум-м», -2003, -432 с.
8. Богоявленский Д.И. Интеллектуальная активность как проблема творчества. / Д.И. Богоявленский. -Ростов на Дону, -1983. -3-35 с.
9. Крутецкий В.А. Психология математических способностей школьников. / В.А. Крутецкий. -М.: Просвещение, -1968. -431 с.

**E-mail:** musa.rzayev.73@mail.ru
**Rəyçilər:** *ped.ü.fəls.dok.* **N.R. Abbasov,**
*dos.* **N.B. Nəsirov**
**Redaksiyaya daxil olub:** 25.11.2011.

*UOT 372.851*

***Ceyhun Bəşir oğlu Əlizadə***
*Mingəçevir Dövlət Universitetinin müəllimi*
ORCID: 0000-0003-0051-7467

# QAUSS METODU İLƏ XƏTTİ CƏBRİ TƏNLİKLƏR SİSTEMİNİN KOMPÜTERDƏ HƏLLİ

***Джейхун Башир оглы Ализаде***
*преподаватель Мингячевирского Государственного Университета*

# КОМПЬЮТЕРНОЕ РЕШЕНИЕ СИСТЕМЫ ЛИНЕЙНЫХ АЛГЕБРАИЧЕСКИХ УРАВНЕНИЙ МЕТОДОМ ГАУССА

***Jeyhun Bashir Alizadeh***
*teacher Mingachevir State University*

# COMPUTER SOLUTION OF A SYSTEM OF LINEAR ALGEBRAIC EQUATIONS BY THE GAUSS METHOD

**Xülasə.** Məqalədə xətti cəbri tənliklər sisteminin kompüterdə Qauss metodu ilə həlli reallaşdırılır. Ali riyaziyyat kursunda xətti cəbri tənliklər sistemi əsas mövzulardan biridir. Belə tənliklər sisteminin Qauss metodu ilə müxtəlif proqramlaşdırma dillərində həll etmək və alınan xətaları müqayisə etmək mümkündür. Qauss metodunun hesablama sxemi iki mərhələdən ibarətdir. Bu iki mərhələ - düz və tərs gediş proqramın tərtibi zamanı mühüm rol oynayır. Proqramlaşdırılma sahəsi ilə məşğul olan tələbə və müəllimlər üçün bu məqalə xüsusi əhəmiyyətə malikdir.
***Açar sözlər:*** *metod, alqoritm, proqram, tənlik, sistem*

**Резюме.** В данной статье система линейных алгебраических уравнений решается методом Гаусса на компьютере. Система линейных уравнений - одна из основных тем в курсе дальнейшей математики. Такую систему уравнений можно решить методом исключения Гаусса на разных языках программирования и сравнить полученные ошибки. Расчетная схема метода Гаусса состоит из двух этапов. Эти два этапа – прямое исключение и обратное сестринское образование - играют важную роль в разработке программы. Эта статья особенно важна для студентов и преподавателей в сфере программирования.
***Ключевые слова:*** *метод, алгоритм, программа, уравнение, система*

**Summary.** In this paper, a system of linear algebraic equations is solved by a Gaussian method on a computer. The system of linear equations is one of the main topics in the course of further mathematics. It is possible to solve such a system of equations by the Gaussian elimination in different programming languages and compare the obtained errors. The calculation scheme of the Gaussian method consists of two stages. These two stages – forward elimination and back sibstitution - play an important role in the design of the program. This article is especially important for students and teachers in the field of programming.
***Key words:*** *method, algorithm, program, equation, system*

Praktik məsələlərdə xətti cəbri tənliklər sistemini (XCTS) həll etmək üçün müxtəlif metodlardan istifadə edilir. Bu metodlardan ən çox yayılmış metod məchulların ardıcıl yoxetmə – Qauss metodudur. Qauss metodu çox effektivdir.

Gauss metodunun hesablama sxemi iki mərhələdən ibarətdir. İlk addım sistemi trapesiya vəziyyətinə gətirməkdir. Bu mərhələ düz gediş adlanır. İkinci mərhələ – məçhulların təyini – tərs gediş adlanır (1, s. 257-258).

Gauss metodunun düz gedişi, birinci sütundan başlayaraq məçhullar üçün əmsalların ardıcıl aradan qaldırılmasından ibarətdir.

Düz gediş aşağıdakı düsturlara uyğun olaraq həyata keçirilir. Dairəvi mötərizədəki k indeksi dövrün nömrəsini – sütun nömrəsini bildirir.

K-cı sətir ədədə vurulur.

$$d_{jk}^{(k)} = \frac{a_{jk}^{(k)}}{a_{kk}^{(k)}} \qquad (1)$$

J-cu sətirdən k-cı sətir çıxılır.

$$a_{jj}^{(k+1)} = a_{jj}^{(k)} - d_{jk}^{(k)} \cdot a_{kj}^{(k)}, \quad j = k+1, \cdots, n; \quad j > k \qquad (2)$$

$$b_j^{(k+1)} = b_j^{(k)} - d_{jk}^{(k)} \cdot b_k^{(k)} \qquad (3)$$

Tərs gediş – məçhulların hesablanması – sistemin son tənliyindən başlayaraq aşağıdakı düsturlara əsasən həyata keçirilir.

$$x_n = \frac{b_n^{(n)}}{a_{nn}^{(n)}}, \quad x_k = \frac{\left(b_k^{(k)} - \sum_{j=k+1}^{n} a_{kj}^{(k)} x_j\right)}{a_{kk}^{(k)}}, \quad k = n-1, n-2, \cdots, 1 \qquad (4)$$

XCTS-nin kompüterdə həllini reallaşdırmaq üçün (1), (2), (3) və (4) düsturlarından istifadə edərək, C++ və Python alqoritmik dillərində proqram tərtib edərək verilən tənliklər sisteminin həllini tapaq.

Misal. Verilmiş xətti cəbri tənliklər sistemini Qauss metodu ilə həll edin.

$$\begin{cases} x_1 - 2x_2 + 3x_3 - 4x_4 = 2 \\ 3x_1 + 3x_2 - 5x_3 - x_4 = -3 \\ 3x_1 + 0x_2 + 3x_3 - 10x_4 = 8 \\ -2x_1 + x_2 + 2x_3 - 3x_4 = 5 \end{cases}$$

Həlli:

1. C++ da.

```
#include <iostream>
using namespace std;
int n, i, j, k;
int main()
{
cout << "n-i daxil edin " << endl;
cin >> n;
float a[30][30],x[30],b[30],v;
cout << "a b-i daxil edin " << endl;
for (i = 1; i <= n; i++)
{
for (j = 1; j <= n; j++)
{
cout << "a[" << i << "," << j << "]= ";
cin >> a[i][j];
}
cout << "b[" << i << "]= ";
cin >> b[i];
}
for(i=1;i<=n;i++)
a[i][n+1]=b[i];
for(i=1;i<=n;i++)
{
v=a[i][i];
for(j=1;j<=n+1;j++)
a[i][j]=a[i][j]/v;
for(k=i+1;k<=n;k++)
{
v=a[k][i];
for(j=i+1;j<=n+1;j++)
a[k][j]=a[k][j]-v*a[i][j];
}
}
x[n]=a[n][n+1];
for(i=n-1;i>=1;i--)
{
x[i]=a[i][n+1];
for(j=i+1;j<=n;j++)
x[i]=x[i]-a[i][j]*x[j];
}
cout<<"yekun"<<endl;
for(i=1;i<=n;i++)
cout<<"x["<<i<<"]="<<x[i]<<" ";
return 0;
}
```

Məçhulların əmsallarını və sərbəst hədləri klaviaturadan daxil edərək aşağıdakı nəticəni alırıq:

```
x[1]=2 x[2]=4 x[3]=4 x[4]=0.999999
Process returned 0 (0x0) execution time : 64.050 s
Press any key to continue.
```

2. Python-da.

```
n =int(input('n-i daxil edin:'))
A=[]
B=[]
print('A matrisini daxil edin:')
A = [[int(elem) for elem in input().split()] for i in range(n)]
print('B-i daxil edin:')
B = [int(elem) for elem in input().split()]
def SwapRows(A, B, row1, row2):
A[row1], A[row2] = A[row2], A[row1]
B[row1], B[row2] = B[row2], B[row1]
def DivideRow(A, B, row, divider):
```

Reaksiya tənliyində $O_2$-nin əmsalının $SO_2$-nin əmsalından 2 dəfə az olduğunu nəzərə almaqla reaksiyanın sürətinin də $O_2$-yə görə 2 dəfə az olduğunu müəyyən etmiş oluruq.

Belə ki, $\vartheta_{reak(SO_2)} = 2\vartheta_{reak(O_2)}$

$2\vartheta_{reak(O_2)} = \frac{\vartheta_{reak(SO_2)}}{2} = \frac{0,2}{2} = 0,1 \ mol/\ell \cdot san$




**Məsələ 4.**

$2NO + O_2 \rightarrow 2NO_2$ reasiyasına aid qrafikə əsasən $NaO_2$-nin qatılığını hesablayın.

Həlli:

$\Delta\tau = 20 - 10 = 10 \ san$

$\Delta C(O_2) = 0,6 - 0,2 = 0,4 mol/\ell$

Beləliklə, 10 saniyədə 0,3 mol/$\ell$ $O_2$ sərf olunur, ondan 2 dəfə çox $NO_2$ olmalıdır, çünki reaksiya tənliyində $NO_2$-nin əmsalı 1-ə bərabərdir. $C(NO_2)=2C(O_2)=2\cdot0,3=0,6 \ mol/\ell$ .

**Məsələ 5.**

$N_2 + 3H_2 - 2NH_3$ reaksiyasında $N_2$-nin ilkin qatılığı $C_1(N_2) = 0,6\frac{mol}{\ell}$ -dir. 20 saniyədən sonra $N_2$-nin qatılığı, yəni $C_2(N_2) = 0,2\frac{mol}{\ell}$ -dır. Bu reaksiyanın sürətini $H_2$-yə görə hesablayın.

Həlli: 20 saniyə ərzində $N_2$-nin qatılığının dəyişməsi

$\Delta C_{(N_2)} = 0,2 - 0,6 = -0,4\frac{mol}{\ell}$ olur. Bu zaman

$\Delta C_{(N_2)} = 3 \cdot \Delta C_{(N_2)} = 3 \cdot 0,6 = -1,8\frac{mol}{\ell}$ olur.

$H_2$-yə görə həmin reaksiyanın sürəti

$\vartheta_{(H_2)} = \frac{\Delta C_{(H_2)}}{\tau} = \frac{1,8}{20} = 0,09\frac{mol}{\ell \cdot san}$ olur.

**Məsələ 6.**

| Reaksiyaya girən maddələr | Reaksiya aparılan qabın həcmi (litr ilə) | Reaksiyaya sərf olunan zaman (dəqiqə ilə) | $\vartheta_{reak} \frac{mol}{\ell \cdot san}$ |
|---|---|---|---|
| $\frac{Cu_3COOH}{C_2H_5OH}$ | 3 | 10 | 0,01 |

Əmələ gələn efirin kütləsini qramla hesablayın.

Həlli:

$\upsilon_{reak} = \frac{\Delta\upsilon}{\nu \cdot \Delta\tau}$ $\upsilon = \vartheta reak \cdot v \cdot \Delta\tau = 0,01 \cdot 4 \cdot 10 = 0,3 mol$

$m_{(Cu_3COOCH_5)} = \upsilon \cdot M = 0,3 \cdot 88 = 26,4q$

**Məsələ 7.**

| Reaksiyalar | Başlanğıc maddələrin qatılığının dəyişməsi | Sürət dəyişməsi |
|---|---|---|
| I $N_{2(q)} + 3H_{2(q)} + 2NH_{3(q)}$ | 2 dəfə azaldıqda | x |
| $II\ H_{2(q)} + J_{2(a)} + 2HJ_{3(q)}$ | 2 dəfə azaldıqda | y |

x və y-i müəyyən edin.

Həlli: a) $\upsilon_1 = k\cdot\frac{C_{N_2}}{2}\cdot\left(\frac{C^3_{H_2}}{2}\right) = \frac{k\cdot C_{N_2}\cdot C_{N_2}}{2\cdot 2^3}$

Deməli x=16 dəfə azalır

b) $\upsilon_2 = k\cdot 2\cdot C_{H_2}\cdot 2\cdot C_{J_2} = 4kC_{H_2}\cdot C_{J_2}$

y=4 dəfə artır.

### *Temperaturun reaksiya sürətinə təsiri*

Kimyəvi reaksiyaların temperaturla düz mütənasibdir. Temperaturun reaksiya sürətindən düz-mütənasib asılılığı Hollandiya alimi X. Vant Hoff tərəfindən kəşf elinmiş və Vant Hoff qanunu adlanır. Qanunun riyazi ifadəsi isə aşağıdakı kimi qeyd olunur:

$\vartheta_{t_2} = \vartheta_{t_1}\cdot\gamma^{0,1(t_2-t_1)}$ və ya $\vartheta_{t_2} = \vartheta_{t_1}\cdot\gamma^{\frac{\Delta t}{10}}$

**Məsələ 8.**




Qrafikə əsasən,

$\gamma$ =2 olarsa, $t_1$-i hesablayın.

Həlli:

$$\frac{\upsilon_{t_2}}{\upsilon_{t_1}} = \gamma^{0,1(t_2-t_1)}$$

$$\frac{1,2}{0,6} = 2^{0,1(40-t_1)}$$

$40-t_1=10$

$t_1= 30$ san.

**Məsələ 9.**

| $\gamma$ | $t_1$°C | $t_2$°C | $\tau_1(san)$ | $\tau_2(san)$ |
|---|---|---|---|---|
| 2 | 85 | 75 | 17 | X |

X-i hesablayın.

Həlli: Qeyd olunan cədvəldən aydın olur ki, temperatur azalır. Qaydaya əsasən bilirik ki, temperatur azalırsa surət də azalır. Bu halda reaksiyanın sürəti $2^{\frac{85-75}{10}} = 2$ dəfə azalır, sürət 2 dəfə azalır, zaman 2 dəfə artır.

Beləliklə, X=2·17=34 san.

### *Homogen reaksiyaların sürətinə qaz halında olan reagentlərin təzyiqinin təsiri*

Qaydaya əsasən deyə bilərik ki, homogen reaksiyanın sürəti reaksiyaya daxil olan qazların təzyiqindən düz mütənasib asılı olur ki, bu zaman reaksiyanın kinetik tənliyində qatılıq əvəzinə qazların parsial təzyiqinin yanmasıdır.

Məsələ 10.

$2NO + O_2 \rightarrow 2NO_2$ reaksiyasında reagentlərin parsial təzyiqini 2 dəfə artırdıqda reaksiyanın sürəti necə dəyişir?

Təzyiqin reaksiya sürətinə təsiri düsturuna əsasən

$$\vartheta = k \cdot P_{NO}^2 \cdot P_{O_2}$$

$$\vartheta_{1K} \cdot \left(2P_{NO}^2\right) \cdot 2P_{O_2} = 8 \cdot kP_{NO}^2 \cdot PO_2$$

$$\frac{\vartheta_1}{\vartheta} = \frac{8k \cdot P_{NO}^2 \cdot P_{O_2}}{P_{NO}^2 \cdot P_{O_2}}$$

### *Reaksiyanın sürətinin reaksiyaya daxil olan qabın həcmindən asılılığına dair məsələlərin həlli üsulları*

**Məsələ 11.**

| Reaksiya | Reaksiya gedən qabın həcm dəyişməsi | Reaksiya sürətinin dəyişməsi |
|---|---|---|
| $2SO_2 + O_2 \rightarrow 2SO_3$ | 2 dəfə azalır | X |

X-i hesablayın.

Həlli:

Əgər reaksiyaya girən qazın həcmini 2 dəfə azaltsaq, bu zaman qatılığı 2 dəfə artırmış olarıq.

$$\vartheta_{reak} = k \cdot C_{SO_2}^2 \cdot CO_2$$

$$\vartheta = k \cdot 2C_{SO_2}^2 \cdot \left(2CO_2\right) = 8k \cdot C_{SO_2} \cdot CO_2$$

Deməli, reaksiyanın sürəti 8 dəfə artar.

### *Katalizatorun kimyəvi reaksiyanın sürətinə təsiri*

Katalizator – reaksiyanın sürətini dəyişdirən, lakin prosesin sonunda dəyişməz qalan maddədir. İnhibitor və ya mənfi katalizator – reaksiyanın sürətini azaldan maddədir.

Katalitik zəhər – katalizatorun aktivliyinin azaldan maddədir.

Katalitik reaksiya – katalizatorun iştirakı ilə gedən reaksiyalardır.

Kataliz – katalitik reaksiya zamanı baş verən hadisəyə deyilir. .

**Məsələ 12.**

1. $NO + O_2 \rightarrow 2NO_2$
2. $NO_2 + SO_2 \rightarrow SO_3 + NO$

Verilmiş reaksiya mərhələlərinə əsasən aşağıdakıları müəyyən edin:

1. Başlanğıc maddələr;
2. Katalizator;
3. Aralıq məhlulu;
4. Reaksiya məhlulu.

Həlli: İlk öncə, qeyd edilmiş reaksiya mərhələlərini tərəf-tərəfə toplayaq. Bu halda II mərhələnin hər iki tərəfi 2-yə vurulur:

1. $\cancel{2NO_2} + O_2 \rightarrow \cancel{2NO_2}$
2. $\cancel{2NO_2} + SO_2 \rightarrow SO_3 + \cancel{2NO}$

$$2SO_2 + O_2 \rightarrow 2SO_3$$

Yeni tənlik




**Problemin aktuallığı.** İstər ali təhsil müəssisələrində, istərsə də ümumtəhsil məktəblərində kimyəvi kinetikanın nəzəri əsaslarının mənimsənilməsi prosesində bir sıra çətinliklər meydana çıxır. Kimyəvi kinetikanın düzgün mənimsənilməsi təhsilalanlarda təkcə faktoloji biliklərin deyil, həmçinin onlarda prosedural və konseptual biliklərin dinamik inkişafını tələb edir.

**Problemin elmi yeniliyi.** Mövzu ilə əlaqədar məsələ nümunələrinin hazırlanması və yeni tövsiyələrin verilməsidir.

**Problemin praktik əhəmiyyəti.** Kimyəvi reaksiyanın sürəti və ona təsir edən amillər mövzusuna uyğun məsələ nümunələrinin və onların həlli üsullarının hazırlanması ilə bağlı verilən tövsiyələrdən metodika sahəsində tədqiqat aparanlar faydalana bilərlər.

**Ədəbiyyat:**


1. Abbasov, M.M. Kimyadan vəsait. I hissə / M.M. Abbasov. -Bakı: Abituriyent jurnalının xüsusi buraxılışı. -2013. -s.138-149
2. Nuriyeva M.S. Kimyəvi reaksiyanın sürəti, kimyəvi kinetika və kimyəvi tarazlığa aid qısa hesabatın hazırlanması // -Bakı: Azərbaycan Respublikası Təhsil İnstitutunun Elmi əsərləri, -2021. № 2, -s.121-125
3. Kimyadan vəsait. I hissə. M.M. Abbasov. V.S. Əliyeva. R.M. Mustafayeva [və b.] -Bakı: Abituriyent jurnalının xüsusi buraxılışı, -2020.- s.98-119
4. 8-ci siniflər üçün Kimya dərsliyi. V.M. Abbasov., M.M. Abbasov., R.Y. Əliyev [və b.] -Bakı: Aspoliqarf, - 2005, -s.109-119


**E-mail:** metanet.nuriyeva91@gmail.com

**Rəyçilər:** *kim.ü.fəls.dok., dos.* **R.M. Ağayeva,**
*kim.ü.fəls.dok., dos.* **G.G. Şəfaqətova**
**Redaksiyaya daxil olub:** 30.11.2022.

UOT 372.854

**Gülnarə Nizami qızı İsmayılova**
kimya üzrə fəlsəfə doktoru
Azərbaycan Dövlət Pedaqoji Universiteti

**Günay Şiraslan qızı Yusubova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNİN IX SİNİF KİMYA KURSUNDA “BOR YARIMQRUPU ELEMENTLƏRİ. ALÜMİNİUM VƏ ONUN BİRLƏŞMƏLƏRİ” MÖVZUSUNDA İNTEQRASİYADAN İSTİFADƏNİN ÜSTÜNLÜKLƏRİ

**Гульнара Низами гызы Исмайлова**
доктор философии по химии
Азербайджанский Государственный Педагогический Университет

**Гюнай Шираслан гызы Юсубова**
Азербайджанский Государственный Педагогический Университет

# ПРЕИМУЩЕСТВА ИСПОЛЬЗОВАНИЯ ИНТЕГРАЦИИ ПО ТЕМЕ: “ЭЛЕМЕНТЫ ПОДГРУППЫ БОРА. АЛЮМИНИЙ ЕГО СОЕДИНЕНИЯ” В КУРСЕ ХИМИИ IX КЛАССА ОБЩЕОБРАЗОВАТЕЛЬНОЙ ШКОЛЫ

**Gulnara Nizami Ismayilova**
doctor of philosophy in chemistry
Azerbaijan State Pedagogical University

**Gunay Shiraslan Yusubova**
Azerbaijan State Pedagogical University

# THE ADVANTAGES OF USİNG İNTEGRATİON ON THE TOPİC “BORON UBGROUP ELEMENTS. ALUMİNİUM AND İTS COMPOUNDS” İN THE IX GRADE CHEMİSTRY COURSE OF GENERAL EDUCATİON CHOOLS

**Xülasə.** Bu məqalədə müasir dövrdə ən çox işlədilən inteqrasiya anlayışı və onun təlim prosesində əhəmiyyəti qeyd olunmuşdur. Həmçinin IX sinif məktəb kimya kursunda metallar, onların fiziki-kimyəvi xassələri və metalların ərintiləri mövzularının coğrafiya, fizika və biologiya fənləri ilə inteqrasiyası araşdırılmışdır. Sonda isə “Bor yarımqrupu elementləri. Alüminium və onun birləşmələri” mövzusunun tədrisində hansı inteqrasiya imkanlarının reallaşdırılması göstərilmişdir.

***Açar sözlər:*** *inteqrasiya, metallar, coğrafiya, fizika, biologiya, alüminum, ərinti, fiziki-kimyəvi xassə*

**Резюме.** В данной статье упоминается наиболее используемая концепция интеграции в наше время и ее важность в процессе обучения. Также в школьном курсе химии 9 класса исследована интеграция темы металлов, их физико-химических свойств и металлических сплавов с предметами географии, физики и биологии. В конце показано, какие интеграционные возможности реализуются при преподавании темы: «Элементы полугруппы бора. Алюминий и его соединения».

***Ключевые слова:*** *интеграция, металлы, география, физика, биология, алюминий, сплав, физико-химический состав*

**Summary.** In this article, the most used concept of integration in modern times and its importance in the learning process are mentioned. Also, in the 9th grade school chemistry course, the integration of the topics of metals, their physico-chemical properties and alloys of metals with the subjects of geography, physics and biology was investigated. In the end, it is shown what integration opportunities are realized in the teaching of the subject "Boron subgroup elements. Aluminium and its compounds".

***Key words:*** *integration, metals, geography, physics, biology, aluminium, alloy, physical-chemical*

Ölkəmiz müstəqillik qazandığı vaxtdan Respublikamızda məqsədyönlü islahatlar həyata keçirilməyə başlanıldı. Təhsil sistemimizdə yeniləşdirmə prosesi, inkişaf etmiş ölkələrin təcrübəsindən istifadə edərək, öz milli dəyərlərimiz əsasında müasir dövrün tələblərinə uyğun yenidən qurulması vacib olan təhsil sistemi problemi meydana gəldi. Müasir ədəbiyyatlarda qarşılaşdığımız "nəticə və şəxsiyyətyönlü təhsil" kimi ifadələr müasir təhsilin mahiyyətini açıq şəkildə əks etdirir. Belə olan halda, təhsilalanların yaradıcı qabiliyyətli, məntiqi təfəkkürlü, müstəqil qərarlar qəbul edə bilən bir şəxsiyyət kimi formalaşdırılması prioritet bir məsələ kimi qarşıya qoyulur.

Təhsildə yeniliklərin tətbiqi, müasir pedaqoji texnologiyalardan istifadə diqqət mərkəzində durur. Bu mənada hər bir ölkədə olduğu kimi, Azərbaycanda da bir neçə prinsip əsas meyar olaraq götürülür ki, həmin meyarlardan biri də inteqrativlikdir. Qloballaşan dünyada inteqrativliyin bütün sahələrdə tətbiq olunması xüsusi maraq kəsb edir. Təhsilalanların fəaliyyətində tamlığın və bütövlüyün təmin edilməsi təhsilin bütün sahələrində inteqrativliyin həyata keçirilməsi əsasında mümkündür. Bu prinsip təhsilalanlara dünyanın geniş mənzərəsini dərk etməkdə və onların şəxsiyyət kimi formalaşmasında çox böyük dəstək olur.

İnteqrasiya təlim prosesini təkmilləşdirir, fənlər arasında qarşılıqlı əlaqə və asılılığı dərinləşdirməyə xidmət edir. Məhz inteqrasiyanın köməyi ilə şagirdlər biliklər arasında qarşılıqlı əlaqəni başa düşür və həmin bilikləri şəxsi və ictimai problemlərin həllində istifadə edirlər.

Dünya təhsil sistemində inteqrasiya ilə bağlı müxtəlif ifadələr səslənir: "məzmunun inteqrativliyi", "fənnin inteqrativliyi", "kurikulumların inteqrativliyi". Bu ifadələrin özlərinin arasında da bir inteqrasiya mövcuddur.

Alimlərin fikrində təlimdə inteqrasiya iki baxımdan çox əhəmiyyətlidir [1,2]:

Birinci – şagirdlərdə ətraf aləm haqqında bütöv təsəvvür yaradır;

İkinci – fənn üzrə biliklərin əlaqələndirilməsi üçün ümumi müstəvinin yaranmasına xidmət göstərir.

Hal-hazırda kimya fənninin tədrisində kurikulum əsasında yazılmış IX sinif kimya kursunda məzmun aşağıdakı tədris vahidləri üzrə göstərilmişdir:

I. Metallar

1.1. Metalların ümumi xarakteristikası;

1.2. Əsas yarımqrup metalları;

1.3. Əlavə yarımqrup metalları.

Məqalədə metallar mövzusunda inteqrasiya imkanlarını araşdırdığımız üçün yalnız bu mövzunun tədris vahidlərini qeyd etməklə kifayətlənirik.

IX sinfin kimya dərsliyi məzmunu və strukturu baxımından kurikulumun tələbləri əsasında yazıldığı üçün kimya fənninin tədrisində fənlərarası inteqrasiyanı dərsin müxtəlif mərhələlərində və müxtəlif formalarda tətbiqi məsələləri meydana çıxır. Buna əsaslanaraq bir çox mövzular ortaq fənlərin köməyi ilə öyrənilir. Coğrafiya, biologiya, fizika, riyaziyyat, informatika, həyat bilgisi fənlərinin tədris olunduğu IX sinifdə fənlərarası inteqrasiyanın kimya fənninə tətbiq edilməsi daha asandır. Buna misal olaraq aşağıdakı bir neçə mövzuya tətbiq olunmaq imkanı olan fənlərarası inteqrasiyaları qeyd etmək olar [4]:

1. Metalların icmalı. Təbiətdə tapılması və alınmasının ümumi xarakteristikası mövzusuna fənlərarası inteqrasiyanın yaradılmasının tətbiqi zamanı şagird coğrafiya və biologiya fənnində aldıqları biliklərə əsaslanaraq metalların təbiətdə yayılması, insan və bitki orqanizmlərindəki rolu, fotosintez prosesində hansı metalın iştirak etdiyi haqqında suallara cavab verərək dərs haqqında təsəvvürlərini dialoq vasitəsilə genişləndirir;

2. Çuqun və polad istehsalı mövzusunda müəllim coğrafiya fənni ilə inteqrasiya yaradaraq təhsilalanlardan çuqun və poladın xam maddəsi olan dəmir filizlərinin tapılma yerlərini və çıxarılma üsullarını soruşarkən şagirdlərdə o biri fənlərdən əldə etdikləri biliklər əsasında rahat şəkildə cavab ala bilir.

Təlim prosesində inteqrasiyanın həyata keçirilməsi müəllimdən diqqət, səriştə tələb edən bir prosesdir. Bu nöqteyi-nəzərdən IX sinifdə hər bir mövzu üzrə fənlərarası inteqrasiyanın reallaşdırılması vacib bir məsələ kimi qarşıda durur. Tədris vahidlərinin sonunda ümumiləşdirici dərs prosesi zamanı bu tip inteqrasiyanı bir qədər də genişləndirmək olar. Təlim prosesini elə qurmaq lazımdır ki, şagird təyin olunmuş ümumi mövzunu dərk etməklə yanaşı, bu mövzunun öyrənilməsində və ən əsası da tətbiq edilməsində hansı anlayış, bilik və bacarıqların gərəkli olduğunu daha aydın şəkildə anlasın, hər bir fənnin dərindən mənimsənilməsinin vacibliyini bilsin. Belə olan halda kimya dərslərində yalnız təbiət elmləri deyil, eyni zamanda, texniki fənlər ilə əlaqəyə ehtiyac olması fənnin inteqrativliyini daha da yüksək pilləyə qaldırır, onun şagirdlərin zehnindəki rolunu yüksəldir, daha da geniş əlaqələr qurmağı tələb edir.

IX sinif məktəb kimya kursunda "Metallar və onların fiziki-kimyəvi xassələri" və "Metalların ərintiləri" mövzularını coğrafiya və biologiya fənləri ilə inteqrasiyasını aşağıdakı cədvəl şəklində vermək mümkündür.

***Cədvəl 1.***




***Cədvəl 2.***




***Cədvəl 3.***



Metallar mövzusuna aid birinci dərsin məqsədi: metalların dövri sistemdə tutduğu mövqeyi, atomlarının quruluşundakı xüsusiyyətlərini araşdırmaq; metallarda kristal qəfəsin xarakterik xüsusiyyətləri və metallik rabitə barədə təsəvvür yaratmaq; elektroliz prosesinin mahiyyətini və ərintilərin, məhlulların elektrolizi haqqında bilikləri öyrətmək.

Yeni tədris materialının xeyli hissəsi şagirdlərin keçmiş biliklərinin aktuallaşdırılması və genişləndirilməsi yolu ilə aparılır. Bu məqsədlə şagirdlərə aşağıdakı sual – tapşırıqlar verilə bilər: [5]

– Bəsit maddə kimi metallar və onların birləşmələri haqqında nələri bilirsiniz?

– Metalların yer səthində yayılması və tətbiq sahələrini göstərin.

– Metalların dövri sistemdə mövqeyi haqqında bildiklərinizi söyləyin.

– Əsas və əlavə yarımqrup metallarının atomlarının quruluşu müqayisə edin.

– Metal atomlarının xarici energetik səviyyəsində əsasən neçə elektron olur?

– Təbiətdə hansı metallara sərbəst və hansı metallara birləşmələr şəklində rast gəlinir?

– Ən çox təbiətdə yayılan metal hansıdır?

– Azərbaycanda hansı metalların yataqları olduğunu bilirsiniz?

Daha sonra filiz haqqında məlumatlar araşdırılır. Metalların alınması üsulu və ərintilər haqqında ətraflı məlumatlar verilməklə şagirdlərin bilik və bacarıqları dərinləşdirilir.

Bu dərsdə mövzu ilə əlaqədar olduğuna görə metallik rabitə haqqında biliklər aktuallaşdırılır. Şagirdlərə yönəldici və idtiqamətləndirici suallar verməklə mövzu haqqında anlayışlar formalaşdırılır.

Müəllim izahatını metal rabitəsinin, kovalent və ion rabitələrinin oxşar və fərqli cəhətlərini qeyd etməklə davam etdirir. Şagirdlərlə qarşılıqlı dialoq aparmaqla onlarının tədqiqatçılıq qabiliyyətlərini inkişaf etdirmiş olur.

Məktəb kimya kursunun IX sinfində “Bor yarımqrupu elementləri. Alüminium və onun birləşmələri” mövzusunun tədrisində inteqrasiya imkanlarının reallaşdırılması xüsusi maraq kəsb edir. Bu səbəbdən əvvəlcə bu mövzunun tədrisi zamanı müəllimin dərsdə qarşıya qoyduğu məqsəd aşağıdakı kimi ola bilər:

Alüminium və onun birləşmələrinə aid şagirdlərin əldə etdiyi ümumi biliklər əsasında yeni bilik və bacarıqların öyrədilməsi: alüminium misalında tipik amfoter metal, onun birləşmələri haqqında təsəvvürlərin genişləndirilməsi; ion mübadilə, hidroliz anlayışları barədə biliklərin inkişaf etdirilməsi. Bilikləri və bacarıqları dərinləşdirmək üçün şagirdlərlə birlikdə bir neçə sual aydınlaşdırılır:

1. Alüminiumun fəal olmasına baxmayaraq, qızdırdıqda belə oksigenlə və su ilə reaksiyaya girməsinin səbəbini necə izah etmək olar?
2. Nə üçün alüminium adi şəraitdə duru turşularla reaksiyaya girdiyi halda, qatı nitrat və sulfat turşuları ilə adi şəraitdə reaksiyaya girmir?
3. Alüminium qələvi məhlulu ilə qarşılıqlı təsirindən hansı məhsullar alınır? Reaksiyaların tənliyini yazın.

İnteqrasiya biliklərin tam və bütöv bir şəkildə dərk edilməsi üçün tədris prosesində reallaşdırılan mühüm amillərdən biridir. Ümumtəhsil məktəblərində “Bor yarımqrupu elementləri. Alüminium və onun birləşmələri” mövzusunun tədrisində biologiya fənni ilə inteqrasiya yaradılmasını aşağıdakı kimi göstərmək olar:

Alüminium mikrobioelementlər qrupuna daxildir. Canlı orqanizmdə onun miqdarı $5\times10^{-3}\%$ təşkil edir. Alüminium preparatlarının tibbdə quruducu və qismən də antimikrob təsirə malik maddə kimi tətbiq edilir. Alüminium zəylərinin $Me^{+}\ Al(SO_4)_2$ 0,5 – 1%-li məhlulları dəridə selikli qişaların iltihabı prosesləri zamanı tətbiq edilir. Əsasi alüminium-asetat – $Al_2(OH)_3(CH_3COO)_3$ duzunun 8%-li məhlulu durulaşdırılmış şəkildə yumaq, islatmaq və kompres üçün işlədilir.

IX sinif kimya kursunda metallar mövzusunun tədrisində riyaziyyat fənni ilə fənlərarası inteqrasiya yaratmaq imkanı da mümkündür.

Mövzunun tədrisində metalların təbiətdə tapılması haqqında məlumatlar verilərkən coğrafiya fənni ilə birbaşa əlaqə yaratmaq daha perspektivdir.

Coğrafiya, biologiya, informatika fənləri ilə fənlərarası inteqrasiya yaradılaraq bu fənləri sevən şagirdlərin kimyaya olan marağını artırır. Bu səbəbdən kimya müəllimləri şagirdlərin bu fənnə olan marağını artırmaq üçün fənlərarası inteqrasiyadan istifadəyə üstünlük verməlidirlər.

**Problemin aktuallığı.** Tədris prosesində şagirdlərdə mövzuya dair tamlığın və bütövlüyün təmin edilməsi, şagirdlərin kimya fənninə marağın oyadılması, biliklərin tam mənimsənilməsi texnologiyasının tətbiq edilməsidir.

**Problemin praktik əhəmiyyəti.** Ümumtəhsil məktəblərinin IX sinif kimya kursunda "Bor yarımqrupu elementləri. Alüminium və onun birləşmələri" mövzusunun tədrisi zamanı istifadə edilən inteqrasiyadan, biologiya fənni ilə fənlərarası əlaqənin yaradılması metodikasından, tədqiqatçılar və müəllimlər yararlana bilərlər.

**Problemin elmi yeniliyi.** İnteqrasiyanın təlim prosesində rolu, metallar, onların fiziki-kimyəvi xassələri, metalların ərintiləri mövzularının coğrafiya, biologiya və fizika fənləri ilə inteqrasiyası, orta ümumtəhsil məktəblərində "Bor yarımqrupu elementləri. Alüminium və onun birləşmələri" mövzusunun tədrisində inteqrasiya imkanlarından istifadə olunması, tövsiyələrin verilməsidir.

**Ədəbiyyat:**


1. "Kurikulum" jurnalı, 2013, № 2, s. 14-21.
2. L. Franzie, Loepp məqaləsi. https: //files. eric. ed. gov/full tex /EJ 610852 pdf.
3. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Bakı: Təhsil, 2008.
4. Tağıyeva A.M. Ümumtəhsil məktəblərində kimyanın biologiya ilə əlaqəli tədrisinin nəzəriyyəsi və təcrübəsi: ped.fəls.dok. ... dis. avtoref. Bakı, 2015.
5. Məmmədova A.Z. Kimyanın tədrisində müasir təlim texnologiyaları. Bakı, 2012.


**E-mail:** gunayyusifova987@gmail.com

**Rəyçilər:** *kim.ü.fəls.dok.* **G.V. Şadlinskaya,**
*kim.ü.fəls.dok.* **N. Babayeva**
**Redaksiyaya daxil olub:** 21.11.2022.

*UOT 372.854*

***Gülzar Vəsəd qızı Şadlinskaya***
*kimya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*

***Rəqsanə Rəşad qızı Qarayeva***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# KİMYANIN TƏDRİSİ ZAMANI LAYİHƏLƏR METODUNUN TƏTBİQİ

***Гюльзар Васад гызы Шадлинская***
*доктор философии по химии, старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

***Рагсана Рашад гызы Гараева***
*Азербайджанский Государственный Педагогический Университет*

# ПРИМЕНЕНИЕ МЕТОДА ПРОЕКТОВ ПРИ ПРЕПОДАВАНИИ ХИМИИ

***Gulzar Vasad Shadlinskaya***
*doktor of philosophy in chemistry*
*senior lecturer at Azerbaijan State Pedagogical University*

***Ragsana Rashad Garayeva***
*Azerbaijan State Pedagogical University*

# APPLICATION OF PROJECTS METHOD WHILE TEACHING CHEMISTRY

**Xülasə.** Layihələr metodunun əsasını şagirdlərin idraki vərdişlərinin, öz biliklərindən müstəqil istifadə qabiliyyəti, informasiya məkanında istiqaməti tutmaq və alınan məlumata tənqidi münasibət bacarıqlarını inkişafı təşkil edir. Təqdim edilən layihə “Silisium və onun birləşmələri” mövzusuna həsr edilmiş, silisium və onun birləşmələrinin quruluşu, fiziki-kimyəvi xassələri, təbiətdə, insan orqanizmində, texnikada əhəmiyyəti öyrənilmişdir.

Layihə fəaliyyəti şagirdlərdə planlaşdırma, tədqiqatçılıq, kommunikativlik, təqdimat bacarıqları formalaşdırır.

***Açar sözlər:*** *planlaşdırma, tədqiqatçı, kommunikativlik, təqdimat*

**Резюме.** В основе метода проектов лежит развитие познавательных навыков учащихся, способностей самостоятельно использовать свои знания, умений ориентироваться в информационном пространстве и критически осмысливать полученную информацию. Представленный проект посвящен теме «Кремний и его соединения», изучены строение и физико-химические свойства кремния и его соединений, их значения в природе, организме человека, технике.

Проектная деятельность формирует у учащихся умения планировать, исследовать, презентировать, коммуникативность.

***Ключевые слова:*** *планирование, исследователь, коммуникативность, презентация*

**Summary.** Basic of projects method comprises the ability of independent use the cognitive habits and their skills by students, to take direction in the information space and the development of critical attitude skills to obtained information. The presented project was devoted to the topic "Silica and its compounds" and structure of silica and its compounds, physical and chemical properties, its significance in nature,human organism and technique was studied in this project.

Project activity forms planning, research, communicability, presentation abilities in students.

***Key words:*** *planning, researcher, communicability, presentation*

Cəmiyyətin müasir inkişaf mərhələsi ümumi təhsilə xüsusi tələblər qoyur ki, burada məqsəd özünütəkmilləşdirmə qabiliyyətli, müstəqil olaraq bilikləri əldə etməyi bacaran, müxtəlif məsələləri həll etmə üsul və vasitələrini seçə bilən fəal, yaradıcı şəxsiyyət yetişdirməkdir.

Bununla əlaqədar olaraq, təklif edilən metod bu gün ümumtəhsil məktəb praktikasında aktual aparıcı metoddur. Onun əsas ideyası ondan ibarətdir ki, şagird yalnız özünün sərbəst olaraq seçdiyi fəaliyyətlə həvəslə məşğul olsun.

Layihələr metodu – kompleks öyrədici metod olub, tədris prosesini fərdiləşdirməyə, tədris tapşırıqlarının yerinə yetirilməsi zamanı şagirdə öz fəaliyyətini müstəqil planlaşdırmağa, təşkil və kontrol etməyə imkan verir.

"İdrak etdiyim hər şeyin mənə nə üçün və harada lazım olduğunu və bu bilikləri necə tətbiq edəcəyimi bilirəm" – layihələr metodunun müasir anlayışı budur. Layihələr metodunun əsasını şagirdlərin idraki vərdişlərinin, öz biliklərini müstəqil tətbiq etmək qabiliyyətlərinin, informasiya məkanında düzgün istiqamətlənmək və alınan informasiyaya tənqidi yanaşma bacarıqlarının inkişafı təşkil edir (1, s.7) .

Layihənin icrası zamanı müxtəlif metod və vasitələrdən istifadə, elm, texnika, texnologiya, yaradıcılıq sahəsində bilik və bacarıqların inteqrasiyası nəzərdə tutulur. Yerinə yetirilən layihənin nəticələri "hiss edilməlidir", yəni həll edilən nəzəri problemdirsə – konkret həlli, praktiki problemdirsə – tətbiq üçün hazır konkret nəticə olmalıdır.

Şagird aktivləşir, maraqlanır, tədrisin bərabərhüquqlu iştirakçısına çevrilir. O, standart düşüncədən, stereotip fəaliyyətdən uzaqlaşır ki, bu da öyrənmək cəhdini inkişaf etdirməyə imkan verir. Dərs zamanı və dərsdənkənar vaxtlarda belə bir işin öyrədici, tərbiyəedici, həmçinin inkişafetdirici əhəmiyyəti böyükdür. Layihələr metodu tədrisin məzmununa, formasına, metodlarına ənənəvi yanaşmanın dəyişməsi üçün müəllimə geniş imkanlar yaradaraq, tədris prosesinin təşkili sistemini keyfiyyətcə yeni səviyyəyə çıxarır. Bu metoddan tədrisin istənilən mərhələsində, müxtəlif yaşlı və qabiliyyətli şagirdlərlə işləyərkən və müxtəlif çətinlik dərəcəli materialların öyrədilməsi zamanı istifadə edilə bilər.

Layihələrin icrası zamanı şagirdlərin və müəllimin rolu keyfiyyətcə dəyişir. Layihənin müxtəlif mərhələlərində bu rollar fərqlənir. Müəllim bütün mərhələlərdə layihənin koordinatoru, məsləhətçisi və köməkçisidir. Şagirdlər prosesin aktiv iştirakçılarıdırlar. Burada vurğu tədrisin məzmununa deyil, malik olduqları biliklərin tətbiqi prosesinə edilməlidir.

Şagirdlər layihənin fəaliyyət qaydaları, layihə qarşısında qoyulan tələblərlə tanış edilməlidirlər:

- Layihədə hər hansı problem həll edilməlidir;
- Tədqiqat işi aparmalıdır;
- Layihə şagirdlər tərəfindən müstəqil yerinə yetirilməlidir;
- Müəllim məsləhətçi rolunda olmalıdır;
- Layihənin nəticələrinin praktiki əhəmiyyəti olmalıdır;
- Layihənin sonunda nəticələr analiz edilməlidir.

Şagirdlər layihə üzərində işə başlamazdan əvvəl təlimatlandırılırlar:

1) Layihəyə qoyulan tələb;

2) Metodiki təlimatlar, layihənin düzgün tərtib edilməsi üçün yaddaş;

3) Layihənin qiymətləndirilməsi üçün ballar şkalası (2, s.14).

Nümunə olaraq, "Silisium və onun birləşmələri" mövzusunda fərdi tədqiqat layihəsini göstərə bilərik.

**Standart:**

4.1.1. Metallar və qeyri-metalların, onların birləşmələrinin, sadə üzvi birləşmələrin tətbiqinə və həyatda roluna dair referatlar hazırlayır.

**Təlim nəticəsi:** Silisium və onun birləşmələrinin tətbiqinə və həyatda roluna dair referatlar hazırlayır.

**Hazırlıq**:

✓ 9-cu sinif dərsliyində s. 134-dəki "Silisium – dioksid və metasilikat turşusu" mövzusu ilə tanış olmaq.

✓ 9-cu sinif dərsliyində s. 138-dəki " Silisiumun təbii birləşmələri və onların texnikada tətbiqi" mövzusu ilə tanış olmaq.

**Tədqiqat sualları:**

1. Məqsəd nədən ibarətdir?
2. Silisium və onun birləşmələrinin insan orqanizmi üçün əhəmiyyəti nədən ibarətdir?
3. Silisium və onun birləşmələrinin çatışmazlığı hansı xəstəliklərə səbəb olur?

Şagirdin təqdim etdiyi bu layihədə silisium və onun birləmələrinin insan orqanizmi üçün əhəmiyyəti, silisiumun orqanizmimizdə funksiyası, onun orqanizmdə çatışmazlığı hansı xəstəliklərə səbəb olduğu öyrənilmişdir.

Şagird tədqiqatında silisiumun birləşmələrinin tibb sahəsində tətbiqi qeyd edilmiş, həmçinin qida vasitəsilə tövsiyə olunan, tərkibində böyük miqdarda silisium olan qida məhsullarının siyahısı verilmişdir.

Layihədə silisiumun insan orqanizminə təsiri haqqında məlumat verilərək, sübut edilir ki, silisium həm də stomatologiyada və farmakologiyada istifadə edilir, bir çox xəstəliklər məhz onun orqanizmdə çatışmazlığından meydana çıxır.

Layihənin *aktuallığını* – silisiumun təbiətdə, insanın həyatında, texnikada və digər müxtəlif sahələrdə vacibliyinin müzakirəsi, həmçinin onun quruluşunun, xassələrinin, tətbiqinin və tarixinin nəzərdən keçirilməsi təşkil edir.

*Məqsəd* silisiumun quruluşu əsasında silisium, onun birləşmələri, onların fiziki və kimyəvi xassələri, təbiətdə və insan üçün əhəmiyyəti haqqında müxtəlif təsəvvürləri təqdim etməkdir.

Layihənin məzmunu silisium, silisium dioksid, müxtəlif mineralları, bioloji əhəmiyyəti, atom quruluşu, kristal quruluşu, fiziki-kimyəvi xassələri, kosmosda mövcudluğu haqqında məlumatlardan ibarətdir.

Tədqiqat işinin nəticəsində bildirilir ki, silisium Yer üzərində həyatın mövcudluğu üçün ən mühüm elementlərdəndir. İnsanın gəzdiyi torpaq, gündəlik istifadə etdiyimiz bir çox materiallar və cisimlər, insanın özü, müxtəlif qidalar və s. məhz silisiumdan ibarətdir.

Layihə fəaliyyətinin təşkili praktikasının analizi vasitəsilə əldə etdiyimiz nəticələr:

– Layihə işi daxili idraki motivasiyanı stimullaşdırır və kimyaya marağı artırır;

– Dərslər daha fəal keçir;

– Yalnız yaxşı qiymət deyil, həm də yaxşı biliklərə və işdə yaxşı nəticələrə yiyələnmək üçün stimul yaranır.

Layihə icra edən şagirdlərdə planlaşdırma, tədqiqatçılıq, kommunikativlik, təqdimat bacarıqları formalaşır.

Beləliklə, layihə fəaliyyəti – özünütəkmilləşdirmə təsrübəsi qazanan, əməkdaşlığa hazır, müstəqil işləmək bacarıqlarına və vərdişlərinə malik yeni tip şagird formalaşdırmağa kömək edir.

**Problemin aktuallığı**. Öyrənənlərin tədqiqat aparan zaman təfəkkürün hər üç növü baxımından (məntiqi, tənqidi və yaradıcı) problemin həllinə yanaşması, layihə hazırlamaq bacarığına sahib olması problemin aktuallığıdır.

**Problemin praktik əhəmiyyəti.** Ümumi orta təhsil və ya tam orta təhsil müəssisələrində kimya fənninin tədrisi zamanı "Silisium və onun birləşmələri" mövzusunun layihə metodu ilə öyrənilməsi, şagirdlərin tədqiqatçılığı nəticəsində silisiumun insan orqanizmi üçün əhəmiyyətinin öyrənilməsi problemin praktik əhəmiyyətidir.

**Problemin elmi yeniliyi.** Ümumi orta və ya tam orta təhsil müəssisələrində kimya fənni tədris planında mövzuların yeni təlim metodları ilə keçirilməsi problemin elmi yeniliyidir.

**Ədəbiyyat:**

1. Попова Ю.В. Метод проектной деятельности на уроках химии. -Уральск, -2016
2. Язычeнко М.В. Метод проектной деятельности на уроках химии. -Кемерово, -2017.
3. Mehrabov, A.O. Azərbaycan təhsilinin müasir problemləri. / A.O. Mehrabov. -Bakı: Mütərcim, -2007. -447 s.
4. Бичеева В.В. Проектно-исследовательская деятельность по химии. Образовательная социальная сеть nsportal.ru. 24.10.2018
5. Тарасова Т.А. Использование метода проектов при изучении химии // Педагогическое мастерство: материалы III Междунар.науч.конф. (г. Москва, июнь 2013)

**E-mail:** shadligulzar@yandex.ru
qarayeva.reksane@mail.ru
**Rəyçi:** *kim.ü.fəls.dok., dos.* **R.M. Ağayeva,**
**Redaksiyaya daxil olub:** 21.11.2022.

UOT 372.854

***Rumiyyə İnşad qızı Camalova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*

# KİMYANIN TƏDRİSİ ZAMANI SƏRİŞTƏLƏRİN İNKİŞAFI YOLLARININ TƏDQİQİ

***Румия Иншад гызы Джамалова***
*старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

# ИССЛЕДОВАНИЕ ПУТЕЙ РАЗВИТИЯ КОМПЕТЕНЦИЙ ПРИ ПРЕПОДАВАНИИ ХИМИИ

***Rumia Inshad Jamalova***
*senior lecturer Azerbaijan State Pedagogical University*

# RESEARCH OF COMPETENCE DEVELOPMENT WAYS DURING CHEMISTRY TEACHING

**Xülasə**. Məqalədə şagirdləri kimyanın sirlərinə yiyələndirmək istəyən hər bir müəllimin dövlət standartlarını araşdıraraq, tələbi incələməsindən, belə ki, sadədən mürəkkəbə doğru inkişaf prinsipini əsas tutaraq kimya fənn standartlarını reallaşdıracaq mövzuların məzmununda şagirdə lazım olacaq problemlərin araşdırılmasından, söhbət açılır. Xüsusilə, kimya dərslərinin həyatla əlaqəli olduğunu nəzərə alıb REACT modelindən istifadə edərək hazırlanmış cari plan nümunəsindən, tədqiqat zamanı təfəkkür, fəaliyyət, dəyərlərlə bağlı səriştələrin formalaşdırılması və inkişaf etdirilməsindən, hər bir dərsin mənimsənilməsinin səmərəliliyini müəyyən etmək üçün "Qavrama xəritəsi"nin qurulması imkanlarından, yaradıcı tətbiqetmə üçün "doğru, səhv" tapşırıqlarının qurulması texnikasından bəhs edilir.
***Açar sözlər:*** *tədqiqat, REACT, təfəkkür, fəaliyyət, dəyər, özünüinkişaf, əlaqələndirmə, sınaqdan keçirmə, təcrübə etmə, tətbiqetmə, əməkdaşlıq, transfer etmə, gündəlik həyata çevirmə, qavrama xəritəsi*

**Резюме.** В статье рассмотрен каждый учитель, желающий научить школьников секретам химии путем изучения государственных стандартов и сужения спроса, чтобы исходя из принципа развития от простого к сложному, от рассмотрения задач, которые понадобятся ученику в содержании предметов, реализовывались стандарты предмета химии, особенно учитывая, что уроки химии связаны с жизнью. На примере модели РЕАКТ подготовлен текущий план, формирование и развитие компетенций, связанных с мышлением, действием, и ценности при исследовании, возможности построения «Карты восприятия» для определения эффективности усвоения каждого урока, и методика построения «верных, ложных» заданий для творческого применения.
***Ключевые слова:*** *исследовательская работа, REACT, мышление, деятельность, ценность, саморазвитие, мотивация, опыт, применение, сотрудничество, трансфер, в превести повседневную жизнь, перцептивная карта*

**Summary.** In the article, every teacher who wants to teach students the secrets of chemistry by researching the state standards and narrowing down the demand, so that based on the principle of development from simple to complex, from the examination of the problems that the student will need in the content of the subjects that will realize the chemistry subject standards, especially, taking into account that chemistry lessons are related to life, using the REACT model. It is discussed about the example of the current plan, the formation and development of intellect quality, action, and values-related competencies during research, the possibilities of building a "Perception Map" to determine the efficiency of mastering each lesson, and the technique of building "true, false" tasks for creative application.
***Key words:*** *Research, REACT, thinking, activity, value, self-development, motivation, testing, experience, application, cooperation, transfering, to convert daily life, perceptual mapp*

XX əsrin əvvəllərində qloballaşan dünyanın inkişafı, dünya təhsil sisteminə inteqrasiya, planlı iqtisadiyyatdan bazar iqtisadiyyatına keçid, tez-tez dəyişən həyat şəraiti, texnologiyaların sürətli inkişafı, qlobal innovasiyalar və başqa bu kimi proseslər biliklər sisteminin metodologiyasında çoxlu sayda dəyişikliklərə meydan açdı. Qloballaşmanın gətirdiyi kompleks problemlər təhsil sferasından da yan ötmədi və təhsil işçilərinin qarşısına fəaliyyət sisteminin ən yüksək səviyyədə təşkili üçün bir deyil, coxvektorlu yanaşma tələbi qoymaqla pedaqoji prosesin təşkilində yeni metodlar, innovativ yanaşmaları üzə çıxardı. Belə ki, müasir təhsil təhsilalanlarda yeni təfəkkür və mədəniyyətin, fərdin özünüinkişaf səylərinin, özündə liderlik keyfiyyəti tərbiyə etmənin, analitik, yaradıcı qabiliyyətlərin, gözlənilməz vəziyyətlərdə müstəqil qərar qəbul etmək bacarıqlarının formalaşdırılmasını tələb edir.

Təhsildə təbiət fənlərinin, fizika, biologiya, kimyanın tətbiqi yeniyetmə gənclərin müstəqil həyata hazırlanması, onların gələcəkdə şəxsiyyət kimi formalaşması üçün əsas komponentlərdən biridir. Xüsusən, kimyanın insanların dünyagörüşünün inkişafında, onların bir şəxsiyyət kimi formalaşmasında rolu böyükdür. Bütün canlı və cansız varlıqların tərkibində kimya vardır. Bütün canlı varlıqlar kimi insanlar da kimyəvi maddələrlə qidalanır, orqanizmlərində çox mürəkkəb kimyəvi proseslər gedir, yeni maddələr əmələ gəlir və ya parçalanır.

Azərbaycan Respublikasında Ümumi təhsil pilləsinin dövlət standartları – 2020 sənədinin prinsiplərinə əsasən kimya fənni üzrə ümumi təlim nəticələri nəticəyönlülüyü, şəxsiyyətyönlülüyü, inteqrativ, tələbyönlü məzmunu ilə ənənəvi tədris proqramlarından fərqlənir. Dövlət standartlarında, həmçinin təhsilalanlarda formalaşdırılacaq səriştələr nəzərdə tutulmuşdur. Təhsilin humanist, demokratik prinsipləri əsasında təhsilalanlarda tədqiqat xarakterli təfəkkürlə, fəaliyyətlə və dəyərlərlə bağlı səriştələri inkişaf etdirmək, formalaşdırmaq vacibdir.

Ümumi təhsilin Dövlət standartları sənədinə görə Ümumi təhsil səviyyəsində kimya fənni üzrə ümumi təlim nəticələri:

1) maddələri tərkibinə və quruluşuna görə fərqləndirir;

2) xassələrinə görə maddələrin tətbiq sahələrini izah edir;

3) maddələrdə baş verən dəyişikliklərin səbəblərini və nəticələrini şərh edir.

Ümumi təhsilin Dövlət standartları sənədinə görə kimya fənni üzrə Tam orta təhsil səviyyəsi üzrə ümumi təlim nəticələri:

1) kimyəvi qanun və qanunauyğunluqların mahiyyətini izah edir;

2) maddələrin tətbiq sahələrini proqnozlaşdırır;

3) ekoloji problemlərin həllində kimyanın rolunu dəyərləndirir.

Tam orta təhsil səviyyəsi üzrə Təmayül siniflərdə Ümumi təlim nəticələri:

• maddələri tərkib və quruluşuna görə fərqləndirir, onların tətbiq sahələrini xassələri ilə əlaqələndirir;

• kimyəvi reaksiyaların qanunauyğunluqlarına dair bilik və bacarıqlara yiyələnir və onları tətbiq edir;

• kimyəvi maddələrin tərkib, quruluş və çevrilmələrini modelləşdirir;

• sərbəst şəkildə eksperimentlər həyata keçirir, müşahidə aparır və nəticələrini dəyərləndirir;

• maddələrin tərkib, quruluş və çevrilmələri ilə əlaqəli hesablamalara dair bilik və bacarıqlarını nümayiş etdirir;

• elm və texnologiyanın inkişafında, ətraf mühitin mühafizəsində kimya elminin rolunu şərh edir və təqdimatlar hazırlayır;

• kimya elminin əsaslarına dair informasiya mübadiləsi, müzakirəsi və tətbiqetmə bacarıqlarının nümayişində XXI əsr ünsiyyət mədəniyyətindən istifadə edir.

*Kimyəvi hadisələr məzmun xəttinin tədrisi zamanı təfəkkür və fəaliyyətlə bağlı səriştəlilik.*

Kimya fənninin tədrisi zamanı Ümumi orta təhsil səviyyəsində kimyadan əldə edilən müvafiq bilik və bacarıqlar şagirdlərə onları əhatə edən maddi aləmin və burada baş verən hadisələrin təhlilinə və bunun əsasında gündəlik həyati problemlərin həllinə imkan verir. Şagirdlərin intellektual inkişafına, uğurlu praktiki fəaliyyətinə zəmin yaradan təfəkkür tərzi formalaşdırır. Başqa fənlərin öyrənilməsinə kömək edir və təhsilin davam etdirilməsi üçün imkan yaradır. Müxtəlif forma və məzmuna malik məlumatların məntiqi cəhətdən təhlil edilməsi təmin olunur.

Tam orta təhsil səviyyəsində isə fəaliyyətlərin genişləndirilməsi və inkişaf etdirilməsi yolu ilə yeni anlayış və mahiyyətlərin, daha sistemli

və tətbiqyönlü praktik vərdişlərin və bacarıqların aşılanması təmin olunur. Gələcək təhsil və peşə fəaliyyətinin davam etdirilməsinə zəmin yaradan kimyəvi biliklərin mənimsənilməsi və geniş dünyagörüşünün formalaşdırılması təmin olunur.

Kimya təliminin müasir məzmununa əsasən kimya fənninin 4 məzmun xətti məlumdur:

*Maddə və maddi aləm.*

Maddə və maddi aləm məzmun xətti üzrə şagirdlər onları əhatə edən maddələrin tərkibi, quruluşu, xassələri, kimyəvi rabitələri, onların tiplərini, saf və qarışıq maddələri, metal və qeyri-metalları, üzvi və qeyri-üzvi maddələri fərqləndirmək, maddələrin quruluşuna görə xassələrini proqnozlaşdırmaq, maddələri təyinatına görə istifadə etmək, kimyəvi maddələrlə düzgün davranmaq bacarığına yiyələnirlər.

*Kimyəvi hadisələr.*

Kimyəvi hadisələr məzmun xətti üzrə şagirdlər maddələrin bir-birinə çevrilməsi, reaksiya nəticəsində yeni maddələrin alınması, bu çevrilmələrin baş vermə səbəbləri, qanunauyğunluqları, kimyəvi reaksiyaların tənlikləri əsasında hesablamaların aparılması, ətraf aləmdə baş verən çevrilmələrdən yararlanmaq və onların zərərli təsirindən qorunmaq üçün praktik təcrübələr və riyazi hesablamaların köməyi ilə zəruri bacarıqlara yiyələnirlər.

*Eksperiment və modelləşdirmə.*

Eksperiment və modelləşdirmə məzmun xətti üzrə kimyəvi reaksiyaların təcrübi olaraq aparılması, maddələrin quruluşu və çevrilmələrinin, molekulların quruluşu, kristal qəfəslərinin üçölçülü modellərinin hazırlanması məqsədilə aparılan praktik işlər şagirdlərdə fəza təsəvvürlərinin formalaşmasına zəmin yaradır.

*Kimya və həyat.*

Kimya və həyat məzmun xətti üzrə şagirdlər ətraf mühitə zərər vuran maddələri tanımaq, müxtəlif sənaye sahələrinin və məişət tullantılarının, maşın və mexanizmlərin tullantı qazlarının 9 ziyanlı təsirini müəyyənləşdirmək, kənd təsərrüfatında, səhiyyədə istifadə olunan kimyəvi maddələrin ətraf mühitə və sağlamlığa nə dərəcədə mənfi təsiri olduğunu araşdırmaqla ekoloji problemlərin həllində yaxından iştirak etmək üçün zəruri bilik və bacarıqlara yiyələnirlər.

Kimyəvi hadislələr məzmun xəttinin tədrisi zamanı təfəkkür və fəaliyyətlə bağlı səriştəlilik məhz dövlət standartlarının tələbinin reallaşdırılmasıdır.

1) təfəkkürlə bağlı səriştələr – yaradıcılıq (kreativlik), tənqidi təfəkkür, problem həlletmə, qərar qəbuletmə, müstəqil öyrənmə;

2) fəaliyyətlə bağlı səriştələr – ünsiyyət, əməkdaşlıq, rəqəmsal savadlılıq, informasiya savadlılığı, maliyyə savadlılığı;

3) dəyərlər – milli kimliyin dərki və milli iftixar hissi, fəal vətəndaş mövqeyi, şəxsi və sosial məsuliyyət, demokratiya və insan hüquqlarına hörmət, mədəni müxtəlifliyə hörmət.

| **Təsnifat** | **Səriştələr** | **Ümumi orta təhsil səviyyəsində** | **Tam orta təhsil səviyyəsində** |
|---|---|---|---|
| **Təfəkkür** | yaradıcılıq (kreativlik) | qeyri- standart yanaşma nümayiş etdirir | innovativ layihələr hazırlayır |
| | tənqidi təfəkkür | təhlil edilən məsələlərdə uyğunsuzluqları və ziddiyyətləri müəyyən edir | qiymətləndirmə zamanı dəlillərə və dəyərlərə əsaslanır |
| | problem həlletmə | problemin optimal həlli yollarını müəyyən edir | problemli situasiyalarda emosional sabitlik nümayiş etdirir, problemi konstruktiv şəkildə həll edir |
| | qərar qəbuletmə | qərar qəbulunda prioritetlərə əsaslanır | əsaslandırılmış qərarlar qəbul edir və nəticəsi üçün məsuliyyət daşıyır |
| | müstəqil öyrənmə | öz öyrənmə fəaliyyətini müəyyənləşdirə, istiqamətləndirə, tamamlaya bilir | öz öyrənmə fəaliyyətinin keyfiyyətini qiymətləndirir |

| | | | |
|---|---|---|---|
| **Fəaliyyət** | ünsiyyət | ana dilində və xarici dildə ünsiyyət qurur | ana dilində və xarici dildə fikirlərə münasibət bildirir, mülahizələrini əsaslandırır |
| | əməkdaşlıq | kollektivin ortaq məqsədləri üçün çalışır | kollektivdə birgə fəaliyyət və liderlik bacarıqları nümayiş etdirir |
| | rəqəmsal savadlılıq | İKT-nin imkanlarından məqsədyönlü istifadə edir | cəmiyyətin həyatında İKTnin əhəmiyyətini dəyərləndirir, fəal istifadəçi bacarıqları nümayiş etdirir |
| | informasiya savadlılığı | informasiyanın xassələrini nəzərə almaqla, onu emal və istifadə edir | informasiyadan fəaliyyətində məqsədyönlü istifadə edir |
| | maliyyə savadlılığı | səmərəli istehlak davranışı nümayiş etdirir, resurslardan qənaətlə istifadə edir | iqtisadi layihələr qurur, sahibkarlıq ideyaları irəli sürür |
| **Dəyərlər** | milli kimliyin dərki və milli iftixar hissi | azərbaycançılıq ideyalarını təbliğ edir fəal vətəndaş mövqeyi yaşadığı bölgə və ölkə haqqında məlumatlıdır dövlət və dövlətçilik ənənələri barədə məlumatlıdır | azərbaycançılıq ideyalarını təbliğ edir |
| | fəal vətəndaş mövqeyi | dövlət maraqlarının müdafiəsində öz rolunu dərk edir | dövlət maraqlarını müdafiə edir |
| | şəxsi və sosial məsuliyyət | şəxs-cəmiyyət münasibətlərini şərh edir, cəmiyyət qarşısında məsuliyyətini dəyərləndirir | cəmiyyət qarşısında məsuliyyətini şərh edir, sosial layihələrdə iştirak edir, könüllülük fəaliyyəti ilə məşğul olur |
| | demokratiya və insan hüquqlarına hörmət | insan hüquq və azadlıqlarının mahiyyətini dərk edir | insan hüquq və azadlıqlarını müdafiə edir |
| | mədəni müxtəlifliyə hörmət | birgə yaşayış qaydalarına əməl edir | ayrı-seçkiliyin yolverilməzliyini əsaslandırır |

Tədqiqatla bağlı Bakı şəhəri Səbail rayonu M. Rahim adına 7 nömrəli tam orta məktəbin 7 və 8-ci siniflər üzrə iki sinif kontrol və eksperimental siniflər seçilmiş, tədqiqat aparılmışdır. Dərsin fəal interaktiv, tədqiqat xarakterli olması istiqamətində anket sorğu keçirilmişdir. 7-ci siniflər üçün 7a və 7b siniflərində aparılmış sorğunun nəticələrini təqdim edirik.




**Diaqram 1:** *7a və 7b siniflərində aparılmış sorğunun nəticələrini əks etdirən diaqram*

Şagirdləri kimyanın sirlərinə yiyələndirmək istəyən hər bir müəllim, ilk növbədə, standartları araşdırır, standartlarda nə tələb olunduğunu incələyir. Belə ki, sadədən mürəkkəbə doğru prinsipini əsas tutaraq kimyanın ilk anlayışları tədris vahidində yer almış, standartları reallaşdıracaq mövzuların məzmununda şagirdə lazım olacaq problemlərin araşdırılması nəzərdə tutulmuşdur. Xüsusilə, kimya dərslərinin həyatla əlaqəli olduğunu nəzərə alıb REACT modelindən istifadə edərək hazırlanmış cari plan nümunəsini nəzərinizə çatdırırıq. Burada, React-əlaqələndirmə (motivasiya), Experiencing – sınaqdan keçirmə (təcrübə etmə), Applyng – tətbiqetmə (praktik iş), Coorperating – əməkdaşlıq, Transfering – transfer etmə (gündəlik həyata çevirmə) kimi mənalardadır. Məsələn, maddələrin xassələrinə görə təsnifatı – saf maddə və qarışıqlar mövzusu vasitəsilə müəllim 1.1.1. və 3.1.1. standartlarını reallaşdırarkən ilk növbədə bu standartların xüsusiyyətlərini araşdırır, təlim məqsədini düzgün çıxarır. Müəllim şagirdin diqqətini həyatda hər an rast gəldiyi saf maddələrə və qarışıqlara cəlb edir. Bu zaman müəllim şagirdin yaş xüsusiyyətlərini nəzərə alır, bu mövzunun məhz həyat üçün əhəmiyyətli olanlarını araşdıraraq uşaqlarda maraq oyadır və dərsi təcrübələrlə davam etdirir.

**Standart: 1.1.1.,3.1.1.**
**Məqsəd:** *Saf maddə və qarışıqları tərkibinə və fiziki xassələrinə görə fərqləndirərək, sadə təcrübələr və müşahidələr aparır.*
**Mövzu:** *Saf maddələr və qarışıqlar*
**İş forması:** *Böyük qruplarla, kiçik qruplarla*
**İş üsulu:** *Beyin həmləsi, Blinqivil üsulu, kublaşdırma*
**İnteqrasiya:** *B.1.1.2., F. 2.1.3.*
**Resurslar:** *su, yağ, şəkər, xörək duzu, qum, təbaşir tozu, dəmir tozu, oduncaq kəpəyi, kükürd tozu, kimyəvi stəkan, qıf, süzgəc kağızı, ayırıcı qıf, spirt lampası, ştativ, çini kasa*
***https://www.youtube.com/watch?v=00kKPOs_FA4***

Daha maraqlı olar ki, əlaqələndirmə və ya dərsin motivasiyası həyatla əlaqəli şəkildə adi bir hekayə kimi qurulsun. Nümunə üçün bu istiqamətdə bir motivasiya –hekayə tövsiyə olunur.

**Motivasiya**

**"Aydan artıq 7- ci sinif şagirdi idi. Yavaş- yavaş anasının köməkçisinə çevrilirdi. O bir dəfə anası işdən gələnəcən onun işini yüngülləşdirmə məqsədilə çay qoyub, yemək hazırlamaq qərarına gəlir. Və ilk olaraq çay qaynatmaq lazım olduğunu bildiyindən kranı açıb çaydana su doldurur. Bu zaman Aydan suyun çirkli gəldiyini müşahidə edir. Bu anda onun ağlında müxtəlif suallar canlanır.**

**Yönəldici suallar:**

- **Su nə üçün çirklidir?**
- **Onu necə təmizləmək olar?**
- **Öncə nə etmək lazımdır?**
- **Suyu təmizləmək üçün evdə hansı vasitələr var?**

Sınaqdan keçirmə mərhələsində şagirdlər artıq bu suallara uyğun təcrübələr aparacaq, gələcəkdə gündəlik həyatda bu tip problemlərlə qarşılaşdıqda nə etmək lazım olduğunu özləri müəyyən edəcəklər. Beləliklə, şagirdlər aşağıdakı təcrübələri yerinə yetirirlər. Bu təcrübə təlimatçı şagirdlər tərəfindən də aparıla, digər şagirdlər tərəfindən isə müşahidə edilə bilər.

**Fəaliyyət I**

**Təchizat: qum, su, stəkan, kolba, süzgəc kağızı, şüşə çubuq.**

**Nə edəcəksiniz?**

1. **Stəkana bir az qum və yarıya qədər su töküb qarışdırın.**
2. **Qıfı kolbaya, süzgəc kağızını isə qıfa yerləşdirin.**
3. **Şüşə çubuq vasitəsilə qumlu suyu qıfa süzün.**
4. **Müşahidələrinizi qeyd edin.**




**Fəaliyyət II**

**Təchizat: xörək duzu və ya şəkər, su, spirt lampası, ştativ, şüşə çubuq**

**Nə edəcəksiniz?**

1. **Çini kasada xörək duzu və ya şəkəri su ilə qarışdırın.**
2. **Məhlul olan çini kasanı ştativin halqasına yerləşdirin.**
3. **Spirt lampasını ştativin altlığında kasanın altında yerləşdirib, fitili alovlandırın.**
4. **Müşahidələrinizi qeyd edin.**



**Fəaliyyət III**

**Təchizat: ştativ, ayırıcı qıf, bitki yağı,su, qəbuledici**

**Nə edəcəksiniz?**

1. **Ayırıcı qıfı ştativə yerləşdirin.**
2. **Qıfın kranının altına qəbuledici yerləşdirin.**
3. **Bitki yağını su ilə qarışdırın, ayırıcı qıfın kranının bağlı olduğunu dəqiqləşdirib, qarışığı qıfa əlavə edin, emulsiyanın durulmasını gözləyin.**
4. **Kranı açın. Yağa çatanda kranı bağlayın. Müşahidələrinizi qeyd edin.**




**Fəaliyyət IV**

**Təchizat: dəmir qırıntıları, oduncaq kəpəyi və ya kükürd tozu, maqnit.**

**Nə edəcəksiniz?**

1. **Dəmir qırıntıları ilə oduncaq kəpəyini və ya kükürd tozunu qarışdırın.**
2. **Maqniti qarışığa yaxınlaşdırın.**




Təcrübələr başa çatdıqdan sonra şagirdlər bu təcrübələrin harada istifadə olunduğunu müəyyən etməlidirlər. 1-ci fəaliyyətdəki təcrübənin süzmə üsulu olduğunu müəyyən edən şagirdlər Aydanın hekayəsinə uyğun olaraq anlayırlar ki, bu üsuldan məişətdə geniş tətbiq olunur. 2-ci fəaliyyətdəki təcrübədən xörək duzu və şəkər istehsalında istifadə olunur. 3-cü təcrübədən isə neft sənayesində, eləcə də məişətdə istifadə olunur. 4-cü təcrübədən də aydındır ki, bu üsuldan dülgərlər və ya dəmirçilər istifadə edir. Artıq əməkdaşlıq mərhələsində şagirdlər apardıqları təcrübələrin mahiyyətini açıqlayacaqlar. Bu zaman onlar qruplarla, cütlərlə və s. iş formaları ilə işləyə bilərlər. Qruplara iş vərəqləri təqdim olunur. Aparılmış təcrübələrə uyğun tapşırıqlar verilir.

**I Qrup**

1. **Qumlu su nə üçün süzmə vasitəsilə ayırdınız?**

______________________________

______________________________

2. **Qum və su qarışığı birlikdə necə adlanır, ayrı- ayrı necə adlanır?**

______________________________

______________________________

______________________________

______________________________



**II Qrup**

1. **Şəkərlə və ya xörək duzu ilə suyu nə üçün buxarlandırma vasitəsilə ayırdınız?**

**2. Şəkər (xörək duzu) və su qarışığı birlikdə necə adlanır, ayrı- ayrı necə adlanır?**



**III Qrup**

1. **Yağla suyu nə üçün durultma üsulu (ayırıcı qıfla) vasitəsilə ayırdınız?**

**2. Yağ və su qarışığı birlikdə necə adlanır, ayrı- ayrı necə adlanır?**




**IV qrup**

1. **Dəmir qırıntıları və kükürd tozu (oduncaq kəpəyi) qarışığını nə üçün maqnit vasitəsilə ayırdınız?**

**2. Dəmir qırıntıları və kükürd tozu (oduncaq kəpəyi) qarışığı birlikdə necə adlanır, ayrı- ayrı necə adlanır?**




Bu tapşırıqları işlədikdən sonra transfer etmə mərhələsi başlayır ki, bu mərhələdə şagirdlər gündəlik həyatla əlaqəli film, videolar və s. müşahidə edərək, öyrəndikləri məlumatların yeni, əvvəllər rastlaşmadıqları bir vəziyyətə tətbiq edilməsi ilə qarşılaşır, eyni zamanda, onların diqqətini çəkməmiş yeni bir hadisə ilə əlaqələndirilməsinin təmin edilməsi mərhələsi ilə üzləşirlər. Biliyin bacarıqlar şəklində yeni vəziyyətə ötürülməsi və ya tətbiqi həm dərsdə, dəm də dərsdənkənar hadisələrə tətbiq edilə bilər. Şagirdin qavraya bilmədiyi və ya qavramaqda çətinlik çəkdiyi yeni bir texnologiya və ya anlayışı, gündəlik həyatda daha əvvəl həll edə bilmədiyi bir problemi həll etmək üçün istifadə etməsi də modelin məhz transferetmə mərhələsi çərçivəsindədir.

*https://www.youtube.com/watch?v=00kKPOs_FA4*. Şagirdlər bu videonu izləyirlər. Çirkli suyun ev şəraitində necə təmizlənə biləcəyinin şahidi olurlar. Əslində onlar çayın qaynamasını gündəlik müşahidə edirlər. Ancaq gündəlik gördükləri bir prosesin bu dərsdən sonra onların həyatına yeni bir vəziyyət kimi, proses kimi daxil olması şagirdin bir ömür boyu dostuna çevrilməsi deməkdir. Hər bir dərsin mənimsənilməsinin səmərəliliyini müəyyən etmək üçün “Qavrama xəritəsi” qurmaq məsləhət görülür. Qavrama xəritəsindən fəal-interaktiv dərsin əsasən nəticə və ümumiləşmə, yaradıcı tətbiqetmə, dəyərləndirmə və ya refleksiya mərhələsində istifadə etmək səmərəli olardı.

Kimya müəllimlərinə yaradıcı tətbiqetmə mərhələsi üçün “doğru, səhv” deyə bir tapşırıq vermək tövsiyə olunur.

Bu yolla şagirdlərdə məişətdə baş verən hadisələri dərk edərək problemi həll etmə bacarığı aşılanır ki, bu da şagirdin gələcəkdə əmək prosesində, sənayedə iş zamanı qarşısına çıxan maneələri asan və sadə yolla aşa bilsin.

Kimyanın tədrisi zamanı səriştələrin inkişafı yollarının tədqiqi adlı tədqiqat zamanı aşağıdakı nəticələr əldə olunmuşdur.

1. Araşdırmalar zamanı müəyyən edildi ki, kimya fənn kurikulumunu tətbiq edərkən məktəblər laboratoriya, maddi- texniki baza ilə lazımi səviyyədə təmin olunmadığından müəllimlər nəzəri biliklərə üstünlük verir.

2. Kimya fənninin daha çox praktik xarakterə malik olduğunu nəzərə alsaq, şəraitə uyğun müvafiq vasitələrdən istifadə etməklə şagirdlərdə nəzəri biliklərin tətbiqetmə bacarıqlarına çevrilməsinə, eləcə də həmin bacarıqların həyatla əlaqələndirilməsinə nail olmaq olar. Müvafiq mövzuların tədrisində belə sadə təcrübələrin aparılması şagirdlərdə tətbiqetmə, tədqiqatçılıq və s. bu kimi həyati bacarıqların formalaşmasına təsir edir.

3. Kimyəvi hadisələr məzmun xəttinin tədrisi zamanı təfəkkürlə bağlı səriştələr – yaradıcılıq (kreativlik), tənqidi təfəkkür, problem həlletmə, qərar qəbuletmə, müstəqil öyrənmə və fəaliyyətlə bağlı səriştələr - ünsiyyət, əməkdaş-

lıq, rəqəmsal savadlılıq, informasiya savadlılığı, maliyyə savadlılığının inkişafına müxtəlif strategiyalarla – REACT modeli, təcrübələrlə, fəaliyyətlərlə – "Qavrama xəritəsi", "doğru, səhv" tapşırıq modelləri ilə nail olmaq mümkündür. Bu yolla şagirdlərdə məişətdə baş verən hadisələri dərk edərək problemi həll etmə bacarığı aşılanır ki, bu da şagirdin gələcəkdə əmək prosesində, sənayedə iş zamanı qarşısına çıxan maneələri asan və sadə yolla aşa bilsin.






**Problemin aktuallığı.** Tədqiqat zamanı öyrənənlərdə təlim ehtiyaclarının təmin edilməsi və "məmnun şagird" perfomansının formalaşması, onlarda öyrənməyə cəlb olunma və prosesi mənimsəmə, problemin həllinə məntiqi, tənqidi və yaradıcı yanaşma zamanı səriştələrin inkişaf etdirilməsi, formalaşdırılması problemin aktuallığıdır.

**Problemin elmi yeniliyi.** Şagird tədqiqatçılığı zamanı təkcə akademik biliklərin deyil, layihə əsaslı öyrənmə ilə onlarda sosial və emosional sferanın, mənəvi və fiziki inkişafın təmin edilməsi, səriştələrin inkişaf etdirilməsi problemin elmi yeniliyidir.

**Problemin praktik əhəmiyyəti.** Dayanıqlı inkişaf məqsədlərini, xüsusən 4-cü məqsədi əsas tutaraq öyrənənlərin yaşamaq üçün öyrənmək, humanist, demokratik prinsiplər əsasında şəxsiyyət kimi inkişaf etdirilməsi istiqamətində kimyadan mənimsədikləri biliklərin və əldə etdikləri səriştələrin həyata transferini təmin etmək, belə ki, məntiqi induktiv və deduktiv yanaşmadan tranduktiv yanaşmaya keçid alması isə problemin praktik əhəmiyyətidir.

**Ədəbiyyat:**


1. "Təhsil haqqında" Azərbaycan Respublikasının qanunu, -Bakı, -2009.
2. Azərbaycan Respublikasında Ümumi təhsilin Dövlət Standartları, -Bakı, -2022.
3. İ. Lətifov, E. Manafov, B. Həsənova, R. Camalova, M. Məmmədov, Y. Cəfərov, Ş. Mustafa, S. Həmidov, E. Abdullayev, Tam orta təhsil səviyyəsinin təmayüllü X- XI sinifləri üçün kimya fənni üzrə kurikulum, Azərbaycan Respublikası Təhsil Nazirliyinin 28 aprel 2022-ci il tarixli F-238 nömrəli əmri ilə təsdiq edilmişdir.
4. Kimya fənni üzrə təhsil proqramı. -Bakı, -2013.
5. Əliyev, E. Müasir təhsil texnologiyaları. / E. Əliyev. -Bakı: Qanun Nəşriyyatı, -2011.
6. Müasir təlim texnologiyaları tezaurusu. -Bakı: Qanun Nəşriyyatı, -2011.


**E-mail:** rumiyye.camalova_82@mail.ru
**Rəyçilər:** *ped.ü.elm.dok.* **A.H. Əliyev,**
*kim.ü.fəls.dok., dos.* **R.M. Ağayeva**
**Redaksiyaya daxil olub:** 11.11.2022.

# BİOLOGİYANIN TƏDRİSİ METODİKASI
# МЕТОДИКА ПРЕПОДАВАНИЯ БИОЛОГИИ
# METHODS OF TEACHING BİOLOGY

UOT 372.857

**Gülşən Nadir qızı Hacıyeva**
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

## METODİK ƏDƏBİYYATDA BİOLOGİYANIN TƏDRİSİ METODİKASI İLƏ ƏLAQƏDAR YAZILMIŞ PROQRAMLAR VƏ DƏRSLİKLƏR

**Гюльшан Надир гызы Гаджиева**
*доктор философии по педагогике, доцент*
*Азербайджанский Государственный Педагогический Университет*

## ПРОГРАММЫ И УЧЕБНИКИ ПО МЕТОДИКЕ ПРЕПОДАВАНИЯ БИОЛОГИИ В МЕТОДИЧЕСКОЙ ЛИТЕРАТУРЕ

**Gulshan Nadir Hajiyeva**
*doctor of philosophy in pedagogy, associate professor*
*Azerbaijan State Pedagogical University*

## PROGRAMS AND TEXTBOOKS RİTTEN İN CONNECTİON WİTH THE TEACHİNG METHODOLOGY OF BİOLOGY IN METHODOLOGİCAL LİTERATURE

**Xülasə.** Elmi biliklərin və yeni tədris metodlarının mənimsənilməsində əhəmiyyət kəsb edən cəhətlər aşağıdakılar olmalıdır: ali pedaqoji məktəblərdə biologiyanın tədrisi metodikası fənninin indiki dövrün tələblərinə uyğun tam inkişafı həyata keçirilməlidir; tədris proqramı üzrə aparılan dərslərdə tələbələrin qiymətləndirilməsi, onların hansı səviyyədə və hansı keyfiyyətli biliklərə malik olması araşdırılmalı, dərs vəsaitləri və avadanlıqlarla müəllimlərin texnoloji cəhətdən hazırlığının və onların sertifikatlaşdırılmasının həvəsləndirici bir metod kimi rolu göstərilməlidir.
***Açar sözlər:*** *proqram, dərslik, dissertasiya, məqalə, dərs vəsaitləri, dərsliklər*

**Резюме**. Важнейшими аспектами усвоения научных знаний и новых методов обучения должны быть следующие: всесторонняя разработка методики преподавания биологии в высшей педагогической школе обязана осуществляться в соответствии с требованиями современной эпохи, на уроках, проводимых по учебному плану, должна быть исследована оценка учащихся, уровень и качество их знаний. В качестве поощрительного метода следует показать роль технологической подготовки и аттестации учителей средствами обучения и оборудованием.
***Ключевые слова:*** *программа, учебник, диссертация, статья, учебные пособия, учебники*

**Summary.** Aspects of importance in the assimilation of scientific knowledge and new teaching methods should be as follows: full development of biology teaching methodology in higher pedagogical schools should be carried out in accordance with the requirements of the current era; In the lessons conducted according to the curriculum, the assessment of students, the level and quality of their knowledge should be investigated, and the role of technological preparation of teachers with teaching aids and equipment and their certification should be shown as an encouraging method.
***Key words:*** *program, textbook, dissertation, article, teaching aids, textbooks*

Ali məktəbdə biologiyanın tədrisi ilə əlaqədar proqramın hazırlanmasında aşağıdakı prinsip əsas götürülmüşdür: proqram bakalavr təhsil pilləsi üçün müasir texnologiyanın tələblərinə uyğun hazırlanmalıdır; gələcək mütəxəssislərin nəzəri və praktik hazırlığı məsələlərinin həllində istifadə olunan metodlar tətbiqi istiqamətdə olmalıdır; proqramın bölmələrində müasirlik, fəal təlim metodları və kompüterdən istifadənin həyata keçirilməsi məsələsinə xüsusi yer verilməlidir: proqramda verilmiş bölmələrin dərs təqvim saatlarına uyğun həyata keçirilməsi məsələsinə baxılmalı, proqramın hazırlanmasında nəzəri və praktik bilik və bacarıqların inkişafına aid mövzu və tapşırıqlara kifayət qədər diqqət verilməli, ümumtəhsil məktəb proqramının yeni variantı da nəzərə alınmalıdır.

Elmi biliklərin və yeni tədris metodlarının mənimsənilməsində əhəmiyyət kəsb edən cəhətlər aşağıdakılar olmalıdır: ali pedaqoji məktəblərdə biologiyanın tədrisi metodikası fənninin indiki dövrün tələblərinə uyğun tam inkişafı həyata keçirilməlidir; tədris proqramı üzrə aparılan dərslərdə tələbələrin qiymətləndirilməsi, onların hansı səviyyədə və hansı keyfiyyətli biliklərə malik olması araşdırılmalı, dərs vəsaitləri və avadanlıqlarla müəllimlərin texnoloji cəhətdən hazırlığının və onların sertifikatlaşdırılmasının həvəsləndirici bir metod kimi rolu göstərilməlidir.

Professor-müəllimlərin fəaliyyəti zamanı əsas aşağıdakı amillərə diqqət yetirilməlidir: mühazirə və praktik məşğələ zamanı fəaliyyət növlərini və təlimin təşkili formalarını dəyişmək; professor-müəllimlərin mühazirə və praktik məşğələlərə hazırlaşmalarını asanlaşdırmaq; gələcək biologiya müəllimliyi ixtisaslı peşəkarların fəaliyyətində sərbəstliyi əldə etmək; indiki zamanda bakalavr və magistrlər üçün müasir tələblərə uyğun materialları çapa hazırlayıb nəşr etdirmək.

Ali məktəb qarşısında duran başlıca məsələlərdən biri də tələbələrin metodiki biliklərinin keyfiyyətini yüksəltmək, tədrisi indiki zamanın tələblərinə uyğunlaşdırmaqdır. Tələbələrin metodiki hazırlığı bütün dünyada ənənəvi xarakter daşıyan kompüterlə bağlı olmalı, biologiyanın tədrisi metodikası fənninin kompüterdən istifadə ilə tədris edildiyi diqqətdən qaçmamalıdır.

Pedaqoji universitetlərdə biologiyanın tədrisi metodikası aşağıdakı tələbləri ödəməlidir: biologiyanın tədrisi metodikasından qazanılmış nəzəri biliklərin praktik məşğələlərdə tətbiq edilməsi. Bu istiqamətdə seçilmiş metodların tədrisi zamanı kursun tamlığı gözlənilməli, onların həlli məqsədyönlü olmaqla digər elmlərlə əlaqəsinə üstünlük verilməli; pedaqoji universitetlərdə praktik və laborator məşğələlərlə əlaqədar üsul və metodlar öz əksini tapmalıdır. Buna görə də müəllim hazırlığı və biologiyanın tədrisinin yeni yollarının tapılması mühüm rol oynamalıdır; tələbələrin biologiyanın tədrisi metodikası üzrə biliklərinin möhkəmlənməsi və formalaşdırılmasında praktik məşğələlər kursun məzmununu, strukturunu və bu fənnin işlənib vahid hala düşməsində rol oynamaqla bərabər, müasir texnologiyanın tələblərinə uyğun yolların, forma və metodların tapılmasına təkan verməlidir. Ali məktəb dərslik və proqramlarına daim yeni və müasir məsələlər daxil edilməlidir. Məktəb dərsliklərinə müəyyən tələblər verilməlidir.

Dərsliyin mətni üçün seçilən didaktik materiallar aşağıdakı prinsiplərə əsaslanmalıdır:

1) dərslik – proqramın tədris materialının seçilməsinə qoyulmuş tələbləri yerinə yetirməli, hər kurs üçün müəyyənləşdirilən tədris materialı cəmiyyətin inkişafının əsas dinamikasını və qanunauyğunluğunu açmağa xidmət etməlidir;

2) dərslik üçün seçilən material bioloji anlayışların əsas tərəflərini və istiqamətlərini özündə ehtiva etdirən faktlara əsaslanmalıdır.

Ümumiyyətlə**,** dərslik tələbənin maraq və ehtiyacı nəzərə alınmaqla tərtib edilir, təhsil mərhələlərinin sonunda nəticələr tələbədən gözlənilir, tələbəyə istiqamətlənir.

Biologiyanın tədrisi metodikasına aid bir sıra proqramlar və dərsliklər, dərs vəsaitləri nəşr olunub tələbələrin və orta məktəb müəllimlərinin istifadəsinə verilmişdir. Bunların tərtib olunmasında bu sahənin mütəxəssislərinin, metodist alimlərin çox böyük xidməti olmuşdur.

*T.M. Rüstəmov*. Pedaqoji universitet və institutlarda bakalavr hazırlığı üçün proqram. Biologiyanın tədrisi metodikası (Bakı, 1998).

*Ə.M. Hüseynov, T.Q. Abdullayeva.* Biologiyadan məsələlərin həlli (Bakı, 2008).

*Ə.M. Hüseynov.* Orta məktəbdə biologiyadan sinifdənkənar məşğələlərin təşkili və aparılması (Bakı, 2008).

*B.İ. Ağayev, Ə.M. Hüseynov, Y.K. Əhmədov, Ə.N. Fərəcov, T.Ə. Feyzullayeva.* Pedaqoji universitet və institutlarda bakalavr hazırlığı üçün dövlət imtahanı proqramı. Biologiya (Bakı, 2008).

*Ə.M. Hüseynov, Ə.M. Məhərrəmov, H.M. Hacıyeva, R.İ. Quliyev, T.Q, Abdullayeva, S.A. Ələkbərova.* Biologiyanın tədrisi metodikasından kurs və yoxlama işləri (Bakı, 2008).

*H.M. Hacıyeva, S.L. Axundova.* Azərbaycan Respublikasında ali təhsilin bakalavr pilləsində ibtidai sinif müəllimlərinin hazırlığı üzrə "Həyat bilgisi və onun tədrisi metodikası" fənninin kurikulumu (Bakı, 2010).

*Ə.M.Hüseynov, T.Q.Abdullayeva, N.N.Əliyeva.* İbtidai məktəblərdə ilkin bioloji anlayışların tədrisi metodikası ( Bakı, 2011.)

*H.M. Hacıyeva, J.H. Ibrahimova, P.M. Qafarova, S.V. Abdullayeva, A.İ. Əhmədova.* Biologiyanın ümumiləşdirici sxemlərlə tədrisinin mənimsəməyə təsiri (IX-XI siniflər). Dərs vəsaiti (Bakı, 2011).

Ölkədə təhsil sahəsində islahat proqramının müvəffəqiyyətlə həyata keçirildiyi bir dövrdə "Təhsil haqqında" qanunun qəbul edilməsi onun inkişaf istiqamətlərini bir daha aydınlaşdırdı. Təhsilin inkişaf etmiş ölkələr səviyyəsinə qaldırılmasının konkret yollarını göstərdi. Təhsil alanın şəxsiyyət kimi formalaşdırılması, təlim prosesinin əsas subyekti kimi götürülməsi zərurəti yarandı. Təhsildə demokratikləşdirmə, humanistləşdirmə, ümumiləşdirmə və diferensasiya prinsiplərinin həyata keçirilməsi lazım bilindi. Tədrisdə fəal təlim metodlarının, yeni pedaqoji texnologiyaların tətbiqi reallaşdırıldı.

Hazırda təlimdə ənənəvi metodlarla yanaşı inteqrativ metodlardan da istifadə edilir və müsbət nəticələr almır. Fəal təlim metodlarının tətbiqində şagirdlərə ümumiləşdirmə aparmaq bacarıqlarının aşılanması əsas məsələlərdən biri kimi meydana çıxır. İnteqrativ təlimdə materialın ümumiləşdirilməsi dərsin əsas mərhələsi hesab olunur. Materialın ümumiləşdirilməsinin şagirdlər tərəfindən həyata keçirilməsinə xüsusi əhəmiyyət verilir. Ona görə də şagirdlər dərsdə ümumiləşdirmə aparılmasına hazırlaşdırılır. Proqramda xüsusi olaraq öz əksini tapmış ümumiləşdirici dərslər də şagirdlərin ümumiləşdirmə bacarıqları əsasında qurulur. Dərs materialının ümumiləşdirilməsi o qədər də asan bir proses deyildir. Bütün şagirdlər onu aydın dərk etmir və ümumiləşdirmə apararkən materialı uzun-uzadı söyləyirlər. Onlar mətnin sistemə salınmasında, qısa, konkret ifadə edilməsində, əsas olanların digərlərindən seçilməsində çətinlik çəkirlər.

*Ə.M. Hüseynov, T.Q. Abdullayeva.* Biologiya tədrisinin müasir metodikası (Bakı-2012). Vəsaitdə aşağıdakılar haqda bəhs olunmuşdur:

Biologiyanın tədrisi metodikası fənni pedaqoji elmdir.

Biologiya tədrisi metodikasının başqa elmlərlə əlaqəsi.

Biologiya tədrisi metodikasının elmi əsasları.

Biologiya (təbiyyat) metodikasının inkişaf tarixi.

Azərbaycanda biologiya metodikasının inkişaf tarixi.

Bioloji təhsilin inkişaf perspektivləri.

Təhsilin demokratikləşdirilməsi.

Tədris materialının sistemi və ardıcıllığı.

Tədris materialının elmiliyi və mənimsənilməsi.

Məktəb biologiyasının məzmunu və xüsusiyyətləri.

Fənlərarası əlaqə.

Bioloji anlayışların sistemi.

Anlayışların inkişafı metodikası və s.

*R.L. Sultanov, G.N. Hacıyeva.* "Ümumi entomologiya" fənninin kurikulum proqramı və onun standartları (ekoloji əsaslarla) adlı metodik vəsait. Universitetlər və institutların biologiya, səhiyyə, ekologiya, torpaqşünaslıq və kənd təsərrüfatı üzrə fakültələrinin bakalavr pilləsi üçün (Bakı, 2013).

*Ə.M. Hüseynov, A.E. Mirzəyeva.* Biologiyanın tədrisində müasir təlim metodlarının tətbiqi. Metodik vəsait (Bakı, 2014).

Vəsaitə daxildir:

Müasir təlim metodlarının prinsipləri və xüsusiyyətləri.

Müasir təlim metodlarından istifadə imkanları.

Biologiyanın tədrisində təlim metodlarının tətbiqi yolları.

Sinifdənkənar məşğələlərdə fəal təlim metodlarının tətbiqi.

*H.M. Hacıyeva, Ə.M. Məhərrəmov, İ.M. Kazımov, E.F. Səfərova.* Pedaqoji universitet və

institutların biologiya fakültəsi magistr hazırlığı üçün "Biologiyanın tədrisi metodikasının inkişaf tarixi və elmi əsaslari" fənninin proqramı (Bakı, 2015).

Magistr pilləsində tədris edilən "Biologiyanın tədrisi metodikasının inkişaf tarixi və elmi əsasları" fənninin məzmununun təhsildə gedən yeniliklərlə əlaqələndirilməsinə imkan verir. Biologiyanın tədrisi metodikasının keçdiyi inkişaf və onun elmi əsasda izah edilməsi lazım gəlir. Magistr pilləsi tələbələrinə fənnin inkişaf tarixi öyrədilməli, onun inkişafında müsbət hallar, qabaqcıl təcrübə, faydalı, səmərəli fəaliyyət onlara çatdırılmalı, fənnin inkişafında qarşıya çıxan çətinliklər, buraxılan səhvlər aydınlaşdırılmalı, onlara istinad edərək fənnin gələcək inkişafında qarşıya çıxan çətinliklərin aradan qaldırılması yolları göstərilməlidir.

Fənnin tədrisinin ikinci hissəsində magistrlərə biologiyanın tədrisi metodikasının elmi əsasları öyrədilməli, bioloji təhsilin mahiyyəti, strukturu, tarixi inkişafı ardıcıl mərhələlərlə onlara çatdırılmalı, bu elmin təlimi prinsipləri, pedaqoji, metodik aspektləri izah edilməlidir. Təlimin metodları təsnifat üzrə tələbələrə çatdırılmalı, onların tədrisdə tətbiqinin imkanları, səmərəli yolları izah edilməli, biologiya fənn kurikulumunun tələbləri, əsas müddəaları tələbələrə aydınlaşdırılmalı, təlimin təşkil formaları, onlardan standartlar əsasında istifadə edilməsi qaydaları göstərilməlidir. Bütün bunlar magistratura pilləsində biologiyanın tədrisi metodikasının inkişaf tarixi və elmi əsasları fənninin tədrisinin zəruriliyini əsaslandırır. Yuxarıda deyilənlərə istinadən fənnin əsas məsələlərini əhatə edən fənn proqramının işlənilməsi zərurəti yaranır.

*G.N. Hacıyeva. Bakalavr hazırlığı üçün "Biologiyanın tədrisi metodikası" fənninin proqram (Bakı, 2016).* Proqramda qabaqcıl beynəlxalq təcrübə, təhsilin müasir problemləri, yəni nəzəri-praktik didaktik müddəalar nəzərə alınmalı, orta məktəbdə tədris olunan digər fənlərin də biologiya ilə fənlərarası inteqrasiya məsələləri də diqqət mərkəzində dayanmalıdır. Bu meyarlarla yanaşsaq, indiki proqramlarda biologiyanın nəzəri, praktik və inteqrativ istiqamətləri öz əksini tapmalıdır.

**Problemin aktuallığı.** Ali pedaqoji məktəblərdə oxuyan gənclərdə təhsili keyfiyyətinin artırılmasından ibarətdir.

**Problemin elmi yeniliyi**. İlk dəfə olaraq metodiki ədəbiyyatda biologiyanın tədrisi metodikası ilə əlaqədar yazılmış proqramlar və dərsliklərdən söhbət açılır.

**Problemin tətbiqi əhəmiyyəti.** Məqalədə irəli sürülən ideya və tövsiyələr, eləcə də tədqiqatın nəticələri biologiya müəllimi ixtisası üzrə hazırlanan kadrların pedaqoji ustalığının artırılmasına kömək edəcəkdir.

**Ədəbiyyat:**

1. Hacıyeva G.N. Biologiyadan didaktik materiallar. Bakı, 2007.
2. Paşayev Ə., Rüstəmov F. Pedaqogika. Bakı, 2010.
3. Ümumi təhsil kurikulumunun əsasları üzrə təlim. Bakı, 2014.
4. Veysova Z. Fəal - interaktiv təlim. Bakı, 2007.

**E-mail:** gyulshan.gadzhiyeva@mail.ru
**Rəyçilər:** *biol.ü.fəls.dok., dos.* **E.F. Səfərova,**
*biol.ü.fəls.dok., dos.* **T.Q. Abdullayeva**
**Redaksiyaya daxil olub:** 27.10.2022

*UOT 372.857*

***Əliyənnağı Məhəmmədtağı oğlu Məhərrəmov***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti*

***Veysəl Vüsal oğlu Abişov***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# X-XI SİNİFLƏRDƏ BİOLOGİYANIN TƏDRİSİNDƏ BİOLOJİ ANLAYIŞLARIN ÖYRƏDİLMƏSİNİN ƏHƏMİYYƏTİ

***Алияннаги Магомедтаги Магеррамов***
*доцент*
*Азербайджанского Государственного Педагогического Университета*

***Вейсал Вюсал оглы Абышов***
*Азербайджанский Государственный Педагогический Университет*

# ВАЖНОСТЬ ОБУЧЕНИЯ БИОЛОГИЧЕСКИМ ПОНЯТИЯМ В ПРЕПОДАВАНИИ БИОЛОГИИ В X-XI КЛАССАХ

***Aliyannahi Mahammadtaghi Maharramov***
*assistant professor at*
*Azerbaijan State Pedagogical University*

***Abishov Veysel Vusal oghlu***
*Azerbaijan State Pedagogical University*

# THE IMPORTANCE OF TEACHING THE BIOLOGICAL CONCEPT IN TEACHING BIOLOGY IN GRADES X-XI

**Xülasə.** Məqalədə X-XI siniflərdə biologiyanın tədrisində bioloji anlayışların sistemlə öyrədilməsi, onun inkişaf etdirilməsi önə çəkilir. Qeyd edilir ki, biologiya elminin əsaslarının öyrədilməsi məhz anlayışlardan başlayır. Bu səbəbdən bioloji anlayışların məzmunu və sistemi daima təkmilləşdirilməlidir.

***Açar sözlər:*** *bioloji anlayışlar, təkamül anlayışları, növmüxtəlifliyi, konvergensiya, divergensiya, növ*

**Резюме.** В статье освещается системность преподавания биологических понятий и ее развитие в преподавании биологии в X-XI классах. Отмечено, что обучение основам биологических наук начинается с понятий. По этой причине содержание и система биологических понятий должны постоянно совершенствоваться.

***Ключевые слова:*** *биологические понятия, эволюционные концепции, видовое разнообразие, конвергенция, дивергенция, вид*

**Summary.** The article highlights the systematic teaching of biological concepts and its development in the teaching of biology in grades X-XI. It is noted that teaching the basics of biological sciences begins with concepts. For this reason, the content and system of biological concepts must be constantly improved.

***Key words***: *biological concepts, evolutionary concepts, species diversity, convergence, divergence, species*

Ümumtəhsil məktəblərində müxtəlif fənlər üzrə şagirdlərə elmlərin əsaslarının öyrədilməsi müvafiq anlayışların izahı ilə həyata keçirilir. Əsas fənlərdən biri kimi biologiyanın (X-XI siniflər) tədrisində bioloji anlayışlar təlim prosesinin əsasını təşkil edir. Çünki bütün elm-

lərin əsaslarının öyrədilməsi məhz anlayışlardan başlayır. Hər hansı bioloji anlayışın mahiyyəti şagirdlərə aydın olmasa, o heç bir prosesin, hadisənin, qanunauyğunluqların mahiyyətini dərk edə bilməz. Ona görə də didaktikanın ümumi prinsiplərinə uyğun olaraq təlimin əsas məqsədi şagirdlərə şüurlu, sistemli və möhkəm bilik verməkdir. Onda təlimin üç vəzifəsini: öyrənmək, tərbiyələndirmək və inkişaf etdirmək vəzifələrini həyata keçirmiş olarıq. Anlayışlar insanı düşündürür. Düşüncə isə mövcud aləmi əks etdirməklə biliksizlikdən biliyə doğru yolda müxtəlif mərhələlərdən keçir.

Xarici aləmi dərk etməklə müəllimin vəzifəsi cisim və hadisələri, onların əlamətlərini hiss orqanları ilə duymaq, qavramaq, sonra təsəvvür etməkdir. Bunun nəticəsində ümumiləşdirmə yaradılır. Bunu təxmini olaraq aşağıdakı kimi təsəvvür etmək olar: insan – hiss – duyğu – qavrama – təsəvvür – anlayış – mühakimə –ümumiləşdirmə. Deməli, anlayış ümumiləşdirilmiş təsəvvürlərdir. Onların şagirdlərə sistemlə öyrədilməsi, yaddaşda möhkəmləndirilməsi təlimin əsas vəzifələrindəndir. Orta məktəb fənlərinin, o cümlədən biologiyanın əsas vəzifələrindən biri anlayışların şagirdlərə düzgün izah edilməsi və öyrədilməsidir. Burada yanlışlığa yol verilməməlidir.

Məlumdur ki, elmin inkişafı ilə əlaqədar yeni-yeni anlayışlar yaranır, onların bir hissəsi tədrisə gətirilir. Ümumtəhsil məktəblərində biologiya fənlərinin tədrisində çox zəngin bioloji anlayışlar mövcuddur. Bir sıra anlayışlar elmin, cəmiyyətin inkişafı ilə əlaqədar olaraq köhnəlir, tədrisdən çıxarılır. Müasir həyatla əlaqələnməyən, əhəmiyyətini itirmiş anlayışların mövzulardan, məzmundan çıxarılması təbii haldır. Bu baxımdan X-XI siniflərdə öyrədilməsi çətin olan təkamül anlayışları dəfələrlə dəyişdirilmişdir. Elmi əsasları, dayağı olmayan metafizik anlayışlar köhnəlmiş elmi-dialektik anlayışlar onları əvəz etmişdir. Biologiyanın məzmunundakı anlayışlar sistemləşdirilməli, tədrisdə ardıcıllığı gözlənilməlidir. Sadə təkamül anlayışlarının aşağı siniflərdən öyrədilməsi əhəmiyyətlidir. Ümumiyyətlə, anlayışları öyrədərkən şagirdlərin bilik və yaş səviyyəsi nəzərə alınmalıdır.

Məktəb təcrübəsindən məlumdur ki, əsas problemlərdən biri bioloji anlayışların öyrədilməsidir, belə ki, anlayışların əsil mahiyyətinin öyrədilməsi həmişə kölgədə qalır. Şagirdlər hər hansı bioloji anlayışın tərifini və ya məzmununu sözlə ifadə edir, lakin onun elmi mahiyyətini dərk etmirlər. Məsələn, şagird tənəffüs, fotosintez, təkamül, populyasiya, biosenoz və s. anlayışları kitabda olduğu kimi deyir. Lakin onların başvermə səbəblərini və mexanizmlərini izah etməkdə çətinlik çəkirlər. Yuxarı sinif şagirdlərinə verilmiş: "Tənəffüs nədir?", "Tənəffüslə yanmanın fərqi nədir?" kimi sualların mahiyyətini izah edə bilməmələrinin bir sıra obyektiv səbəbləri vardır:

1. Dərsliklərdə anlayışların elmi mahiyyəti, onun məzmunu zəif işıqlandırılmışdır. Eyni zamanda, elə anlayışlar var ki, onun adı çəkilir, mahiyyətinin izahına toxunulmur. Bu da müəllim və şagirdləri çətinlik qarşısında qoyur.

2. Anlayışların elmi mahiyyətini müəllimlərin özlərinin zəif bilməsi, yaxud ondan tamamilə xəbərsiz olmasıdır. Məsələn, dixotomik, monopodial, simpodial budaqlanma kimi anlayışların mahiyyəti dərsliklərdə verilmir, müəllimlərdə həmin anlayışların nədən ibarət olmasını izah edə bilmirlər.

3. Anlayışların məzmunu sistemlə verilmir, onlar bir-biri ilə əlaqələndirilmir. Daha doğrusu, sadədən mürəkkəbə prinsipi əsasında inkişaf etdirilmir. Nəticədə anlayışları öyrətmək əngəl olur.

4. Anlayışların öyrədilməsində kurslar arasında, başqa fənlərlə zəif əlaqə yaradılır və ya heç yaradılmır. Bu da anlayışların mahiyyətinin şagirdlər tərəfindən şüurlu mənimsənilməsinə və mexaniki əzbərləməsinə gətirib çıxarır.

5. Anlayış şagirdlərin praktik bilik, bacarıq və vərdişləri ilə zəif əlaqələndirilir və ya heç əlaqələndirilmir.

6. Anlayışları inkişaf etdirmək üçün məntiqi ardıcıllıq və sistematiklik gözlənilmir.

7. Anlayışların izahında, inkişaf etdirilməsində təlim metodlarından və priyomlarından düzgün istifadə olunmur. Xüsusən müqayisə priyomlarından az istifadə olunur.

8. Anlayışları öyrətmək üçün təlim prosesində didaktik şərait yaradılmır.

9. Yeni anlayışlar yaradıldıqda keçmiş anlayışlar yada salınmır, təkrarlanmır, yaxud əlaqələndirilmir və s.

Yuxarıda sadaladığımız qüsurlar günügündən inkişafda olan biologiya elminin və orta məktəb proqramlarının müasir tələbinə uyğun deyildir. Çünki təlim prosesini yüksək səviyyə-

də təşkil etmək, şagirdlərin zehni qabiliyyətini, bütövlükdə dünyagörüşünü inkişaf etdirmək üçün xüsusi və ümumbioloji anlayşları elmi zəmində öyrətməyə ehtiyac duyulur.

Bioloji anlayışları öyrətməyin əsas yollarından biri də öyrənilmiş materialın ümumiləşdirilməsidir. Ümumiləşdirmə nəticəsində anlayışların həcmi getdikcə dərinləşdirilir və formalaşdırılır. Bunun üçün çalışmaq lazımdır ki, şagird kitabdan və yaxud təcrübədən özü müstəqil nəticə çıxarsın. Şagirdlərin praktik bilik və bacarıqlara yiyələnməsi, eksperiment və müşahidə aparmaları, bioloji anlayışların inkişafı və formalaşmasında böyük əhəmiyyət kəsb edir. Yuxarıda qeyd etdiyimiz kimi mənimsənilməsi çətin olan anlayışlardan "təkamül anlayışlarının" öyrədilməsi üzərində dayanaraq fikrimizi çatdıraq.

X-XI sinif biologiyadan "Təkamül təlimi", "Üzvi aləmin inkişafı", "Makrotəkamül", "Yer üzərində həyatın əmələ gəlməsi" bəhsinin mövzuları təkamül anlayışları ilə zəngindir. Təkamül anlayışlarının öyrədilməsi imkanları geniş olan belə mövzuların tədrisinə müəllim daha ciddi yanaşır. İlk növbədə, imkanlar müəyyənləşdirilir, onlara uyğun məzmun işlənilir, tədrisi həyata keçirilir. Belə mürəkkəb anlayışları öyrədərkən tarixilik, sistematiklik, ardıcıllıq, tədricilik kimi prinsiplərə əməl olunmalıdır. Belə anlayışların dərindən öyrədilməsində əsas məqsəd şagirdlərə həyatda, təbiətdə, xüsusilə canlılar arasında baş verən dəyişkənlikləri, inkişafı, onun qanun və qanunauyğunluqlarını izah etməkdir. Təbiətdə gedən daimi inkişaf dəyişmələri onların başa düşəcəyi tərzdə aydınlaşdırmaqdır. İzah edilməlidir ki, təbiətdə canlılar dünyaya gəlir, inkişaf edir, ölür, məhv olur, cansız təbiət komponentlərinə çevrilir. Beləliklə, təbiət və cəmiyyətdə arasıkəsilmədən dəyişmələr inkişaf edir. Təbiətdə gedən inkişaf bizdən, bizim şüurumuzdan asılı olmayaraq baş verir və heç zaman dayanmır. İnkişaf nəticəsində canlıların yeni növləri yaranır, onlar yeni dəstə, fəsilə, sinif və tipin əmələ gəlməsinə səbəb olur.

Təkamül anlayışlarının öyrədilməsi ilə şagirdlərin dünyaya real baxışları formalaşır, onlar dəyişkənlik, irsiyyət, inkişafın, qanun və qanunauyğunluqlarını dərk etməklə həyatda olduğu kimi təsəvvür edir və təbiətə sağlam, şüurlu baxır, onun nemətlərinə qənaətçilliklə yanaşır, canlıların qorunmasının, onlar üçün lazımı şəraitin yaradılmasının zəruriliyini hiss edir, onlarda canlılara qarşı qayğılı münasibət formalaşır. Biologiyanın tədrisində təkamül anlayışlarının öyrədilməsi necə gəldi, ara-sıra aparıla bilməz. Onlar şagirdlərə elmi, pedaqoji, psixoloji prinsiplər baxımından izah edilməlidir.

Müəyyən edilmiş prinsiplərə əməl olunmazsa (ardıcıllıq, sistemliliyin gözlənilməsi, ümumiləşdirmələrin aparılması, sadədən mürəkkəbə, ibtidaidən aliyə və s.) şagirdlər üçün anlayışlar tam aydın olmaz, onlar mövzunu öyrənməkdə çətinlik çəkərlər. X-XI sinif biologiya kurslarında təkamül anlayışlarının tədrisində şagirdlərə Yer üzərində həyatın əmələ gəlməsi və inkişafı, inkişafın istiqamətləri, qanun və qanunauyğunluqları izah edilir, onların həyatda düzgün mövqe tutmasına dair bacarıqlar aşılanır. Təbiidir ki, aşağı siniflərdə, xüsusilə VI-VII sinif biologiya kursunun tədris edildiyi yaşda şagirdlər onları birdən-birə dərk etmək iqtidarında olmurlar. Ona görə də təkamül anlayışlarının şagirdlərin yaş xüsusiyyətləri nəzərə alınmaqla öyrədilməsi məqsədə müvafiqdir.

Biologiyanın tədrisində təkamül anlayışları bir neçə istiqamətdə tədris edilir. Belə ki, ilk növbədə, kurslar üzrə bitkilərin zoologiya kursunda heyvanların, insan kursunda insanın heyvanlarla qohumluğu, ümumi biologiyada isə inkişafın yolları, qanun və qanunauyğunluqları izah edilir.

İkinci istiqamətdə həyatda baş verən proseslər üzrə birhüceyrəlilərin yaranması, onlardan çoxhüceyrəlilərin inkişafı, su bitki və heyvanlarının quruya çıxması, fotosintez prosesinin baş verməsi, qeyri-cinsi və cinsi çoxalma formalarının inkişafı, daha mürəkkəb ali varlığın – şüurlu insanın əmələ gəlməsi və təkamülü aydınlaşdırılır.

Üçüncü istiqamətdə hər bir prosesin bir-biri ilə qarşılıqlı əlaqəsi xronoloji sistem üzrə öyrədilir. Təkamül anlayışlarının öyrədilməsi istiqamətləri də bir-biri ilə qarşılıqlı əlaqədə həyata keçirilir. Bunun şagirdlərin yetkin şəxsiyyət kimi formalaşmasında əhəmiyyəti böyükdür.

"Yeni növlərin əmələ gəlməsi" mövzusunun tədrisi müvafiq plan üzrə həyata keçirilir.

Dərsin planı:

1. Növlərin əmələ gəlməsi haqqında qısa məlumat.
2. Darvin növəmələgəlmə haqqında. Mikrotəkamül.

3. Növ müxtəlifliyi, növün əmələ gəlməsi üçün pillədir.
4. Coğrafi növ əmələgəlmə.
5. Ekoloji növəmələgəlmə.
6. Təcrid olunmanın əhəmiyyəti.
7. Konvergensiya.

Müəllim qeyd edir ki, təbiətdə yeni növlər indi də əmələ gəlir. Prosesin nə cür getdiyini ancaq Darvinin təbii seçmə nəzəriyyəsi ilə düzgün izah etmək mümkündür. Müasir dövrdə təbii seçmə haqqında təlim yeni dəlillərlə zənginləşdirilmiş çoxlu yeni fikirlərlə inkişaf etdirilmişdir. Lakin Ç.Darvin tərəfindən təbii seçmə haqqında inkişaf etdirilən əsas müddəalar da öz əhəmiyyətini saxlayır. Darvin təbiətdə yeni növlərin əmələ gəlməsindən bəhs edərkən ev heyvanlarının əhliləşdirilməsi dəlillərdən istifadə etmiş və göstərmişdir ki, ev heyvanlarının cinslərində indiki heyvanlara nisbətən müxtəliflik az olmuşdur. Sonralar insanlar onların üzərində istədikləri istiqamətdə süni seçmə aparmışlar. Beləliklə, bunlar həm öz aralarında, həm də əmələ gəldikləri ilk əcdaddan öz əlamətlərinə görə ayrılmağa, yəni divergensiya etməyə başlamışlar.

Ev heyvanları cinsləri və mədəni bitki sortları arasında divergensiya hadisəsi getdiyi kimi təbiətdə də bu proses davam edir. Təbiətcə müşahidə olunan divergensiyanın hərəkətverici qüvvəsi təbii seçmədir. Şagirdlər növdaxili mübarizədən bilirlər ki, eyni dərəcədə tələbata və ehtiyaca malik olan bir növün fərdləri arasında yaşayış uğrunda mübarizə daha kəskin gedir. Burada divergensiya baş verir, təbii seçmə isə qarışır, bir-birlərindən ən çox fərqlənən fərdlər yaşayır, az fərqlənənlər isə tədricən sıradan çıxır – məhv olur.

Üzvi aləmin təkamülü təbii seçmə nəticəsində divergensiya prosesində bir-birindən daha çox aralanır, mühitə ən yaxşı uyğunlaşanlar yaşamaq imkanına malik olurlar. Çünki onların arasında aralıq və başlanğıc formalara nisbətən mübarizə zəifdir.

Beləliklə, bunlar inkişaf edərək yeni növlərə başlanğıc verirlər. Aralıq və başlanğıc formaların isə yaşamaq imkanları, uyğunlaşmaları çox zəif olduğuna görə təbii seçmə nəticəsində nəsilləri kəsilir.

Darvin qeyd edirdi ki, təbiətdə yeni növlərin əmələ gəlməsi prosesi növün öz daxilində başlayır, qruplara parçalanır. Bunlara alim növ müxtəlifliyi adını vermişdir. Müəllim növ müxtəlifliyinin yaranmasını izah etdikdən sonra yeni növlərin əmələ gəlməsindən danışır. Qeyd edir ki, növün arealının genişliyi divergensiya və təbii seçmə prosesinə yardım edən və növ əmələ gəlməsi üçün şərait yaradır. Müəllim bioloji izolyasiyanı (təcrid olunmanı) da şagirdlərə ətraflı izah edir. Göstərir ki, bunların hamısı divergensiya və təbii seçmənin məhsuludur. Ancaq yadda saxlamaq lazımdır ki, təbii seçmə həmişə fərdlər üçün faydalı əlamətlərə üstünlük verir. Bütün canlılar təbii seçmə nəticəsində yaşadıqları şəraitə uyğunlaşırlar.

Anlayışları tədris edərkən mövzuya uyğun əyani vasitələrdən, xüsusilə audiovizual vasitələrdən istifadə edilməlidir.

Biologiyanın tədrisində anlayış öyrədilməsində şagirdlərin müstəqil yaradıcı fəaliyyətinə diqqət artırılmalıdır.

Biologiyanın tədrisində anlayışların öyrədilməsi işinin səmərəliliyini artıran metodik ədəbiyyatın çap olunması, müəllimlərə, tələbələrə çatdırılması zəruridir.

Bioloji anlayışları sistemli yaratmaqla nəinki şagirdlərin biliyi dərinləşir, eyni zamanda, təlim və tərbiyənin vahidliyi təmin olunur.

**Problemin aktuallığı**. Bioloji anlayışların öyrədilməsi biologiyanın tədrisinin əsasını təşkil edir. Şagirdlərin elmi dünyagörüşlərinin formalaşdırılmasında xüsusi rol oynayır. Mövzu ilə bağlı tədqiqat işinin aparılması, faydalı təkliflərin verilməsi aktuallıq kəsb edir.

**Problemin elmi yeniliyi.** X-XI siniflərdə biologiyanın tədrisində bioloji anlayışların sistemlə öyrədilməsinin əhəmiyyəti, anlayışların şagirdlərə düzgün izah edilməsi, yanlışlığa yol verməməsidir.

**Problemin praktik əhəmiyyəti.** Biologiya kursunun tədrisində bioloji anlayışların öyrədilməsinin əhəmiyyəti geniş təhlil edilir, tövsiyə olunur ki, işin səmərəliliyi baxımından metodik ədəbiyyat çap olunsun, müəllimlərə çatdırılsın. Bütün bunlar təlimin keyfiyyətinin yüksəldilməsinə kömək göstərəcəkdir.

**Ədəbiyyat:**

1. Ə.M. Hüseynov, M.Ş. Babayev, Ə.M. Məhərrəmov. Biologiyanın tədrisinin ümumi metodikası. -2003, -138 s.
2. Ə.M. Hüseynov. Orta məktəbdə biologiya tədrisinin nəzəri və metodik əsasları. -Bakı, -2000, -266 s.

3. H.M. Hacıyeva, Ə.M. Məhərrəmov, Z.Z .Əhmədova. Orta ümumtəhsil məktəblərində biologiyanın tədrisində təkamül anlayışlarının öyrədilməsi.- Bakı, -2011, -175 s.
4. Nüşabə Məmmədova, Brilyant Həsənova, Könül Mahmudova və b. Biologiya X sinif. -Bakı, -2017, -176 s.
5. Nüşabə Məmmədova, Brilyant Həsənova, Könül Mahmudova. Biologiya XI sinif. -Bakı, -2019, -192 s.
6. Quliyev, R.Ə. Təkamül təlimi. / R.Ə. Quliyev, M.Ş. Babayev, Axundov. -2009,- 456 s.

**E-mail:** vveabb@gmail.com
**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **G.N. Hacıyeva,**
*dos.* **X.Q. İbrahimova**
**Redaksiyaya daxil olub:** 26.10. 2022.

## *İNFORMATİKANIN TƏDRİSİ METODİKASI*
## *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИНФОРМАТИКИ*
## *METHODS OF TEACHING INFORMATICS*

*UOT 372.800.2*

***Arzu İltifat qızı Cəfərova***
*Gəncə Dövlət Universitetinin müəllimi*

# İNFORMATİKA TƏLİMİNDƏ ŞAGİRD ƏMƏKDAŞLIĞININ TƏŞKİLİ YOLLARI

***Арзу Илтифат гызы Джафарова***
*преподаватель*
*Гянджинского Государственного Университета*

# ПУТИ ОРГАНИЗАЦИИ УЧЕНИЧЕСКОГО СОТРУДНИЧЕСТВА В ОБУЧЕНИИ ИНФОРМАТИКЕ

***Arzu Iltifat Jafarova***
*teacher*
*at Ganja State University*

# WAYS OF ORGANİZİNG STUDENT COOPERATİON İN COMPUTER SCİENCE EDUCATİON

**Xülasə.** Məqalə informatika təlimində şagird əməkdaşlığının təşkili yollarına həsr edilib. İnformatika təlimində motivlər, sosial əməkdaşlıq və qruplarla iş məsələlərinə toxunulub. İnformatika təliminə motivasiyasının formalaşması praktik baxımdan böyük əhəmiyyətə malik olan köklü elmi-metodik problemdir. Müasir pedaqoji psixologiyada bu problem müxtəlif yönümlərdə araşdırılır və sistemli tədqiq olunur. Bu tədqiqatların nəticələri təlim nəzəriyyəsi və təcrübəsi üçün böyük əhəmiyyətə malikdir. Bu sahə vaxtilə ümumpedaqoji aspektdə tədqiq edilmişdir. Müasir dövrdə isə sosial pedaqoji baxımdan diqqəti xüsusilə cəlb edir. İnformatikanın təlimi motivlərinin iki növünü: idrak motivləri və sosial motivlər. İnformatika təlimində sosial motivlərin metodik üsullarla aktivləşdirilməsi idrak motivlərinin də inkişafı üçün əlverişli şərait yaradır. Xüsusi ilə sosial əməkdaşlıq motivləri şagirdlərin informatika təlimə münasibətinin köklü surətdə dəyişilməsi ilə nəticələnir.

***Açar sözlər:*** *informatika təlimi, əməkdaşlıq, şagirdlər, müəllim, idrak, sosial, motivlər*

**Резюме.** Статья посвящена способам организации ученического сотрудничества в обучении информатике. В статье затронуты вопросы мотивов, социального сотрудничества и работы с группами на занятиях по информатике. Формирование мотивации к обучению информатике является глубоко укоренившейся научно-методической проблемой, имеющей большое практическое значение. В современной педагогической психологии эта проблема исследуется в разных направлениях и систематически изучается. Результаты этих исследований имеют большое значение для теории и практики обучения. Эта область изучалась в общепедагогическом аспекте. В современный период она привлекает внимание с социальной и педагогической точки зрения. Существует два типа мотивов обучения информатике: познавательные мотивы и социальные мотивы. Активизация социальных мотивов в обучении информатике методическими приемами создает благоприятные условия для развития и познавательных мотивов. В частности, мотивы социального сотрудничества приводят к радикальному изменению отношения учащихся к обучению информатике.

***Ключевые слова:*** *обучение информатике, сотрудничество, ученики, учитель, познавательные, социальные, мотивы.*

**Summary.** The article is devoted to ways of organizing student cooperation in teaching computer science. The article touches upon the issues of motives, social cooperation and work with groups in the classroom in computer science. The formation of motivation for learning computer science is a deeply rooted scientific and methodological problem of great practical importance. In modern educational psychology, this problem is investigated in different directions and systematically studied. The results of these studies are of great importance for the theory and practice of teaching. This area was studied in the general pedagogical aspect. In the modern period, it attracts attention from a social and pedagogical point of view. There are two types of motives for learning computer science: cognitive motives and social motives. The activation of social motives in teaching informatics by methodological methods creates favorable conditions for the development of cognitive motives. In particular, the motives of social cooperation lead to a radical change in the attitude of students towards learning computer science.

***Key words:*** *teaching computer science, cooperation, students, teacher, cognitive, social, motives.*

**İnformatika təlimində motivlər.** İnformatika təlimi prosesində belə bir təbii sual meydana çıxır: şagird bu fənni nəyin naminə oxuyur? Onu bu fənnin təliminə nə təhrik edir?

İnformatika müəllimi bu suallara cavab axtaranda mürəkkəb və çoxcəhətli bir problemlə – informatika təliminin motivləri problemi ilə rastlaşır.

Məktəb və pedaqoji fikir tarixini nəzərdən keçirəndə bir cəhət diqqəti cəlb edir: bu problem məktəbin yarandığı gündən aktual olmuşdur, müəllimlər necə olursa-olsun, şagirdin məhz təlim motivlərini fəallaşdırmağa ciddi-cəhdlə səy göstərmiş və bu yolla da onun qəlbində elm məşəlini alovlandırmağa çalışmışdır.

Uşağın yaxşı oxuması müəllim kimi valideynləri də düşündürür, narahat edir. Uşağın yaxşı oxuması üçün hələ ailədə möcüzəli nələrsə kəşf etməyiblər. Çarə tapmayanda isə müxtəlif cəza vasitələrindən istifadə ediblər.

Dövrün elm korifeyləri, müdrik pedaqoqlar öz tədqiqatlarında bu və ya digər dərəcədə şagirdlərin təlim motivləri problemi ilə daim maraqlanmışlar. Təlim motivləri bu gün, elmi-texniki tərəqqi və informasiya bolluğu şəraitində xüsusilə aktuallaşıb. Bu amillər informatikanın öyrənilməsi motivini daha da güclü edir.

Motiv – məqsəd bütün fəaliyyət sahələrində olduğu kimi, təlim fəaliyyətinin, o cümlədən informatika fənni tədrisinin də ana xəttini təşkil edir. Şagirdin məktəbə, müəllimlərə, təlim prosesinə, informatika fənninə münasibətinin kökü, ilk növbədə fənnin təlim motivləri ilə bağlıdır.

İnformatika təliminə motivasiyasının formalaşması praktik baxımdan böyük əhəmiyyətə malik olan köklü elmi-metodik problemdir. Müasir pedaqoji psixologiyada bu problem müxtəlif yönümlərdə araşdırılır və sistemli tədqiq olunur. Bu tədqiqatların nəticələri təlim nəzəriyyəsi və təcrübəsi üçün böyük əhəmiyyətə malikdir. Bu sahə vaxtilə ümumpedaqoji aspektdə tədqiq edilmişdir. Müasir dövrdə isə sosial pedaqoji baxımdan diqqəti xüsusilə cəlb edir.

İnformatikanın təlimi motivlərinin iki növünü: idrak motivləri və sosial motivlər. İnformatikanın tədrisində idrak motivləri üçün başlıca cəhət aşağıdakılardan ibarətdir: şagirdin bütün səyi bilavasitə informatika fənninin məzmununa yönəlir: o, informatika fənni üzrə yeni bilikləri – faktları, hadisələri, alqoritmləri, modelləri, prosesləri, qanunauyğunluqları yaxşı öyrənməyə çalışır, əlavə məlumat almaq üçün müəllimə sual verir, məsələni həll etmək üçün müxtəlif üsullar axtarır, onları müqayisə edir, bilikləri müstəqil surətdə əldə etmək yolları ilə maraqlanır, özünütəhsillə məşğul olur və s.

Əgər informatika təlimi prosesində şagirdin fəallığı başqa adamlarla münasibət sahəsinə yönəlirsə, bu zaman sosial motivləri fərqləndirirlər.

İnformatika tədrisində sosial motivlərin aşağıdakı istiqamətlərini ayırd edirlər:

Geniş sosial motivlər: şagird informatika təliminin sosial əhəmiyyətini başa düşür, yaxşı oxumağı öz borcu sayır, ona məsuliyyətlə yanaşır və s.

Mövqe motivləri (və ya dar sosial motivlər): şagird sinifdə və ailədə müəyyən mövqe tutmaq üçün yaxşı oxuyur; o, çalışır ki, yoldaşları və müəllimləri (eləcədə valideynlər və ətrafdakı adamlar) onu yüksək qiymətləndirsinlər, onu tərifləyib təqdir etsinlər.

Sosial əməkdaşlıq motivləri: şagird sinif yoldaşları ilə bilavasitə bir yerdə olmağa, əməkdaşlıq etməyə çalışır, kollektiv işlərdə həvəslə iştirak edir... Məktəb təcrübəsinə diqqət yetirsək, görərik ki, müəllimlər, bir qayda olaraq, id-

## *MƏKTƏBƏQƏDƏR TƏHSİL VƏ TƏRBİYƏ*
## *ДОШКОЛЬНОЕ ОБРАЗОВАНИЕ И ВОСПИТАНИЕ*
## *PRESCHOOL EDUCATION AND UPBRİNGİNG*

*UOT 373.2*

***Təranə Buta qızı Sadıqova***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# MƏKTƏBƏQƏDƏR TƏHSİL MÜƏSSİSƏSİNİN AİLƏ İLƏ ƏMƏKDAŞLIĞININ OPTİMALLAŞDIRILMASI YOLLARI

***Тарана Бута гызы Садыгова***
*доктор философии по педагогике, доцент*
*Азербайджанский Государственный Педагогический Университет*

# ПУТИ ОПТИМИЗАЦИИ СОТРУДНИЧЕСТВА ДОШКОЛЬНОГО ОБРАЗОВАТЕЛЬНОГО УЧРЕЖДЕНИЯ С СЕМЬЕЙ

***Tarana Buta Sadigova***
*doctor of philosophy in pedagogy, associate professor*
*Azerbaijan State Pedagogical University*

# WAYS TO OPTIMIZE COOPERATION OF THE PRE-SCHOOL EDUCATIONAL INSTITUTION WITH THE FAMILY

**Xülasə.** Təhsilin modernləşmə mərhələsində olduğu müasir dövrdə məktəbəqədər təhsil müəssisəsinin ailə ilə əməkdaşlığının optimallaşdırılması xüsusi əhəmiyyət kəsb edir. Məktəbəqədər təhsil müəssisəsinin ailələrlə əməkdaşlığının optimallaşdırılması məqsədilə aşağıdakı yollardan istifadə edilməsi faydalıdır**:** ailələrin tərbiyəvi imkanlarının öyrənilməsi, əməkdaşlıq zamanı tərbiyəvi potensialdan effektiv istifadə edilməsi; valideynlərlə münasibətlərin ailənin maraqlarına yüksək hörmət üzərində qurulması; hər bir uşağın inkişaf perspektivinin aydın görülməsi və onun həyata keçirilməsi yollarının ailəyə başa salınması; ailə ilə xeyirxah qarşılıqlı münasibətin qurulması, yaş və fərdi xüsusiyyətlərin nəzərə alınaraq valideynlərlə işgüzar əlaqənin saxlanılması; hər bir ailənin konkret həyat şəraitini nəzərə alaraq qarşıda qoyulan məqsədə çatmaq üçün valideynlərə düzgün yol və vasitələr seçməkdə kömək edilməsi; valideynlərlə işin planlaşdırılması, hər bir qrupun uşaqlarının tərbiyə səviyyəsinin öyrənilməsi əsasında qrup üzrə pedaqoji maarifləndirmənin planının tərtib edilməsi; məktəbəqədər təhsil müəssisəsinə və tərbiyəçi-müəllimə kömək göstərmək üçün valideynlərin səfərbər edilməsi.

***Açar sözlər:*** *məktəbəqədər, təhsil, müəssisə, ailə, əməkdaşlıq, optimallaşdırma, yol, valideyn*

**Резюме**. Оптимизация взаимодействия дошкольного образовательного учреждения с семьей приобретает особое значение в современную эпоху, когда образование находится на этапе модернизации. В целях оптимизации сотрудничества ДОУ с семьями целесообразно использовать следующие пути: изучение воспитательных возможностей семей, эффективное использование воспитательного потенциала в ходе сотрудничества; установление отношений с родителями, основанных на высоком уважении интересов детей, семьи. Четко видна перспектива развития каждого ребенка и разъясняются пути ее реализации. Установление хороших взаимоотношений с семьей, поддержание деловых отношений с родителями с учетом возрастных и индивидуальных особенностей. А также помощь родителям в выборе правильного пути и средств для достижения намеченной цели с учетом конкретных условий жизни каждой семьи, поддержание репутации родителей, нравственное обогащение семьи.

***Ключевые слова:*** *дошкольное, образование, учреждение, семья, сотрудничество, оптимизация, путь, родитель*

**Summary.** Optimizing the cooperation of the preschool educational institution with the family is of particular importance in the modern era, when education is in the modernization stage. It is useful to use the following ways in order to optimize the cooperation of the preschool educational institution with families: Studying the educational possibilities of families, effectively using the educational potential during cooperation; Establishing relations with parents based on high respect for the interests of the family; The perspective of each child's development is clearly seen and the ways of its implementation are explained to the family; Establishing a good mutual relationship with the family, maintaining a business relationship with parents, taking into account age and individual characteristics; Helping parents to choose the right way and means to achieve the intended goal, taking into account the specific life conditions of each family; Planning work with parents, drawing up a plan of pedagogical education for the group based on studying the education level of the children of each group; mobilizing parents to help the preschool educational institution and the tutor-teacher; Analyzing the results of the preschool educational institution's cooperation with families.

***Key words***: *preschool, education, enterprise, family, cooperation, optimization, parent*

Təhsil sahəsində qazanılan uğurlar məktəbəqədər təhsildən başladığından, hazırda bu sahənin inkişafına dövlətimiz tərəfindən böyük diqqət və qayğı göstərilir. Bunu son illər məktəbəqədər təhsilin inkişafı ilə bağlı bəzi normativhüquqi sənədlərin (Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu; Məktəbəqədər təhsil haqqında Azərbaycan Respublikasının Qanunu; Məktəbəqədər təhsilin dövlət standartı və proqramı; Məktəbəqədər təhsilin proqramı (kurikulumu); Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası və i.a.) qəbul edilməsi bir daha təsdiq edir. Həmin sənədlərə uyğun olaraq məktəbəqədər müəssisələrdə pedaqoji proses uşaqların yaş və fərdi imkanlarına, qabiliyyət və ehtiyaclarına, onlarda sosial-əxlaqı normaların formalaşmasına, bir sözlə, onların hərtərəfli inkişafına yönəldilmişdir.

Təhsilin modernləşmə mərhələsində olduğu müasir dövrdə məktəbəqədər təhsil müəssisəsinin ailə ilə əməkdaşlığının optimallaşdırılması xüsusi əhəmiyyət kəsb edir. Məktəbəqədər təhsil haqqında Azərbaycan Respublikasının Qanununun 19-cu maddəsində göstərildiyi kimi, **v**alideynlərin məktəbəqədər təhsil sahəsində vəzifələri övladının erkən yaşdan fiziki, əxlaqi və intellektual inkişafına şərait yaratmaq, Azərbaycan xalqının adət-ənənələrinə, mənəvi dəyərlərə, azərbaycançılıq məfkurəsinə, vətənə, ana dilinə qarşı hörmət və məhəbbət ruhunda tərbiyə etməkdən ibarətdir. Məktəbəqədər təhsil müəssisəsi də bu vəzifələrin həyata keçirilməsində valideynlərə yaxından kömək etməlidir (1).

Uşaqların tərbiyəsində mühüm rol oynayan ailə həm də cəmiyyətin ilkin özəyidir. Uşaq ailədə dünyaya göz açır, məktəbəqədər təhsil müəssisəsinə gələnə qədər müəyyən bilik, bacarıq və vərdişlərə yiyələnir, fiziki, əxlaqi, əqli, estetik tərbiyənin təməli məhz burada qoyulur. Bu baxımdan valideynlər və ailə uşağın ilk tərbiyəçisi hesab olunur. Ailənin uşağın ilk tərbiyəçisi kimi qəbul edilməsi gələcəkdə təlim-tərbiyə prosesinin məzmunlu qurulması, əlverişli münasibətlərin yaranması üçün vacib amildir. Valideyn və tərbiyəçilərin ümumi səyləri uşaq haqqında məlumatların əldə olunmasına, uşağın davranışı, rəftarı, münasibətləri ilə bağlı fikir və mülahizələrin bölüşdürülməsinə, ən əsası, uşağın böyüməsi və inkişafı üçün daha əlverişli şəraitin yaradılmasına yönəldilir.

Prof. Y.Ş.Kərimov yazırdı: “Ailə nə üçün kiçikyaşlılara belə təsir göstərir? Əvvəla, ailə tərbiyəsi dərin emosionallığı, intimliyi, ailənin hər bir üzvünə, xüsusilə uşaqlara münasibətdə dərin məhəbbəti ilə xarakterizə olunur... Kiçik uşaq emosional, tez mütəəssir olan, fəallıq göstərəndir. Ona görə də ailə tərbiyəsi onlara güclü təsir göstərir. Belə bir şərait valideynlərin məsuliyyətini artırır, uşaqlara davranış nümunəsi göstərmələrini tələb edir. Ailədə qarşılıqlı hörmət, ictimai istiqamətlilik hökm sürməlidir.”!(2) Bu mürəkkəb işdə valideynlərə kömək etmək tərbiyəçinin borcu və vəzifəsidir.

Uşaq vaxtının çoxunu ailədə keçirir, onun qabiliyyət və bacarıqları, fərdi xüsusiyyətləri ailədə nəzərə alınır. Həmçinin uşaq ata-anasını sevir, onlara inanır və valideynlərini təqlid etməyə çalışır. Uşaq şəxsiyyəyinin formalaşmasında ailə ilk məktəbdir. Uşağın şəxsiyyətinin inkişafı, onun tərbiyəsi valideynlərin şəxsiyyətinin necə formalaşmasından çox asılıdır. Bütün bunlar ailə tərbiyəsinin uşaqlara böyük təsir göstərdiyini təsdiq edir.

N.Gəncəvi ailəni uşağın ilk tanış olduğu ictimai mühit adlandırmışdır. O, belə hesab edirdi ki, uşaqların həyatda düzgün mövqe tutması üçün ailə tərbiyəsi əsas olmalıdır. Tərbiyəçi-müəllimlər hər bir ailənin mədəni dəyərlərinə hörmətlə yanaşmalı, uşağın tərbiyə aldığı ilk ictimai-mədəni ocaq olduğundan öz münasibətlərində bu amili diqqət mərkəzində saxlamalıdırlar. Tərbiyəçilər uşaqların ailəsi və yaxınlarının demoqrafik problemləri, ailə üzvlərinin məşğuliyyəti, maraqları haqqında məlumatlar əldə etməlidirlər.

Qarşılıqlı əməkdaşlıq uşağın əqli fəaliyyətinin zənginləşməsinə, özünəinamın yaranmasına, nəticə etibarilə, məktəb həyatına daha rahat uyğunlaşma dövrünü keçməyə təsir göstərir. Valideynlər uşaqların təlim fəaliyyətində iştirak etdikləri təqdirdə onların təlim nailiyyətləri yüksəlir. Belə bir əməkdaşlıq şəraitində valideynlər aşağıdakı məsələlərlə tanış olmalıdırlar: uşaqların yaş xüsusiyyətləri; təlim-tərbiyə işinin əhəmiyyəti; uşaqların fəaliyyətlərini stimullaşdıran öyrədici mühitin vacibliyi; fiziki, emosional müdafiənin təmin edilməsi, mühitin təhlükəsizliyinin zəruriliyi; uşaqların fəallığı.

Valideynlər öz uşaqlarının əqli qabiliyyətləri haqqında tərbiyəçidən məlumat alır, onların təlim nailiyyətlərinə verilən qiyməti daha asan qavrayaraq uşağın irəliləyişini sürətləndirmək məqsədilə tərbiyəçilərlə əməkdaşlıq edirlər. Pedaqoji şura iclaslarında iştirak, valideyn şurasına üzvlük, məktəb həyatı haqqında söhbətlər və birgə mütaliə kimi pedaqoji tədbirlər uşağın təhsilində valideynlərin fəal iştirakını təmin edən çoxsaylı yollarındandır.

Təəssüf ki, bəzi ailələrdə tərbiyə prosesi düzgün qurulmur. Bu da bəzi valideynlərin pedaqoji biliklərə malik olmamasından irəli gəlir. Məktəbəqədər təhsil müəssisələri bütün fəaliyyəti ilə uşaqların ailə tərbiyəsini təşkil etmək, ona pedaqoji istiqamət vermək və bu yolla onların hərtərəfli inkişafını təmin etməlidir. Tərbiyəçi valideyn iclasları, fərdi söhbətlərdən istifadə etməklə valideynləri pedaqoji biliklərlə silahlandırmalıdır. V.A. Suxomlinski qeyd edirdi ki, pedaqoqlar və valideynlər ailə tərbiyəsi haqqında aydın təsəvvürə və onun həyata keçirilməsi yolları haqqında biliyə malik olmalıdır. "...Uşaq ailənin güzgüsüdür, necə günəş, bir damcı suda əks olunur, uşaqlar da ata və ananın təmiz qəlbində əks olunur." (1)

Ailə uşağın tərbiyəsi üçün cəmiyyət qarşısında məsuliyyət daşıyır. Məktəbəqədər təhsil müəssisəsi də, öz növbəsində, valideynlərə uşaqların tərbiyəsi üçün metodların seçilməsində, hər bir uşağın fərdi-psixoloji xüsusiyyətlərini öyrənib formalaşdırmaqda müntəzəm olaraq kömək göstərir.

Düzgün tərbiyə işində valideyn və tərbiyəçinin pedaqoji mərifəti mühüm rol oynayır. J.J.Russo deyirdi ki, uşağın qəlbinə ən cüzi bir şey də təsir edir, ona görə də uşağın yanında əsəbiləşməkdən, söyüş söyməkdən, qeybətçilikdən, yalançılıqdan çəkinmək lazımdır. Uşaq bunları hiss edir, xatirində saxlamırsa, bunlar onun beynində iz buraxır (4).

Ailə ilə real əlaqə yaratmaq üzrə işin ağırlığı tərbiyəçi-müəllimin üzərinə düşür. O, öz fəaliyyətini valideyn komitəsi, valideyn yığıncaqları vasitəsilə təşkil edir. Ailə ilə əlaqə saxlamaq üzrə tərbiyəçi-müəllimin praktiki fəaliyyətinin mühüm hissəsini müntəzəm olaraq uşaqların evlərinə getmək təşkil edir. Belə gedişlər zamanı uşaqların həyat şəraiti yerində öyrənilir, uşaqlara birgə tərbiyəvi təsirləri gücləndirmək üçün tədbirlər razılaşdırılır və əlaqələndirilir. Tərbiyəçi-müəllim ailələrə pedaqoji məsləhətlər verməlidir. Valideynlərin bağçaya dəvət edilməsi də ailə ilə əlaqədə böyük əhəmiyyət kəsb edir. Tərbiyəçi çalışmalıdır ki, valideyn bağçaya gəlməyə özü ehtiyac hiss etsin və uşağın bağçadakı fəaliyyəti, təlim-tərbiyəsi ilə maraqlansın. Tərbiyəçi-müəllim bu görüşə əvvəlcədən hazırlaşmalı, müzakirə edəcəkləri məsələləri özündə qeyd etməlidir. Tərbiyəçi-müəllimin valideynləri pedaqoji yeniliklərlə maarifləndirməsi, uşaq haqqında dəqiq məlumat alması, uşağın bağçada, yaşıdlarının kollektivində özünü necə aparması haqqında məlumat verməsi vacibdir. Tərbiyəçi-müəllim çalışmalıdır ki, bu görüşlərdə valideynlərdə nikbin əhval-ruhiyyə yaratsın, bağça ilə ailə arasında əlaqə möhkəmlənsin.

Valideynlər uşaqlarla keçirilən bütün kütləvi tədbirlərdə, təlimdə, problemlərin həllində iştirak etməyə cəlb edilirlər. Valideynlər tərbiyəçi-müəllimlərlə birlikdə uşağın inkişafının stimullaşdırılmasında fəal iştirak edir, səy göstərirlər. Bunun üçün, ilk növbədə, qruplarda mənimsənilən bilik və bacarıqlar ailədə möhkəmləndirilir.

Ailənin və dövlətin hüquqi münasibətləri normativ sənədlər və qərarlarla nizama salınır.

Ailə tərbiyəsinin hüquqi əsasları Konstitusiyanın müvafiq maddələrində öz əksini tapmışdır. Tərbiyəçi-müəllim valideynlərin nəzərinə çatdırmalıdır ki, Məktəbəqədər təhsil haqqında Azərbaycan Respublikasının Qanununun 17-ci maddəsi "Məktəbəqədər təhsil sahəsində uşaqların hüquqları"na həsr olunmuşdur. Orada qeyd olunur ki, məktəbəqədər təhsil sahəsində uşaqlar aşağıdakı hüquqlara malikdirlər:

– həyat və sağlamlıq üçün təhlükəsiz şəraitdə, mənəvi-psixoloji cəhətdən sağlam pedaqoji mühitdə dövlət təhsil standartlarına uyğun keyfiyyətli təhsil almaq;

– şəxsiyyətin alçaldılmasına, mənəvi və psixoloji duruma və sağlamlığa zərər vuran hərəkətlərin bütün formalarından, fiziki və psixoloji zorakılıq hallarından müdafiə olunmaq;

– uşaqların sağlamlığına, mənəvi və psixoloji durumuna zərər vuracaq istənilən informasiyadan və təbliğatdan müdafiə olunmaq;

– ödənişsiz tibbi xidmətdən istifadə etmək, sağlamlıq vəziyyətinə görə tibbi müayinə xidmətlərindən yararlanmaq, çatışmazlıqların (nitq qüsurları, eşitmə və görmə qabiliyyətlərinin zəifliyi) korreksiya edilməsi üçün psixoloji-tibbi-pedaqoji yardım almaq və i.a. (1)

Məktəbəqədər təhsil müəssisələrində valideynlərlə işin səmərəli təşkili nəticəsində uşaqlarda intellektual bacarıqlar formalaşmış olur. Praktiki olaraq bütün uşaqlar fəaliyyətin məqsədini dərk edir, onun planını nəzərdə tutur, adekvat üsullar seçir, nəticəni yoxlayır, işdə qarşıya çıxan çətinlikləri dəf edir və işi müvəffəqiyyətlə sona çatdıra bilirlər.

Məktəbəqədər təhsil müəssisəsinin ailələrlə əməkdaşlığının optimallaşdırılması məqsədilə aşağıdakı yollardan istifadə edilməsi faydalıdır**:** ailələrin tərbiyəvi imkanlarının öyrənilməsi, əməkdaşlıq zamanı tərbiyəvi potensialdan effektiv istifadə edilməsi; valideynlərlə münasibətlərin ailənin maraqlarına yüksək hörmət üzərində qurulması; hər bir uşağın inkişaf perspektivinin aydın görülməsi və onun həyata keçirilməsi yollarının ailəyə başa salınması; ailə ilə xeyirxah qarşılıqlı münasibətin qurulması, yaş və fərdi xüsusiyyətlərin nəzərə alınaraq valideynlərlə işgüzar əlaqənin saxlanılması; hər bir ailənin konkret həyat şəraitini nəzərə alaraq qarşıda qoyulan məqsədə çatmaq üçün valideynlərə düzgün yol və vasitələr seçməkdə kömək edilməsi; valideynlərlə işin planlaşdırılması, hər bir qrupun uşaqlarının tərbiyə səviyyəsinin öyrənilməsi əsasında qrup üzrə pedaqoji maarifləndirmənin planınının tərtib edilməsi; məktəbəqədər təhsil müəssisəsinə və tərbiyəçi-müəllimə kömək göstərmək üçün valideynlərin səfərbər edilməsi; valideynlərin nüfuzunun saxlanılması, ailənin mənəvi zənginləşdirilməsi, valideynlərin uşaqlara müsbət təsirinə kömək edilməsi; məktəbəqədər təhsil müəssisəsinin ailələrlə əməkdaşlığının nəticələrinin təhlil edilməsi və i.a.

Beləliklə, məktəbəqədər təhsil müəssisəsi ilə ailənin əməkdaşlığının optimallaşdırıması uşaqların təlim-tərbiyəsinin sistematik, rəngarəng qurulmasına, respublikamızın ən kiçik vətəndaşlarının hərtərəfli və ahəngdar inkişafının təmin edilməsinə imkan verir.

**Problemin aktuallığı.** Müasir dövrdə məktəbəqədər təhsil müəssisələrində təlim işinin demokratik prinsiplər əsasında qurulması mühüm əhəmiyyət kəsb edir. Məktəbəqədər təlim özünəməxsus cəhətlərə malikdir. Orada valideynlərin müraciətlərinə, arzu və istəklərinə daha ciddi yanaşmaq, uşaqların maraqlarının nəzərə alınmasını stimullaşdırıcı vasitə kimi dəyərləndirmək zəruri hesab edilir. Uşaq problemlərinin həlli zamanı valideynləri aktiv müzakirəyə cəlb etmək, onları uşaqlarla birgə yaradıcılıq işinə cəlb etmək məqsədəuyğundur. Bu baxımdan bağça ilə ailənin birgə işinin də daha əlverişli qaydada qurulması diqqət mərkəzində olmalıdır.

**Problemin elmi yeniliyi**. Məqalədə məktəbəqədər təhsil müəssisəsi ilə ailənin əməkdaşlığı ilə bağlı fikirlər təhlil olunmuş, həmçinin onun təlim-tərbiyə işinin keyfiyyətinin yüksəldilməsinə təsiri əsaslı şəkildə göstərilmişdir.

**Problemin praktik əhəmiyyəti**. Məqalədə əldə olunmuş nəticələr məktəbəqədər təhsil müəssisəsi ilə ailənin əməkdaşlığı optimallaşdırılması və pedaqoji prosesin səmərəli təşkili üçün əhəmiyyətlidir. Bu nəticələr məktəbəqədər təhsil müəssisələrinin ailə ilə əməkdaşlığının optimallaşdırılmasına kömək edir.

**Ədəbiyyat:**


1. Məktəbəqədər təhsil haqqında Azərbaycan Respublikasının Qanunu, 14 aprel 2017-ci il.
2. Kərimov Y,Ş. Uşaq məktəbə gedir. Bakı, 2002.
3. Suxomlinski N.A. Ürəyimi uşaqlara verirəm. Bakı, 1979, s. 46
4. Руссо Ж.Ж. Педагогические сочинения. В. 2 т. М., 1981.

5. Əlizadə Ə.Ə., Abbasov A.N. Ailə: IX sinif üçün dərslik. Bakı: Maarif, 1989.
6. Məktəbəqədər təhsilin proqramı (kurikulumu). 2022.
7. Sadıqova.T.B. Məktəbəqədər təhsil müəssisələrində təlim-tərbiyə işinin təşkili. Bakı: Nərgiz, 2010.
8. Sadıqova T.B. Uşaq bağçasının ailə ilə birgə işi, Bakı: Nərgiz, 2012.


**E-mail**: t.sadiqova2013@ya.ru

**Rəyçilər:** *ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 22.11.2022.

*UOT 373.2*

***Dilşad Səlim qızı Dadaşova***
*Bakı şəhəri Xətai rayonu 72 nömrəli körpələr evi-uşaq bağçasının müdiri*
https://orcid.org/0000-0003-2288-9886

# MÜASİR MƏRHƏLƏDƏ MƏKTƏBƏQƏDƏR MÜƏSSİSƏ RƏHBƏRİNİN İNNOVATİV FƏALİYYƏTİ

***Дильшад Салим гызы Дадашова***
*заведующая яслями-детским садом № 72 Хатаинского района города Баку*

## ИННОВАЦИОННАЯ ДЕЯТЕЛЬНОСТЬ РУКОВОДИТЕЛЯ ДОШКОЛЬНОГО УЧРЕЖДЕНИЯ НА СОВРЕМЕННОМ ЭТАПЕ

***Dilshad Salim Dadashova***
*head of the kindergarten No.72 of Khatai district of Baku city*

## INNOVATİVE ACTİVİTY OF THE HEAD OF A PRESCHOOL İNSTİTUTİON AT THE PRESENT STAGE

**Xülasə.** Məqalədə məktəbəqədər təhsil müəssisələrində təşkilati və pedaqoji işin və innovativ fəaliyyətin təşkilində yeni yanaşmalardan, pedaqoji texnologiyalardan istifadə məsələlərindən bəhs edilir. Məktəbəqədər təhsildə istifadə edilən müasir yanaşmalar məktəbəqədər yaşlı uşağın keyfiyyətli təlim-tərbiyəsinə və nailiyyətlərinə zəmanət verir, onların gələcəkdə məktəbdə uğurlu təhsilinə zəmin yaradır. Müasir yaradıcı, kreativ rəhbərlər məktəbəqədər təhsil müəssisəsində istənilən müsbət nəticəni əldə etmək üçün müxtəlif yanaşmalardan istifadə edirlər.
***Açar sözlər:*** *məktəbəqədər təhsil, yeni yanaşmalar, pedaqoji texnologiyalar, təlimin keyfiyyəti*

**Резюме.** В статье говорится о новых подходах и использовании педагогических технологий при построении организационно-педагогической работы и инновационной деятельности в дошкольных образовательных учреждениях. Современные подходы, применяемые в дошкольном образовании, гарантируют качественное образование и достижения дошкольника, закладывают основу для его успешного обучения в школе в будущем. Современные творческие, креативные руководители используют разные подходы для достижения желаемого положительного результата в дошкольном образовательном учреждении.
***Ключевые слова:*** *дошкольное образование, новые подходы, педагогические технологии, качество образования*

**Summary.** The article talks about new approaches and the use of pedagogical technologies in the organization of organizational and pedagogical work and innovative activities in preschool educational institutions. Modern approaches used in preschool education guarantee high-quality education and achievements of a preschooler, lay the foundation for his successful schooling in the future. Modern creative, creative leaders use different approaches to achieve the desired positive result in a preschool educational institution.
***Key words:*** *preschool education, new approaches, pedagogical technologies, quality of education*

1990-cı illərin əvvəllərindən etibarən digər postsovet ölkələrində olduğu kimi Azərbaycanın da təhsil sistemi onun bütün əsas komponentlərinə təsir edən dəyişikliklərə məruz qalmışdır. Dəyişikliklər təhsil sisteminin müasirləşdirilməsi zərurəti yaratdı. Təhsil sisteminin müasirləşdirilməsinin ən mühüm vəzifəsi və prioritet istiqamətlərindən biri bu sistemin, o cümlədən məktəbəqədər təhsilin idarəetmə modelinin müasirləşdirilməsidir. Bu şəraitdə nailiyyət-

lərə sistemli yanaşma və təhsilin keyfiyyətinin qiymətləndirilməsi tələblərini təmin edən idarəetmə texnologiyaları məsələsi məktəbəqədər təhsil müəssisəsinin rəhbəri üçün böyük əhəmiyyət kəsb edir.

XXI əsrdə, elm və texnikanın sürətlə inkişaf etdiyi, insan fəaliyyətinin bütün sahələrində yeniləşmələrin baş verdiyi müasir dövrdə pedaqoji elmlər sistemində idarəetməyə yeni yanaşmalar meydana gəlməkdədir. Belə ki, öyrənənlərə hazır biliklərin verildiyi ənənəvi təlim metodlarından fərqli olaraq, yeni təlim metodları, təlim prosesinə yeni texnologiyaların tətbiq edilməsi, yeni idarəetmə qaydalarının da yaradılmasını tələb edir. Belə bir şəraitdə məktəbəqədər təhsil müəssisələrinin idarə olunması və uğur əldə edilməsində bu sahənin fərqli tələblərlə nəticələrə doğru istiqamətləndirilməsi lazım gəlir.

Məktəbəqədər təhsildə müsbət nəticələrin əldə edilməsi ona düzgün, elmi istiqamətli rəhbərlikdən, onun keyfiyyətli şəkildə idarə edilməsindən çox asılıdır. Təhsil müəssisələrinin, o cümlədən məktəbəqədər təhsil müəssisələrinin innovativ idarə edilməsi qarşıya qoyulmuş əsas hədəfə çatmağın, əsas məqsədin reallaşdırmağın və nəticəyönlü idarəetmə prosesinin təmin olunmasının əsas və başlıca amillərindən biridir.

Məlum olduğu kimi, məktəbəqədər təhsil təhsilin birinci pilləsidir. O, uşaqların məktəb təliminə müvəffəqiyyətlə hazırlanmasının əsasında durur. Hazırda Təhsil sistemində, o cümlədən məktəbəqədər təhsil nəticəyönlüdür. Nəticəyönlülük, həm də idarəetmənin məqsədləri ilə müəyyən olunur. Müsbət nəticəyə nail olmaq üçün, hər şeydən əvvəl, müəssisədə optimal idarəetmə sistemi yaradılmalıdır.

Bu problemi həll etməklə işlədiyimiz müəssisədə biz idarəetmənin inzibati metodlarından səmərəli fəaliyyət üçün müsbət motivasiyanı gücləndirən sosial-psixoloji metodlara keçməyi məqsədəuyğun hesab edirik. Bizim müəssisədə yeniliklərə açıq, yaradıcı həmfikirlərdən ibarət yaradıcı, sabit komandamız formalaşmışdır. Həmçinin kadr seçimində də biz təhsilə, ixtisasa, təcrübəyə, uşaq kollektivini təşkil etmək bacarığına, valideynlərlə əlaqə yaratmağa, yaradıcı işləmək istəyinə, peşəkarlıq səviyyəsini daim təkmilləşdirmə bacarığına daim diqqət yetiririk.

Məktəbəqədər təhsil müəssisəsinin rəhbəri cəmiyyətin yenidən qurulmasında özünün rolunu anlamalı, valideynlərlə əlaqəli iş aparmalı, uşaqların maraqlarını qorumalı, pedaqoqların peşəkarlığını artırmalı, pedaqoji prosesin optimallaşdırılmasından ötrü yeni texnologiyaları öyrənərək iş prosesinə tətbiq etməlidir. Məktəbəqədər təhsil müəssisəsi rəhbərinin idaretmə səriştəliliyi birbaşa onun özünü və şəxsi məqsədlərini dərk etməsindən, vaxtını və səyini düzgün sərf etməsindən, stressləri aradan qaldırmasından, özünü öyrənərək dəyişməsindən bilavasitə asılıdır. Müəssisə rəhbərinin pedaqoji kollektivin digər üzvlərini işə cəlb etməsi, nəticəyönlü ümumi nəticə əldə etməkdir. Belə dinamik və çevik nəticəyönlü idarəetmə sistemində bütövlükdə hər bir işçinin iş keyfiyyəti də yüksəlir. Digər tərəfdən, belə idarəetmə pedaqoji kollektivin sərbəstliyini, yaradıcı təşəbbüskarlığını idarəetmədə iştirak etmək arzusunu artırır.

Bir təhsil müəssisəsinin inkişafı təkcə yeniliklərin tətbiqi, innovasiya prosesinin inkişafı yolu ilə həyata keçirilə bilməz. Yeniliyi idarə etmək üçün hər bir müəssisə rəhbəri onun mahiyyətini anlamalı, məzmununu, quruluşunu bilməli və öyrənməlidir. Məktəbəqədər təhsil müəssisəsinin inkişaf prosesi mürəkkəb dinamik bir sistemdir, buna görə də innovativ fəaliyyət (bir sistem olaraq) da strukturlaşdırılmışdır və tərkibi aşağıdakı strukturu aşağıdakı komponentlərlə: fəaliyyət, mövzu, səviyyə, məzmun, idarəetmə, təşkilati ayırd edilə bilər.

Hər bir təhsil müəssisəsində innovativ prosesin idarə edilməməsi onun tez bir zamanda pozulmasına səbəb olur, buna görə idarəetmə strukturunun olması özünü idarəetmə elementlərini istisna etməyən bu prosesdə sabitləşdirici və dəstəkləyici amildir. İnnovasiya prosesinin təşkilati quruluşu aşağıdakı: təşkilati – praktik – ümumiləşdirmə – həyata keçirmə mərhələlərini əhatə edir. Yeniliyin bütün struktur komponentləri bir-biri ilə əlaqəlidir. Bunların paralel, eyni vaxtda aparılması vacibdir və bu, təhsil müəssisəsinin səmərəli inkişafına imkan verəcəkdir.

*Məktəbəqədər təhsil müəssisələrində innovativ fəaliyyətin məqsədi* – uşaq bağçasının pedaqoji sisteminin keyfiyyətcə daha yüksək təhsil nəticələrinə nail olmaq qabiliyyətini artırmaqdır.

Təhsil sistemindəki innovativ fəaliyyəti nəzərə alaraq qeyd etmək lazımdır ki, "təhsildə yenilikinnovasiya" anlayışının müasir şərhləri daha çox təhsil və təlimin yeni vasitələrinin,

metodlarının və texnologiyalarının inkişafı və tətbiqi ilə əlaqələndirilir.

Yeni məzmun, məktəbəqədər təhsil proqramı (kurikulumu) uşağın fərdiliyinə və cəmiyyətin sifariş və ehtiyaclarına yönəldilmiş təhsil prosesinin dəyişkənliyini təmin etmək üçün hazırlanmışdır. Məktəbəqədər təhsil müəssisələrinin fəaliyyətində yeniliklərin tətbiqi metodik xidmətin təşkilində dəyişiklik və yeniliklər tələb edir. Peşəkar səriştəlilik xüsusilə vacibdir ki, bu da tərbiyəçi-müəllimlərin, rəhbərin şəxsi və peşəkar inkişafına əsaslanır.

İnnovasiya prosesləri məktəbəqədər təhsilin inkişafında və müəssisənin işindəki dəyişikliklərə aiddir, pedaqoji işçilərinin fəaliyyət və düşüncə tərzindəki dəyişikliklərlə müşayiət olunur, həmçinin sistemin bir idarəetmə sistemindən başqasına keçməsinə səbəb olan yeni tətbiq mühitinə daxil edilməsidir.

Məktəbəqədər təhsildə innovativ fəaliyyətin öz xüsusiyyətləri vardır. Birinci xüsusiyyət, innovasiya prosesinin subyektlərinin uşaqlar, valideynlər və tərbiyəçi-müəllimlər olmasıdır. Bu nəzərə alınmırsa, deməli pedaqoji yenilik əslində təhsili olan hər şeyi, yeniliyin bütün humanist tərkib hissəsini atır. Pedaqoji yeniliyin ikinci fərqləndirici xüsusiyyəti ən çox mümkün pedaqoji problemlərin sistemli şəkildə işıqlandırılmasına olan ehtiyacdır. Pedaqoji yeniliyin səmərəliliyini müəyyən edən şərt, fərdi metodologiyanın problemlərini həll edən, ümumi suallar verən və mövcud didaktik prinsipləri yeni bir şəkildə yenidən düşünməyə başlayan tərbiyəçi-müəllimlərin tədqiqat fəaliyyətidir. Təhsil sahəsinə gəldikdə, yeniliyin yeni məzmun, metod, təlim prosesinin təşkili forması və ya valideynlərin real tələbləri əsasında təhsil sahəsində sosial xidmətlərin göstərilməsinə yeni bir yanaşma şəklində təcəssüm etdirən son nəticə hesab edilə bilər.

*Məktəbəqədər təhsil müəssisələrində innovativ fəaliyyətin təşkili.* Məktəbəqədər təhsil müəssisəsi rəhbərinin vəzifəsi-innovativ prosesi təşkil edən və həyata keçirənlərin fərdi keyfiyyətlərini, peşəkar səviyyəsini, yeni fəaliyyət növlərinə psixoloji hazırlığını nəzərə alaraq kollektivin innovativ fəaliyyətə başlaması üçün motivasiya yaratmaqdır.

Məktəbəqədər təhsil müəssisələrinin innovativ fəaliyyətinə informasiya və metodiki dəstəyin göstərilməsi vacibdir:

- məktəbəqədər təhsil müəssisəsinin innovativ fəaliyyəti və prioritet istiqaməti ilə bağlı qabaqcıl pedaqoji təcrübə haqqında məlumat bazasının yaradılması;
- yeni proqram və texnologiyaların tətbiqi üzrə işləyən tərbiyəçi müəllimlərin diferensiallaşdırılmış informasiya materialları ilə təmin edilməsi;
- metodik materiallardan ibarət video kitabxananın yaradılması, açıq məşğələlər, layihə mövzuları üzrə sərgilər və s.

Məktəbəqədər təhsildə müsbət dəyişikliklər tərbiyəçi-müəllimə məktəbəqədər yaşlı uşaqların təliminin forma və üsullarını seçməkdə sərbəstlik verir. Tərbiyəçi-müəllimin seçdiyi təlim forması zehni əməliyyatların formalaşmasına töhfə verməli, problemlərin yaradıcı həlli və təşəbbüsün təzahürü üçün şərait yaratmalı, müstəqillik və məsuliyyəti öyrətməli, uşaqları öz davranışlarına nəzarət etmək bacarığında tərbiyə etməlidir. Məktəbəqədər təhsilin müasirləşdirilməsi uşaq bağçasında təlimin təşkilinin yeni formalarının axtarışına səbəb oldu. Məktəbəqədər yaşlı uşaqların təlimi özünəməxsus xüsusiyyətlərə malikdir, təlim prosesinin təşkilində qeyri-standart yanaşmalardan istifadə olunur. Bu baxımdan məktəbəqədər təhsil müəssisələri qarşısında öz fəaliyyətlərinin məqsədyönlü əsaslarına yenidən baxmaq, təhsilin məzmununu, təlim prosesinin təşkilinin forma və üsullarını, tərbiyəçi-müəllimin yanaşmasını dəyişdirmək vəzifəsi durur.

Hamımıza məlumdur ki, məktəbəqədər təhsil müəssisəsində innovativ proses hər bir şəxsə öz inkişaf ehtiyaclarını ödəməyə, potensialını inkişaf etdirməyə və qorumağa imkan verən, müəyyən bir sistem daxilində böyüklər və uşaqlar arasında inkişaf edən sistemli, vahid və məqsədyönlü qarşılıqlı əlaqə prosesidir.

Təlimin təşkilinə müasir yanaşmalar məktəbəqədər təhsil müəssisəsində fəaliyyətin innovativ istiqamətləndirilməsi ilə bağlıdır. Müasir məktəbəqədər təhsil hər bir uşağın bilik qazanmasından fərdi inkişafına dəstək strategiyasının seçilməsinə qədər olan yanaşmadır. Hazırda məktəbəqədər yaşlı uşaqların təlim-tərbiyəsi, təhsildə innovativ texnologiyaların tətbiqi və məktəbəqədər təhsil müəssisələrində təlim-tərbiyə prosesində ən səmərəli işdir. Pedaqoji innovasiya pedaqoji fəaliyyət sahəsində yenilik, təlim və tərbiyənin məzmunu və texnologiyasın-

da dəyişiklik, onların səmərəliliyini artırmaq üçün mövcud fəal metod və məlumatların ötürülməsi vasitələrinin axtarışıdır. Məktəbəqədər təhsilin dövlət standartına uyğun olaraq, tərbiyəçi-müəllim məktəbəqədər yaşlı uşaqların inkişafı üçün sosial şərait yaratmalıdır.

**Problemin aktuallığı.** Bir təhsil müəssisəsinin inkişafı təkcə yeniliklərin tətbiqi, innovasiya prosesinin inkişafı yolu ilə həyata keçirilə bilməz. Yeniliyi idarə etmək üçün hər bir müəssisə rəhbəri onun mahiyyətini anlamalı, məzmununu, quruluşunu bilməli və öyrənməlidir.

**Problemin elmi yeniliyi.** Məktəbəqədər təhsil sisteminin idarə edilməsinə innovativ yanaşmaların tətbiqi müasir dövrdə ən aktual məsələlərdən olduğu üçün məqalədə bu məsələlər öz əksini tapmışdır.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** Məqalədən məktəbəqədər təhsil müəssisələrin rəhbərləri faydalana bilər.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası // Azərbaycan müəllimi qəzeti, -2013, 25 oktyabr.
2. "Azərbaycan Respublikasında məktəbəqədər təhsilin dövlət standartları". (2019). -Bakı: 8 avqust, edu.gov.az.
3. Cəfərova L. Məktəbəqədər təhsilin yeniləşdirilməsi yollarında. // Məktəbəqədər və ibtidai təhsil, -2009, № 2.- s.15-21.
4. Cəfərova L. Məktəbəqədər təhsil: inkişafin prioritetləri və problemləri. // -Bakı: Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, 2011, № 3, s.68-72.
5. Cəfərova L. Məktəbəqədər müəssisələrdə təlim prosesində keyfiyyətin idarə olunması. //-Bakı: Kurikulum, -2013, № 3,- s. 43-47.


**E-mail:** dadashova.dilshad@mail.ru

**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **L.K. Cəfərova,**
*ped.ü.fəls.dok.* **S.Ş. Musayeva**
**Redaksiyaya daxil olub:** 11.11.2022.

*UOT 373.2*

***Humay Hüseyn qızı Cəbiyeva***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun baş mütəxəssisi*

# AİLƏ ŞƏRAİTİNDƏ KİÇİKYAŞLI MƏKTƏBLİLƏRDƏ BİRGƏ FƏALİYYƏT BACARIQLARININ FORMALAŞDIRILMASI

***Хумай Гусейн гызы Джабиева***
*старший специалист*
*Института Образования Азербайджанской Республики*

# ФОРМИРОВАНИЕ НАВЫКОВ СОВМЕСТНОЙ ДЕЯТЕЛЬНОСТИ У ШКОЛЬНИКОВ МЛАДШЕГО ВОЗРАСТА В УСЛОВИЯХ СЕМЬИ

***Humay Huseyn Jabiyeva***
*senior specialist at the Institute of Education of the Republic of Azerbaijan*

# FORMALİZATİON OF SKİLLS OF JOİNT ACTİVİTİES İN THE FAMİLY İN PRİMARY CLASSES

**Xülasə.** Məqalədə müəllim-valideyn-şagird münasibətləri və ailədə birgə fəaliyyət zamanı formalaşan bacarıqlar haqqında məlumat verilmişdir. Şagirdlərə elm, təhsil və biliyin verilməsi müəllim-valideyn-şagird münasibətindən asılıdır. Valideynlərlə şagirdlərin birgə fəaliyyət göstərməsi üçün istirahət günlərində kitab oxumaq, teatrlara, kinoteatrlara ziyarət etmək, birgə inkişafla bağlı müxtəlif stolüstü oyunlar keçirmək, yaradıcı işlə məşğul olmaqla əlaqədar tövsiyələr verilmişdir.
***Açar sözlər:*** *birgə fəaliyyət, valideyn, məktəb, şagird, təhsil, həyat, kollektiv, tərbiyə*

**Резюме.** В статье представлена информация об отношениях учитель-родитель-ученик и навыках, формируемых в процессе совместной деятельности в семье. Предоставление науки, образования и знаний учащимся зависит от отношений учитель-родитель-ученик. Для совместной работы родителей и учащихся были даны рекомендации по чтению книг, посещению театров и кинотеатров, игре в различные настольные игры, связанные с совместным развитием, занятия творчеством.
***Ключевые слова:*** *совместная деятельность, родитель, школа, ученик, образование, жизнь, коллектив, воспитание*

**Summary.** The article provides information about teacher-parent-student relations and skills formed during joint activities in the family. The transfer of science, education and knowledge to students depends on the teacher-parent-student relationship. Recommendations were given for parents and students to work together, read books on weekends, visit theaters and cinemas, hold various board games related to joint development, and engage in creative work.
***Key words:*** *joint activities, parent, school, student, education, life, collective, upbringing*

Uşaqlıq – insan həyatının ən mühüm dövrüdür, gələcək həyata hazırlıq deyil, əsl, parlaq, bənzərsiz, təkrarolunmaz həyatdır. Uşaqlığın necə keçməsi bugünkü şagirdin necə insan olacağından asılıdır.

Uşaq şəxsiyyətinin formalaşmasında ailənin rolu əvəzedilməzdir. Ailə bir-biri ilə qohumluq bağları olan insanların birliyidir. Ailə hər kəsin həyatında böyük rol oynayır. Ailə üzvləri hər işdə bir-birlərinə kömək etməlidirlər.

İnsanın böyüyüb boya-başa çatdığı ailənin onun tərbiyəsində, əxlaqlı insan kimi yetişməsində rolu əvəzsizdir. Ailənin elə ən əsas funksiyası da gələcək üçün öz məsuliyyətini dərk edən, əxlaqi dəyərləri mənimsəyən insan yetişdirməkdir. Hər bir ata-ana övladına mükəmməl

tərbiyə verməyə, onu əxlaqlı insan kimi yetişdirməyə çalışmalıdır. Bunun üçün, ilk növbədə, onlar övladlarına nümunə olmalıdırlar. Ata-ana öz sevgisi, hörməti, şəfqəti, mərhəməti ilə övladlarına nümunə olmağa çalışmalıdır. (10)

Peyğəmbərimiz (SAV) buyurmuşdur:

"Heç bir ata övladına gözəl ədəb və tərbiyədən daha dəyərli və üstün bir sərvət qoymaz."

Ailə uşağın həyatının ağıllı təşkilini təmin etmək, yaşlı nəsillərin həyat və əməyinin müsbət təcrübəsini mənimsəməyə kömək etmək, fəaliyyətin, vərdişlərin, münasibətlərin dəyərli fərdi təcrübəsini toplamaq məqsədi daşıyır.

Ailə tərbiyəsində valideynlərlə uşaqlar arasında münasibətlər şəxsi-emosional xarakter daşıyır. Ana və ata uşaqlarla xoş rəftar etməli, fiziki və psixoloji cəhətdən yaxşı inkişaf etmək üçün uşağa, hər şeydən əvvəl, sevgi, məhəbbət verməlidirlər.

Ailədə şagirdlərin üzərinə düşən öhdəlikləri, məsuliyyət və vəzifələri vardır. Şagirdlər evdə öhdəsinə düşən işləri görməlidirlər. Öz otağını təmizləməli, əşyaları səliqəyə salmalı, ev işlərində analarına kömək etməlidirlər. Bacı-qardaşlarına, valideynlərinə aid əşyaları qarışdırmamlıdırlar. Anaya, ataya, ailədə böyük yaşlılara itaət etməli, onların sözünə baxmalı, dediklərinə, nəsihətlərinə əməl etməlidirlər. Ailədə yaşca böyük uşaqlar kiçik uşaqları həmişə qorumalı, onların qayğısına qalmalıdırlar. Onlara qulluq etməkdə analarına kömək göstərməlidirlər.

Ailə ilə birlikdə sərf olunan vaxt birgə fəaliyyətdir. Birgə fəaliyyət nəticəsində uşaqları müxtəlif tərəflərdən daha yaxından tanımaq olur. Valideynlər təmkinlə, səbirlə övladlarına düzgün izah etməyi bacarmalıdır. Birgə fəaliyyət zamanı uşaqlarınızı daha yaxşı və müxtəlif tərəflərdən tanıyacaqsınız.

Valideynlər uşaqlarının tərbiyəsini, təlimini və inkişafını ümumtəhsil müəssisələrinin istifadəsinə buraxırlar. Onlar övladlarının uğurları ilə az maraqlanırlar. Onları birgə fəaliyyətə cəlb etmək isə praktiki olaraq mümkün deyildir. Uşağın tam inkişafı məhz birgə fəaliyyətdə baş verir. Kiçik yaş dövründə uşaqların ətrafında baş verənlər onlar üçün çox həssas bir dövrdür və bu onun sonrakı həyatında iz buraxır. Məhz bu dövrdə uşaqlara valideynlərin diqqəti xüsusilə lazımdır. Daha sonra bu dövrü geri qaytarmaq mümkün olmayacaqdır.

Hər bir uşağın öz inkişaf zonası var – valideynləri ilə birgə edə bildiklərini özləri sərbəst edə bilmirlər. Uşaqların bu bacarıqlarından istifadə edib onlara düzgün istiqamət verilməlidir. Bunun üçün birgə fəaliyyət göstərmək lazımdır. Birgə fəaliyyət zamanı əvvəlcə uşaq sadəcə baxacaq, sonra isə özü sərbəst öyrəndiklərini tətbiq edə biləcək. Əsas rol valideynin üzərinə düşür.

Valideynlər təkcə övladının geyimi, qidası ilə maraqlanmamalı, həm də onlarla ünsiyyət qurmalı, düşünməyə sövq etməlidir. Birlikdə oynamaq, gəzmək, müxtəlif mövzularda danışmaq, hekayələr qurmaq, kitablar oxumaq və cizgi filmini izləmək olar. Kiçik yaşlı uşaqlar üçün ata-anasının nə etdikləri, nə danışdıqları maraqlıdır. Valideynlər övladları üçün faydalı olanları etməlidir. Uşaq nəyəsə cəhd edən zaman böyüklər tərəfindən tərif eşidəndə qürur, sevinc hissi keçirir. Ana birgə yaradıcılıq prosesində övladına kömək etməli və onu istiqamətləndirməlidir, o isə birgə fəaliyyət nəticəsində edilən işin mümkün olduğunu başa düşməlidir.

Beləliklə, uşaqla birgə işləmək üçün nə etmək lazımdır?

1. Kitab oxumaq. İstirahət günlərində uşağa yatmazdan əvvəl və ya gün (axşam) ərzində kitab oxumaq olar. Belə dəqiqələrdə uşaqda idrak sahəsinin inkişafı ilə yanaşı, birbaşa əxlaqi keyfiyyətlərin formalaşması da baş verir. Ən əsası isə valideynlərlə belə bir vəhdətdə olarkən, uşaqda tez-tez öz sirləri və problemləri haqqında danışmaq arzusu yaranır.

2. Teatrlara, kinoteatrlara ziyarət. İlkin mərhələdə bu cür səfərlərin təşəbbüskarı valideynlərdir. Uşaqlar gedəcəkləri yeri və mövzunu özləri seçirlər. Bu, valideynlərin uşaqla fəaliyyətidir. Bunu həyata keçirməklə böyüklər öz uşaqlarına daha yaxın olur və bu ailə münasibətlərinin möhkəmlənməsinə kömək edir.

3. Birgə inkişaf, uşaq-valideyn oyunu. Hər cür stolüstü oyunlar: domino, söz-məntiqi və s. uşaqların və valideynlərin birgə fəaliyyətini artırır. Oyun uşaq üçün ən xoş fəaliyyətdir, onun daxilində o inkişaf edir və tərbiyə olunur.

4. Birgə uşaq-valideyn yaradıcılığı. Uşaqların və valideynlərin birgə yaradıcılığı evdə bir çox müsbət emosiyalar və isti atmosfer yaradır. Yaradıcılıq prosesi uşağın hərtərəfli inkişafını stimullaşdırır. Motor bacarıqları təkmilləşdirilir, təxəyyül formalaşır, yaradıcılıq potensialı artır.

Valideynlər, adətən ya bütün gününü işdə keçirir, ya da digər işlərlə məşğul olurlar. Birgə yaradıcılıq zamanı isə valideynin övladına qarşı diqqəti artır. Valideynlər evdə övladlarının yaradıcılığını sərgiləmək üçün bir guşə yarada bilər. Bu, uşaqlarda özlərini daha əhəmiyyətli hiss etməyə imkan verəcəkdir.

Həyatda ən çox bizə vacib olanı unuduruq. Dəyər verdiyimiz insanlara kifayət qədər vaxt ayırmırıq. Onlarla az vaxt keçiririk. Sonra isə özümüzə "Niyə biz belə fərqliyik?", "Niyə bir-birimizi anlamırıq?" suallarını veririk. Ona görə də valideynlər övladlarını hər zaman diqqət mərkəzində saxlamalı, onların qayğısına qalmalıdırlar.

Ailə – uşağın ilk kollektividir, burada gələcək şəxsiyyətin əsası qoyulur. Uşaq təhsil müəssisəsinə daxil olduğu andan "pedaqoji üçbucaq" (müəllim-valideyn-şagird) formalaşır. Müəllimlər, şagirdlər və valideynlər arasında əlaqələr uşaqların tərbiyəsi və inkişafında əldə olunan nailiyyətlərdən asılıdır. Valideyn təlim-tərbiyə prosesinin fəal iştirakçısı olmalıdır.




Uşağın həyatı iki mühüm sahədən ibarətdir: məktəb və ailə, hansılar ki, dəyişikliyə məruz qalır və inkişaf edirlər. Buna görə də müəllim və valideynlər daim birgə fəaliyyət göstərməlidirlər. Valideynin müəllimlə əlaqəsinin olmaması uşağın təlim-tərbiyəsinə zərər verir. Müəllim valideynləri təhsilə cəlb etməlidir. Şagirdlər vaxtlarının xeyli hissəsini məktəbdə keçirirlər. Valideynlər uşaqlarının təlim-tərbiyəsi, kollektiv münasibətlərdə vəziyyətini, həmyaşıdları ilə əlaqələrini bilməlidirlər. O, məktəb həyatının iştirakçısı, uşağının həyatında əsas hadisələrin şahidi olmalıdır. Buna görə də müəllim daim valideynlə əlaqə saxlamalıdır. Valideynlərin və şagirdlərin birgə fəaliyyəti təhsilə marağı artırır, şagirdlərin motivasiyasını, ailədə münasibətlərini inkişaf etdirir. Valideynlər bilməlidir ki, uşaq kollektivinin fəaliyyəti nə qədər maraqlı və müxtəlif olarsa, onların uşaqlarının sosial inkişafı daha da inkişaf edər. Onlar təhsil prosesinin, sinif işinin təşkilində iştirak edərək, öz övladlarının və bütövlükdə şagird kollektivinin inkişafına kömək edirlər.

Dərslik komplektində həyat bilgisi fənni vasitəsilə ailədə birgə bacarıqların formalaşdırılması ilə bağlı mövzular yer almışdır. Şagirdlərə ailədəki vəzifələrinin öhdəsinə düşən işlərin nədən ibarət olduğu haqqında məlumat verilmiş, müəllim – valideyn – şagird əlaqələrinin uşaqların tərbiyəsi və inkişafındakı rolundan bəhs edilmişdir.

I-IV siniflər üzrə "Fərd və cəmiyyət" məzmun xəttində birgə fəaliyyət ilə bağlı standartlar verilmişdir.

**I sinif**

2.1. İnsanı sosial varlıq kimi dərk etdiyini nümayiş etdirir.

2.1.2. Birgə fəaliyyətin faydasını nümunələr əsasında izah edir.

**II sinif**

2.1. İnsanı sosial varlıq kimi dərk etdiyini nümayiş etdirir.

2.1.2. Özünün və yoldaşlarının kollektiv daxilindəki fəaliyyətinə münasibət bildirir.

**III sinif**

2.1. İnsanı sosial varlıq kimi dərk etdiyini nümayiş etdirir.

2.1.2. "Cəmiyyət" anlayışı haqqında təsəvvürlərini ifadə edir.

**IV sinif**

2.1. İnsanı sosial varlıq kimi dərk etdiyini nümayiş etdirir.

2.1.2. İnsanı sosial varlıq kimi səciyyələndirən cəhətlər barədə kiçik təqdimat hazırlayır.

Həyat bilgisi I-IV sinif dərsliyində də birgə fəaliyyət ilə bağlı mövzular yer almışdır. Bunlar aşağıdakılardır: I sinifdə "Kollektiv", II sinifdə "Kollektiv", III sinifdə "İnsan və cəmiyyət", IV sinifdə "Vətəndaşlıq", "Məsuliyyət hissi".

Birgə fəaliyyəti zamanı şagirdlərdə aşağıdakı bacarıqlar formalaşdırılır:

- birgə işləmək;
- əməkdaşlıq etmək;
- digərlərinin fikrinə hörmətlə yanaşmaq;
- hər kəsə öz fikrini söyləməyə imkan yaratmaq, təmkinli olmaq;
- fikrini sübut etməyi bacarmaq;
- sirr saxlamağı bacarmaq, heç kəsin sirrini başqasına danışmamaq;

• hər zaman gülərüz olmağa çalışmaq, ən çətin vəziyyətdə belə insanların üzünə gülümsəməyi bacarmaq;

• çətinlik yarananda yardım etmək, zəif şagirdlərə daha çox diqqət yetirməkdir.

**Problemin aktuallığı.** Ailədə valideynlərin şagirdlərlə birgə fəaliyyəti əhəmiyyətli olduğu üçün bu sahəyə həsr edilmiş bütün tədqiqat və elmi araşdırmalar xüsusi aktuallıq kəsb edir.

**Problemin elmi əhəmiyyəti.** Bu məqalədə ailədə birgə fəaliyyət zamanı formalaşan bacarıqlardan, müəllim-valideyn-şagird münasibətlərinin uşaqların tərbiyəsi və inkişafındakı rolundan bəhs edilmişdir.

**Praktik əhəmiyyəti.** Məqalə müəllimlər, gənc tədqiqatçılar, doktorant və dissertantlar, magistrantlar üçün faydalı olacaqdır. Məqalədən uşaqların tərbiyə və təlimi ilə məşğul olan hər kəs və valideynlər faydalana bilərlər.

**Ədəbiyyat:**


1. Cabbarlı, N. Həyat bilgisi -1. / N. Cabbarlı, G Soltanova. -Bakı: Şərq-Qərb, -2020.
2. Cabbarlı, N. Həyat bilgisi -2. / N. Cabbarlı H. Abbasova, S. Məmmədova. -Bakı: Şərq-Qərb, -2021.
3. Mehdiyeva, G. Həyat bilgisi - 3. / G. Mehdiyeva. -Bakı: Aspoliqraf, -2018.
4. Mehdiyeva, G. Həyat bilgisi - 4. / G. Mehdiyeva. -Bakı: Aspoliqraf, -2019.
5. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. -Bakı: Təhsil, -2008.
6. Ümumi təhsilin fənn standartları (I-XI siniflər). -Bakı: Mütərcim, -2012.
7. https://ustschool.edusite.ru/p46aa1/p12aa1.html
8. https://nsportal.ru/blog/detskii-sad/all/2016/10/10/otdyh-s-detmi
9. https://womo.ua/bonusyi-sovmestnoy-deyatelnosti-s-rebenkom-i-kak-ee-organizovat/
10. http://www.himayadar.org/ail---xlaq--n-dir-.html


**E-mail:** chh228@hotmail.com
**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **B.O. İbadova,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 28.11.2022.

## *COĞRAFİYANIN TƏDRİSİ METODİKASI*
## *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ГЕОГРАФИИ*
## *METHODS OF TEACHING GEOGRAPHY*

*UOT 372.891*

***Yeganə Ələşrəf qızı Məhərrəmova***
*Bakı şəhəri, Xətai rayonu 287 nömrəli "Zəkalar" liseyinin coğrafiya müəllimi*

# COĞRAFİYA FƏNNİNİN TƏDRİSİNDƏ İNNOVATİV TƏLİM METODLARININ TƏTBİQ EDİLMƏSİ YOLLARI

***Егяна Алешраф гызы Магеррамова***
*учитель географии лицея № 287 «Закелар» Хатаинского района города Баку*

# ПУТИ ВНЕДРЕНИЯ ИННОВАЦИОННЫХ ОБУЧАЮЩИХ МЕТОДОВ В ПРЕПОДАВАНИИ ГЕОГРАФИИ

***Yegana Aleshraf Maharramova***
*geography teacher of secondary school No. 287 "Zakelar" of Khatai district of Baku city*

# WAYS TO IMPLEMENT INNOVATIVE TEACHING METHODS IN TEACHING GEOGRAPHY

**Xülasə.** Məqalədə qeyd olunur ki, tədris prosesində müxtəlif innovativ metodlardan istifadə olunur. İnnovativ təlim metodları – mürəkkəb didaktik kateqoriyadır. Coğrafiyanın tədrisində tətbiq olunan hər hansı metod şagirdlərin idrakı fəaliyyətin müxtəlif növlərini aktivləşdirir. Metod qarşıya qoyulan məqsədə çatmaq üçün istifadə olunan üsulların məcmusudur. İnnovativ təlim metodları öz təbiətinə görə mürəkkəb və çoxcəhətli anlayışdır. Hər bir metod özündə müəllim və şagirdlərin fəaliyyət priyomlarını birləşdirir. Bu fəaliyyətin, əlaqənin yüksək pedaqoji dəyəri isə innovativ təlim metodlarının yeniləşdirilməsindən, təkmilləşdirilməsindən və səmərəli tətbiqindən çox asılıdır.

***Açar sözlər:*** *coğrafiya, təhsil, innovasiya, müəllim, şagird, təlim*

**Резюме.** В статье отмечается, что в учебном процессе используются различные инновационные методы. Инновационные обучающие методы представляют собой сложную дидактическую категорию. Любой метод, применяемый в обучении географии, активизирует познавательную деятельность учащихся. Инновационные методы обучения по самой своей природе представляют собой сложное и многогранное понятие. Каждый метод объединяет деятельность учителя и учащихся. Высокая педагогическая ценность этой деятельности и общения во многом зависит от обновления, совершенствования и эффективного применения инновационных методов обучения.

***Ключевые слова:*** *география, образование, инновации, учитель, ученик, обучение*

**Summary.** The article notes that various innovative methods are used in the educational process. Innovative teaching methods represent a complex didactic category. Any method used in teaching geography activates the cognitive activity of students. Innovative teaching methods, by their very nature, are complex and multifaceted. Each method combines the activities of the teacher and students. The high pedagogical value of this activity and communication largely depends on the renewal, improvement and effective application of innovative teaching methods.

***Key words:*** *geography, education, innovation, teacher, student, learning*

XXI əsrdə həyatımızın bütün sahələrində yaşanan sürətli inkişaf dünyanı qlobal bir məkan halına gətirmişdir. Bu baxımdan da insan və məkan əlaqələrini araşdıran bir elm sahəsi olan coğrafiyanın tədrisinin də əhəmiyyətini artırmışdır. Dünyanın kompleks əlaqələrini anlamaq, təbiət və insana aid müxtəlif problemləri həll edə bilmək, davamlı bir gələcək qura bilmək, ancaq coğrafi təhsil ilə anlaşılan, yadda qalan, istifadə edilə bilən bir bacarığa çevirmək mümkündür.

Coğrafiya insanlıq tarixi qədər qədim olan bir elmdir. Yerin müxtəlif ərazilərinin təbii şəraiti və təsərrüfatı haqqında insanların konkret biliklərə olan praktik tələbatı hələ uzaq keçmişdə coğrafiyanın meydana gəlməsinə səbəb olmuşdur. Hər bir xalq öz ölkəsi, həmçinin başqa ölkələr haqqında ən zəruri faktiki biliklərə yiyələnməyə can atırdı.

Ölkəmizdə təhsilin keyfiyyətinin yüksəldilməsi, onun inkişafı istiqamətində əhəmiyyətli dərəcədə işlər görülür. Qabaqcıl dünya ölkələrinin innovativ metodları öyrənilir, onun əsasında yeni proqramlar formalaşır. Tədrisin keyfiyyətini yüksəltmək, şagird yaradıcılığını artırmaq, onların sərbəst axtarışını, nəzəri biliklərini praktik olaraq tətbiq etmək bacarıqlarını formalaşdırmaq innovativ metodlardan səmərəli istifadə qaydaları yeni coğrafiya proqramında öz əksini tapmışdır.

Azərbaycanda coğrafiyanın tədrisi vəzifələrindən biri də şagird dünyagörüşündə dialoqa girmək, ünsiyyətdə olmaq və s. fəaliyyət növləri əsas götürülür. Bu prinsip şagirdlərin bir-biri ilə və geniş mənada ölkəmizin digər ölkələrlə qarşılıqlı münasibətləri yaratmağa istiqamətləndirir, müasir təhsil konsepsiyasını, inkişafetdirici və tərbiyələndirici təlim prinsiplərinin tələblərini yerinə yetirməyə imkan verir.

Tədris prosesində vətənpərvərlik tərbiyəsi önəmli yer tutur. Şagirdləri ölkənin gələcək məsuliyyətini daşıyan və ona görə də bu gün cəmiyyətdə aktiv mövqedə dayanmaq üçün mübariz bir şəxsiyyət kimi yetişdirmək kursun tədrisində aparıcı rola malikdir.

Yeni strategiyaların tətbiqi öyrətmə və öyrənmə arasında dairəvi sistem yaradır, şagirdlər informasiya əldə edirlər, müəllimin dəstəyi ilə əldə etdiklərini nümayiş etdirir, nəticəyə gəlir və yenidən informasiya ötürürlər.

Tədris prosesində müxtəlif metodlardan istifadə olunur. İnnovativ təlim metodları – mürəkkəb didaktik kateqoriyadır. Coğrafiyanın tədrisində tətbiq olunan hər hansı metod şagirdlərin idrakı fəaliyyətin müxtəlif növlərini aktivləşdirir. *Metod* – qarşıya qoyulan məqsədə çatmaq üçün istifadə olunan üsulların məcmusudur. İnnovativ metodların məqsədi müasir dövrdə dəyişmiş və öyrənməyi öyrətmək prinsipinə istiqamətlənmişdir.

Didaktik tədqiqatlarda təlim prosesinin qanunauyğunluqları təhsilin məzmununun şagirdlər tərəfindən səmərəli mənimsənilməsini, onların tərbiyə olunmasını və inkişafını təmin edən yollar və şərtlər də müəyyənləşdirilmişdir. Məktəbin qarşısında duran məqsəd və vəzifələr, təhsilin məzmunu təlim metodlarının köməyi ilə həyata keçirildiyindən, pedaqoji tədqiqatlarda təlim metodlarının yeniləşdirilməsi, təkmilləşdirilməsi, həyatın tələblərinə uyğunlaşdırılması – didaktikanın əsas problemlərindən biri kimi diqqət mərkəzində olmuş, psixoloji, pedaqoji aspektlərdə izah olunmuşdur. İnnovativ metodların səmərəli olması bu problemin düzgün həllindən çox asılıdır. Şagirdlərin səthi deyil, dərin biliyə yiyələnməsini təmin etmək, yaradıcılığını inkişaf etdirmək, onları müstəqil idraka alışdırmaq, onlara kollektiv sürətdə işləməyi öyrətmək üçün innovativ təlim metodlarının strukturunu, tipologiyasını və təsnifatını bilmək, müəllimlə şagirdinin birlikdə göstərdikləri fəaliyyətin yollarını müəyyənləşdirmək həmişə aktual olmuşdur.

İnnovativ təlim metodları öz təbiətinə görə mürəkkəb və çoxcəhətli anlayışdır. Hər bir metod özündə müəllim və şagirdlərin fəaliyyət priyomlarını birləşdirir. Bu fəaliyyətin, əlaqənin yüksək pedaqoji dəyəri isə innovativ təlim metodlarının yeniləşdirilməsindən, təkmilləşdirilməsindən və səmərəli tətbiqindən çox asılıdır. İnnovativ təlim metodlarının seçilməsi və tətbiqi ilə əlaqədar pedaqoqlar arasında çox müxtəlif, bəzən də bir-birinə əks mövqelər özünü göstərirdi. Metodların təsadüfən seçilməsi, bəzi metodlar: aludəçilik, ayrı-ayrı metodların universallaşdırılması, konkret dərs və auditoriya üçün optimal metodun müəyyən edilməməsi təlim nəzəriyyəsinin inkişafında və ümumiyyətlə, ali təhsilinin səmərəliliyinin yüksəldilməsində problemlər doğurur. Müəllim təlim prosesində ayrı-ayrı fərdlər üzərincə sistematik rəhbərlik etməli, lazımi köməklik göstərməlidir. Həqiqətən də metod fənnin özü ilə elmin metodologiyası ilə əlaqədardır. Təlimin məqsədi, müəllimin məq-

sədi, şagirdin məqsədi ardıcıllığında hər bir sonrakı məqsəd özündən əvvəlki məqsədin transformasiya edilməsi kimi meydana çıxır, bunların arasında əlaqə mövcuddur. Bununla belə, nə təlimin məqsədi ilə müəllimin məqsədi, nə də müəllimin məqsədi ilə şagirdinin məqsədi tam eyniyyət təşkil edə bilmir.

Göründüyü kimi, təlim metodları təsnifatında çoxfıkirlilik, müxtəlif yanaşmalar mövcuddur. Bu çoxluğun və müxtəlifliyin pedaqoji elmə heç bir ziyanı yoxdur. Təlim metodlarının elmi keyfiyyətinin səviyyəsi, heç də onun mücərrəd mülahizələrlə müəyyənləşdirilmiş təsviri və tərkibi ilə deyil, müəllimə aydın olması, əməli işində ona yardım etməsilə ölçülməlidir.

Təhsil sisteminin inkişaf tendensiyası, innovativ metodlar sahəsində novator müəllimlərin iş üsullarına dair toplanmış faydalı təcrübələr, pedaqoji-psixoloji tədqiqatların nəticələri daima sistemləşməli, ümumiləşməli və təlim-tərbiyə prosesinin məzmununun yeniləşdirilməsini tələb edir. Bu problemlərin həlli təhsil sferasına, pedaqoji prosesə fəal və interaktiv metodlar anlayışının elmi əsaslarla gətirilməsini vacib bir problem kimi qarşıya qoyur və bütövlükdə təhsildə texnoloji yanaşmaların tətbiqini aktuallaşdırır.

Təcrübə və müşahidələr sübut edir ki, coğrafiyanın tədrisində müasir innovativ təlim metodları üçün aşağıdakılar daha səciyyəvidir:

- müəllimin özünün fəallığı ilə şagirdinin yaradıcı fəallığa cəlb edilməsi;
- şagirdin aktiv fəaliyyəti və bu zaman onlara elementar bacarıqların aşılanması;
- müəllimin şagirdlərlə və şagirdlərin bir-biri ilə əməkdaşlığı;
- hərəkətli, süjetli, didaktik rollu oyunlardan istifadə, sosial bərabərliyin və psixoloji şəraitin yaradılması;
- müəllimin təqdim etdiyi tematik materialın şagirdin yaradıcı təfəkkürünə və milli düşüncə tərzinin formalaşmasına təsir etməsi.

İnnovativ təlim metodları şagirdlərə aşağıdakı keyfiyyətləri aşılamalıdır:

- müstəqil düşünmək, sərbəst fikir söyləmək;
- öz təcrübəsini və biliyini təhlil etmək qabiliyyəti;
- özünüqiymətləndirmək;
- əməkdaşlıq etməyi (başqaları ilə işləməyi bacarmaq, ümumi məqsədə çatmaq üçün işin bölüşdürülməsi);
- başqalarını dinləməyi, müxtəlif fikirlərə hörmət etməyi və dözümlü olmağı;
- öz fikirlərini arqumentlərlə izah və sübut etmək;
- kreativ təfəkkürün inkişafı;
- birgə həll yollarını müəyyənləşdirməyi və qərar çıxarmağı.

İnnovativ təlim metodları dərsə qədər hazırlıq prosesində müəllimin, dərsdə isə şagirdlərin fəallığını tələb edir. İnnovativ metodların köməkliyi ilə təlimin həm təhsilləndirici, həm inkişafetdirici, həm də tərbiyələndirici funksiyaları özünü daha qabarıq şəkildə büruzə verir və təlimin keyfiyyətinin yüksəldilməsinə səbəb olur.

Fəal təlim şagirdlərin fəal idrak fəaliyyətinə əsaslanan və təhsil prosesinin digər iştirakçıları ilə əməkdaşlıq şəraitində həyata keçirilən təlimi nəzərdə tutur.

Yeni yanaşmanın mahiyyəti ondadır ki, təlim şagirdin yaddaşının təkcə yeni elmi biliklərlə zənginləşdirilməsinə deyil, həm də təfəkkürün müntəzəm inkişaf etdirilməsi əsasında daha çox biliklərin müstəqil əldə edilməsi və mənimsənilməsi, ən mühüm bacarıq və vərdişlərinin, şəxsi keyfiyyət və qabiliyyətlərin qazanılmasına yönəlib. Bu zaman şagirdlər müəllimin rəhbərliyi altında, xüsusi seçilmiş, asan başa düşülən və yadda qalan, ən vacib təlim materialının öyrənilməsi prosesində fakt və hadisələrin səbəb-nəticə əlaqələrini, qanunauyğunluqlarını aşkar etməyi, nəticə çıxarmağı, mühüm və dərin ümumiləşdirmələr aparmağı öyrənirlər.

Dünyada gedən qloballaşma həyatın bir çox sahələrinə öz təsirini göstərir. Təhsildə aparılan islahat məhz həmin zərurətdən yaranmışdır. Təhsilin keyfiyyətini yüksəltmək, yeni pedaqoji texnologiyaları öyrənib onlardan səmərəli istifadə etmək başlıca vəzifə kimi qarşıda durur. Yeni pedaqoji təfəkkürün başlıca prinsipləri – demokratikləşmə, humanistləşdirmə, fərdiləşdirmə, diferensiallaşdırma, inteqrasiya, şəxsiyyətin formalaşdırılması və inkişaf etdirilməsini həyata keçirir. Metod olaraq interaktivlik təlim prosesində müəllim və şagird arasında işin gedişindən – mövzudan, şərhdən, dialoqdan, rollu oyundan həmin anda meydana çıxan yanaşma, izah, dialoq və s. asılıdır, yəni bu tərz əvvəldən

planlaşdırılmır, işin – təlim prosesinin gedişi bu məqamı ortaya çıxarır və daha çox şagirdin müstəqilliyi, müdaxiləsi ilə baş verir. Digər tərəfdən, interaktivlik şagirdlərin özləri arasında da ola bilər. Əsas cəhət odur ki, bu prosesdə əməkdaşlıq edən öyrənənlər və öyrədən eyni hüquqlu mövqedə dayanırlar. Təbii ki, müəllim öyrədən olaraq bələdçi, fasilitator, məsləhətçi funksiyasını yerinə yetirir: şagirdlərin işlərinə müdaxilə etmədən problemləri qoyur, istiqamət verir, nəzarət edir, axtarış istiqamətlərini hazırlamağa kömək edir, amma təlim tapşırıqları üzərində şagirdlər özləri birlikdə – öz aralarında tədqiqat aparır, diskussiya apararaq işləyirlər.

İnnovativ təlim metodunun tədris prosesinə daxil edilməsi şagirdlərin passivliyinin aradan qaldırılmasına, lazım olan təfəkkür xüsusiyyətlərinin və yaradıcılığın formalaşdırılması və təlim keyfiyyətinin yüksəldilməsinə şərait yaradır.

Son illər respublikamızda innovativ təlim metodlarının mənimsənilərək iş prosesinə tətbiqi sahəsində müəyyən nəticələr əldə olunmuşdur. Tədris prosesində müasir texnologiyaların tətbiqi dərslərin səmərəliliyini yüksəldən ən vacib şərtlərdəndir.

**Problemin aktuallığı.** Təhsil sisteminin inkişaf tendensiyası, inovativ metodlar sahəsində müəllif şagirdlərin, novator müəllimlərin iş üsullarına dair toplanmış faydalı təcrübələr, pedaqoji-psixoloji tədqiqatların nəticələri daima sistemləşməli, ümumiləşməli və təlim-tərbiyə prosesinin məzmununun yeniləşdirilməsini tələb edir. Bu problemlərin həlli təhsil sferasına, pedaqoji prosesə fəal və innovativ metodlar anlayışının elmi əsaslarla gətirilməsini vacib bir problem kimi qarşıya qoyur.

**Problemin yeniliyi.** XXI əsrin başlanğıcında Azərbaycan təhsil sisteminin yenidən qurulması, modernləşdirilməsi və bu işlərin təşkilində innovativ metodlardan istifadə olunmaqla yerinə yetirilməsi prioritet problem hesab edilir. Onların həll olunması üçün yeni pedaqoji araşdırmalara ehtiyac duyulur və bu araşdırmaların nəticəsi problemin yeniliyini xarakterizə edir.

**Problemin praktik əhəmiyyəti.** Problemin praktik əhəmiyyəti ondadır ki, interaktiv təlimlər şagirdlərin yaddaşının təkcə yeni elmi biliklərlə zənginləşdirilməsinə deyil, həm də təfəkkürün müntəzəm inkişaf etdirilməsi əsasında daha çox biliklərin müstəqil əldə edilməsi və mənimsənilməsi, ən mühüm bacarıq və vərdişlərinin, şəxsi keyfiyyət və qabiliyyətlərin qazanılmasına yönəlib. Bu zaman şagirdlər müəllimin nəzarəti ilə xüsusi seçilmiş, asan başa düşülən və yadda qalan, ən vacib təlim materialının öyrənilməsi prosesində fakt və hadisələrin səbəb-nəticə əlaqələrini, qanunauyğunluqlarını aşkar etməyi, nəticə çıxarmağı, mühüm və dərin ümumiləşdirmələr aparmağı öyrənirlər.

**Ədəbiyyat:**


1. Mehrabov A.. Təhsilin demokratikləşməsi: problemlər, vəzifələr // -Bakı: Təhsil, mədəniyyət və incəsənət, -2001. № 4.
2. Əlizadə, Ə.Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. / Ə.Ə. Əlizadə -Bakı: Pedaqogika, -2004.
3. Fəal təlim və məktəb rəhbərliyi / “Fəal təlim məktəbləri şəbəkəsinin yaradılması” mövzusunda keçirilmiş seminarın materialları. -Bakı: YUNİSEF, -2000.
4. Veysova, Z. Fəal – interaktiv təlim. / Z. Veysova -Bakı, -2007.
5. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. -Bakı: Hüquq ədəbiyyatı, -2009.
6. Ümumtəhsil səviyyəsində yeni dövlət proqramları (kurikulumları). -Bakı, -2013.


**E-mail:** teraneler@mail.ru

**Rəyçilər:** *ped.ü.fəls.dok.* **Ə.Ə. Gərayev,**
*ped.ü.fəls.dok., dos.* **M.S. Kazımov**
**Redaksiyaya daxil olub:** 25.11.2022.

*UOT 372.891*

***Fəxriyyə Arif qızı Məmmədova***
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ COĞRAFİYANIN TƏDRİSİ PROSESİNDƏ SƏBƏB-NƏTİCƏ ƏLAQƏLƏRİNİN VERİLMƏSİNİN FORMA VƏ NÖVLƏRİ

***Фахрия Ариф гызы Мамедова***
*диссертант по программе доктора философии*
*Азербайджанский Государственный Педагогический Университет*

# ФОРМЫ И ВИДЫ ПРЕДОСТАВЛЕНИЯ ПРИЧИННО-СЛЕДСТВЕННЫХ СВЯЗЕВ ПРОЦЕССЕ ОБУЧЕНИЯ ГЕОГРАФИИ В ОБЩЕОБРАЗОВАТЕЛЬНЫХ ШКОЛАХ

***Fakhriyya Arif Mammadova***
*doctorial student in the program of doctor of philosophy*
*Azerbaijan State Pedagogical University*

# FORMS AND TYPES OF GİVİNG CAUSE-EFFECT RELATİONSHİPS İN THE PROCESS OF TEACHİNG GEOGRAPHY İN COMPREHENSİVE SCHOOLS

**Xülasə.** Səbəb-nəticə əlaqələrinin öyrənilməsi şagirdlərdə məntiqi təfəkkürün inkişafına yol açan mühüm bir prosesdir. Proqram və dərsliklərdə bu əlaqələrin aşkar edilməsi onların öyrənilməsi metodikasının əsas şərtidir. Məqalədə səbəb-nəticə əlaqələrinin proqram və dərsliklərdə verilmə imkanları araşdırılmış, öyrənilmə metodikası təqdim olunmuşdur.
***Açar sözlər:*** *səbəb-nəticə, təbii ərazi kompleksi, proqram, dərslik*

**Резюме.** Изучение причинно-следственных связей-важный процесс, открывающий путь к развитию логического мышления у учащихся. Обнаружение этих связей в программах и учебниках является основным условием методики их изучения. В статье рассмотрены возможности приведения причинно-следственных связей в программах и учебниках, представлена методика их изучения.
***Ключевые слова:*** *причина-следствие, природно-территориальный комплекс, программа, учебник*

**Summary.** The study of cause-effect relationships is an important process that opens the way to the development of logical thinking in students. The discovery of these links in programs and textbooks is the main condition for the methodology of their study. The article examines the possibilities of cause-effect relationships in programs and textbooks, and presents methods of study.
***Key words:*** *cause and effect, natural terrain complex, program, textbook*

Məktəb coğrafiyasının öyrəndiyi nəzəri biliklər içərisində Yer kürəsinin, onun təbəqələrinin, təbii komplekslərinin daim inkişafda olması, təbii komponentlərin qarşılıqlı əlaqəsi və qarşılıqlı təsiri haqqında biliklər mühüm yer tutur. Bu biliklərin öyrənilməsi coğrafi məzmunun əsas komponenti olan səbəb-nəticə əlaqələrinin əhəmiyyəti böyükdür. Səbəb-nəticə əlaqələrinin öyrədilməsinin xüsusi metodikasının hazırlanması bu baxımdan vacibdir.

Səbəb-nəticə əlaqələrinin öyrənilməsi metodikasının işlənilməsi üçün, ilk növbədə, bu əlaqələrin növlərinin və təsnifatının aparılmasını coğrafiya elmində və metodik tədqiqatlardakı vəziyyəti müəyyən edilməlidir.

Tanınmış coğrafiya alimlərinin əsərlərində (V.S. Preobrajenski, A.E. Fedina, F.İ. Milkov və b.) coğrafi əlaqələrin iki növü göstərilmişdir: üfüqi və şaquli əlaqələr.

1. Şaquli əlaqələr dedikdə, bir TƏK-in (təbii ərazi kompleksinin) daxilindəki komponentləri arasındakı əlaqələr sistemi başa düşülür. Bu əlaqələrin öyrənilməsi bizə hər hansı bir ərazi daxilində təbii kompleksin formalaşmasına və diferensasiyasına hansı komponentin daha çox təsir etdiyini görməyə imkan verir. Bu əlaqələri nəzərə almaqla TƏK daxilində ayrı-ayrı komponentlərin müxtəlif şəkildə təsir etdiyini müəyyən etmək əsas və köməkçi əlaqələri ayırmaq olar.

2. Üfüqi əlaqələr isə eyni və ya müxtəlif taksonomik dərəcəli fiziki coğrafi komplekslər arasındakı əlaqələrdir. Bu əlaqələrin köməyi ilə təbii komplekslərin bir-birinə olan təsirlərini müəyyən etməyə imkan verir.

İstər şaquli, istərsə də üfüqi əlaqələrin öyrənilməsi bütövlükdə təbii, eləcə də antropogen amillərin təsiri ilə təbii komponentlərin və təbii komplekslərin dəyişməsini izləməyə imkan verir.

Təbiətdəki əlaqələrin digər bölgüsü enerji mənbələrinə görə aparılır ki, bura daxili və xarici əlaqələr aid edilir. Daxili əlaqələr endogen proseslərlə bağlı olub yerin daxili enerjisi hesabına baş verir. Xarici əlaqələr ekzogen prosesləri əks etdirir və başlıca olaraq Günəşin enerjisi hesabına baş verir (1, s. 105).

Məşhur coğrafiyaçı metodist V.A. Korinskaya şaquli əlaqələrin (komponentlərarası) düz (birbaşa) və əks olduğunu göstərirdi. Bir təbii komponentin ikinci komponentə təsiri düz (birbaşa) əlaqədir və (→) kimi göstərilir. İkinci komponent də, öz növbəsində, birinciyə təsir göstərirsə, bu, əks əlaqə adlanır (←). Birbaşa və əks əlaqələri sxemlərdə belə təsvir etmək olar (⇄) (2, s. 44).

Səbəbiyyət əlaqələri nə qədər təsnif edilsə də, müxtəlifliklər olsa da onlar təbiətdə obyektiv olaraq mövcuddur və onların şagirdlər tərəfindən öyrənilməsi coğrafiya fənninin tədrisində ana xətt kimi aparılmalıdır.

Səbəb-nəticə əlaqələri üzrə biliklərin müəyyən edilməsi və öyrənilməsi zamanı şagirdlərin yaş xüsusiyyətlərinin də nəzərə alınması vacibdir. Psixoloqların tədqiqatlarına əsaslanaraq şagirdlərin ümumi fiziki və əqli inkişaflarının xüsusiyyətləri tədqiqatın gedişində əsas götürülmüşdür. Psixoloqlar belə hesab edirlər ki, elmlərin əsaslarını öyrənərkən yeniyetmələrin təfəkkürləri, səbəbiyyət hadisələrinə maraqları artır. Onlarda təfəkkür daha da dərinləşməklə və ardıcıllıqla inkişaf edir, öz fikirlərini daha sistemli və aydın şəkildə izah etməyə meyl yaranır. Fikirlərində müstəqillik artır, yəni yeni hadisə və faktlara özləri müstəqil şəkildə münasibət bildirməyə çalışırlar. Bütün bunlar şagirdlərin intellektual tələbatlarının artmasına, onların dərketmə qabiliyyətlərinin inkişafına səbəb olur. Orta yaş dövrlərində yeniyetmələrdə hadisələr arasındakı əlaqələrə və qarşılıqlı münasibətlərə maraq inkişaf edir və təkmilləşir, bu əsasda da təbiət hadisələrinin nəzəri cəhətdən qavranılması baş verir.

Şagirdlərdə fərdi anlayışlar haqqında formalaşan, bilik və bacarıqlarına əsaslanan təfəkkürləri hadisə və proseslər arasındakı əlaqələri, onların səbəblərini açmaq və izah etmək maraqlarına yönəldilir. Yəni onlarda fərdi anlayışlar haqqında olan bilik və bacarıqları daha ümumi anlayışların və təsəvvürlərin formalaşmasına yönəlir. Şagirdlər idrak qabiliyyətlərinin inkişafı bu halda müəllimin ustalığından və digər pedaqoji şərtlərdən daha çox asılıdır.

Beləliklə, şagirdlərin yaş xüsusiyyətlərinin, əqli inkişaflarının spesifikasını nəzərə almaqla, həmçinin tədris materiallarının məzmununu əsas götürməklə səbəb-nəticə əlaqələrinin növlərini müəyyən edərək coğrafiya elminin daha dərindən öyrənilməsini təhlil etməyə çalışmışıq.

Elmi və metodiki ədəbiyyatda verilmiş fikirləri nəzərə alaraq coğrafiyanın tədrisi zamanı öyrənilən səbəb-nəticə əlaqələrinin xarakteristikasını verməyə çalışmışıq. Bu zaman onları yeni coğrafiya proqramının (kurikulumunun) tələblərinə müvafiq olaraq məzmun xətlərini nəzərə almaqla qruplaşdırmaq lazımdır [ 3, s. 66].

"Təbiət" məzmun xəttinə daxil olan biliklər fiziki coğrafiyanın məzmununu əhatə edir və coğrafiyanın aparıcı anlayış və təsəvvürlərini özündə birləşdirir. Yeni proqramın üstünlüklərindən biri də anlayış və təsəvvürlərin VI sinifdən XI sinfə qədər ardıcıl inkişafının nəzərə alınmasından ibarətdir. Ənənəvi proqramda ayrı-ayrı kursların öyrənilməsi ilə bu əlaqələr qırılırdı. Məhz səbəb-nəticə əlaqələrinin dərsliklərdə nə qədər aydın və ardıcıllıqla əks olunmasından asılı olaraq problemin həllinə nail olmaq olar.

*1. Ərazinin coğrafi mövqeyi ilə ərazinin təbii şəraiti arasındakı əlaqələr.* Yer kürəsində hər bir ərazinin özünəməxsus konkret mövqeyi vardır və bu onun təbiətinin xüsusiyyətlərini müəyyən

edir. Məntəqənin ekvatora görə mövqeyə onun təbii şəraitini, ilk növbədə, iqlimi xüsusiyyətlərini müəyyən edir, yəni günəş radiasiyasının miqdarını, iqlim qurşağını, hava kütlələrinin temperaturunu, yağıntılarını və s., iqlim də, öz növbəsində, daxili suların qidalanmasına və rejiminə, torpaq-bitki örtüyünün, heyvanlar aləminin xarakterinə həlledici təsir göstərir. Bu əlaqələrin öyrənilməsi və mənimsənilməsi təbii şəraitin şimaldan cənuba doğru dəyişməsi qanunauyğunluğunun səbəblərini izah etməyə imkan verir.

Ərazinin dəniz və okeanlara görə mövqeyi, şərqdən qərbə doğru geniş məsafədə uzanması da təbii şəraitə öz təsirini göstərir. Bu xüsusiyyətlər iqlim qurşağı daxilində müəyyən fərqlərin – iqlim tiplərinin yaranmasını şərtləndirir. Bu fikirlərin izahı təbii şəraitin qərbdən şərqə doğru dəyişməsinin səbəblərini aydınlaşdırmağa şərait yaradır. Başqa sözlə, okeandan uzaqlaşdıqca istiliyin və rütubətin paylanmasında fərqlərin iqlim tiplərinin formalaşmasına səbəb olur.

*2. Relyeflə bağlı əlaqələr.* Daxili və xarici proseslərin relyefin formalaşmasına və inkişafına təsiri. Geoloji quruluşun faydalı qazıntıların yaranmasına və coğrafi yayılmasına təsiri.

a) Daxili əlaqələr. Bu əlaqələrə ərazinin geoloji quruluşunun müasir relyefin formalaşmasına təsiri aiddir. Yer kürəsinin müasir relyefi daxili və xarici proseslərin qarşılıqlı təsirinin nəticəsində formalaşmışdır. Məhz bu prosesləri nəzərə almaqla relyefin müasir vəziyyətini qiymətləndirmək olar. Daxili proseslərə əsas eralarda baş verən dağəmələgətirən hərəkətlər, vulkanizm, zəlzələlər, qurunun tədricən hərəkəti və s. aiddir.

Faydalı qazıntıların paylanmasındakı qanunauyğunluqları yalnız dağ süxurlarının mənşəyi və ərazinin geoloji inkişaf tarixi ilə əlaqəli şəkildə başa düşmək olar. Filiz mənşəli faydalı qazıntılar daha çox kristallik, maqmatik və metamorfik süxurlarla əlaqəlidir. Onlar yüksək temperatur və təzyiq şəraitində formalaşmışlar. Qeyri-filiz faydalı qazıntılar isə (neft, qaz, kömür və s.) başlıca olaraq çökmə mənşəli süxurlardan yaranmışdır.

b) Xarici əlaqələr. IV Dövr buzlaşması ilə müasir relyef arasındakı əlaqələr. Buzlaşmalar iqlim şəraitinin dəyişməsi nəticəsində baş vermişdir. IV Dövrdə bilavasitə buzlaq altında qalan ərazilərin müasir relyefində buzlaşmanın izləri özünü göstərir. Buzlağın əhatə etdiyi rayonlarda buzlaq denudasiyası, dağılmış materialların çöküntüləri, çökəkliklərin, yastı təpəliklərin olması xarakterikdir.

c) Müasir iqlim şəraiti ilə relyef formaları arasındakı əlaqələr. Müxtəlif iqlim qurşaqlarında aşına prosesləri də fərqli olur. belə ki, daha sərt iqlimə malik qütb qurşaqlarında daimi donuşluq saxlanılır və spesifik relyef formaları yaranır. Əksinə, mülayim qurşaqda yarğan, qobu şəbəkəsi yayılıb. Səhra və yarımsəhralarda barxan və dyunlara rast gəlinir.

*3. İqlimlə bağlı əlaqələr.*

a) İqlim şəraitinin ərazinin coğrafi mövqeyindən asılılığı. İqlim əmələgətirən ən mühüm amillərdən biri ərazinin coğrafi enliyi olduğu üçün bu əlaqəyə daha çox diqqət verilir. Coğrafi enlikdən asılı olaraq günəş şüalarının düşmə bucağı və günəş radiasiyasının miqdarı da dəyişir ki, bu da ərazinin iqliminin istilik şəraitini təmin edir.

b) Ərazinin qərbdən şərqə doğru geniş məsafədə, meredianal istiqamətdə uzanması. Qərbdən şərqə doğru geniş məsafədə uzanan materiklərdə, yaxud onların geniş düzənliklərində iqlim şərqə doğru kontinentallaşır. Daxili rayonlara getdikcə hava kütlələri transformasiyaya uğrayır, yağıntıların miqdarı azalır, illik temperatur amplitudu artır.

c) Atmosferin ümumi dövranının iqlimə təsiri. Hava kütlələrinin təsiri ilə formalaşan iqlimin xüsusiyyətlərini, həmçinin atmosfer cəbhələrinin təsirini nəzərə alınması tələb olunur. Məhz bu təsirlərin nəticəsidir ki, Avrasiya materikinin Atlantik okeanı sahillərində dəniz iqlimi tipi formalaşır. Daxili hissələrə doğru hava kütlələrinin təsiri dəyişir, mülayim-kontinental və kontinental iqlim tipləri yaranır. Sakit okean sahillərində mussonların təsiri ilə musson iqlimi hakimdir.

d) Relyefin iqlimə təsiri. Quruda istilik və rütubətin paylanmasında relyef böyük rol oynayır. Düzənliklərdə iqlim şəraiti enlik istiqamətində, dağlarda isə şaquli istiqamətdə dəyişir. Məsələn, Şərqi Avropa düzənliyində hava kütləlləri Atlantika üzərindən gələn havanın şərqə doğru hərəkətinə, Arktik havanın isə cənuba sərbəst hərəkət etməsinə şərait yaradır. Yaxud, sıra dağlar okeandan gələn hava kütlələrinin qarşısını kəsərək onların sıra dağların əks tərəfə keçməsinə imkan vermir. Odur ki, sıra dağların hava kütlələrinin gəldiyi yamacları bol, əks yamacları ilə kifayət qədər az yağıntı alır.

*4. Daxili suların iqlim, relyef və dağ süxurları ilə əlaqəsi*

a) Daxili suların relyef və dağ süxurlarından asılılığı. Relyef təbiətin ən mühüm komponentlərindən biridir və daxili sulara da təsiri böyükdür. O, çayların hövzələri üzrə axını tənzimləyir, çayların axınının istiqamətini, düşməsini, meylini, axım surətini, eroziya fəaliyyətini müəyyən edir. Dağ süxurlarının petroqrafik tərkibindən sülb axımının miqdarı xeyli dərəcədə asılıdır. Relyef və dağ süxurları, həmçinin göllərin coğrafi paylanmasına və göl çökəkliklərinin xarakterinə, yeraltı suların dərinliyinə və hərəkət istiqamətlərinə, bataqlıqların yaranmasına, müasir buzlaqların yayılmasına və s. təsir edir.

Öz növbəsində, çaylar da relyefə təsir göstərir. Çaylar öz dağıdıcı və yaradıcı fəaliyyətləri ilə relyefi dəyişdirirlər. Terraslı çay dərələri yaradır, dağlardan və yüksəkliklərdən külli miqdarda material daşıyırlar. Bu da materialların dağılmasına, daşınmasına və çökdürülməsinə, düzənliklərdə delta və s. formaların yaranmasına səbəb olur.

b) Daxili suların iqlimdən asılılığı. İqlim də relyef kimi təbiətin əsas komponentlərindən biridir. İqlim çay şəbəkəsinin sıxlığını, çayların qidalanması və rejimini, yeraltı suların yerləşməsinin dərinliyini, bataqlıqların yerləşməsini və s. müəyyən edir. Məsələn, musson iqlimində yerləşən Amur çayı yay yağışları hesabına bol sulu olur və daşqınlar xarakterikdir. Soyuq dövrdə isə çayın suyu azalır və buz bağlayır.

c) Çaylarla relyef arasındakı əlaqə. Relyef çayların təsiri ilə dəyişir. Belə ki, çay sularının yaradıcı və dağıdıcı fəaliyyəti nəticəsində çay sahilləri dəyişir, terraslar yaranır, çayların daşıdığı materiallar toplanaraq delta və adalar əmələ gətirir.

*5. Torpaq və bitki örtüyünün relyeflə, dağ süxurları, iqlim və daxili sularla qarşılıqlı əlaqəsi.*

a) Torpaq və bitki örtüyü ilə relyef və dağ süxurları arasındakı asılılıq. Dağlıq və düzənlik ərazilərin torpaq və bitki örtüyünün müxtəlifliyi bu asılılığın izahını verir. Belə ki, düzənliklərdə iqlim şəraiti enlik istiqamətində dəyişir, təbii zonalar da enlik istiqamətində uzanır. Məsələn, Şərqi Avropa düzənliyində enlik zonallığını müşahidə edə bilərik. Dağlarda relyef iqlim şəraitinin şaquli istiqamətdə dəyişməsinə səbəb olur ki, müvafiq olaraq torpaq, bitki örtüyü və heyvanat aləmi də şaquli istiqamətdə dəyişir. Məsələn, Kür-Araz ovalığındakı enlik zonallığı dağlarda şaquli qurşaqlıqla əvəz olunur.

b) Torpaq və bitki örtüyünün iqlim şəraitindən asılılığı. Ərazinin istilik və rütubət göstəricilərinin nisbəti torpaqəmələgəlməsi prosesinə də təsir edir. İstilik və rütubətin nisbətinin fərqli olduğu müxtəlif təbii zonalarda torpaqəmələgəlmə prosesləri də bir-birinə bənzəmir. Məsələn, aşağı temperatur şəraitində rütubət artıqlığının yarandığı tundra təbii zonasında torpaqəmələgəlmə prosesi də zəif gedir, torpağın qalınlığı, çürüntünün (humusun) miqdarı da az olur. Aşağı temperatur çürüntü əmələ gəlməsi prosesini ləngidir, torpaqda çoxlu üzvi maddələr toplanır, tora qley qatları yaranır.

*6. Heyvanlar aləminin iqlim şəraiti və bitki örtüyü ilə əlaqəsi.*

Heyvanlar aləmi xüsusilə daha çox iqlim şəraiti və bitki örtüyü ilə əlaqədardır. Məsələn, qütb ərazilərində yaşayan heyvanların dərisinin əsasən ağ, qalın piy qatının olması onları sərt iqlim şəraitindən qoruyur. Səhra iqlimində yaşayan heyvanlar isə sürətli qaçışları ilə öz düşmənlərindən qorunurlar. Yeraltı yuvalarda yaşayan heyvanlar isə yer üstündə gizlənmək üçün şəraitin olmaması üzündən belə bir həyat tərzi seçirlər. Həmçinin onlar əsasən gecələr ov edirlər ki, bu da yırtıcı heyvanlardan asılılıqla əlaqəlidir.

*7. Təbii ərazi kompleks (TƏK) daxilindəki təbii komponentlər arasındakı əlaqələr (şaquli əlaqələr).*

Yer səthi öz bütövlüyü ilə seçilən müxtəlif təbii komplekslərdən ibarətdir. Hər bir təbii kompleks daxilində komponentlərin özünəməxsus qarşılıqlı əlaqələri və qarşılıqlı təsirləri vardır.

*8. TƏK-lərarası əlaqələr (üfüqi əlaqələr).*

Aydındır ki, bir-biri ilə yaxın ərazilərdə yerləşən təbii komplekslər arasında da qarşılıqlı əlaqə və qarşılıqlı təsir vardır. Bir təbii kompleksin qonşu komplekslərə təsiri mümkündür. Məsələn, Mərkəzi Asiyada xüsusi ilə yayda kəskin kontinental iqlim hakimdir. Bu dövrdə burada hakim olan tropik hava kütlələri qonşu ərazilərə də daxil olur və quraqlıq yaradır.

*9. Təbiət və cəmiyyətin qarşılıqlı əlaqələri.*

Yer kürəsində təbii şəraitin müxtəlifliyi əhalinin, sənaye və kənd təsərrüfatının da ərazilər üzrə qeyri-bərabər paylanmasına səbəb olmuşdur. Deməli, təsərrüfat fəaliyyəti də müəyyən də-

rəcədə təbii şəraitdən və təbii ehtiyatlardan asılıdır. Eyni zamanda, insanların təsərrüfat fəaliyyəti daxili suların, bitki, torpaq örtüyünün, heyvanlar aləminin dəyişməsinə səbəb olur. Bu komponentlərin dəyişməsi digər komponentlərin də dəyişməsinə səbəb olur, nəticədə, bütün təbii kompleks dəyişir. Məsələn, meşələrin qırılması və yerinə mədəni bitki əkinlərinin artması heyvanlar aləminin məhv olmasına, eroziya və yarğan şəbəkəsinin inkişafına səbəb olur. Odur ki, bu dəyişiklikləri əvvəlcədən görərək qarşılıqlı tədbirlərin planlaşdırılması çox vacibdir (1, s. 87).

"Cəmiyyət" məzmun xəttinə daxil olan bilik və bacarıqlar iqtisadi və sosial coğrafiyanın məzmununa daxildir. İqtisadi və sosial coğrafiya üzrə səbəb-nəticə əlaqələrini və yeni proqramda VI sinifdən XI sinfə qədər sadədən mürəkkəbə doğru dərinləşdirilməsi nəzərdə tutulub və onlar "Təbiət" məzmun xətti üzrə olan əlaqələrlə paralel şəkildə aparılır. Bu əlaqələri nəzərdən keçirək:

*1. Ərazinin iqtisadi mövqeyinin tarixən dəyişməsi* nəzərdən keçirilir. Əlverişli iqtisadi coğrafi mövqe tədricən öz rolunu itirsə, əksinə, müəyyən dövrdən sonra əlverişsiz coğrafi mövqeyə malik olan ərazi çox əlverişli bir mövqeyə malik ola bilər. Coğrafiya dərslərində buna misal kimi Böyük Britaniyanı misal göstərmək olar. Əlverişli dəniz və hava yolları üzərindəki əlverişli mövqe daha müasir nəqliyyat vasitələrinin inkişaf etməsi ilə öz üstün rolunu itirmiş oldu. Yaxud Süveyş və Panama kanallarının çəkilməsi ilə Misir və Panamanın iqtisadiyyatının inkişafına təkan verilmiş oldu. Azərbaycan Respublikasının timsalında isə Böyük İpək yolunun bərpasını misal göstərməklə respublikamızın geosiyasi mövqeyinin nə dərəcədə dəyişməsini qeyd edə bilərik.

*2. Təbii şərait və təbii ehtiyatların ölkələrin iqtisadi inkişafı* arasındakı əlaqənin öyrənilməsi. Aydındır ki, iqtisadi rayonun, regionun, yaxud ölkələrin iqtisadi coğrafi xarakteristikası zamanı təbii şərait və təbii ehtiyatların iqtisadi cəhətdən qiymətləndirilməsi aparılır. Şagirdlərdə bu bacarıqların formalaşdırılması məhz bu əlaqələrin araşdırılması nəticəsində mümkün olur. Təbii şəraitə əsasən ərazinin kənd təsərrüfatı cəhətdən ixtisaslaşması və ərazi təşkilini, təbii ehtiyatların mövcudluğu isə istehsalın yerləşmə prinsiplərini müəyyən etməyə kömək edir.

*3. Əhalinin təbii artımı və yerləşməsinin ölkənin iqtisadi inkişafına* təsiri arasındakı əlaqə. İstehsal sahələrinin inkişafı və yerləşməsinə əmək ehtiyatlarının və onların ərazi üzrə paylanmasının təsirini araşdırmaqla şagirdlər müəyyən asılılıqları müəyyən edə bilərlər. İEÖ ilə İEOÖ üzrə əmək ehtiyatlarının miqdarının, təbii artımının arasındakı fərqlər öz təsirini iqtisadiyyata, əhalinin miqrasiyasına, sosial fərqlərin və problemlərin yaranmasına təsirsiz ötüşmür.

*4. Xammal və enerji ehtiyatları ilə təsərrüfat sahələrinin* yerləşməsi arasındakı əlaqə. Təsərrüfatın inkişafı ölkələrin xammal və enerji resursları ilə təminatından çox asılıdır. Lakin son illər bu amil də müəyyən dəyişikliyə uğramış, iqtisadiyyatda bu amilin rolu əsaslı surətdə dəyişmişdir. Bir sıra ölkələr xammal və enerji ehtiyatları ilə pis təmin olmasalar da iqtisadi inkişaflarına nail olmuş, əksinə, zəngin təbii resurslarla enerji ehtiyatlarının olduğu ölkələrdə inkişafdan hələ də geri qalırlar.

*5. Təbiətin mühafizəsi, təbii sərvətlərdən səmərəli istifadə* edilməsi ilə istehsal sahələrinin yerləşdirilməsi arasındakı əlaqə. Antropogen təsirin güclənməsi ətraf mühitə öz mənfi təsirini göstərir. Odur ki, istehsal sahələrinin yerləşdirilməsində təbiətin mühafizəsi amillərinin nəzərə alınması vacibdir. İstehsalın inkişafının təbiətin qorunması və təbiətə mənfi təsirlərinin aradan qaldırılması kimi məsələlərin əlaqələndirilməsi tədris prosesində şagirdlərin daha çox diqqətinə çatdırılmalıdır.

*6. Ölkənin iqtisadi inkişafı ilə regionların qeyri-bərabər* inkişafı və onlar arasındakı fərqlərin aradan qaldırılması arasındakı əlaqələr. Regionların stabil inkişafı ölkə iqtisadiyyatının əsasında durmalıdır. Dünya ölkələri və regionları arasındakı qeyri-bərabərliyi yaradan səbəblərin araşdırılması, onların aradan qaldırılması yollarının müzakirəsi qeyd olunan əlaqələrin öyrənilməsinə xidmət edir.

Səbəb-nəticə əlaqələrinin tədris prosesində açılmasının bir sıra metodik şərtlərini öyrənərkən dərsliklərdə bu əlaqələrin hansı formada verilməsini də nəzərdən keçirmək lazımdır. Dərsliklərin mətnində verilən nəzəri biliklərlə yanaşı şagird fəaliyyətini tələb edən müstəqil və sərbəst işlərdə, sual və tapşırıqlarda səbəb və nəticəni əks etdirən sxemlərə, xəritə-sxemlərə, test tapşırıqlarına, suallara rast gəlinir. Ümu-

miyyətlə, səbəb-nəticə əlaqələrinə aid biliklərin öyrədilməsi prosesində bir çox formalardan istifadə öyrədilməsi prosesində bir çox formalardan istifadə oluna bilər.

Aydındır ki, səbəbiyyətlə bağlı müəyyən nəzəri biliklər dərsliyin mətnində verilməlidir. Tədricən bu biliklər müxtəlif tədris situasiyalarında istifadə edilməklə nəticələr çıxarmağa, yeni biliklər əldə etməyə yönəldilməlidir. Odur ki, istər dərslikdə, istərsə də əlavə vəsaitlərdə təklif olunan bir sıra formalarla müəllimlər tanış olmalıdırlar ki, sonradan onlardan tədris prosesində şagirdlərin fəaliyyətlərini təşkil etmək üçün səmərəli istifadə edə bilsinlər.

**Problemin aktuallığı.** Coğrafiya fənninin məzmununda səbəb-nəticə əlaqələri mühüm əhəmiyyətə malikdir. Fənnə aid biliklərin daha mükəmməl mənimsənilməsi üçün hadisə və proseslər arasında məntiqi əlaqənin qurulması çox vacibdir. Bu məntiqi əlaqə də səbəb-nəticə əlaqələrinin öyrənilməsi ilə qurula bilər. Məhz bu baxımdan səbəb-nəticə əlaqələri coğrafiyanın tədrisi prosesində xüsusilə diqqətə alınmalı, xüsusi metodika ilə tədris olunmalıdır.

**Problemin elmi yeniliyi.** Məqalədə səbəb-nəticə haqqında biliklərin tədris prosesinə daxil edilməsinin metodikası işlənmiş, pedaqoji metodoloji cəhətdən əsaslandırılması, şagirdlərin səbəb- nəticə əlaqələri ilə tanışlığının yolları və formaları öz əksini tapmışdır.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqat ümumtəhsil məktəblərində coğrafiya fənnini tədris edən müəllimlər, pedaqoji təhsil alan tələbələr üçün faydalıdır.

**Ədəbiyyat:**


1. Развитие познавательной самостоятельной деятельности учащихся при изучении физической географии / под.ред. И. Бариновой, Т.П. Герасимовой. -Москва, -1983.
2. Коринская, В.А. Самостоятельная работа учащихся по географии материков. / В.А. Коринская. -Москва: Просвещение, -1983.
3. Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün coğrafiya fənni üzrə təhsil proqramı (kurikulumu) (VI-XI siniflər). -Bakı, -2013.


**E-mail: f**_mammedova@yahoo.com

**Rəyçi:** *ped.ü.fəls.dok., dos*. **D.M. Əskərov**
**Redaksiyaya daxil olub:** 22.11.2022.

## *TƏSVİRİ İNCƏSƏNƏTİN TƏDRİSİ METODİKASI*
## *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИЗОБРАЗИТЕЛЬНОГО ИСКУССТВА*
## *METHODS OF TEACHING FINE ARTS*

*UOT 372.87.0*

***Emilya Məmməd qızı Həsənova***
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*Gəncə Dövlət Universiteti*

# DƏRS-SÖHBƏTLƏR QEYRİ-STANDART DƏRSLƏRİN BİR NÖVÜ KİMİ

***Эмилья Мамед гызы Гасанова***
*диссертант по программе доктора философии*
*Гянджинский Государственный Университет*

# УРОК-БЕСЕДА КАК НЕСТАНДАРТНЫЙ ВИД УРОКА

***Emilya Mammad Hasanova**,*
*doctorial student in the program of doctor of philosophy*
*Ganja State University*

# LESSONS-CONVERSATION – A TYPE OF NON-STANDARD LEARNING

**Xülasə.** Təhsil müəssisələrində, o cümlədən ümumtəhsil məktəblərində təlimin keyfiyyətinə nail olmaq üçün bir sıra vasitələrdən və iş formalarından faydalanırlar. Həmin vasitələr arasında qeyri-standart dərslər özünəməxsus rola malikdir. Qeyri-standart dərslərin növləri sırasında isə dərs-söhbətlər özünəməxsus yer tutur.

***Açar sözlər:*** *şagirdlər, təsviri incəsənət, dərs-söhbətlər, təsviri incəsənət dərsləri, dərs-söhbətlərin təşkili*

**Резюме**. В образовательных учреждениях, а также в общеобразовательных школах, используется ряд средств и форм работы для достижения качества образования. Среди этих средств важную роль играют нестандартные уроки. Среди этих видов нестандартных уроков особое место занимают уроки-беседы.

***Ключевые слова:*** *ученики, изобразительное искусство, уроки-беседы, уроки изобразительного искусства, организация уроков-бесед*

**Summary.** In educational institutions, including secondary schools, use the means and forms of work to achieve the quality of education. Among these means, non-standard lessons play a unique role. Among the types of non-standard activities, a special place is occupied by lessons-conversations.

***Key words:*** *students, fine arts, lectures, fine arts lessons, organization of lectures*

Təlim prosesinin şəxsiyyətyönlü, tələbyönlü və nəticəyönlü əsasında qurulması zamanın tələbidir. Məktəblilərə pedaqoji prosesin bərabərhüquqlu üzvləri kimi yanaşılması onların idrak fəallığına, təşəbbüskarlığına və nəhayət, müstəqilliklərinə xüsusi yer ayrılması təlimin səmərəliliyini yüksəldir.

Təhsil müəssisələrində, o cümlədən ümumtəhsil məktəblərində təlimin keyfiyyətinə nail olmaq üçün bir sıra vasitələrdən və iş formalarından faydalanırlar. Həmin vasitələr arasında qeyri-standart dərslər özünəməxsus rola malikdir. Qeyri-standart dərslərin növləri sırasında isə dərs-söhbətlər mühüm yer tutur.

Bir çox fənlərin tədrisində dərs-söhbətlərdən istifadə oluna bilər. Eyni zamanda, təsviri incəsənət dərslərində incəsənətə dair dərs-söhbətlərin təşkili səmərəli nəticələnir.

Təsviri incəsənət fənni üzrə mövzuların təhsilləndirici, inkişafetdirici və tərbiyələndirici

imkanlarından təlim və təlimdənkənar məşğələlərdə faydalanan şagirdlərdə bədii zövq və yaradıcı təxəyyül inkişafı təmin edilir. Məktəblilər incəsənət əsərlərinin mahiyyətini, faydalılığını yaxşı başa düşərək onları qiymətləndirə, simvolik düşüncəyə yiyələnə bilirlər.

Həmin işdə, söz yox ki, fənn üzrə dərsliklər böyük rola malikdir. Dərsin səmərəliliyi, maraqlı və cəlbedici olması isə, bir çox vasitələrdən asılıdır. Onların arasında incəsənətə dair söhbətlərin əhəmiyyəti böyükdür. Bütün bunları yaxşı başa düşən qabaqcıl müəllimlər bir sıra hallarda dərs – söhbətlərdən faydalanırlar.

Təsviri incəsənət fənninin məqsədi şagirdlərin estetik dünyagörüşünün və hissiyyat aləminin inkişaf etdirilməsi qayğısına qalmaq, bədii təsvir vasitələrindən bəhrələnməklə hadisələri canlandırmaqdır. Fənn yaradıcı təxəyyülə, incəsənət əsərlərini duyaraq qiymətləndirmək, obrazlı və simvolik düşünmə qabiliyyətinə malik şəxsiyyətin formalaşdırılmasına yönəlmişdir.

Mövcud ədəbiyyatla tanışlıq göstərir ki, dərs-söhbətlər, o cümlədən təsviri incəsənət fənni üzrə dərs-söhbətlər ya xüsusi tədqiqatların mövzusu olmamış, ya da bu problemə az toxunulmuşdur.

Diqqət yetirək. R.V. Həsənova öz tədqiqatlarında təsviri incəsənət dərslərində səmərəli formalardan və qeyri-standart texnikalardan istifadə məsələlərini işıqlandırmış [1], O.B. Leontyeva dərs-söhbətlərə bu və ya digər dərəcədə münasibət bildirmiş [2], A.V. Filatova [3] isə, dərs-söhbətlərə təsviri incəsənət məşğələlərində təlim fəaliyyətinin növü kimi yanaşmışdır. E.S. Rapatseviçin tərtib etdiyi "Psixoloji-pedaqoji lüğət"də [4] başqa məsələlərlə bərabər dərs söhbətlərə də yer ayrılmışdır. Y.V. Solonina [5] və İ.M. Karpeykinanın [6] tədqiqatları isə, qeyri-standart dərslərə aiddir.

Nəzərdən keçirdiyimiz problemi bəzi səbəblər aktuallaşdırır:

1. Dövlət sənədlərində səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılması və təlimin məzmununun təkmilləşdirilməsi mühüm tələb kimi qeyd olunur. Bu da öz növbəsində təsviri incəsənət fənninin məzmununun optimallaşdırılmasını və tədrisdə səmərəli metodlardan və vasitələrdən faydalanmağı tələbata çevirir.

2. Müəllimlər arasında elələri vardır ki, təsviri incəsənət fənninin tədrisi prosesində dərs-söhbətlərin imkanlarını lazımınca qiymətləndirmirlər.

3. Təsviri incəsənət fənninin tədrisi zamanı dərs-söhbətlərin səmərəli təşkilinə istiqamətlənmiş zəruri ədəbiyyat hazırlanıb nəşr edilməmişdir.

4. Bundan başqa problemin ayrı-ayrı məsələlərini, o cümlədən nəzəri və praktik əsaslarını özündə cəmləşdirən tədqiqatlar aparılmamışdır.

Dərs-söhbətlərin üstünlükləri çoxdur. Məşğələlərdə söhbət (dərs-söhbət) şagirdlərin yaradıcı təxəyyülünü fəallaşdırır, onların nitqini və yaddaşını inkişaf etdirir, təhsilalanlara öz fikirlərini məntiqli və düzgün ifadə etməkdə öz köməyini göstərir. Müəllimin izahat işlərindən sonra şagirdlərin rəsm işinə başlaması məsləhətdir. Məktəblilər şəkilçəkmədə, hadisə və əşyaları canlandırmaqda daha az səhv buraxırlar. Onlarda fantaziya güclənir. Dərs-söhbətlər tərbiyəedici rola malikdir. Azərbaycan və xarici ölkə rəssamlarının əsərləri ilə tanışlıq sayəsində incəsənətə maraq çoxalır, doğma təbiətə məhəbbət, gözəlliyə meyl hissləri inkişaf edir. Təsviri incəsənətin tədrisi zamanı incəsənətə dair dərs-söhbətlərin səmərəli təşkili və məqsədyönlü, sistemli və fasiləsiz həyata keçirilməsi səmərəliliyin mühüm şərtidir.

Mövcud ədəbiyyatda qeyri-standart dərslərin aşağıdakı növlərinin adları çəkilir: yaşlararası dərs, dərs-benefis, dərs-paradoks, fənlərarası dərs, dərs-səyahət, dərs: – Nə? Harada? Nə zaman? dərs-ədəbi mehmanxana, dərs-musiqi salonu, rəsm qalereyasında, muzeydə, teatrda dərs istehsalatda, çöldə, meşədə dərs, reqlamentləşdirilməmiş dərs, dərs-soruş-cavab verək, dərs-döyüş (fənn), dərs-praktikum, dərs-biliklərə baxış, təlim fəaliyyətinin səmərəli təşkili üzrə şagirdlərin təcrübə mübadiləsi dərsi, dərs-ünsiyyət.

Başqa növlər də vardır: nağıl süjetinin ifası; dəyirmi masa, yaxud konfrans; dərs-tamaşa; açıq fikirlər dərsi; dərs-turnir; fərəh hissi keçirmə dərsi; dərs-brifinq; əqli hücum; dərs-viktorina; dərs-evrika; mühazirə-təxribat; riyazi xokkey, aktual müsahibə; təqlidi-rollu modelləşdirmə; şagirdlərin təfəkkürünün modelləşdirilməsi; mühazirə-dialoq.

***Dərs-söhbətin strukturu***. Mərhələlər: təşkilati mərhələ, məqsədin və vəzifələrin irəli sürülməsi, standart və qeyri-standart vəziyyətlərdə biliklərin və fəaliyyət üsullarının müəyyənləşdirilməsi, ümumiləşdirmə və dərsin yekunlaşdırılması, ev tapşırığının aydınlaşdırılması.

*Məqsəd* – biliklərin dərindən mənimsənilməsi, ümumiləşdirmə və sistemləşdirmənin yüksək səviyyədə aparılması.

*Vəzifələr*:

– təhsilləndirici – mövzu üzrə əvvəlki dərslərdə qazanılmış bilik və bacarıqlara yiyələnmənin keyfiyyəti və səviyyəsi; biliklər sistemi kimi materialın ümumiləşdirilməsi;

– tərbiyəedici – ümumi mədəniyyət tərbiyələndirmək, ətraf aləmin estetik qavranılması; şagirdlərin real özünüqiymətləndirilməsi üçün şəraitin yaradılması; məktəbliləri bir şəxsiyyət kimi nəzərə almaq;

– inkişafetdirici – fəza təfəkkürünün, təsnif etmək bacarığının inkişaf etdirilməsi; əlaqələri müəyyən etmək; nəticələri formalaşdırmaq; qruplarda iş zamanı kommunikativ vərdişlərin inkişaf etdirilməsi; idrak fəallığının inkişaf etdirilməsi; xüsusiyyətlərin, qanunauyğunluqların aydınlaşdırılması; tutuşdurmaq, müqayisə etmək bacarığının inkişaf etdirilməsi.

T.L. Slabova qeyri-standart dərsləri aşağıdakı şəkildə təsnif edir: dərs-mətbuat konfransı; dərs-yarış; layihə metodikasının və informasiya texnologiyaları elementlərinin tətbiqi ilə dərs; dərs-rollu oyun; kompüter testləşdirilmədən istifadə etməklə dərs; kompüter öyrədici proqram tətbiq etməklə dərs [7].

Q.A. Stulinanın təsnifatı isə belədir: dərslər-məhkəmələr; dərslər-forumlar; dərslər-disputlar; dərslər-dialoqlar; dərslər-mətbuat konfransları; dərslər-konsertlər; usta-sinif [8].

Digər ədəbiyyatda [113] dərsin tipləri öz məqsədinə və yerinə yetirməli olduğu vəzifələrə görə, beş qrupa bölünmüşdür. Diqqət yetirək:

“1. *Yeni materialın öyrənilməsi dərsi.* Buraya giriş hissəsi, müşahidə və materialın toplanması – dərsin variantları kimi daxil edilir:

1. Dərs-mühazirə. 2. Dərs-söhbət. 3. Tədris kinofilmindən istifadə etməklə dərs. 4. Nəzəri və praktik müstəqil illər dərsi (tədqiqat xarakterli). 5. Qarışıq dərs (bir dərsdə dərsin müxtəlif növlərinin uzlaşdırılması).

II. *Bilik, bacarıq və vərdişlərin təkmilləşdirilməsi dərsləri:*

1. Müstəqil işlər dərsi. 2. Laborator işi dərsi. 3. Praktik işlər dərsi. 4. Dərs-ekskursiya. 5. Seminar.

III. *Ümumiləşdirmə və sistemləşdirmə dərsi:*

Buraya 5 tip dərslərin bütün əsas növləri daxildir.

V. Bilik, bacarıq və vərdişlərin yoxlama (kontrol) uçotu və qiymətləndirilməsi:

1. Yoxlamanın şifahi forması (frontal, fərdi və qrup halında sorğu). 2. Yazılı yoxlama. 3. Məqbul. 4. Praktik və laborator məqbul işləri. 5. Yoxlama (müstəqil) işi. 6. Qarışıq dərs (birinci üç növün uzlaşdırılması).

V. Qarışıq dərslər:

Bir sıra didaktik vəzifələr yerinə yetirilir” [9].

Təlim və təlimdənkənar məşğələlərdə təsviri incəsənət fənni üzrə materiallarla tanış olan məktəblilərdə bədii zövq və yaradıcı təxəyyül inkişaf edir. Onlar incəsənət əsərlərini qədərincə anlayaraq qiymətləndirə bilir, simvolik düşüncə tərzinə malik olurlar. Həmin sahədə, şübhəsiz, fənn üzrə dərsliklər mühüm əhəmiyyətlidir. Məşğələlərin səmərəliliyinə, maraqlı və cəlbedici olmasına isə bir sıra vasitələr kömək edir. Onların sırasında incəsənətə dair söhbətlərin özünəməxsus rolu vardır. Bunu nəzərə alan müəllimlər, lazım gəldikdə dərs-söhbətlərin imkanlarından faydalanırlar.

Digər fənlərdə olduğu kimi, təsviri incəsənət dərslərində də məktəblilər təhsillənir, tərbiyələnir və inkişaf edirlər. Təhsillilik dedikdə, bu, necə başa düşülməlidir? Bəzi müəllimlərə, mütəxəssislərə elə gəlir ki, təhsillilik dedikdə, təlim prosesində şagirdləri yalnız biliklərə yiyələndirmək başa düşülməlidir.

Dosent Ə.M. Abbasovun yazır: *“Təhsil əsl mənasında insan kapitalının formalaşdırılması vasitəsi kimi özünün məzmunu, bir sıra vasitələr sistemi və ümumilikdə mexanizmləri ilə mövcuddur. Xüsusilə akseoloji yanaşma müstəvisində təhsil daşıdığı dəyərlər kontekstində cəmiyyət üçün faydalı olan insanın inkişaf etməsində aparıcı funksiya daşıması ilə fərqlənir. Təhsil həm də mədəniyyətlərdən ibarət dəyərlərin mənimsənilməsi vəzifəsini icra edən bir sistem kimi də fəaliyyət göstərir”* [10, s. 7].

Tədqiqatlarımız zamanı V-VII siniflərin təsviri incəsənət dərsliklərinin incəsənətə dair dərs-söhbətlərin aparılması imkanlarını öyrəndik. Həmin siniflərdə mövzular fənn kurikulumunun məzmun xətləri üzrə standartların həyata keçirilməsinə istiqamətlənir, şagirdlərin idrak fəallığına və yaradıcı müstəqilliyinə yönələn texnologiyalara əsasən planlaşdırılmışdır.

Ümumtəhsil məktəblərinin V siniflərinin təsviri incəsənət dərsliyindəki “Xalq sənətinin yaradıcılıq mənbəyi” bölməsinə daxil olan “Simvollara çevrilmiş təbiət”, “Azərbaycan daxmasının daxili dünyası”; “Ulu irsimiz – xalq geyimləri və Azərbaycan xalçaları” bölməsinə aid olan “Azərbaycan xalçaları”; “Dekor – insan, cəmiyyət, zaman” bölməsində nəzərdə tutulmuş “İnsanlara bəzək nə üçün lazımdır?”; VI sinfin dərsliyindəki “Təsviri sənətdə janrlar” bölməsinə daxil olan “Təsvirlərdə insan obrazı” və “Təbiət motivləri”; eləcə də VII sinfin Təsviri incəsənət dərsliyinə salınmış “Azərbaycan memarlıq məktəbləri”, “Təsviri sənətdə əfsanəvi obrazlar”, “Heykəltəraşlıqda insan obrazı” və s. mövzular üzrə dərs-söhbətlərin təşkili məqsədəuyğun sayılır.

V sinfin təsviri incəsənət dərsliyinə metodik rəhbərlikdə fənnin vəzifələri aşağıdakı kimi müəyyənləşdirilmişdir:

– *“Azərbaycanın, eləcə də dünya incəsənətinin görkəmli nümayəndələri və onların yaradıcılığı ilə şagirdlərin tanış olmalarını təmin etmək;*

*– Həyati gerçəkliklərin və sənət əsərlərinin şagirdlər tərəfindən bədii-obrazlı qavranılmasını təmin etmək, onların estetik zövqünün inkişafına nail olmaq və təsviri sənət nümunələrinin timsalında ölçü, forma, simmetriya, harmoniya məfhumlarının mahiyyəti barədə şagirdlərin təsəvvürlərini dərinləşdirmək;*

*– Şagirdlərdə müqayisə, təhlil və təsvir qabiliyyətlərini təkmilləşdirmək, onlarda sadə tərtibat-dizayn bacarıqları formalaşdırmaq, təsviri sənət üzrə istedadlı uşaqların üzə çıxarılmasını təmin etmək”* [11, s. 3].

Dərs-söhbətlər göstərilən vəzifələrin yerinə yetirilməsinə imkan verir. Şagirdlər təsviri incəsənətin ayrı-ayrı dövrlərinə, mərhələlərinə, növlərinə və janrlarına həsr olunmuş dərs-söhbətlər zamanı, həmçinin praktik məşğələlər prosesində incəsənətin tarixinə ekskurs edirlər. Dərsin başlıca vəzifələrindən biri şagirdlərə təsviri incəsənətin dilinə aid biliklər verməkdən ibarətdir. Məktəblilər buna yiyələnərək, bədii əsəri, onun məzmununu, formasını, obraz zənginliyini, özünəməxsusluğunu yaradıcı şəkildə qiymətləndirməyi bacarır, eyni zamanda, dünya xalqları tərəfindən yaradılmış bədii dəyərlərə məhəbbətlə və hörmətlə nüfuz edirlər.

Kurikulumda əsas diqqət nəticəyönlülüyə yönəlmişdir. Təkcə bilikləri mənimsəmək deyil, zəruri bacarıq və vərdişlərə sahib olmaq da nəzərdə tutulur.

Ümumtəhsil məktəblərinin V-VII siniflərində incəsənətə dair dərs-söhbətlər gerçəklik və ətraf aləmin təbii mənzərəsi haqqında şagirdlərdə aydın təsəvvür oyadır: “...Təhsil proqramı (kurikulumu)”nda qeyd olunduğu kimi, “Təsviri fəaliyyət şagirdləri məkan və forma ölçülərini hiss etməyə, obrazlı və məntiqi düşünməyə, bu düşüncələri vizual obrazlarda əks etdirməyə istiqamətləndirir” [9].

V-VII siniflərdə incəsənətə dair dərs-söhbətlər şagirdlərin həm estetik zövqünü, estetik düşüncə və təfəkkürünü, həm də hadisələri bədii təsvir vasitələri ilə ifadə etmək bacarıqlarını inkişaf etdirir, onlarda estetik və bədii mədəniyyət formalaşdırır.

İncəsənətə dair dərs-söhbətlər haqqında danışılan məsələlərin reallaşmasına kömək edir və etməlidir.

**Problemin aktuallığı.** Ölkəmizdə təhsilin inkişaf etdirilməsi, dünya təhsil sistemində özünə layiqli yer tutması, təlimin məzmununun təkmilləşdirilməsi və müasirləşdirilməsi istiqamətində məqsədyönlü, sistemli və fasiləsiz işlər aparılır. V-VII siniflərdə incəsənətə dair dərs-söhbətlər həmin məqsədyönlü işlərin tərkib hissəsi kimi aktuallıq daşıyır.

**Problemin elmi yeniliyi**. Məqalədə V-VII siniflərdə təsviri incəsənətin tədrisi zamanı incəsənətə dair dərs-söhbətlərin təşkili üzrə işin səmərəli yollarına aydınlıq gətirilmişdir.

**Problemin praktik əhəmiyyəti**. Problemlə bağlı iş sistemi, əsas elmi ideyalar, tədqiqatın nəticələri dərs-söhbətlərin təşkili zamanı V-VII sinif şagirdləri ilə məqsədyönlü, səmərəli, sistemli və ardıcıl işləri aparmaqda müəllimlərə kömək göstərəcəkdir.

**Ədəbiyyat:**


1. Гасанова, Р.В. Использование эффективных форм и нетрадиционных техник на уроках изобразительного искусства https://open-lesson.net/3646/
2. Леонтьева, О.В. Беседа -один из ведущих методов преподавания в классах коррекционно развивающего обучения в основной школе // -Москва: Современные наукоемкие технологии, -2010. № 12, -с. 36-43.

3. Филатова, А.В. Уроки-беседы как вид учебной деятельности на уроке изобразительного искусства. uroki-besedy_kak_vid_uchebnoy_deyatelnosti_na_uroke_izobrazitelnogo_iskusstva.doc
4. Психолого-педагогический словарь / Сост. Рапацевич Е.С. -Минск, -2006. -с. 29-30
5. Солонина, Е.В. Развитие творческих способностей учащихся на уроках изобразительного искусства 5-7 классах. http://www.uchportal.ru/publ/23-1-0-5363
6. Карпейкина, И. М. Применение нестандартных уроков для повышения учебной активности учащихся. http://pedsovet.su/publ/47-1-0-4006
7. Слабова, Т.Л.Нестандартные уроки. http://festival.1september.ru/articles/414974/
8. Стулина, Г.А. Типы уроков http://festival.1september.ru/articles/596998/htp://school120.edusite.ru/p143aa1.html
9. Azərbaycan Respublikasının ümumtəhsil məktəblərinin I-IX sinifləri üçün təsviri incəsənət fənni üzrə təhsil proqramı (kurikulumu). -Bakı: ARTPİ, -2013.
10. Abbasov, Ə.M. Ümumi təhsilin bəzi pedaqoji məsələlərinə dair / “Ümumtəhsil fənlərinin tədrisinə dair tədqiqlər” kitabında / Ə.M. Abbasov. -Bakı: “Vahid-M” MMC, -2017. -s. 7-21
11. Məmmədova, M. Təsviri incəsənət: V sinif: Müəllim üçün metodik vəsait / M. Məmmədova, B. Mirzəyeva, N. Əliyeva. -Bakı: Aspoliqraf, -2012. -96 s.


**E-mail:** emilya-hesenova@bk.ru

**Rəyçilər:** *ped.elm.dok., prof.* **A.N. Abbasov,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 01.12.2022.

*UOT 37.0*

# MİLLİ MAARİFÇİLİK TARİXİMİZ: PEDAQOJİ ARAŞDIRMALAR MÜSTƏVİSİNDƏ

# НАЦИОНАЛЬНАЯ ПРОСВЕТИТЕЛЬСКАЯ ИСТОРИЯ: НА УРОВНЕ ПЕДАГОГИЧЕСКИХ ИССЛЕДОВАНИЙ

# NATIONAL ENLIGHTENMENT HISTORY: AT THE LEVEL OF PEDAGOGICAL RESEARCH




Son illərdə Azərbaycan maarifçiliyinin tarixinə həsr olunmuş və aktuallığı ilə diqqəti cəlb edən tədqiqatların aparılması və monoqrafik nəşri milli təhsil tariximizə, pedaqogika elminə yeni töhfələr kimi dəyərləndirilə bilər. Belə əsərlərdən biri də pedaqogika elmləri doktoru, professor Həsən Bayramovun "İrəvan Müəllimlər Seminariyası: milli maarifçiliyin genezisi və prioritetlərin paradiqması" monoqrafiyasıdır. Apostrof-A nəşriyyatının çap etdiyi bu monoqrafiyada (Bakı, 2022, 204 s.) Çar Rusiyasının Cənubi Qafqazdakı təhsil siyasəti, Şimali Azərbaycanda, İrəvan bölgəsində təhsilin yenidən təşkili məsələləri, İrəvan Müəllimlər Seminariyasının yaradılması səbəbləri və onun fəaliyyəti əhatə olunmuşdur. Üç fəsildən ibarət olan monoqrafiyanın məzmunu İrəvan Müəllimlər Seminariyasının keçdiyi tarixi yola aydınlıq gətirmək, bu təhsil ocağının Azərbaycan pedaqoji fikir tarixində yeri və rolunu müəyyənləşdirmək üçün mühüm əhəmiyyət kəsb edir.

Əsərin birinci fəslində İrəvan Müəllimlər Seminariyasının yaranmasının ictimai-maarifçi genezisi araşdırılmışdır. Bu fəsildə Çar Rusiyasının Şimali Azərbaycanı işğal edəndən sonra yeni tarixi-maarifçi transformasiyaya keçid, yeni tipli təhsilin ilkin şəbəkələnməsi və ictimai-maarifçi hərəkatın tipologiyası məsələləri öyrənilmiş, problemin mahiyyəti ciddi faktlar əsasında təhlil olunmuş, mənbələrin məlumatları ümumiləşdirilərək nəticələr çıxarılmışdır.

Müəllif ilk növbədə XIX yüzilliyin əvvəllərində Cənubi Qafqazda gedən ictimai-siyasi proseslərə diqqət yetirmiş, o dövrdə Çar Rusiyasının işğalçılıq siyasətini, işğalın nəticələrini qeyd etmiş və bu bölgədə çarizmin yeni təhsil siyasətinin mahiyyətini aydın şəkildə əsaslandırılmışdır.

Tarixi mənbələr göstərir ki, Çar Rusiyası XIX yüzilliyin əvvəllərində Cənubi Qafqazı işğal etdikdən sonra burada öz mövqeyini möhkəmləndirmək üçün təkcə hərbi, siyasi-inzibati sahədə deyil, təhsilin idarəedilməsində, onun məzmununun köklü şəkildə dəyişdirilməsi sahəsində də islahatlar keçirməyə başladı. İmperiyanın hakim dairələri işğal etdikləri ərazilərdə xalqı itaətdə, müstəmləkə əsarətində saxlamaq üçün təhsil məsələlərinə xüsusi diqqət yetirməyi vacib hesab edirdilər. O dövrün tarixi sənədlərinin təhlilindən aydın olur ki, çar hökuməti, hər şeydən əvvəl,

Rusiyaya, imperiyaya sadiq olan vətəndaşların yetişdirilməsi üçün yollar axtarmış və ona görə də təhsilin məzmununu bu istiqamətə yönəltmişdir. O zaman çara yazılan məktublarda açıq etiraf olunurdu ki, Cənubi Qafqazı, Azərbaycanı əsarətdə saxlamağın ən rahat yolu yerli əhaliyə rus dilində təhsil vermək, uşaqların rus adət-ənənələrinə uyğun tərbiyə etmək, onların özünüdərkinə şərait yaratmamaqdır.

Prof. H.B. Bayramov monoqrafiyada bu məsələlərə toxunmuş və çar hökumətinin Cənubi Qafqazdakı təhsil siyasətinin əsl mahiyyətinin nədən ibarət olduğunu göstərmişdir.

XIX yüzilliyin ikinci yarısında artıq Rusiya imperiyasının müxtəlif bölgələrində yeni tipli təhsil müəssisələrinin – seminariyaların yaradılması zərurəti meydana çıxmışdı. Bu seminariyalar əsasən ibtidai siniflər üçün pedaqoji kadr hazırlamaq funksiyasını yerinə yetirirdi. Rusiya Dövlət Şurasının qərarı ilə İrəvanda da Müəllimlər Seminariyası yaradıldı və 1881-ci ilin noyabrında onun açılışı oldu. Bu məsələlər barədə monoqrafiyanın ikinci – "Çar Rusiyası dövrü İrəvanda müəllim hazırlığının milli kreativləri" fəslində geniş bəhs edilmişdir. Burada ilk növbədə İrəvan Müəllimlər Seminariyasının yaranmasını şərtləndirən maarif zəmininin nədən ibarət olduğu qeyd edilmiş, İrəvan və Qori Müəllimlər Seminariyaları arasında paralellər aparılmış, prioritetlər müəyyənləşdirilmişdir.

Prof. H.B. Bayramov seminariya açılanadək məscidlərin nəzdindəki məktəb və mədrəsələrin fəaliyyətini, onların cəmiyyətindəki əhəmiyyətini qeyd edir, tarixən xalqımızın mədəni yüksəlişində onların baza rolu oynadığını dilə gətirir.

Məlum məsələdir ki, bu təhsil ocaqlarında əsasən ərəb dilinə üstünlük verir, elmi əsərlər də ərəb dilində yazılırdı. O zaman, orta əsrlər dövründə Qərbi Avropa ölkələrində fəlsəfə və elmin yayılmasında latın dili necə rol oynayırdısa, müsəlman Şərqində də ərəb dili belə bir rol oynayırdı. Lakin danılmaz faktdır ki, etnik kimliyin dini kimliyə çevrilməsi prosesində məhz dini məktəblər, buradakı təhsilin məzmunu az rol oynamamışdır.

XIX yüzillikdə – yeni tarixi şəraitdə isə vəziyyət tədricən dəyişməyə başladı. Milli kimlik məsələsinin gündəmə gəlməsi Avropa tipli məktəblərə marağı artırdı. Tədqiqatçı H.B. Bayramov məsələnin bu aspektlərini də xüsusi diqqətdə saxlamış, ənənəviliyi və tarixiliyi elmi baxımdan müqayisə edərək dövrün maarifçilik fəlsəfəsini əsaslandırmışdır.

Monoqrafiyada İrəvan Müəllimlər Seminariyasının açılışında (1881) iştirak etmiş və uzun müddət bu təhsil ocağında Azərbaycan dili və şəriətdən dərs demiş, eyni zamanda bir müddət Azərbaycan şöbəsinin müdiri işləmiş Axund Molla Məhəmmədbağır Qazızadənin həyatı və fəaliyyətindən geniş bəhs edilmişdir.

Tarixdən məlumdur ki, A.M. Qazızadə dövrünün çox görkəmli şəxsiyyəti olmuşdur. Belə ki, o, ana dilli ilə yanaşı, bir neçə xarici dili də mükəmməl bilmiş, ərəb, fars, rus və s. dillərdə sərbəst danışmışdır. O, 1890-cı illərdə İrəvan Quberniyasının Ali Dini Məclisinin sədri vəzifəsinə təyin olunmuş, ömrünün sonunadək həm də bu məsul vəzifəni daşımışdır. İrəvan Müəllimlər Seminariyasında tədris olunan Ana dili dərsliyinin həmmüəlliflərindən biri də A.M. Qazızadə olmuşdur.

Tarixi mənbələr göstərir ki, İrəvan Müəllimlər Seminariyasında seminariya rəhbərliyinin, burada çalışan qeyri-azərbaycanlıların, o cümlədən ermənilərin soydaşlarımıza qarşı ayrıseçkiliyinin, təzyiq və təqiblərinin qarşısının alınmasında A.M. Qazızadə çox işlər görmüşdür.

Tarixi mənbələrdə A.M. Qazızadənin azərbaycanlıların mənafeyini müdafiə etmək üçün imperiyanın paytaxtı Sankt-Peterburqa qədər getdiyi, çarizmin ən yüksək hakimiyyət orqanlarının nümayəndələri ilə görüşdüyü barədə məlumatlar vardır. Bu davranışları təkcə İrəvanda deyil, bütövlükdə türk-müsəlman aləmində ona böyük nüfuz qazandırmışdı.

A.M. Qazızadə və onun yetirmələri bölgədə milli maarifçiliyin yayılmasında böyük rol oynadılar. Seminariyanı bitirən azərbaycanlılar imtahan verərək kənd müəllimi statusunu alır və ayrı-ayrı bölgələrdə müəllim kimi işləmək imkanı əldə edirdilər.

Tədqiqatçı prof. H.B. Bayramov Axund Molla Məhəmmədbağır Qazızadənin, Həmid bəy Şahtaxtinskinin, Rəşid bəy Şahtaxtinskinin, İbadulla Muğanlinskinin və başqalarının da fəaliyyətinə diqqət yetirmiş, onların maarifçiliyin yayılmasında xidmətlərini göstərmişdir. O, İrəvan Müəllimlər Seminariyasından bəhs etməklə bərabər, eyni zamanda XIX yüzilliyin 2-ci yarısında fəaliyyətə başlayan və Azərbaycan maarifçiliyinin inkişafında xüsusi mövqeyi olan Qori Müəl-

limlər Seminariyası barədə də bəzi vacib məqamları diqqətə çatdırmış, bu seminariyaların əlaqələrini, onların milli pedaqoji fikrimizin inkişafında təsir gücünü faktlarla əsaslandırmışdır.

Tədqiqatçı haqlı olaraq yazır ki, Qori Müəllimlər Seminariyasının yarandığı ilk dövrdə bu şəhər (Qori) Azərbaycan milli maarifçiliyinin yeni mərkəzinə çevrilə bilməmişdi. Bu da onunla bağlı idi ki, o zaman mədəni maarif işinin əsas mərkəzi Tiflis və Bakı idi. Türk müsəlman əhalisi Qori ilə müqayisədə daha çox Tiflisdə cəmləşmişdi. Lakin İrəvan şəhəri isə quberniya mərkəzi olmaqla, azərbaycanlıların əksəriyyət təşkil etdiyi şəhər idi. Digər tərəfdən Rusiya işğalınadək Qoridən fərqli olaraq İrəvanda müsəlman maarifçi mühiti vardı. Araşdırmalar göstərir ki, çarizmin işğalına qədər, işğal ərəfəsində təkcə İrəvan şəhərində 12 məscid olmuş və hər bir məscidin nəzdində bir məktəb fəaliyyət göstərmişdir. Bu məscidlərdə 221 şagirdin təhsil aldığı faktı da məlumdur. Bütün bunlar İrəvan maarifçilik mühitinin hələ əvvəllər də mövcud olduğunu sübut edir. Sadəcə yeni tarixi şəraitdə təhsilin məzmunu, həm də əsas məqsədi dəyişmiş, imperiyanın tələb etdiyi kadrların yetişdirilməsi qarşıya qoyulmuşdu.

Prof. H.B. Bayramov İrəvan Müəllimlər Seminariyası məzunlarının dini-fanatizmə qarşı mübarizəsindən də bəhs etmiş və milli demokratik fikrin inkişafında onların rolunu ön plana çəkmişdir. O, Mirzə Cabbar Məmmədzadənin 1917-ci ildən nəşrə başlayan "Burhani-həqiqət" adlı məcmuədə çap etdirdiyi "Tərbiyə" adlı 8 silsilə məqalələrini təhlil edir və onun maarifçilik işində nə qədər əhəmiyyətli rol oynadığını əsaslandırır.

Qeyd edək ki, məcmuədə "Tərbiyə" başlığı altında verilən məqalələrin bu günümüz üçün tərbiyəvi əhəmiyyəti böyükdür. Müəllif burada uşaqların sağlam həyat tərzi keçirmələrini istər fiziki, istərsə də mənəvi sağlamlığın başlıca şərti hesab edir. O, yazır ki, uşağa nə qədər diqqət və qayğı göstərilsə, ona qulluq edilsə, o zaman o, sağlam böyüyər. Dini fanatizmə xas olan hərəkətlər insanı dünyadan bixəbər edir, inkişafın qarşısını alır. Uşaqların tərbiyəsinə bu yanaşma pedaqoji baxımdan da əhəmiyyətlidir. Ona görə mətbuat səhifələrində tərbiyəvi məzmunlu yazıların verilməsi həmişə böyük maraq doğurmuşdur.

Qeyd etdiyimiz məsələlərlə bağlı prof. Həsən Bayramovun əsərində elmi-pedaqoji təhlillər aparılmış və burada İrəvan Müəllimlər Seminariyasının bölgədə maarifçilik missiyasının nəticələri kimi əsaslandırılmışdır.

Monoqrafiyanın üçüncü fəsli "İrəvan milli, ictimai-maarifçi mühitinin tarixi missiyası" na həsr olunmuşdur. Burada İrəvan Müəllimlər Seminariyasının azərbaycanlı müəllim kadrlarının hazırlığında rolu məsələsi öyrənilmiş, eyni zamanda bu bölgədəki maarifçilik mühitinin prioritetlərinə yekun baxış ümumiləşdirilmişdir.

Prof. H.B. Bayramov araşdırmalarının nəticələri kimi İrəvan Müəllimlər Seminariyasının, onun azərbaycanlı müəllim və məzunlarının yeni ictimai-maarifçi hərəkatın tarixi təşəkkülünə haqlı olaraq ciddi töhfə verdiyi qənaətinə gəlmiş və fikirlərini aşağıdakı məzmunda əsaslandırmışdır:

Məzunlar seminariyanın tədris-pedaqoji mühitinə daxil olmaqla aktiv şəkildə maarifçilik fəaliyyətinə başladı, bu təhsil ocağında azərbaycanlı mühitini formalaşdırdılar. Onlar gimnaziya ilə birlikdə tədris müəssisələri üçün proqram, metodik vəsait və dərslikləri hazırladılar. Bununla yanaşı, "Lək-lək" və "Burhani-həqiqət" jurnallarının simasında mətbuatda maarifçilik mövzusunda məqalələrlə çıxış etməklə, onun yaxın ərazilərə yayılmasını təmin etdilər. Qəza kənd məktəblərinin şəbəkələşməsi nəticəsində milli maarifçiliyin yeni mərhələsinin yaranması da seminariya məzunlarının xidmətləri sayəsində reallaşdı. Məzunların mühüm xidmətlərindən biri də "Molla Nəsrəddin", "Tuti", "Zənbur", "İqdam", "İrşad", "Babayi-Əmir", "Məzəli", "Kaspi", "Şəlalə", "Sövqat", "Kəşkül", "Tərcüman" və b. jurnalların bölgədə yayılmasına rəhbərlik etmək və beləliklə, müəllim və tələbələrin milli dünyagörüşünün formalaşması və inkişafına çalışmaq olmuşdur.

Tədqiqatçı fikirlərini ümumiləşdirərkən məzunların Bakı, Təbriz, Gəncə, Naxçıvan, Qars, Tiflis, Qarabağ bölgələri ilə qarşılıqlı əlaqələrini diqqətə çatdırır, bu əlaqə zəminində mövcud tarixi şəraitdən maksimum faydalanmağa çalışdıqlarını qeyd edir.

Ümumiyyətlə, Azərbaycanda müstəqillik hərəkatında, müstəqilliyin əldə olunmasında və sonrakı proseslərdə milli maarifçiliyin, bu hərəkatın görkəmli nümayəndələrinin, o cümlədən

İrəvan Müəllimlər Seminariyası və onun məzunlarının böyük xidmətləri olmuşdur.

Azərbaycanın İrəvan bölgəsində maarifçilik mühitinin yaranması və İrəvan Müəllimlər Seminariyasının maarifçilik tariximizdə rolu məsələlərinin dərindən öyrənilməsi baxımından prof. Həsən Bayramovun araşdırmaları ciddi elmi mənbə kimi əhəmiyyətlidir. Onun "İrəvan Müəllimlər Seminariyası: milli maarifçiliyin genezisi və prioritetlərin paradiqması" monoqrafiyası tarixi faktlara, elmi təhlil və ümumiləşdirmələrə əsaslanan əsər kimi dəyərlidir. Bu monoqrafiyada əksini tapmış ideyalar maarifçilik mövzusunda yeni tədqiqat istiqamətlərinin müəyyənləşdirilməsinə, yeni tədris resurslarının hazırlanmasına geniş imkanlar yaradır.

**İntiqam Hilal oğlu Cəbrayılov**
*pedaqogika elmləri doktoru, professor*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*Təhsilin nəzəriyyəsi və tarixi şöbəsinin müdiri*
**Redaksiyaya daxil olub:** 29.11.2022

# *MÜƏLLİMİN ÖZÜNÜTƏHSİLİ*
# *САМООБРАЗОВАНИЕ УЧИТЕЛЯ*
# *SELF-EDUCATION OF THE TEACHER*

*UOT 37.0*

***Səmayə Xeyrulla qızı Nəzərova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi*
Orcid kod:0000-0002-9574-7515

## MÜASİR DÖVRDƏ AZƏRBAYCANDA RƏSSAMLIĞIN İNKİŞAFI VƏ CƏMİYYƏTDƏ MÖVQEYİ

***Самая Хейрулла гызы Назарова***
*преподаватель Азербайджанского Государственного Педагогического Университета*

## РАЗВИТИЕ ЖИВОПИСИ В АЗЕРБАЙДЖАНЕ В СОВРЕМЕННЫЙ ПЕРИОД И ЕЕ ПОЗИЦИЯ В ОБЩЕСТВЕ

***Samaya Kheyrulla Nazarova***
*teacher at Azerbaijan State Pedagogical University*

## DEVELOPMENT OF PAINTING IN AZERBAIJAN IN THE MODERN PERIOD AND POSITION IN SOCIETY

**Xülasə.** Müasir dünyanı nə iləsə təəccübləndirmək olduqca çətindir. Çünki artıq dünyanı heyrətləndirəcək çox az şey var desək, yəqin ki, yanılmarıq. Təsviri incəsənət, rəssamların fırçasından çıxan əsərlər həqiqətən də tamaşaçıların marağını cəlb etməyə qadirdir. Azərbaycan təsviri incəsənət ustalarının çəkdiyi əsərlərin çox az hissəsi dünyada tanınıb. Azərbaycanda tarixən ölkəmizi tanıtmağa qadir olan rəssamlar olub, sadəcə onların dünya sənət okeanına çıxışları məhdud idi. Orta əsr Azərbaycan rəssamlarının əsərlərinin dünya muzeylərində və şəxsi kolleksiyalarda sənət inciləri kimi yer tutması Azərbaycan təsviri incəsənətinin qələbəsidir. Orta əsrlər Azərbaycan rəssamlarının çəkdiyi əsərlər, miniatürlər bütün dünyada məşhurdur. Dahi rəssamımız Soltan Məhəmmədin "Bəhram Gurun şir ovu", "Məhəmməd Peyğəmbərin meracı", "Xosrovun çimən Şirini görməsi", "İsgəndərin Çin xalqı ilə görüşü" və s. əsərləri dünyada çox məşhurdur. Ağa Mirəkin əsərləri də həmçinin, dünya muzeylərini bəzəyir. Onun "Məcnun heyvanlar arasında", "Xosrov və Şirinin xidmətçilərin nağılını dinləməsi", "Xosrovun taxta çıxması", "Şapurun Xosrovun yanına qayıtması" unikal nümunələrdir. Seyid Əlinin "Bəhram Gur və qoca çoban", "Məcnun Leylinin çadırı qarşısında", "İbn Səlamın elçiliyi" və s. əsərlərin adını çəkə bilərik. Azərbaycan rəssamlarının əl işləri qədim zamanlardan dünya səyyahlarını maraqlandıran əsl sənət inciləridir.

***Açar sözlər:*** *rəssamlıq, müasirlik, inkişaf, mədəniyyət, əsərlər, yaradıcılıq*

**Резюме.** Современный мир довольно сложно чем-то удивить. Потому что, если мы скажем, что мир уже ничем не восторгается, мы, вероятно, не ошибемся. Изобразительное искусство, произведения кисти художников действительно способны вызвать интерес у зрителей. Очень немногие произведения азербайджанских мастеров изобразительного искусства получили признание в мире. Исторически в Азербайджане были художники, способные продвигать нашу страну, но их доступ к мировому художественному океану был ограничен. То, что произведения средневековых азербайджанских художников находятся в музеях и частных коллекциях мира как жемчужины искусства, является победой азербайджанского изобразительного искусства. Работы и миниатюры, написанные средневековыми азербайджанскими художниками, известны во всем мире. Работы нашего гениального художника Солтана Мухаммеда «Охота на льва Бахрам Гур», «Мирадж пророка Мухаммеда», «Хо-

сров видит купающуюся Ширин», «Встреча Александра с китайским народом» и др. очень известны в мире. Произведения Аги Мирака также украшают музеи мира. Уникальными образами могут послужить: «Меджнун среди зверей», «Хосров и Ширин слушают сказку слуги», «Восхождение Хосрова на престол», «Возвращение Шапура к Хосрову». Можно также перечислить работы Саида Али «Бахрам Гур и старый пастух», «Меджнун перед шатром Лейли», «Сватовство Ибн Салама». Работы азербайджанских мастеров – настоящие жемчужины искусства, издревле интересующие путешественников мира.

***Ключевые слова:*** *живопись, современность, развитие, культура, произведения, творчество*

**Summary.** It is quite difficult to surprise the modern world with something. Because if we say that there is very little to amaze the world anymore, we probably wouldn't be wrong. Fine art, works from the brushes of artists are really able to attract the interest of the audience. Very few works of Azerbaijani fine art masters have been recognized in the world. Historically, there have been artists in Azerbaijan who were able to promote our country, but their access to the world art ocean was limited. The fact that the works of medieval Azerbaijani artists have a place in world museums and private collections as pearls of art is a victory of Azerbaijani fine art. Works and miniatures painted by medieval Azerbaijani artists are famous all over the world. Our genius artist Soltan Mohammad's "Bahram Guru's Lion Hunt", "Mohammed's Prophet's Dream", "Khosrov's Seeing the Bathing Lion", "Alexander's Meeting with the Chinese People", etc. his works are very famous in the world. Aga Mirak's works also decorate world museums. His "Among the Enchanted Animals", "Khosrov and Shiri listening to the servant's tale", "Khosrov's accession to the throne", "Shapur's return to Khosrov" are unique examples. Sayyid Ali's "Bahram Gur and the old shepherd", "In front of Majnun Leyli's tent", "Embassy of Ibn Salam", etc. we can name the works. Handicrafts of Azerbaijani artists are real pearls of art that have been of interest to world travelers since ancient times.

***Key words:*** *painting, modernity, development, culture, works, creativity*

Azərbaycan rəssamları tam olaraq hələ dünyaya inteqrasiya etməyiblər. Bu gün dünya Azərbaycan rəssamları deyəndə daha çox Səttar Bəhlulzadənin bənzərsiz əsərlərini xatırlayır. Sovet dövrü Azərbaycan rəssamlarının əksəriyyətinin o illərdə xarici ölkələrdə sərgiləri təşkil edilirdi. Bu rəssamlar Azərbaycan həyatını bu sərgilərdə ifadə edə bilirdilər. Sovet illərində bizim rəssamlar dünyaya sovet rəssamı kimi təqdim edilirdi. Yəni onların azərbaycanlı olduğunu dünyada çox az adam bilirdi. O rəssamlar Azərbaycan adına tanınsaydılar, biz bu gün onun daha çox faydasını görərdik. Sovet dövrü Azərbaycan rəssamlarının müraciət etdiyi mövzular ancaq ölkə ilə məhdudlaşmırdı, dünyanın əksər xalqları, onların məişəti, həyat tərzi ilə bağlı dəyərli əsərlər yaradırdılar. Bu əsərlərin beynəlmiləl mahiyyəti də böyük idi. Bu gün dünya muzeylərində Azərbaycanın Sovet dövrü rəssamlarının əsərləri sərgilənir. Keçən çağlarda Səttar Bəhlulzadə, Mikayıl Abdullayev, Maral Rəhmanzadə, Tahir Salahov, Toğrul Nərimanbəyov, Rasim Babayev və digər rəssamlar dünyaya çıxmaq üçün mücadilə aparırdılarsa, buna müəyyən qədər nail oldular. Onların əsərləri dünyada az-çox tanınır, qiymətləndirilir. Bu gün sevindirici haldır ki, dövlətin bu sahəyə dəstəyi nəticəsində klassik Azərbaycan rəssamlarının əsərlərindən ibarət sərgilər açılır, onların kataloqları çap olunur. Bundan başqa, müasir rəssamlar arasında da dünyaya çıxmağa iddialı olanlar var. Son illər Azərbaycan təsviri incəsənətinin dünyada təbliğ edilməsi və onun müasir nümayəndələrinin tanıdılması üçün Heydər Əliyev Fondu da böyük işlər görür, vaxtaşırı olaraq Azərbaycan rəssamlarının fırça nümunələri dünyanın müxtəlif ölkələrində sərgilənir. Elə bu məqsədlə də 2000-ci ildə ölkəmizdə, ilk dəfə olaraq, Rəssamlıq Akademiyası açıldı. Bu hadisəni yalnız mədəni həyatımız yox, həm də bütövlükdə xalqımız üçün çox mühüm addımlardan biri hesab etmək olar (2,58).

Azərbaycan mədəniyyətinin dünyada təbliğ olunmasında müasir fırça ustaları arasında Dünya Rəssamlıq Akademiyasının üzvləri də var ki, bir neçə il əvvəl həmin rəssamların Bakıda sərgisi də açılıb: xalq rəssamları Xanlar Əhmədov, Mir Nadir Zeynalov, əməkdar incəsənət xadimi Arif Aziz, əməkdar rəssam Eldar Qurbanov, tanınmış rəssamlar Səmədağa Cəfərov və Nağdəli Xəlilov Dünya Rəssamlıq Akademiyasının üzvləridir. 100-dən çox ölkənin tanınmış fırça ustalarını öz ətrafında birləşdirən bu mötəbər quruma rəssamlarımız 2009-cu ildən üzv ol-

mağa başlamışlar. Belə bir təşkilatda təmsil olunmaqla Azərbaycan rəssamlıq məktəbinin qədim və özünəməxsus ənənələrini dünyada daha geniş formada təbliğ etməyə nail olur.

Bu gün Azərbaycan təsviri incəsənətini dünyada tanıdan rəssamlar arasında Sakit Məmmədovun nailiyyətlərini qeyd etmək lazımdır. Sakit Məmmədov UNESCO Rəssamlar İttifaqının üzvü, Rusiya İmperator Rəssamlar Akademiyasının akademiki, Minilliyin Adamı, Avropanın Şərəf ordeni, İtaliyanın Leonardo da Vinçi ordeni, Avropa Təbiət Elmlər Akademiyasının həqiqi üzvü, Portuqaliyada Festivalda Vera birincilik mükafatı, Beynəlxalq Vera mükafatı, Çingiz Aytmatov adına Beynəlxalq mükafat, Beynəlxalq Vətən Övladı və Dədə Qorqud mükafatları, Birincilik mükafatları və s. qızıl medal və digər mükafatlara layiq görülmüşdür (1, 69).

Vatikan Zadəgan Heraldika Akademiyasının qrafı Sakit Məmmədov dünya mədəniyyətinə töhfəsinə görə Roma Müasir İncəsənət Akademiyasının fəxri üzvü seçilib. S. Məmmədovun fırça nümunələri dünyanın bir sıra ölkələrində sərgilənib. Azərbaycanla yanaşı Türkiyədə, Rusiyada, Ukraynada, Belarusda, İsveçdə, Almaniyada, İtaliyada, Belçikada, Fransada, Avstriyada, Misirdə, Çində, Gürcüstanda, Tatarıstanda, Sinqapurda, Portuqaliyada və digər ölkələrdə fərdi sərgisi keçirilib. Azərbaycan rəssamlıq sənətinin görkəmli nümayəndələrindən biri olan Sakit Məmmədovun rəsmləri bu gün dünyanın məşhur muzeylərinin, qalereyalarının, habelə hərraclarda kolleksionerlərin məmnuniyyətlə əldə etmək istədikləri əsərlər sırasındadır: "Xatirə şəkli", "Oyun", "Məşq", "Falabaxanlar", "Ad günü", "Leninqrad xatirələri", "Yaşasın İstanbul", "Bayram", "Toy", "Metro", "13 nömrəli avtobus", "Həvəskar" və s. əsərləri S. Məmmədovun maraqlı əsərlərindəndir. Rəssamın bəzi tematik rəsmlərini konkret bir məkana, zamana aid etmək qeyri-mümkündür. Belə əsərlərdə rəssam sanki öz dünyasının zamanını göstərmək istəyir. Görkəmli rus tənqidçisi Andrey Bajenov da rəssamın yaratdıqlarından heyrətlənərək, "Sakit Məmmədovun əli intibah rəssamının əlinə bənzəyir", – deyib (4,235).

Rəssamlıqda Opalizm akademik rəssam S. Məmmədov tərəfindən özülü qoyulmuş bir məktəbdir, üslubdur. Opalizm sözünün etimologiyası opal daşından götürülüb. Qədim yunan dilində gözqamaşdıran, latın dilində valehedici görünüş, sanskrit dilində qiymətli daş kimi tərcümə edilən bu mineral daş növü özündə birləşdirdiyi rənglərlə yalnız zərgərlik məmulatı kimi deyil, müalicəvi, fövqəladə və ilhamlandırıcı xüsusiyyəti ilə min illərdir insanların zövqünü oxşamaqdadır. Opalda mövcud olan isti rəng çələngi S. Məmmədovun hələ gənclik illərindən böyük rəğbətini qazanıb. Təsadüfi deyil ki, daşda olan rəng oyununa onun, demək olar, bütün yaradıcılıq nümunələrində rast gəlinir. Bununla sənətkar sübut eyməyə çalışıb ki, heç bir rəssam Tanrının təbiətə bəxş etdiyi rənglərdən savayı yeni bir çalar icad etməyib. Rəssamın əsərlərində opalın daha çox nəcib, alovlu, yaxud bolder, hidrofan növündəki rəng çalarlarını görmək mümkündür. Düzdür, opal rəssamın yumşaq yaxma ilə yaratdığı əsərlərində daş növü kimi deyil, əlbisələrdə, baş geyimlərində, qadın zinət əşyalarında və s. formalarda təzahür edir. Yəni opal rəssamın yaratdığı tablolarda yeni forma ilə üzə çıxır. Buna baxmayaraq, rəsmlərdə daşın insanda yaratdığı xoş ovqatı və müalicəvi xüsusiyyətini hiss etmək olar. Sevindirici haldır ki, S. Məmmədovun yaratdığı Opalizm məktəbi yalnız özü deyil, rəssamın tələbələri tərəfindən də yüksək peşəkarlıqla təqdim olunur. Şübhə yoxdur ki, sənətkarın yaratdığı bu üslub gələcəkdə yetirmələri ilə yanaşı, dünyanın müxtəlif ölkələrində yaşayıb yaradan yüzlərlə, minlərlə rəssamın yaradıcılığı tərəfindən də davam etdiriləcək (3, 95).

Böyük Britaniya Kraliçası II Elizabetin anadan olmasının 90 illik yubileyi münasibətilə Londonda keçirilən tədbirlərdə Azərbaycan rəssamı Sakit Məmmədovun "Cıdır düzü" adlı rəsm əsəri Azərbaycan Respublikası Atçılıq Federasiyasının prezidenti Elçin Quliyev tərəfindən hədiyyə olaraq II Elizabetə təqdim edilib.

Azərbaycan nümayəndə heyətinin tərkibində Londonda səfərdə olan əsərin müəllifi, məşhur rəssam Sakit Məmmədov əsərdə Cıdır düzü, milli adət-ənənələrimiz, at cinslərimiz, musiqi alətlərimiz, Şuşanın Xarı bülbülü və çövkən oyununun təsvir olunması barədə Kraliçaya məlumat verib. Sakit Məmmədov müvəffəqiyyətli işləri ilə dünyaya Azərbaycan mədəniyyətini məhz bu səpkidə tanıda bilmişdir.

Bu gün Heydər Əliyev Fondu mədəni irsimizə çox böyük qayğı ilə yanaşır. Fondun təşki-

latçılığı ilə dünyanın müxtəlif ölkələrində rəsm sərgiləri açılır, rəssamlarımız tanıdılır. Parisdə keçirilən "Art Shopping" beynəlxalq müasir incəsənət sərgisində azərbaycanlı rəssamların əsərləri nümayiş etdirilib.

Parisdə Luvr muzeyinin Karusel salonunda baş tutmuş "Art Shopping" beynəlxalq müasir incəsənət sərgisində Azərbaycanı Əsmər Nərimanbəyova və Məryəm Ələkbərli təmsil ediblər.

Toğrul Nərimanbəyov Assosiasiyasının prezidenti Əsmər Nərimanbəyova bu sərgidə nümayiş olunan əsərlərini Azərbaycanın zəngin mədəniyyəti, incəsənəti, mənəvi dəyərlərindən ilham alaraq ərsəyə gətirdiyini bildirib. Rəssam deyib ki, məqsədi qədim və zəngin mədəniyyətimizi rənglər dünyasına çevirərək fransalılara təqdim etməkdir. Azərbaycan rəssamlarının əsərlərində milli geyimlərimiz, milli musiqi alətlərimiz öz əksini tapıb və bu əsərlər milli elementlərlə zəngindir. Bütün bunlar Azərbaycanı, onun maddi və mənəvi sərvətlərini dünyada tanıtmaq yolunda görülən işlərdir.

Dövrümüzün incəsənət insanları içərisində Aida Mahmudova, Əli Həsənov, Leyla Əliyeva, Faiq Əhməd, Rəşad Ələkbərov, Fərid Rəsulov, Qafar Rzayev, Mahmud Rüstəmov, Nail Ələkbərov, Rəşad Babayev, Sitarə İbrahimova, Afət Bağırova, Niyaz Nəcəfov, Altay Sadıxzadə, Məmməd Mustafayev, Fuad Salayev və bir çox şəxslər daxildir. Müasir Azərbaycan rəssamları daha özəl mövzulara, müasir gəncliyə yaxın və lazım olan mövzulara toxunurlar (5,125).

Azərbaycan təsviri sənət nümunələrinin sərgiləndiyi maraqlı obyektlərdən biri də Müasir İncəsənət Muzeyidir. XX əsrin ikinci yarısından bu günümüzə kimi Azərbaycan təsviri sənəti və heykəltəraşlığının avanqardlarından təşkil olunmuş əsərlər toplusu muzeyin əsasını təşkil edir. Bu, insan ruhunun müşahidə, axtarış və azadlığını əks etdirən rəsm və heykəllər toplusudur.

2009-cu il mart ayının 20-dən fəaliyyət göstərən muzeydə Azərbaycan rəssamları və heykəltəraşlarının 800-dən artıq əsəri sərgilənir. Muzeydə Səttar Bəhlulzadə, Böyükağa Mirzəzadə, Elmira Şaxtaxtinskaya, Tahir Salahov, Ömər Eldarov, Nadir Əbdürrəhmanov kimi sənətkarların əsərləri nümayiş olunur. Muzeyin dizaynının müəllifi məşhur rəssam Altay Sadıxzadədir. Burada, eyni zamanda, uşaq incəsənəti zalı, kitabxana, videozal, restoran, art-kafe də var (6, 79).

Son illərdə keçirilən respublika və beynəlxalq əhəmiyyətli sərgilərin sayı 500-ü ötüb. Bu illərdə Azərbaycan rəssamlarının əsərləri Almaniya, ABŞ, Rusiya, Türkiyə, İran, Fransa, İsveçrə, İtaliya, Niderland, Sloveniya, Misir, Səudiyyə Ərəbistanı, Cənubi Koreya, Ukrayna, Moldova, Özbəkistan, Braziliya, Çin, Avstriya, Portuqaliya və s. kimi ölkələrin ən nüfuzlu sərgi salonları, muzey və qalereyalarında nümayiş etdirilib. Dövlətimizin qayğısı nəticəsində təsviri sənət yaradıcılarımızı daha böyük uğurlar gözləyir.

**Problemin aktuallığı.** Bu məqalənin aktuallığı ondan ibarətdir ki, müstəqillik illərində Azərbaycan təsviri sənətinin tərəqqisi, dünyada təbliği, gənc rəssamların yaradıcılığının dəstəklənməsi istiqamətində də bir çox məqsədyönlü işlərin görülməsi hər zaman bütün dövrlər üçün aktual olacaqdır.

**Problemin elmi yeniliyi.** Bu mövzuda geniş araşdırmalar və ideyalar məhz bu məqalədə işıqlandırılmışdır.

**Problemin tətbiqi əhəmiyyəti.** Müxtəlif rəssamların əsərlərində rəssamlıq sahəsində irəli sürdükləri bir çox fikirlər müxtəlif tədqiqatlarda istifadə oluna bilər.

**Ədəbiyyat:**

1. Azərbaycan incəsənəti, təsviri sənət, dekorativ-tətbiqi sənət. memarlıq-ensiklopedik məlumat kitabı, -Bakı: "Letter-press", c.1, -2010, -81S; c.2-3, -2011. -200S.
2. Ədəbiyyat, dilçilik, mədəniyyət və incəsənət-mövzu sözlüyü. -Bakı, 2004.-185S.
3. Əfəndiyev, R. Təsviri sənət. / R. Əfəndiyev, M. Nəcəfov, M. Tərlanov. -Bakı, -1962.
4. Əfəndi, R. Azərbaycan incəsənəti. / R. Əfəndi. -Bakı: "Şərq-Qərb". -2007, - 265S.
5. Kərimov, K.C. Azərbaycan incəsənəti. / K.C. Kərimov, R.S. Əfəndiyev, N.İ. Rzayev. -Bakı,- 1992.
6. Quliyeva N. Azərbaycan incəsənəti. / N. Quliyeva. -Bakı: "Buta", -2006, -c.1, - 100 s.

**E-mail:** semaye.nezerova@gmail.com
**Rəyçi:** *ped.ü.fəls.dok.* **F.T. Xudiyeva**
**Redaksiyaya daxil olub:** 05.12.2022.

## MÜNDƏRİCAT
## ОГЛАВЛЕНИЕ
## CONTENTS

## *MƏKTƏB VƏ PEDAQOJİ FİKİR TARİXİ*
## *ИСТОРИЯ ШКОЛЫ И ПЕДАГОГИЧЕСКОЙ МЫСЛИ*
## *HISTORY OF SCHOOL AND PEDAGOGICAL THOUGHT*



## *TƏRBİYƏ TEXNOLOGİYALARI*
## *ВОСПИТАТЕЛЬНЫЕ ТЕХНОЛОГИИ*
## *UPBRİNGİNG TECHNOLOGIES*



## *PSİXOLOGİYA, YAŞ FİZİOLOGİYASI VƏ İNKLÜZİV TƏHSİL MƏSƏLƏLƏRİ*
## *ВОПРОСЫ ПСИХОЛОГИИ, ВОЗРАСТНОЙ ФИЗИОЛОГИИ И ИНКЛЮЗИВНОГО ОБРАЗОВАНИЯ*
## *ISSUES OF PSYCHOLOGY, AGE PHYSIOLOGY AND INCLUSIVE EDUCATION*

## *İNGİLİS DİLİNİN TƏDRİSİ METODİKASI*
## *МЕТОДИКА ПРЕПОДАВНИЯ АНГЛИЙСКОМУ ЯЗЫКУ*
## *METHODS OF TEACHING ENGLISH*



## *RİYAZİYYATIN TƏDRİSİ METODİKASI*
## *МЕТОДИКА ПРЕПОДАВАНИЯ МАТЕМАТИКИ*
## *METHODS OF TEACHING MATHEMATICS*

***FİZİKANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ФИЗИКИ***
***METHODS OF TEACHING PHYSICS***



***KİMYANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ХИМИИ***
***METHODS OF TEACHING CHEMISTRY***

***BİOLOGİYANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ БИОЛОГИИ***
***METHODS OF TEACHING BİOLOGY***



***İNFORMATİKANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИНФОРМАТИКИ***
***METHODS OF TEACHING INFORMATICS***



***TEXNOLOGİYANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ТЕХНОЛОГИИ***
***METHODS OF TEACHING TECHNOLOGY***



***MƏKTƏBƏQƏDƏR TƏHSİL VƏ TƏRBİYƏ***
***ДОШКОЛЬНОЕ ОБРАЗОВАНИЕ И ВОСПИТАНИЕ***
***PRESCHOOL EDUCATION AND UPBRİNGİNG***

**TƏQDİM OLUNAN MƏQALƏLƏRƏ TƏLƏBLƏR**

1. Digər redaksiyalara təqdim olunmamış məqalələr qəbul edilir.
2. Məqalələr son tədqiqatların nəticələrini əks etdirməli, yeni ideyalarla zəngin olmalı, elmi məqalələrin yazılışına qoyulan tələblər gözlənilməlidir.
3. Məqalənin mətni təxminən 6-8 səhifə olmalıdır. Azərbaycan, rus və ingilis dillərində məqaləyə aid açar sözlər verilir.
4. Məqalənin mətni Azərbaycan dilində latın əlifbası (Times New Roman), rus dilində krill əlifbası və ingilis dilində ingilis (ABŞ) əlifbası ilə Times New Roman - 14 şrift ilə 1,5 intervalla yığılmalı, elektron variantı ilə birlikdə (disklə) təqdim olunmalıdır.
5. Məqalələr üç dildən - Azərbaycan, rus və ingilis dillərindən birində çap olunur. 3 dildə (Azərbaycan, rus və ingilis) məqalənin xülasəsi təqdim edilir. Xülasədə irəli sürülən başlıca elmi müddəalar, tədqiqatdan alınan nəticələr, problemin nəzəri və praktik əhəmiyyəti öz əksini tapmalıdır.
6. Məqalə aşağıdakı ardıcıllıqla yazılır: birinci sətirdə müəllif(lər)in adı, atasının adı və soyadı; ikinci sətirdə elmi dərəcəsi və elmi adı (yaxud doktorant də dissertant olması və s.); üçüncü sətirdə iş yeri, vəzifəsi; dördüncü sətirdə böyük hərflərlə məqalənin adı. Daha sonra bu qaydada həmin məlumatlar rus və ingilis dillərində təkrar edilir.
7. Həmmüəlliflərin üç nəfərdən artıq olması məqsədəuyğun deyildir.
8. Redaksiya məqalədə zəruri dəyişiklər və ixtisarlar, redaktə aparrmaq hüququna malikdir. 9. Məqalələrə iki mütəxəssisin rəyi, şöbə və ya kafedranın, həmçinin ali məktəbin Elmi Şurasının və ümumtəhsil, yaxud orta ixtisas təhsili müəssisəsinin pedaqoji şurasının iclas protokollarından çıxarışlar əlavə olunur.
10. Məqalədəki faktların, məlumatların dürüstlüyünə müəlliflər cavabdehdir. İrəli sürülən elmi müddəalar müəllifin özünə məxsus olmalı, istifadə edilmiş nəzəri fikirlərin mənbəyi göstərilməlidir.
11. Məqalədə son 5-10 ildə çap olunan əsərlərə istinadlara üstünlük verilməlidir. Məqalənin sonunda verilən ədəbiyyat siyahısı əlifba ardıcıllığı ilə deyil, istinad olunan ədəbiyyatların mətndə rast gəlindiyi ardıcıllıqla nömrələnməli və məsələn, (1) və ya (1, s. 119) kimi işarə olunmalıdır. Eyni ədəbiyyata mətndə başqa bir yerdə təkrar istinad olunarsa, onda istinad olunan həmin ədəbiyyat əvvəlki nömrə ilə göstərilməlidir.
12. Jurnal öz profilinə uyğun məqalələri dərc edir.
13. Elmi məqalələrin sonunda elm sahəsinin və məqalənin xarakterinə uyğun olaraq aktuallıq əsaslandırılmalı, elmi yeniliyi, tətbiqi əhəmiyyəti, iqtisadi səmərəsi və s. aydın şəkildə verilməlidir.
14. Daha sonra istinad olunmuş ədəbiyyatın siyahısı verilir.
15. Plagiatlıq faktları aşkar edildikdə həmin məqalənin nəşri dayandırılır.
16. Məqalə müəlliflərinin hüquqları qorunur.
17. Jurnalda "ardı növbəti nömrədə" adı altında seriya məqalələr dərc olunmur.
18. Məqalələrin müxtəlif dillərdə olan xülasələri bir-birinin eyni olmalı və məqalənin məzmununa uyğun gəlməlidir.
19. Məqalənin sonunda rəyçilərin adı, atasının adı və soy adı, elmi dərəcəsi və elmi adı; sonrakı sətirdə məqalə müəllifinin elektron ünvanı (E-mail) göstərilməlidir.
20. Məqaləyə müəllif haqqında aşağıdakı məlumatlar əlavə olunur: məqalə müəllif(lər)inin adı, atasının adı soyadı, işlədiyi müəssisə (hansı müəssisədə doktorant və dissertant olması) və müəssisənin ünvanı, müəllif(lər)in vəzifəsi, elmi dərəcəsi və adı, iş və ev telefonları, ev ünvanı, elektron poçt ünvanı (Email).

## ТРЕБОВАНИЯ К ПРЕДСТАВЛЕННЫМ СТАТЬЯМ

1. Принимаются статьи, не представленные в других редакциях.
2. Статьи должны отражать результаты последних исследований, быть богатыми новыми идеями, в них должны быть соблюдены требования, предъявляемые написанию научных статей.
3. Текст статьи должен составлять около 6-8 страниц. Ключевые слова для статьи должны быть представлены на трех языках: азербайджанском, русском и английском.
4. Текст статьи должен быть представлен на диске вместе с электронным вариантом, с интервалом 1,5; шрифтом 14 Times New Roman - латинского алфавита на азербайджанском языке, кириллицы на русском языке, и английским алфавитом (США) на английском языке.
5. Статьи публикуются на одном из трех языков - азербайджанском, русском и английском. Резюме статьи предоставлено на 3 языках (азербайджанском, русском и английском). В статье должны быть отражены основные научные положения, изложенные в резюме, выводы, сделанные из исследования, должна быть представлена теоретическая и практическая значимость проблемы.
6. Статья должна быть написана в следующем порядке: на первой строке имя, фамилия и отчество автора (авторов); вторая строка содержит ученую степень и ученое звание (диссертант или докторант и т. д.); третья строка указывает место работы, должность; на четвертой строке представлено название статьи прописными буквами. Затем эта же информация повторяется на русском и английском языках.
7. Нежелательно иметь более трех соавторов.
8. Редакция имеет право вносить изменения и сокращения в статью.
9. Вместе со статьей должно быть предоставлено два отзыва специалистов: заведующих кафедрой или отделом, а также выписка из протокола Ученого совета вузов и педагогического совета общеобразовательного или среднего специального образования.
10. Авторы статьи несут ответственность за достоверность приведенных в статье фактов и информации. Предлагаемые научные положения должны принадлежать автору и должен быть указан источник используемых теоретических идей.
11. Ссылки следует давать на работы, опубликованные за последние 5-10 лет. Список литературы, приведенный в конце статьи, должен быть пронумерован не в алфавитном порядке, а в том порядке, в котором указанная литература появляется в тексте, например (1) или (1, стр. 119). Если та же самая литература повторяется в другом месте в тексте, то эта же литература должна быть указана под предыдущим номером.
12. Журнал публикует статьи, имеющие отношение к его профилю.
13. В конце научной статьи должна быть обоснована актуальность в соответствии с характером статьи и областью науки, четко указана научная новизна, важность ее применения, экономическая эффективность и т.д.
14. Затем предоставляется список использованной литературы.
15. При обнаружении фактов плагиата публикация статьи прекращается.
16. Права авторов статьи защищены.
17. Журнал не публикует серии статей под заголовком «продолжение в следующем номере».
18. Резюме статей на разных языках должны быть одинаковыми и соответствовать содержанию статьи.
19. В конце статьи должно быть указано имя, отчество и фамилия рецензентов, их ученая степень и ученое звание; следующая строка должна содержать адрес электронной почты автора статьи.
20. В статью добавляется следующая информация об авторе: имя, фамилия, отчество автора (авторов), учреждение, где он работает (докторантом или диссертантом которого является) адрес учреждения, должность, ученая степень и звание автора(ов), домашний и рабочий телефоны, домашний адрес, электронная почта (E-mail).

**REQUIREMENTS FOR SUBMITTED ARTICLES**

1. Submitted articles should not be published or accepted for publication in other editions.
2. Articles should reflect the results of recent research, be rich in new ideas and they must comply with the requirements for writing scientific articles.
3. The text of the article should be about 6-8 pages. Keywords for the article should be presented in three languages: Azerbaijani, Russian and English.
4. The text of the article should be presented on the disk together with the electronic version, with an interval of 1.5; 14 point Times New Roman font - Latin alphabet in Azerbaijani, Cyrillic in Russian, and English alphabet (USA) in English.
5. Articles are published in one of three languages - Azerbaijani, Russian and English. A summary of the article is provided in 3 languages (Azerbaijani, Russian and English). The article should reflect the main scientific provisions presented in the summary, the conclusions drawn from the study, the theoretical and practical significance of the problem should be presented.
6. The article is written in the following order: on the first line the name, surname and patronymic of the author (s); the second line contains the academic degree and academic title (doctoral student or candidate for a degree, etc.); the third line indicates the place of work, position; the fourth line represents the title of the article in capital letters. Then in this order the same information is repeated in Russian and English.
7. It is undesirable to have more than three co-authors.
8. The Editorial Board has the right to make changes and reductions in the article.
9. Two expert reviews should be provided together with the article: heads of department or chair, as well as extract from the protocol of Academic Council of the higher school and the Pedagogical Council of general or secondary special education institutions.
10. The authors of the article are responsible for the accuracy of the facts and information provided in the article. The proposed scientific provisions should belong to the author and the source of used theoretical ideas must be indicated.
11. The articles should refer to works published in the last 5-10 years. The list of references given at the end of the article should not be numbered in alphabetical order, but in the order in which the indicated literature appears in the text, for example (1) or (1, p. 119). If the same literature is repeated elsewhere in the text, then the same literature should be indicated under the previous number.
12. The journal publishes articles related to its profile.
13. At the end of a scientific article, the relevance should be justified according to the nature of the article and the area of science, scientific novelty, importance of its application, economic efficiency, etc. should be clearly indicated.
14. Then a list of references is provided.
15. When the facts of plagiarism are discovered, the publication of the article is stopped.
16. The rights of the authors of the article are protected.
17. The journal does not publish a series of articles under the heading “continued in the next issue”.
18. Summary of articles in different languages should be the same and consistent with the content of the article.
19. At the end of the article the name, patronymic and last name of the reviewers, their academic degree and academic title should be indicated; the next line should contain the email address of the author of the article.
20. The following information about the author is added to the article: name, surname, patronymic of the author (authors), the institution where he works (doctoral student or candidate for a degree), address of the institution, position, academic degree and the title of the author (s), home and work phones, home address, email address.

